# QURANİ-KƏRİMDƏ İMAMƏT VƏ CANİŞİNLİK

:Müəllif

Ayətullah əl-üzma Nasir Məkarim Şirazi

:Çap nəşriyyat

əl-Mustafa (s) Beynəlxalq Tərcümə və Nəşr mərkəzi

:Digital nəşriyyat

İsfəhan Qaimiyyə adına komputer araşdırmalar mərkəzi

# Mündəricat

## QURANİ–KƏRİMDƏ İMAMƏT VƏ CANİŞİNLİK

### KİTAB HAQQINDA

"KITABıN ADı: "Qurani–Kərimdə imamət və canişinlik

MüəLLIF: Ayətullah əl–üzma Nasir Məkarim Şirazi

TəRCüMə EDəN: R. Şükürbəyli

Redaktorlar: E. Rəhimli, M. Əlizadə

KompYUTERDə YığAN: V. Əsədov

NAşIR: Beynəlxalq əl–Mustəfa (s) Akademiyası

ÇAP NöVBəSI: Birinci

TARIX: ۲۰۰۹

TIRAJ: ۲۰۰۰

ISBN: ۹۷۸–۹۶۴–۱۹۵–۰۲۷–۱

:İNVAN

İran, Qum, Bahar prospekti, Beynəlxalq əl–Mustəfa (s) Akademiyasının nəşriyyatı. Telfax: ۰۰۹۸ ۲۵۱ ۷۷۴۹۸۷۵

İran, Qum, Məhəmməd Əmin prospekti, Elmlər Akademiyasının nəzdi, Beynəlxalq əl–Mustəfa (s) Akademiyasının nəşriyyatı.

Telfax: ۰۰۹۸ ۲۵۱ ۲۱۳۳۱۰۴

WWW.MIUP.IR , WWW.ESHOP.MIUP.IR

E–MAIL: ADMIN@MIUP.IR, ROOT@MIUP.IR

# QURANİ-KƏRİMDƏ

# İMAMƏT VƏ CANİŞİNLİK

[Müəllif: Ayətullah əl-üzma Nasir Məkarim Şirazi[DU١] [١

[Tərcümə edən: Rza Şükürbəyli[DU٢] [٢

________________________

[DU١] [٣][DU٢] [۴]

**NAŞİRDƏN**

[NAÕİRDƏN[DU١] [١

İslam tarixində “imamət”, “canişinlik” və “imamşünaslıq” elə ilkin dövrdən tutmuş indiki zamanımıza qədər ən əhəmiyyətli məsələlərdən biri kimi, həmişə diqqət mərkəzində olmuşdur. Bəlkə də elə bir mövzu tapılmaz ki, onun simasının təsvirindəki qədər ona qələm, mürəkkəb sərf edilsin. İslam mənbələrində müsəlmanların rəhbərliyi ilə əlaqədar nəql olunan hədis və rəvayətlərin sayı olduqca çox və bütün cəhətləri belə dolғun işıqlandırılmışdır. Hətta ən mötəbər və səhih kitablarda dəfələrlə adı çəkilən .“səqəleyn” və “səfinə” kimi birbaşa canişinliyi təyin edən hədislərin sayı az deyildir

Məsum imamların buyuruqlarından əlavə, hələ Quranın ona ayrılan xass ayələri bu məsələnin əhəmiyyətini bir daha artırır. Məsələn, Qurani-Kərimdə ümumi imamət və vilayətlə əlaqədar diqqəti xüsusi cəlb edən “ulul-əmr” və “sadiqin”, xüsusi imamət və vilayətlə əlaqədar isə “leylətül-məbit” və “xeyrul-bəriyyə” kimi ayələr müşahidə olunur ki, sünnü və şiələrin təfsir kitablarında onlara geniş şərhlər verilmiş və burada məsum .imamlar rəhbərliyin kamil nümunələri kimi qeyd edilmişdir

Təfsir üslubu baxımından yazılan kitablar arasında hər hansı bir mövzu üzərində aparılan xüsusi təfsir forması isə bir mövzuya aid ayələrin toplanması, çoxşaxəli mövzuların araşdırılması, dərin mənalı ayələrin düzgün izahı və s. spesifik xüsusiyyətləri ilə fərqlənir. Elə bu kitab da həmin üslubda yazılan A. N. M. Şirazinin dəyərli əsərlərindən

______________________

[DU١] [٢]

biridir və “Qurani-Kərimdə imamət və canişinlik” adı ilə Beynəlxalq əl-Mustəfa (s) Akademiyasının tədqiqatçı məzunlarından sayılan R. Şükürbəyli namizədlik elmi dərəcəsi almaq üçün azəri türkcəsinə tərcümə etmiş və BMA tərəfindən ən üstün elmi .iş kimi tanınmışdır

Yeri gəlmişkən, bu dəyərli əsərin tərcüməsinin ərsəyə çatdırılmasında zəhmət çəkən !bütün elm əhlinə xüsusi minnətdarlığımızı bildiririk

Beynəlxalq əl-Mustəfa (s) Akademiyası

Tədqiqat şöbəsi

səh:۶

## MÜNDƏRİCAT

MÌNDƏRİCAT

## ÖN SÖZ

### İşarə

[DU١] [١]

Ümumi mənada “imamət” və “rəhbərlik”, xüsusi mənada isə İslam Peyğəmbərinin canişinlik məsələsi tarixdə yüksək əhəmiyyət daşıyan teoloji-təfsiri bəhslərdəndir və .heç bir mövzu haqda bu qədər söz açılmamışdır

Təəssüflər olsun ki, bəzən bu məsələ mövzudan kənara çıxaraq qanlı müharibə meydanına çevrilmişdir. Bəzi teoloqların dediyi kimi, vilayət və imamətlə bağlı çəkilən qılınc qədər İslamda qılınc çəkilməmişdir! Məhz bu səbəbdən də ən çox kitab İslamın köklü əqidəvi üsullarından olan bu məsələ barədə yazılmış və bütün incəliklərilə maraqlananların ixtiyarına verilmişdir. Əlbəttə, burada məntiqsiz, ixtilaf törədən və .yersiz təəssübkeşlikdən doğan fikirlərə də rast gəlinir

:Belə mühüm və həssas məsələ ilə bağlı bizim vəzifəmiz aşağıdakılardan ibarətdir

Məntiqsiz və təəssüb doğuran bəhslərdən uzaq olub, Allahın kitabına, qəti sünnə(١) .١ ;və əqli sübutlara istinad və onları tərtib etmək

İmamət”in əsasları ilə məsum imamların ilahi mənsəbindən sayılan vilayət və“ .٢ ;rəhbərliyi uyğunlaşdırmaq

______________________

[DU١] [٢]

səh:١١

---

Sünnə” lüğətdə üslub mənasındadır – istər yaxşı olsun, istərsə də pis. Dini“. [١] -١ termində isə Peyğəmbəri-Əkrəm (s)-in əməl və sözlərindən ibarət olan və Qurani-Kərimdə aşkar şəkildə qeyd olunmayan əmr, nəhy və göstərişlər mənasını daşıyır. Həmçinin o həzrətin bir şeyi müşahidə edib təsdiqləməsinə də şamil olur. Yəni Peyğəmbər (s) hər hansı bir müsəlmandan gördüyü bir işi ona qadağan etməyibsə və

həqiqətdə sükutu ilə o əməli təsdiqləyibsə, sünnə ona da aiddir. İslami şəriət mənbələrindən biri də “sünnə”dir. (“Məalimul-mədrəsətəyn”, Əllamə Əskəri, ٣-cü cild, səh. ٩.) (Müt.)

.Bu məsələni Quran baxımından araşdırıb, imamətlə bağlı ayələri dəqiq təfsir etmək .٣

Bəzi tədqiqatçıların dediyi kimi, imamət haqda fikirlər yenicə yaranmamışdır; əksinə İslam aləmində peyğəmbərliyin davamı olan ümmətin rəhbərlik və İslamın taleyi ilə (əlaqədar köklü bir məsələdir.(١

Əlbəttə, biz hər şeydən öncə varlıq aləmində, daha sonra bəşəriyyət aləmində rəhbərlik məsələsini, sonra isə məsum imamların rəhbərliyini və nəhayət, naiblərin hökumət və rəhbərliyini araşdıracağıq. Bütün bunlardan əvvəl isə bir neçə məsələni :araşdırmaq daha zəruridir

## ?İMAMƏT, YAXUD CANİŞİNLİK NƏDİR

Qeyd etmək lazımdır ki, imamətin tərifi haqda fikir ayrılığı vardır; bir qrup müsəlmanların (şiə və Əhli-beyt (ə) məktəbinin ardıcıllarının) nəzərinə görə, imamət dinin əsası və etiqadın köklərindən olduğu halda, başqa bir qrupun (əhli-sünnənin) .nəzərinə əsasən, fürui-din və əməli göstərişlərdən sayılır

Məlum olduğu üzrə, hər iki qrup məsələyə eyni gözlə baxmadığından təbii olaraq ona :fərqli təriflər vermişlər. Məsələn

:Əhli-sünnə alimlərindən biri imaməti belə tərif edir

اَلْامامهُ رِئاسَهٌ عامَّهٌ فِي اُمُوْرِ الدّيِنِ وَالدُّنْيا، خَلافَه عَنِ النّبِی (ص)

İmamət – İslam Peyğəmbərinin (s) canişinliyi adı ilə din və dünya işlərinə ümumi“ (rəyasət və rəhbərlikdir!”(٢

Bu tərifə əsasən, imamət hökumət rəhbərliyinə dair zahiri məqam və vəzifədən ibarətdir. Bu hökumət dinə əsaslanır və Peyğəmbər (s)-in (hökumət işlərindəki) .canişini adını daşıyır. Təbiidir ki, burada “imam” xalq tərəfindən seçilməlidir

Başqa bir tərifdə deyilir: “İmamət – müəyyən bir şəxsin şəri hökmlərə nəzarət etməsi və din üzrə İslam Peyğəmbərinin (s) canişini olmasından ibarətdir. Belə ki, ona itaət (bütün müsəlmanlara vacibdir!”(٣

---

.İmamət və rəhbəri”, Şəhid Mütəhhəri, səh. ۱۳“. [۱] -۱

.Şərhi-təcrid”, Quşçi, səh. ۴۷۲“. [۲] -۲

Təcridül-etiqad” kitabının qədim şərhi, Şəmsəddin İsfahani Əşəri, “Tovzihul-“. [۳] -۳ murad”dan (“Şərhu-təcridil-etiqad”ın haşiyəsi) nəqlən, Seyid Haşim Hüseyni Tehrani, .səh. ۶۷۲

Bu tərifin birinci tәriflə elə də fərqi yoxdur və hər ikisi eyni məfhumu ehtiva edir. İbn Xəldun tarixlə əlaqədar yazdığı "Müqəddimə" adlı kitabında bu tərifi qeyd etmişdir.

Şeyx Müfid "Əvailul-məqalat" kitabının "ismət"(۱) bölümündə belə yazır:

اِنَّ الاَئِمَّهَ القائِمِينَ مَقامَ الْاَنْبِياء فِى تَنْفِيذِ الْاَحْكامِ وَ اِقامَهِ الحُدوُدِ وَحِفْظِ الشَرايع وَتأديبِ الاَنامِ مَعْصوُموُن كَعِصْمَهِ الاَنْبِياء

"Peyğəmbər (s)-in canişinləri olan imamlar hədd(۲), hüquq və hökmləri icra etmək, şəriəti qoruyub-saxlamaq, eləcə də insanların tərbiyəsində peyğəmbərlər kimi (günah və xətadan) məsumdurlar!"(۳)

Əhli-beyt (ə) ardıcıllarının əqidəsi ilə uyğun gələn bu tərifə əsasən, "imamət" xalqa rəyasət və rəhbərlikdən də yüksək bir məqamdır. İmamlar peyğəmbərlərin (vəhyi müstəsna etməklə) bütün spesifik xüsusiyyətlərinə malikdirlər. Buna görə də "ismət" sifəti (günah və xətalardan pak olmaq) imamlara da aiddir.

"Şərhu Ehqaqil-həqq" kitabında şiələr baxımından imamət belə tərif olunmuşdur: "İmamət – peyğəmbərliyi və onun ayrılmaz xüsusiyyətlərini istisna etməklə, bütün səciyyəvi xüsusiyyətlər və fəzilətləri əhatə edən ilahi bir mənsəb və məqamdır."(۴)

Bu tərifə əsasən, "imam" Peyğəmbər (s)-in vasitəsilə Allah tərəfindən seçilir, o həzrətin (peyğəmbərlik məqamından başqa) bütün fəzilət və imtiyazlarına malikdir, onun işi yalnız dini hökumət və rəhbərliklə bitmir. Beləliklə, imamət fürui-din və əməli vəzifələrdən deyil, əksinə dinin əsaslarından sayılır!



---

۱- [۱] "İsmət", yəni insan elə bir güclü dərketmə qüvvəsinə malik olsun ki, başqaları kimi günah etməyə qadir olduğu halda, günaha düşməsin. Bu məsələ Allahın məsum şəxsi günahı tərk etməyə məcbur etməsi kimi təsəvvür olunmamalıdır. Allah-taala insana yüksək ağıl, kamal, dərrakə, mənəvi paklıq, eləcə də ibadət və itaətə son dərəcədə diqqət kimi böyük nemətlərin bəxş etməsi nəticəsində onun günah etmək qüdrətinə malik olmasına bayxmayaraq, onu öz ixtiyarı ilə tərk edir. Peyğəmbərlər və imamlar da bu məqama malik olduqları üçün onlara "məsum" deyilir. ("Camieyi-kəbirə

(.ziyarətnaməsinin şərhi”, Seyid Abdullah Şübbər, səh. ١٨٠.) (Müt

Şəriətdə bəzi günah və pozğun işləri törədənlərin fiziki cəzalanmasına “hədd” . [٢] -٢ (.deyilir. (Müt

.Müqəddimə”, İbn Xəldun, səh. ١٩١“ . [٣] -٣

.(Şərhu Ehqaqil-həqq”, ٢-ci cild, səh. ٣٠٠ (birinci vərəqaltı haşiyədə“ . [۴] -۴

## ?İMAMƏT ÜSULİ–DİNDƏNDİR, YOXSA FÜRUİ–DİNDƏN

Öncə qeyd edildiyi kimi, bu sualın cavabı bizə aydındır. Amma bununla belə, müxtəlif nəzəriyyələr də mövcuddur. Əhli-sünnənin məşhur alimi və “Nəhcül-həqq”(۱) kitabının müəllifi Fəzl ibn Ruzbehan yazır: “Əşərilərin baxışında imamət dinin əsası və etiqadi (məsələlərdən deyil, əksinə mükəlləfin əməli ilə bağlı olan fürui-dindəndir!”(۲

Bu məsələdə əhli-sünnənin digər firqələri ilə əşərilik arasında heç bir fərq yoxdur. Çünki onların hamısı imaməti əməli yöndə xalqa tapşırılan vəzifələrdən bilirlər. Yalnız Əhli-beyt (ə) məktəbinin ardıcılları olan şiələr, eləcə də Qazi Beyzavi və onun bir qrup ardıcılı onu dinin əsaslarından hesab edirlər.(۳) Bunun səbəbi isə aydındır; çünki imamət Allah tərəfindən ilahi bir mənsəb və məqam olduğu üçün onun təyin olunması yalnız Allaha aiddir. Şəriətin əsasını qoyan Peyğəmbər (s)-ə inam zəruri olduğu kimi, imamlara da inam labüddür. Lakin bu o demək deyildir ki, imamiyyə şiələri bu fikirlə müxalif olanları kafir adlandırsın; əksinə onlar sair müsəlman firqələrinin hamısını müsəlman bilir və onlara bu əqidəni qəbul etməsələr də, müsəlman qardaşı kimi baxırlar. Məhz bu səbəbdən də şiələr dini etiqadı iki hissəyə bölmüşlər: ۱) dinin əsasları .– tövhid, nübüvvət və məad; ۲) məzhəb əsasları – ilahi ədalət və imamət

:Bu məsələni imam Rizanın (ə) bir buyruğu ilə sona yetiririk

اِنَّ الْاِمامَهَ زَمامُ الدِّينِ وَنِظامُ المُسلِمِينَ وَصَلاحُ الدُّنْيا وَعِزُّالمؤْمِنِينَ، اِنَّ الْاِمامَهَ اُسُّ الْاِسْلامِ النّامِی وَفَرْعُهُ السّامِی، بِالْاِمام تَمامُ الصَّلاه وَالزَّكات وَالصِّيام وَالحَجّ وَالجَهاد وَتَوْفيرُ الفَيئ وَالصَّدَقات وَاِمْضاءُالْحُدوُد وَالْاَحكام، وَمَنْعُ الثُّغوُر وَالْاَطْراف، اَلاِمامُ يَحِلُّ حَلالَ الله، وَيَحْرُمُ حَرامَ الله، وَيُقِيمُ حُدوُد الله، وَيَذُبُّ عَنْ دِينِ الله، وَيَدْعُو اِلی سَبِيلِ رَبِّهِ بِالحِكْمَهِ وَالْمَوْعِظَهِ الْحَسَنَهِ وَالْحُجَّهِ الْبالِغَهِ

İmamət dinə rəhbərlik, müsəlmanların nizam-intizamı, dünyanın abadlığı və“ möminlərin izzəti deməkdir. İmamət həqiqi İslamın əsası və onun gövdəsidir. İmamın vasitəsilə namaz, zəkat, oruc, həcc və cihad kamilləşir, “beytül-mal” (ümumi əmlak) və sədəqə (yoxsullara kömək) çoxalır, qanun və hökmlər icra olunur, İslamın sərhədləri qorunur. İmam Allahın halalını halal, haramını haram bilir, Allahın hökmlərini icra və ,dinini müdafiə edir. Elm

۱- [۱]. “Ehqaqul-həqq” kitabı ona cavab olaraq yazılmışdır.

۲- [۲]. “Ehqaqul-həqq”, ۲-ci cild, səh. ۲۹۴ və “Dəlailus-sidq”, ۲-ci cild, səh. ۴.

۳- [۳]. “Dəlailus-sidq”, ۲-ci cild, səh. ۸.

"!yaxşı nəsihət, möhkəm və tutarlı dəlillə (insanları) Rəbbinə doğru dəvət edir

## ?İMAMƏT BƏHSLƏRİ NƏ VAXTDAN BAŞLANDI

İslam Peyğəmbərindən sonra canişinlik məsələsi üzərində mübahisə yarandıqda, bir qrup Peyğəmbər (s)-in özünə canişin təyin etmədiyini və bu işi ümmətin öz öhdəsinə qoyduğunu iddia edərək dedilər ki, ümmət bir yerə toplaşıb, özləri aralarından bir nəfəri rəhbər seçməli, bununla da o, hökuməti idarə və xalqın nümayəndəsi adı ilə rəhbərlik etməlidir. Hərçənd, belə seçki İslam tarixində əsla baş vermədi; xəlifəliklə bağlı ilk mərhələ yalnız səhabədən təşkil olunan kiçik bir dəstənin təyini, ikinci mərhələ səsvermə, üçüncü mərhələ isə altı nəfərdən ibarət bir şuranın vasitəsilə başa çatdı. Bu .təfəkkür tərzinin tərəfdarları "əhli-sünnə" adlanırlar

Bu fikrə əks olan başqa qrupun əqidəsinə görə, Peyğəmbər (s)-in canişini Allah tərəfindən təyin olunmalıdır. Çünki o, ümmətin maddi və mənəvi rəhbərliyini öhdəsinə götürmək, İslamın əsasını qorumaq, dini yaşatmaq, şəri hökm və Quranın incəliklərini şərh etmək üçün Peyğəmbər (s) kimi yüksək elmə malik, günah və xətadan məsum olmalıdır. Bu qrup "imamiyyə", yaxud "şiə" adlanır. Bu ad Peyğəmbər (s)-dən nəql olunan hədislərdən götürülmüşdür. Belə ki, əhli-sünnənin məşhur mənbələrindən sayılan "Əd-durrul-mənsur" kitabında Cabir ibn Abdullah Ənsaridən belə nəql olunur: "Biz Peyğəmbər (s)-in yanında idik və bu zaman Əli (ə) bizə tərəf gəlməyə başladı. :Peyğəmbər (s) buyurdu

...اِنَّ هذا وَ شِيعَتَهُ لَهُمُ الْفائِزُونَ يَوْمَ الْقِيامَهِ

O və onun şiələri qiyamət günü nicat tapacaqlar." Bu vaxt "İnnəlləzinə amənu və" əmilus-salihati ulaikə hum xeyrul-bəriyyəh!" (Həqiqətən, iman gətirib saleh əməllər (yerinə yetirənlər yaradılmışların ən yaxşılarıdır!) – ayəsi nazil oldu." (١)

Hicri qəməri tarixi ilə ٥-ci əsrin məşhur əhli-sünnə alimi Hakim Nişapuri "Şəvahidut-tənzil" kitabında Peyğəmbəri-Əkrəm (s)-dən müxtəlif sənədlərlə bu məzmunu ifadə edən iyirmidən artıq rəvayət

١- [١] . “Əd-durrul-mənsur”, ۶-cı cild, səh. ٣٧٩. (“Bəyyinə” surəsinin ٧-ci ayəsinin təfsirində.)

nəql etmişdir. O cümlədən, İbn Abbasdan belə nəql olunur: “Həqiqətən, iman gətirib saleh əməllər yerinə yetirənlər yaradılmışların ən yaxşılarıdır!” – ayəsi nazil olduqda, :Peyğəmbəri-Əkrəm (s) Əliyə (ə) buyurdu

هُوَ اَنْتَ وَ شیعَتَک...

(Bu ayədən məqsəd sən və şiələrindir!”(١“

Başqa bir hədisdə Əbu Bərzədən nəql olunur ki, Peyğəmbəri-Əkrəm (s) bu ayəni :tilavət etdikdən sonra buyurdu

هُمْ اَنْتَ وَ شیعَتَک یا عَلِیّ

(Ya Əli! Onlar sən və şiələrindir!”(٢“

Bu hədis İbn Həcərin “Əs-səvaiq” və Məhəmməd Şəbləncinin “Nurul-əbsar” kimi əhli-(sünnənin، mötəbər kitablarında da qeyd olunmuşdur.(٣

Bu rəvayətlərə əsasən, imam Əlinin (ə) tərəfdarları və ardıcıllarının adını Peyğəmbəri-Əkrəm (s)-in özü təyin etmişdir. Bununla belə, bəzilərinin bu ad və ünvandan narahat olub onu pis yad etmələri – “ş” hərfi ilə “şər”, eləcə də “ş” hərfi ilə başlanan digər pis !?sözlərlə ifadə etmələri təəccüblü deyilmi

Doğrudan da, həmişə məntiqli dəlillər üzərində hərəkət etməyə cəhd göstərən bir tədqiqatçının belə sözlər deməsi maraqlıdır! Halbuki hər bir sözün hərflərini asanlıqla .pis və ya yaxşı sözlərə yozmaq olar

Ümumiyyətlə, şiənin yaranma tarixi İslam Peyğəmbərinin vəfatından sonra deyil, əksinə bir mənada elə o həzrətin zamanına qayıdır. Peyğəmbər (s) bu adı imam Əlinin (ə) dostları və ardıcıllarına aid etmişdir. İslam Peyğəmbərini Allahın rəsulu kimi tanıyanlar yaxşı bilirlər ki, (Quran ayəsinə əsasən,) o həzrət nəfsani hislər üzündən danışmır, bütün dedikləri vəhyə əsaslanır. Əgər o həzrət “Ya Əli! Sən və ardıcılların qiyamət günü nicat

١- [١]. "Şəvahidut-tənzil", ٢-ci cild, səh. ٣۵٧.

٢- [٢]. Yenə orada, səh. ٣۵٩.

٣- [٣]. "Əs-səvaiq", səh. ٩۶ və "Nurul-əbsar", səh. ٧٠ və ١١٠. Bu hədisin raviləri və onu nəql edən kitablar barəsində əlavə məlumat əldə etmək istəyənlər "Ehqaqul-həqq" kitabının ٣-cü cildinin ٢٨٧-ci və ١۴-cü cildinin ٢۵٨-ci səhifələrinə müraciət etsinlər.

.tapanlardansınız!” – deyə buyurubsa, deməli, bu eyni həqiqətdir

## QURAN VƏ LÜĞƏTDƏ “İMAM” SÖZÜ

QURAN VƏ LÌĞƏTDƏ İMAM� SÖZÌ

Lüğət alimlərinin qeyd etdikləri kimi, “imam” sözü feldən əmələ gələn mücərrəd isimdir və insanın diqqət mərkəzində saxladığı və ardınca düşərək tələb etdiyi hər bir şeyə aid edilir. Bu söz müxtəlif yerlərdə ayrı-ayrı mənaları ifadə edir. Məsələn, bəzən “imam cümə”, “imam camaat”, “hidayət imamı”, bəzən də “zəlalət imamı” kimi müəyyən (mənalar nəzərdə tutulur.(١

Bu söz, əslində “niyyət etmək” mənasını daşıyan “əmm” sözündən götürülmüşdür. “Məqayisul-lüğət” kitabında yazılır: “Ümm” əsl, mərcə, camaat və din mənasını bildirir, iqtida olunan və hər bir işdə qabaqcıl şəxsə “imam” deyilir. “İmam” sözü “ön” ”.mənasında da işlədilmişdir

Lisanul-ərəb” kitabında imam sözü üçün çoxlu məna qeyd edilmişdir. O cümlədən,“ qabaqcıl, müəllim, evin bünövrəsini qurmaq üçün istifadə olunan ip (vəsait), yol, hər bir .şeyin ön hissəsi və s

Lakin belə nəzərə çarpır ki, “Ət-təhqiq” kitabının müəllifinin yazdığı kimi, bütün bu mənaların batinində müəyyən məqsədlə yanaşı niyyət etmək güdülür. Hətta ərəb dilində anaya “ümm” deyilməsinin səbəbi hər bir şeyin əsas və kökünə “ümm” deyilməkdir. Həm də o, insanın məqsəd və diqqət mərkəzindədir. Həmçinin imam iqtida olunan şəxs mənasında o kəslərə deyilir ki, camaat xüsusi meyl və məqsədlə .onlara doğru üz tuturlar

Bunu da deməliyik ki, Qurani-Kərimdə bu söz və onun cəm forması olan “əimmə” sözü düz on iki dəfə – yeddi dəfə tək, beş dəfə isə cəm halda işlədilmişdir. Qurani-Kərimin :bir ayəsində bu söz “lövhi-məhfuz” mənasında olub, belə buyurulur

كُلَّ شَىْءٍ اَحْصَيْنَاهُ فِى إِمامٍ مُبِينٍ

(Hər bir şeyi aşkar imamda – lövhi-məhfuzda sayıb hesabladıq!”(٢“

:Başqa bir ayədə isə yol mənasında işlədilərək buyurulur



---

.Ət-təhqiq", "əmm" kökü" . [۱] -۱

.Ya-sin" surəsi, ayə: ۱۲" . [۲] -۲

وَإِنَّهُمَا لَبِإِمَامٍ مُّبِينٍ

Hər ikisi (Lut və Şüeyb qövmlərinin yaşadıqları şəhərlər Şama doğru gedən sizin)“ (açıq-aşkar yolunuz üzərindədir!”(۱

.Çünki insan məqsədinə nail olmaq üçün yollara əhəmiyyət verir

Quranın başqa iki ayəsində bu sözlə yəhudi qövmünə örnək və qabaqcıl şəriət olan :Tövrata işarə edilir və buyurulur

وَمِن قَبْلِهِ كِتَابُ مُوسَى إِمَامًا وَرَحْمَةً

(Ondan qabaq Musanın kitabı onlara rəhbər və rəhmət idi.”(۲“

:Bu söz beş ayədə isə ilahi və saleh rəhbərlərə aid edilmişdir. O cümlədən

قَالَ إِنِّي جَاعِلُكَ لِلنَّاسِ إِمَامًا

(Allah İbrahimə buyurdu: “Mən səni insanlara imam təyin etdim!”(۳“

:Daha başqa bir ayədə bir qrup peyğəmbərlər haqda buyurulur

وَجَعَلْنَاهُمْ أَئِمَّةً يَهْدُونَ بِأَمْرِنَا

Biz onları əmrimizlə (camaatı) doğru yola yönəldən imamlar və qabaqcıllar təyin“ (etdik!”(۴

Ümumi mənada bu məfhum “Furqan” surəsinin ۷۴-cü, “Qəsəs” surəsinin ۵-ci və .“Səcdə” surəsinin ۲۴-cü ayələrində də gəlmişdir

:Başqa bir ayədə isə küfr və zəlalət rəhbərlərinə aid edilmişdir. Ayədə buyurulur

فَقَاتِلُواْ أَئِمَّةَ الْكُفْرِ

(Belə isə küfr rəhbərləri ilə döyüşün!”(۵“

Digər bir ayədə geniş mənada həm hidayət, həm də zəlalət rəhbərlərinə aid edilərək :buyurulur

يَوْمَ نَدْعُو كُلَّ أُنَاسٍ بِإِمَامِهِمْ

“O gündə (qiyamətdə) hər tayfanı öz rəhbərləri ilə birgə çağıracağıq!”(۶)

Ümumiyyətlə, Qurani-Kərimdə “imam” sözü müxtəlif mənalarda



---

۱- [۱]. “Hicr” surəsi, ayə: ۷۸.

۲- [۲]. “Əhqaf” surəsi, ayə: ۱۲ və “Hud” surəsi, ayə: ۱۷.

۳- [۳]. “Bəqərə” surəsi, ayə: ۱۲۴.

۴- [۴]. “Ənbiya” surəsi, ayə: ۷۳.

۵- [۵]. “Tövbə” surəsi, ayə: ۱۲.

۶- [۶]. “İsra” surəsi, ayə: ۷۱.

.on iki dəfə işlədilmişdir

## QURANİ–KƏRİMDƏ İMAMƏT MƏQAMI

Əsl mənada imamət və rəhbərlik yalnız dini məsələ olmayıb, bütün yaradılış aləmində əhəmiyyət daşıyır. Allah-taala Özü varlıq aləminin əsl imamı və rəhbəridir, kainatı !hidayət və idarə edən də Odur

Qurani-Kərimdə imamət məsələsinə xüsusi əhəmiyyət verilmiş və insanın təkamül seyrinin son mərhələsi sayılaraq, yalnız "ulul-əzm" peyğəmbərlər ona çatmışlar. Belə :ki, "Bəqərə" surəsinin ١٢٤-cü ayəsində buyurulur

وَإِذِ ابْتَلَى إِبْرَاهِيمَ رَبُّهُ بِكَلِمَاتٍ فَأَتَمَّهُنَّ قَالَ إِنِّى جَاعِلُكَ لِلنَّاسِ إِمَامًا قَالَ وَمِن ذُرِّيَّتِى قَالَ لاَ يَنَالُ عَهْدِى الظَّالِمِينَ

Xatırla o zamanı ki, İbrahimi öz Rəbbi kəlmələrlə (müxtəlif vasitələrlə) imtahana çəkdi" və o, imtahanları tamamladı (onların öhdəsindən layiqincə gəldi). Bu zaman Allah ona buyurdu: "Səni insanlara imam təyin etdim!" İbrahim: "Nəslimdən necə? (Onları da İmam qərar verəcəksənmi?)" – dedikdə, Allah buyurdu: "Mənim əhdim (imamlıq məqamı) heç vaxt zalımlara çatmaz! (Və bu məqama yalnız sənin pak və məsum "(!övladların layiqdirlər

Bu ayənin əvvəlində həzrət İbrahimin bir neçə "kəlmə" ilə imtahana çəkilməsindən söz açılmışdır. Təfsir alimləri arasında bu kəlmənin nədən ibarət olduğu barədə fikir ayrılığı (vardır. "Ruhul-məani" kitabının müəllifi bu haqda on üç nəzər qeyd etmişdir.(١)

Lakin nəzərə daha düzgün gələni budur ki, "kəlmələr"dən məqsəd İbrahim peyğəmbərin öhdəsinə qoyulan çətin və ağır vəzifələrdən ibarət müxtəlif əmr və nəhylərdir. Bu vəzifələr – əmr və nəhylər aşağıdakılardan ibarətdir: Bütpərəstlərə qarşı şücaətlə qiyamı, bütləri sındırması, odda yandırılması və digər çətin mərhələlərə dözməsi, eləcə də ürəyinin parası olan övladını qurban etmək məqsədi ilə bıçağı onun boğazına qoyması, ailə-uşağından keçib, onları bir nəfərin belə yaşamadığı Məkkənin quru və yandırıcı torpağında tək-tənha qoyması və nəhayət, müqəddəs vəzifəsini

yerinə yetirmək üçün bütpərəstlərin yaşadığı diyardan köçməsi... Doğrusu, bunların hər biri ağır imtahan olsa da, İbrahim (ə) iman və səbir qüvvəsilə onların öhdəsindən .gələrək imamət məqamına nail olmuşdur

Bəzi təfsirçilər həzrət İbrahimin (ə) imtahanlarının otuzdan çox olduğunu qeyd edərək demişlər ki, bu otuz imtahan Qurani-Kərimin üç yerində – "Tövbə" surəsinin ١٣-cü ayəsi (on imtahan), "Əhzab" surəsinin ١-٩-cu və ٣٥-ci ayələrində (qalan iyirmi imtahan) açıqlanmışdır. Lakin bu imtahanların bir qisminin təkrar yönünə diqqət yetirdikdə, bu .nəzəri düzgün hesab etmək olmaz

Ümumiyyətlə, İbrahim (ə) o zaman qəhrəmanlıq göstərərək bütləri sındırdı, çətin və ağır sınaqların hamısının öhdəsindən layiqincə gələrək imamət libasını geyindi. Allah-taala onun böyük iftixar və məqama nail olduğunu belə açıqlayır: "Mən səni insanlara "!imam təyin etdim

Həzrət İbrahimin (ə) risalət və peyğəmbərlik məqamından, eləcə də bütün !?mübarizələrdən sonra ömrünün sonunda nail olduğu bu məqam hansı məqam idi

Sözsüz ki, həzrət İbrahimin (ə) o ağır imtahanlardan sonra Allah tərəfindən layiq görüldüyü bu məqam onun peyğəmbərlik məqamından üstün olmalıdır. Təfsir alimləri ayədə qeyd olunan "imam" sözü haqda çox söz demişlər və bəziləri bu sözün mənasının incəliyinə varmadığından qəribə sərgərdanlığa düçar olmuşlar. Ən maraqlısı budur ki, bir qrup məşhur təfsirçilər onu nübüvvət və peyğəmbərlik məqamı ilə eyni bilmişlər. Halbuki həzrət İbrahimin (ə) həmin vaxt peyğəmbər olmasında heç bir şəkk-şübhə yox idi. O, imamət məqamına çatanda, peyğəmbərliyindən çox illər keçirdi və övlad sahibi də olmuşdu. Ayənin davamında da Allahdan öz övladları üçün .imamət məqamını istədiyi göstərilir

Bir çox təfsirçilər həzrət İbrahimin (ə) imtahana çəkildiyi "kəlmələr"in Allah tərəfindən aldığı bir sıra təlimlər, yaxud bütpərəstlərlə mübarizəsi, Kəbə evini bina etməsi və oğlunu qurban kəsməsindən ibarət olduğunu bildirsələr də, bəziləri yenə imaməti peyğəmbərlik məqamına aid etmişlər. Halbuki bütün bu göstəriş və

qəhrəmanlıqlar həzrət İbrahimin (ə) peyğəmbərlik məqamından sonra baş vermişdir. Hər halda, onların təfsirlərində “Mən səni insanalara imam təyin etdim!” – cümləsi .tamamilə aydın deyildir

Ayədə qeyd olunan “imamət”in itaətin vacibliyi mənasını bildirən təfsir də düzgün deyildir. Çünki hər bir peyğəmbərə itaət vacibdir. Əgər məqsəd, İbrahimə (ə) itaət .etməyin vacibliyidirsə, artıq bu onun üçün heç bir məqam sayıla bilməz

Bəziləri də başqa bir təfsiri yürüdərək demişlər: “İmamdan məqsəd, din və dünya ”.işlərinə rəhbərlik deməkdir; başqa sözlə desək, hökumətə başçılıq nəzərdə tutulur

Bu təfsir qeyd etdiyimiz digər iki təfsirdən fərqli və uyğun olsa da, yenə imamətin dərin mənaya malik olduğunu göstərmir. Bizim nəzərimizcə, bu zəmində söz açan digər ayələrə diqqət yetirdikdə, imamətin deyilənlərdən daha yüksək bir məqama aid olduğu aydınlaşacaq. O da geniş mənada ilahi proqramları həyata keçirməkdən – həm hökumət məsələləri, həm əmr və hökmlərin icrası, həm də insanların zahiri və batini .tərbiyəsindən ibarətdir

İzah: Peyğəmbərlərin göndərilməsində əsas məqsəd bəşəriyyəti hidayət etmək, :doğru yola yönəltməkdir. Bu hidayət iki mərhələdə həyata keçirilir

.Haqq yolu göstərmək; bu bütün ilahi peyğəmbərlərin vəzifəsidir .١

:Məqsədə çatdırmaq; bu da iki hissəyə bölünür .٢

a) “Təşrii hidayət”; yəni gətirdiyi dinin əsaslarını gerçəkləşdirmək, istər hökumət qurub əhkamları icra və ictimai ədaləti bərpa etməklə, istərsə də əməli olaraq insanları tərbiyə etməklə olsun. Bunların hər ikisi peyğəmbərlərin hədəf və məqsədlərinin gerçəkləşməsi üçün vasitə olsa da, onları həyata keçirmək çox çətindir. Bu işin sahibi mütləq elm, təqva(١), şücaət və



---

Təqva” sözü əsasən Allahın əzəmət və cəlalından qafil olmamaq, Onun“ . [١] -١ hökmləri ilə müxalifət etməmək, inadkar və günahkarların qazandıqları ilahi əzabların

çətin və ağır olmasından qorxmaq mənasındadır. Təqvanın müxtəlif dərəcəsi vardır: ١-Günah və haram işlərdən uzaq olmaqdan ibarət olan xalqın əmr olunmuş təqva həddidir; ٢-Məxsus insanların əldə etdikləri təqva həddidir ki, təkcə haram işlərdən deyil, həm də məkruh və bəyənilməz işlərdən də uzaq olmaq və pəhriz etməkdir; ٣-Məxsusların məxsusunun nail olduqları təqva dərəcəsinə şamil olur. Bu seçilmiş şəxsiyyətlər hətta bəzi mübah və halal olan, lakin insanın özünü məşğul edib, onu Allahın yadı və zikrindən yayındıran əməllərdən çəkinib pəhriz edirlər. ("Camieyi-kəbirə ziyarətnaməsinin şərhi", Seyid Abdullah Şübbər, səh. ٩٨.) (Müt.)

.idarəçilik kimi xüsusiyyətlərə malik olmalıdır

b) "Təkvini hidayət"; yəni mənəvi təsirlə hidayət şüasını insanların qəlbinə yeritmək. Bu isə mənəvi və daxili bir seyrdir. Bununla ilahi rəhbər və peyğəmbərlər öz ardıcıllarını zahiri və xarici seyrlə inkişaf etdirirlər. Şübhəsiz, belə bir proqramı icra etmək istəyən .şəxs bir çox xüsusiyyətlər və hazırlıqlara malik olmalıdır

Hidayətin hər iki qismində dini və ilahi vəzifələr həyata keçirilir, layiqli insanlar maddi və mənəvi, zahiri və batini təkamülə çatdırılırlar. Ayədə qeyd olunan "imamət"dən də məqsəd məhz budur! Həzrət İbrahim (ə) xüsusi sifət və xislətlərə malik olmayınca, bu !məqama nail ola bilməzdi

Qeyd edilənlərdən belə nəticə alırıq ki, bir şəxs həm imamət, həm də peyğəmbərlik məqamına nail ola bilər. Buna "ulul-əzm" peyğəmbərlərdən İbrahimi (ə) və İslam Peyğəmbərini (s) misal göstərmək olar. Eləcə də mümkündür ki, bir şəxs peyğəmbər olmadığı halda, imamət məqamına nail olsun. Buna da "rəsul" və "nəbi"dən fərqli vəhy .almayan məsum imamları misal çəkmək olar

Ümumiyyətlə, ayənin başlanğıcında buyurulan "Mən səni insanlara imam təyin etdim!" – cümləsindən imamət məqamının böyüklüyü və imamın Allah tərəfindən seçilməsi açıq-aşkar məlumdur. Həmin ayənin davamında bu məsələ daha təkidlə qeyd edilir. Belə ki, İbrahim (ə) bu məqama nail olduqda, gələcək nəsli haqda da düşünüb deyir: "İlahi! Nəslimdən də?... (Onları da imam qərar verəcəksənmi?)" Bu zaman Allah tərəfindən belə xitab gəlir: "Mənim (imamət və vilayət) əhdim heç vaxt zülmkarlara çatmaz!" Yəni ey İbrahim! Sənin övladların içərisində yalnız zülm və günahdan uzaq və !pak olanlar bu məqama layiqdirlər

Şübhəsiz, burada buyurulan "zülm"dən məqsəd, yalnız başqalarına rəva görülən zülm və haqsızlıq deyil, həm də geniş

mənada ədalətin müqabili (antonimi) olan zülmdən ibarətdir. Ədalət geniş mənada hər bir şeyin yerini düzgün təyin etmək, zülm isə onun yerini səhv salmaqdır. Qurani-:Kərimdə həzrət Loğmanın (ə) oğluna belə dediyi buyurulur

يَا بُنَيَّ لَا تُشْرِكْ بِاللَّهِ إِنَّ الشِّرْكَ لَظُلْمٌ عَظِيمٌ

(Oğlum! Allaha şərik qoşma; üçnki şirk böyük zülmdür!"(١"

Aydındır ki, burada "ədalət", kamil ədalət, yaxud başqa sözlə desək, imamətlə uyğunlaşan ismət məqamıdır. Günahla yanaşı olan ədalət isə imamət məqamından uzaq və ona layiq deyildir. Buna əsasən, yuxarıdakı ayə imamın məsum və günahsız .olduğuna bir sübutdur

Lakin əsas məsələ budur ki, görəsən, biz ədalətdə ömrün əvvəlindən sonuna qədər hər bir günahdan uzaq olmağı şərt saymalıyıq, yoxsa imamət məqamının burada ?kifayət etdiyini deməliyik

Bəziləri "üsul" qaydalarına əsaslanaraq deyirlər: "Əgər bir kəsə müəyyən vəsf nisbət verilirsə, elə həmin halda ona malik olmalıdır. Məsələn, "ayaq üstə duran" sifətini o kəsə aid edə bilərik ki, həmin vaxt ayaq üstə olsun. Əvvəlcə ayaq üstə olub, sonra isə oturan şəxsə bunu aid etmək düzgün deyildir. Buna əsasən, ayənin məfhumu belə olur ki, imam imamət məqamına nail olduğu zaman zülm, şirk, günah və çirkinliklərdən .uzaq olmalıdır. Deməli, ədalət və ismət sifətləri ömrün əvvəlinə şamil olmur

Lakin hədislərə əsasən, Əhli-beyt imamları (ə) İslam Peyğəmbərinə (s) istinad edərək "imam"ın ömrünün bütün hallarında ədalətli olduğunu bildirmişlər. Abdullah ibn Məsud :Allahın Rəsulundan (s) belə nəql edir ki, Allah-taala İbrahimə (ə) buyurdu

لا اُعْطِيكَ عَهْداً لِلظّالِمِ مِنْ ذُرِّيَّتِكَ

"!Mən (imamət) əhdimi övladlarından zülmkar olanlara əta etmərəm"

قالَ يا رَبِّ وَمَن الظّالِمُ مِنْ وُلْدى الَّذى لا يَنالُ عَهْدِكَ؟

İbrahim (ə) dedi: "İlahi! Sənin əhdinə nail olmayan zülmkar övladlarım

kimlərdir?”

قالَ مَنْ سَجَدَ لِصَنَمٍ مِنْ دوُنِی لا اَجْعَلُهُ اِماماً اَبَداً وَلا یَصْلَحُ اَنْ یَکوُنَ اِماماً

Allah buyurdu: “Məni qoyub, bütə səcdə (pərəstiş) edən kəsi heç vaxt imam təyin etmərəm. O, imamlığa layiq deyildir!”(۱)

Bunu əhli-sünnənin məşhur alimi İbn Məğazili “Mənaqib” kitabında azacıq fərqlə İbn Məsuddan nəql edir ki, Peyğəmbəri-Əkrəm (s) bu ayənin təfsirində buyurdu: “Allah-taala İbrahimə (ə) buyurdu: “Məni qoyub, bütə səcdə (pərəstiş) edən kəsi heç vaxt imam təyin etmərəm!” Sonra Həzrət sözünə əlavə edərək buyurdu: “Nəhayət, İbrahimin duası mənə və qardaşım Əliyə çatdı. Bizim heç birimiz bütə əsla səcdə etməmişik!”(۲)

Mötəbər kitablarda bu zəmində Əhli-beytdən (ə) nəql olunan digər rəvayətlər də vardır. Bütün bu rəvayətlər həqiqətdə bunu açıqlayır ki, İbrahim (ə) Allahdan imamət məqamını zülmkar və müşrik kəsə əta etməsini heç vaxt istəməmiş, əksinə onun Allahdan istəyi sonradan tövbə edərək haqq-ədalət yolunu tutanlar üçün olmuşdur. Bu zaman Allahdan xitab gəlir ki, imamət əhdi yalnız əzəldən zülm etməyən və Allaha şərik qoşmayanlara nəsib olacaq!

Böyük təfsir alimi Əllamə Təbatəbai “Əl-mizan” kitabında yazır: “Bu ayənin imamların (ömürlərinin bütün halında) məsum olmalarına necə dəlalət etməsini ustadlarımızın birindən soruşduqda, belə cavab verdi: “İnsanlar əql və məntiq baxımından dörd qrupa bölünür:

۱. Ömrünü əvvəldən axıra qədər zülm və haqsızlıqla keçirənlər;

۲. Ömrü əvvəldən axıra qədər hər bir günah və zülmdən pak olanlar;

۳. Ömrünün əvvəlində zülmkar olan, axırda isə bu işdən çəkinənlər;

۴. Ömrünü əvvəlcə ədalətlə başlayan, sonra isə zülmlə başa vuranlar.

səh:۲۴

.Əmali", Şeyx Müfid, "Burhan" təfsirindən nəqlən, ١-ci cild, səh. ١٥١, hədis: ١٣" . [١] -١

Mənaqib", İbn Məğazili, "Əl-mizan" kitabından nəqlən, ١-ci cild, səh. ٢٧٨, həmin" . [٢] -٢
.ayənin təfsirində

Şübhəsiz, həzrət İbrahim kimi peyğəmbərin Allahdan birinci və dördüncü qrupa aid olanlar üçün imamət məqamını istəməsi əsla təsəvvür olunmur. Burada iki qrup qalır ki, Allah-taala da üçüncü qrupu imamət məqamından rədd edir. Beləliklə, yalnız bir (qrup qalır, o da ömrünün əvvəlindən sonuna kimi pak və günahdan uzaq olanlar!(١)

Fəxri-Razi "Kəbir" adlı təfsir kitabında etiraf edərək yazır ki, bu ayə peyğəmbərlərin məsum olmasına dəlalət edir. Diqqəti cəlb edən budur ki, həqiqətdə peyğəmbərin məsum olması onun imamət məqamı ilə sübuta yetir, yəni hər bir peyğəmbər ".imamdır

Bütün bu qeyd edilənlərdən sonra bizə Qurani-Kərim baxımından imamət məqamının əzəmət və böyüklüyü məlum olur və məqsədimiz də məhz bu nöqtəni aydınlaşdırmaq .idi

## (İMAMIN VİCUDUNUN FƏLSƏFƏSİ (SƏBƏBİ

Ötən səhifələrdə İbrahimin (ə) imamət məqamından söz açan ayədə "imam"ın vücudunun əhəmiyyəti qısa şəkildə qeyd olundu. Lakin bu mövzu yüksək əhəmiyyətə .malik olduğundan, burada ayrıca, geniş bəhsi lazım görürük

Ümumiyyətlə, peyğəmbərlərin gəlişindəki məqsəd, yaxud vücudunun zərurəti haqda .deyilənlər imamlara da aiddir

Xacə Nəsrəddin Tusi "Təcridul-etiqad" kitabının "nübüvvət" fəslində peyğəmbərlərin besətinin səbəbini açıqlayarkən doqquz səbəb qeyd etmişdir ki, biz burada onlara qısa .şəkildə işarə edəcək və görəcəyik ki, onların çoxu məsum imamlara da şamildir

Əqli mərifətin nəqli yolla qüvvətləndirilməsi. Belə ki, insan əql qüvvəsilə bir çox .١ nəzəri və əməli həqiqətləri dərk etsə də, bəzən qəlbində şübhələr baş qaldırır. Bu isə bir şeyə inam və imanın qarşısını alır. Amma əqlin hökmləri ilahi və məsum rəhbərlərin bəyanı ilə təsdiq edildikdə, bütün maneələr aradan qalxır, insan qəlbən rahatlıq tapır .və hər hansı işə doğru meyli artır

Bəzən insan bir sıra işlərdən çəkinir və qorxur ki, onun əməli .٢

Allahın istəyinə əks olsun. İlahi rəhbərlərin icazəsi və bəyanı ilə bu qorxu aradan qalxır.

۳. İnsanın bütün əməli və rəftarı “əql yaxşı-pisi dərk edir” – fikri çərçivəsinə yerləşmir. Nə çox ola bilər ki, insan əqli bir işin yaxşı, yaxud pis olduğunu dərk etməsin. Burada yaxşı-pisi ayırd etmək üçün ilahi rəhbərlərə ehtiyac duyulur.

۴. İnsan bütün faydalı və zərərli işlərin ilahi rəhbərlər olmadan, yalnız öz düşüncəsi ilə xeyir-ziyanını dərk etməyə qadir deyildir.

۵. İnsan ictimai bir varlıq olduğu üçün ayrı-ayrı fərdlər bir-birləri ilə həmkarlıq və bir-birlərinə kömək etmədən həyatın problemlərini həll etməyə qadir deyillər. Şübhəsiz, burada bütün fərdlərin hüquqlarını qoruyan, onları düzgün istiqamətləndirən qanunlar olmadan ictimai ədalət bərpa olunmayacaq və istənilən nəticəyə çatmayacaqlar. Bu qanunları tam mənada düzgün ayırd və icra edə bilən kəs yalnız agah, pak, məsum və ilahi rəhbərlər ola bilər.

۶. İnsanlar kamalı dərk etmək, elm və maarifi ələ gətirib fəzilətləri qazanmaq baxımından bir-birlərilə fərqlənirlər; bəziləri buna tam qadir, bəziləri isə acizdirlər. İlahi rəhbərlər birinci qrupa təkan, ikinci qrupa isə kömək edirlər ki, hər ikisi mümkün kamala çatsın.

۷. Ümumiyyətlə, insan həyatı elm, sənət və digər vəsaitlə sıx əlaqədardır. İlahi rəhbərlər isə onların inkişafında çox güclü mühərrikdirlər.

۸. İnsanlar əxlaqi səciyyələrlə bir-birindən fərqlənirlər. Onların düzgün təlim-tərbiyəsində pak və məsum kəslərə ehtiyac vardır.

۹. İlahi rəhbərlər itaətlə bağlı savab və mükafat, günahla bağlı cəza və əzabdan tamamilə agahdırlar. Onların insanları əməllərinin axır-aqibətindən xəbərdar etmələri hər hansı vəzifəni düzgün yerinə yetirmək üçün güclü amil sayılır.(۱)

İmamət məqamı nübüvvətin davamı olduğu üçün qeyd edilən səbəblərin çoxu məsumlara da aiddir.

Qurani-Kərimdə bütün bunlar, hətta onların ən üstünü olan üç qismi ixtisarla

çox ayələrdə onlara toxunulmuş və bir ayədə İslam Peyğəmbərinin (s) besətinin :fəlsəfəsi belə bildirilmişdir

هُوَ الَّذِی بَعَثَ فِی الْأُمِّیِّینَ رَسُولًا مِّنْهُمْ یَتْلُو عَلَیْهِمْ آیَاتِهِ وَیُزَکِّیهِمْ وَیُعَلِّمُهُمُ الْکِتَابَ وَالْحِکْمَهَ وَإِن کَانُوا مِن قَبْلُ لَفِی ضَلَالٍ مُّبِینٍ

Yazıb-oxumaq bilməyən ərəblər arasından, özlərindən olan bir peyğəmbər göndərən“ Odur! Bu Peyğəmbər onlara Allahın ayələrini oxuyar, onları saflaşdırar, onlara kitabı və (hikməti öyrədər, hərçənd, əvvəllər açıq-aşkar azğın yolda idilər!”(١

Bu ayədə Peyğəmbər (s) və imamların ən mühüm vəzifəsi olan “təlim” və “tərbiyə” .məsələsinə işarə edilmişdir

:Başqa bir ayədə buyurulur

لَقَدْ أَرْسَلْنَا رُسُلَنَا بِالْبَیِّنَاتِ وَأَنزَلْنَا مَعَهُمُ الْکِتَابَ وَالْمِیزَانَ لِیَقُومَ النَّاسُ بِالْقِسْطِ

Həqiqətən, Biz peyğəmbərlərimizi açıq-aşkar dəlillərlə göndərdik, onlarla birlikdə“ (səmavi) kitab və tərəzi (haqqı batildən ayırd edən ədalətli qayda-qanunlar) nazil etdik (ki, insanlar ədaləti bərqərar etsinlər.”(٢

Bu ayədə düzgün təlim-tərbiyə üçün zəmin yaradan ictimai ədalət məsəlsinə .toxunulmuşdur

Adətən, hakim təbəqə mövqe qazanmaq, yaxud bir qrupun mənafeyini qoruyub-saxlamaq əzmində olduqları üçün kütlənin mənafeyini həmişə buna qurban edirlər. Yalnız pak və ilahi rəhbərlər bəşərin hüquq və mənafelərini olduğu kimi qoruyub müdafiə etmişlər. Hətta qeyri-ilahi rəhbərlərin haqq-ədaləti qorumaları, cəmiyyəti istənilən kamala doğru yönəltmələrini belə fərz etsək, yenə müəyyən işlərin dəqiq ayırd edilməsi əksər hallarda onların öhdəsindən xaricdir. Onlar bu hallarda yalnız səthi fərqləri ayırd edə bilirlər ki, bu da çox əhəmiyyət kəsb etmir. Bu işin öhdəsindən .yalnız Allahın sonsuz elm dəryasına bağlanan ilahi rəhbərlər gələ bilərlər

Yer kürəsinin yarısı yetmiş il hökmranlıq edən marksizmi həqiqi mənada təcrübə etdi. Onlar bu illər ərzində marksizmin əsaslarını möhkəmlətmək üçün geniş təbliğat vasitələrindən istifadə etsələr də, bu yol genişmiqyaslı qəzet, jurnal, hətta sadə

atsalar da, cəmiyyətin problemlərinin həlli, ictimai ədalətin təmini, bəşəriyyətin təkamülü, tarix və ictimai elmlərin düzgün təlimi üçün marksizmin əsaslarını yeganə yol və vasitə qələmə verərək müxaliflərini müxtəlif yollarla sıradan çıxarsalar da, gördüyünüz kimi, bu ideyanın məhsulu diktatura və süqutdan başqa bir şey olmadı. Hətta onların bir çox mütəfəkkir və alimləri bu ideologiyanın əsaslarının səhv olduğunu etiraf etdilər!

Bəlkə də tarixdə bu qədər mütəfəkkir, alim, təhsil ocaqları və universitetləri belə böyük bir məktəb və ideologiyanı müdafiə edib, axırda puç olması misli görünməmiş hadisə olsun. Doğrudan da kim zəmanət verə bilər ki, gələcəkdə yenə adi insan təfəkküründən doğan digər ictimai və etiqadi məktəblər belə bir taleyə düçar olmayacaq?! Belə isə Allah tərəfindən hər bir xəta və səhvdən uzaq olduğuna zəmanət verilən peyğəmbər və məsum rəhbərlərin məktəbi bir daha öz zəruriliyini ifa edir.

Bir sözlə, bəşəriyyəti kamal və səadətə çatdırmaq üçün yaradan mütəal Allah haqq yolu göstərməkdə vəhy qüvvəsi və ismət məqamına malik peyğəmbərlər göndərdiyi kimi, onlardan sonra da bu yolun davam etdirilməsi üçün məsum canişinlər təyin etmişdir. Şübhəsiz, o canişinlər olmadan bu məqsəd natamam və yarımçıq qalacaqdır. Çünki:

١. İnsan əqli bütün kamal, səadət və tərəqqi yollarını müstəqil olaraq ayırd etməyə qadir deyildir.

٢. Peyğəmbərin vəfatından sonra mümkündür ki, din müxtəlif təhriflərə məruz qalsın. Deməli, Allahın dinini azğın kəslərin təhrifi, nadanların dəxaləti, nəfsə uyanların təfsirindən qorumaq üçün məsum və ilahi rəhbərlərə ehtiyac duyulur.

Bu məsələ "Üsuli-kafi" kitabında imam Sadiqdən (ə) nəql olunan məşhur bir hədisdə belə açıqlanır:

اِنَّ فِينا اَهْلَ الْبَيْتِ فِى كُلِّ خَلَفٍ عُدوُلاً يَنْفُونَ عَنْهُ تَحْرِيفُ الْغالِينَ، وَانْتِحالُ الْمُبْطِلِينَ، وَتَأْوِيلُ الْجاهِلِينَ!

Hər bir nəsildə biz Əhli-beytdən ədalətli bir şəxs vardır ki, qüluvv edənlərin (ifrata varanların) təhrifini, bidətini,(١) batil əlini və nadanların

۱- [۱] . “Bidət” sözü lüğətdə yeni zühur edən yeni bir iş mənasındadır. Dində isə bidət dedikdə, hər hansı ixtira olunmuş yeni bir saxta (qondarma) işi və sözü şəriət sahibinə aid etmək nəzərdə tutulur. (“Məalimul-mədrəsətəyn”, Əllamə Əskəri, ۳-cü cild, səh. ۹.) (Müt.)

iftiralarını ondan (İslamdan) uzaqlaşdıracaq!(۱) (Burada məsum imam nəzərdə tutulur.)

İmam Əli (ə) dərin mənalı kəlamlarından birində ona işarə edərək buyurmuşdur: “İlahi! Doğrudan da yer üzü heç vaxt istər aşkar, istərsə də gözlərdən gizli, Allahın dəlil və nişanələrini batildən qoruyan ilahi höccətsiz qalmayacaqdır!” (۲)

۳. İnsanların yaradılış tələbinə uyğun ilahi hökumətin təşkil olunması yalnız məsumların vasitəsilə mümkündür. Çünki tarix göstərdiyi kimi, dinsiz hökumətlər həmişə fərd, yaxud müəyyən bir qrupun maddi mənafeyinə xidmət etmişdir. Dəfələrlə təcrübə olunmuşdur ki, “demokratiya”, “bəşər hüquqları” və “xalq hakimiyyəti” kimi şüarlar asanlıqla kələk və müəyyən məqsədlər üçün vasitəyə çevrilmişdir. Belə vasitələrlə hər hansı bir məqsəd üstüörtülü şəkildə xalqa yüklənilir.

Həqiqətdə bu üç əsas – “haqq yolunu ayırd etmək”, “peyğəmbərlərin mirasını qoruyub-saxlamaq” və “ədalətli hökumət qurmaq” məsum imamın vücudunun fəlsəfəsini təşkil edir.

Bu məsələ ilə əlaqədar mövzumuzu imam Riza (ə)-dan imamətin fəlsəfəsi barədə nəql olunan bir hədis, eləcə də Əmirəlmöminin Əlinin (ə) “Nəhcül-bəlağədə” buyurduğu bir kəlamla sona yetiririk:

İmam Riza (ə) Mərvdə olarkən cümə günü “Came” məscidində camaatın qarşısında bir sıra məsələlərə toxundu. O cümlədən, buyurdu:

اِنَّ الْاِمـامَهَ هِیَ مَنْزِلَهُ الْاَنْبِیـاء، وارِثُ الْاَوصِـیاء، اِنَّ الْاِمـامَه خِلافَهُ اللهِ وَخِلافَهُ الرَّسوُلِ... اَلْاِمامُ اَلْبَـدْرُ الْمُنِیرُ، وَالسِّراجُ الزَّاهِرُ، وَالنّوُرُ السّـاطِعُ، وَالنَّجْمُ الْهـادِی فِی غَیـاهِبِ الـدّجی... اَلْاِمامُ اَلماءُ الْعَـذبُ عَلی الظَّمّاءِ وَالـدّالُّ عَلی الْهُـدی، وَالمُنْجِی مِنَ الرَّدی... اَلْاِمامُ السَّحـابُ الْمـاطِرُ، وَالْغَیثُ الْهاطِـلُ، وَالشَّمْسُ الْمُضِـیئَه... اَلْاِمـامُ اَمینُ اللهِ فِی خَلْقِهِ، وَحُجَّتُهُ عَلی عِبـادِهِ، وَخَلِیفَتُهُ فِی بِلادِهِ... نِظـامُ الدِّین، وَعِزُّالْمُسْلِمینَ، وَغَیْضُ الْمُنافِقِینَ، وَبَوارُالْکافِرینَ

“Şübhəsiz, imamət peyğəmbərlərin məqamı və vəsilərin irsidir. İmamət Allahın nümayəndəliyi, Peyğəmbər (s)-in xilafəti(۳) və canişinliyidir... İmam

١- [١]. “Üsuli-kafi”, ١-ci cild, səh. ٣٢, “sifətül-elm” bölümü, hədis: ٢.

٢- [٢]. “Nəhcül-bəlağə”, qısa kəlamlar: ١٤٧

٣- [٣]. “Xilafət” ərəb dilində başqasının əvəzedicisi olmaq mənasındadır. Xəlifə o kəsə deyilir ki, başqasının ardınca gəlib onun canişini olsun və onun yerində mövcud boşluğu doldursun. (“Məalimul-mədrəsəteyn”, Əllamə Əskəri, ١-ci cild, səh. ١٥۶.) (Müt.)

parlaq ay, işıqlı çıraq, saçan nur, zülmət və qaranlıqda hidayət ulduzu və süqutda xilaskardır... İmam yağış dolu bərəkətli bulud, ardıcıl (dirilik) yağış və parlaq günəşdir... İmam yaranmışlar arasında Allahın əmini, bəndələri üzərində Onun höccəti və canişinidir... İmamın vücudu ilə din nizam-intizam tapır, müsəlmanlar izzət qazanır, münafiqlər qeyzdən yanır və kafirlər həlakətə yetirlər."(۱)

Əmirəlmöminin Əli (ə) qısa bir kəlamla imamətin həqəqətini açıqlayaraq buyurmuşdur: "Müsəlmanların işlərində imamın mövqeyi təsbeh dənələri bir-birinin kənarında nizamla yığan ipə bənzəyir. Əgər ip qırılsa, onlar dağılaraq hər biri bir yerə düşər və (imam olmasa, ictima bir-birinə dəyər, nizam-intizam pozular) heç vaxt onları bir yerə yığıb nizamlamaq olmaz!(۲)



---

۱- [۱] . "Üsuli-kafi", ۱-ci cild, səh. ۲۰۰.

۲- [۲] . "Nəhcül-bəlağə", xütbə: ۴۶.

## I .QURANİ–KƏRİMDƏ ÜMUMİ İMAMƏT VƏ VİLAYƏT

### İşarə

:İmamət və vilayətlə əlaqədar yenə iki fərqli bəhs mövcuddur

Ümumi imamət və vilayət"; yəni hər bir əsr və dövrdə insanlar arasında Allah" .١ tərəfindən bir imam və rəhbər mütləq olmalıdır; istər o, peyğəmbərlik, istərsə də .yalnız imamət məqamına malik olsun

Xüsusi imamət və vilayət"; bu ilahi məqam İslam Peyğəmbərindən sonra onun" .٢ .canişininə aiddir

Başqa sözlə desək, nübüvvət və peyğəmbərlik iki qismə – ümumi və xüsusi .peyğəmbərliyə bölündüyü kimi, imamət də iki qismə bölünür

Qurani-Kərimdə ümumi imamət və vilayətlə əlaqədar bir sıra ayələr mövcuddur. O :cümlədən

إِنَّمَا أَنتَ مُنذِرٌ وَلِكُلِّ قَوْمٍ هَادٍ

(Sən yalnız qorxudansan. Hər tayfanın da bir hidayət edəni vardır."(١"-١

يَا أَيُّهَا الَّذِينَ آمَنُواْ اتَّقُواْ اللّهَ وَكُونُواْ مَعَ الصَّادِقِينَ

Ey iman gətirənlər! Allahdan qorxun (Onun əmrinə qarşı çıxmayın) və doğru"-٢ (danışanlarla birgə olun."(٢

يَا أَيُّهَا الَّذِينَ آمَنُواْ أَطِيعُواْ اللّهَ وَأَطِيعُواْ الرَّسُولَ وَأُوْلِي الأَمْرِ مِنكُمْ



---

.Rəd" surəsi, ayə: ٧" .[١]-١

.Bəraət" surəsi, ayə: ١١٩" .[٢]-٢

۳- “Ey iman gətirənlər! Allaha, Peyğəmbərə və sizlərdən olan əmr sahiblərinə tabe olun.”(۱)

## “İNZAR VƏ HİDAYƏT” AYƏSİ

Birinci ayədə İslam Peyğəmbərinə (s) xitab edilərək buyurulur:

إِنَّمَا أَنتَ مُنذِرٌ وَلِكُلِّ قَوْمٍ هَادٍ

“Sən yalnız qorxudansan. Hər qövmün və millətin də bir hidayət edəni vardır!”

Fəxri-Razi bu ayənin təfsirində üç fikir söyləmişdir:

۱. “Münzir” (qorxudan) və “hadi” (rəhbər və hidayət edən) sözlərinin hər ikisi eyni mənanı daşıyır. Buna əsasən, ayənin mənası belədir: “Sən yalnız hər tayfanı qorxudan və hidayət edənsən!”

۲. İslam Peyğəmbəri (s) qorxudan, Allah isə hidayət edəndir.

۳. İslam Peyğəmbəri (s) qorxudan, imam Əli (ə) isə hidayət edəndir.

İbn Abbas deyir: “Peyğəmbər (s) mübarək əlini sinəsinə qoyub buyurdu: ( اَنا الْمُنْذِرُ ) “Mən qorxudanam!” Sonra isə əlini Əliyə (ə) tərəf uzadaraq buyurdu:

اَنْتَ الْهادِیُ یا عَلیّ! بِکَ یَهْتَدِی الْمُهْتَدوُنَ مِنْ بَعْدِی!

“Ya Əli! Sən (isə) hidayət edənsən. Məndən sonra hidayət tapanlar sənin vasitənlə hidayət olacaqlar.”(۲)

Bu üç təfsiri digər təfsirçilər də qeyd etmişlər. Sünnü təfsirçilərinin bəziləri isə israrla bu ayənin ۱-ci və ۲-ci təfsirinin qəti olduğunu deməyə çalışmışlar. Çünki ۳-cü təfsir onların təəssüblə qarışmış təfəkkür tərzi ilə uyğun deyildir. Halbuki birinci təfsir əsla ayənin zahiri ilə uyğun gəlmir. Çünki hər iki vəsf İslam Peyğəmbərinə (s) aid olsaydı, onda Allah-taalla belə buyurardı: “İnnəma əntə munzirun və hadin li-kulli qovmin.” – “Həqiqətən, sən yalnız hər millət və tayfanı qorxudan və hidayət edənsən!” Başqa sözlə desək, ərəb qrammatikasına əsasən, (“carr və məcrur” olan) “li-kulli qovmin” (hər tayfanı) ifadəsi “hadi” (hidayət edən) sözündən

öncə qeyd edilə bilməz. Əgər öncə qeyd edilərsə, onda hər iki vəsfdən öncə gəlməli və belə deyilməlidir: “İnnəma əntə li-kulli qovmin munzirun və hadin.” – “Həqiqətən, sən hər tayfanın yalnız qorxudanı və hidayət edənisən!” Bir sözlə, “li-kulli qovmin” (hər tayfanı) ifadəsinin iki vəsfdən birindən öncə qeyd edilməsi və digərindən təxirə salınması üçün bir dəlil yoxdur; ya hər ikisindən öncə, ya da hər ikisindən sonra qeyd .edilməlidir

İkinci təfsirdə də uyğunsuzluq vardır. Çünki Allah-taalanın hidayətçi olmasında heç bir şəkk-şübhə olmadığından, onu qeyd etməyə ehtiyac yoxdur. Bir də bu cümlənin zahiri mənası hər bir əsr və zamanda xüsusi hidayətçinin olmasını bildirir. Halbuki Allah-taala tək halda “li-kulli qovmin hadin” (hər tayfanın bir hidayətçisi vardır) – ifadəsindən başa .düşülən cəm halla uyğun gəlmir

Beləliklə, yuxarıda qeyd olunan ayə üçün yeganə məqbul təfsir budur ki, Peyğəmbəri-.Əkrəm (s) qorxudandır və hər bir dövrdə hər qövmün “bir hidayətçi”si vardır

Görəsən, bu hidayətçi hər bir dövr və tayfanın alimlərinə də şamildirmi?” – sualının“ cavabı da mənfidir. Çünki hər bir dövrdə yalnız bir alim deyil, əksinə çoxlu sayda alim ola bilər. İslam Peyğəmbəri (s) bir nəfər olduğu kimi, müsəlmanların hidayətçisi də hər dövrdə bir nəfər olmalıdır. Başqa sözlə desək, İslam Peyğəmbəri (s) dinin təsisçisi olduğundan, camaatı qorxudur, imam isə onları hidayət etməklə o həzrətin yolunu .davam etdirir

Qeyd olunanlar bu ayədən başa düşülən dəqiq incəliklər idi. Bu zəmində şiə və .sünnülərdən nəql olunan rəvayətlərə gəldikdə isə məsələ daha da aydınlaşır

Sünnülərin ən məşhur təfsir kitablarından olan “Əd-durrul-mənsur”da Peyğəmbəri-:Əkrəm (s)-dən bu ayənin təfsiri ilə əlaqədar müxtəlif rəvayətlər nəql edilmişdir

İbn Cərir, İbn Mərdəveyh, Əbu Nəim, Deyləmi, İbn Əsakir və İbn Nəccardan belə .١ nəql edir: “Sən yalnız qorxudansan. Hər qövmün və millətin bir hidayət edəni vardır!” – ayəsi nazil olduqda, İslam Peyğəmbəri (s) əlini sinəsinə qoyub “Qorxudan mənəm!” – deyə buyurdu. Sonra Əliyə işarə edərək buyurdu: “Ya Əli! Hidayətçi

rəhbər) sənsən və məndən sonra hidayət tapanlar məhz sənin vasitənlə hidayət)
(olacaqlar.”(۱

Əbu Bərzə Əsləmi bu ayə barəsində deyir ki, Peyğəmbəri-Əkrəm (s)-dən əlini . ۲ sinəsinə qodyuğu halda, belə buyurduğunu eşitdim: “Həqiqətən, sən qorxudansan!” Sonra əlini Əlinin (ə) sinəsinə qoyub “Hər tayfanın bir hidayət edəni vardır!” – deyə (buyurdu.”(۲

Yenə həmin kitabda bu ayənin təfsirində Abdullah ibn Əhməd, İbn Əbi Hatəm, . ۳ Təbərani, Hakim, İbn Mərdəveyh və İbn Əsakirin imam Əlidən (ə) belə nəql etdikləri (qeyd olunmuşdur: “Allahın Rəsulu (s) qorxudandır, mən isə hidayətçiyəm!”(۳

Başqa bir hədisdə İbn Abbas Peyğəmbəri-Əkrəm (s)-dən belə nəql edir: “Mən . ۴ qorxudanam, Əli isə hidayətçidir. Ya Əli! Hidayət tapanlar məhz sənin vasitənlə ”.hidayət olarlar

Bu hədis bir qrup məşhur sünnü hafizlərinin (hədis əzbərçilərinin), o cümlədən, Hakimin “Müstədrək”, Zəhəbinin “Təlxis”, Fəxri-Razinin “Kəbir”, İbn Kəsirin “Təfsir”, İbn Səbbağ Malikinin “Füsusul-muhimmə”, Gənci Şafeinin “Kifayətut-talib”, Əllamə Təbərinin “Təfsir”, İbn Həyyan Əndəlusinin “Bəhrul-muhit”, Nişapurinin “Təfsir”, (Həməvininin “Fəraidus-səmteyn” və s. təfsir kitablarında qeyd edilmişdir.(۴

Həbibus-seyr” kitabının müəllifi Mirqiyasəddin belə yazır: “Müxtəlif mənbələrə görə,“ .۵ “Həqiqətən, sən yalnız qorxudansan və hər tayfanın bir hidayət edəni vardır!” – ayəsi nazil olduqda, İslam Peyğəmbəri (s) Əliyə (ə) buyurdu: “Mən qorxudanam. Ya Əli, sən isə hidayət edənsən! Məndən sonra hidayət yolunu tapanlar məhz sənin vasitənlə (hidayət olarlar.”(۵

(Bu hədisi Həməvini Əbu Hüreyrədən, o da imam Əlidən (ə) nəql etmişdir.(۶ .۶



---

.Əd-durrul-mənsur”, (Cəlaləddin Süyuti, vəfatı: ۹۱۰ h.q), ۴-cü cild, səh. ۴۵“ . [۱]-۱

.Yenə orada . [۲]-۲

۳- [۳]. Yenə orada.

۴- [۴]. Bu hədisin mənbə və sənədləri ilə əlaqədar məlumat əldə etmək istəyənlər “Ehqaqul-həqq” kitabının ۳-cü cildinin ۹۲-۱۸۸-ci səhifələrinə müraciət edə bilərlər.

۵- [۵]. “Həbibus-seyr”, ۲-ci cild, səh. ۱۲.

۶- [۶]. “Ehqaqul-həqq”, ۳-cü cild, səh. ۹۲.

Bu hədis Hakimin “Müstədrək” kitabında Əbu Büreydə Əsləmidən geniş şəkildə belə .۷ :nəql olunmuşdur

دَعا رَسوُلُ اللهِ (ص) بالطَّهوُرِ وَعِنْدَهُ عَلِيُّ ابْنُ اَبی طالِبٍ فَاَخَذَ رَسوُلُ اللهِ (ص) بِيَدِ عَلِيٍّ بَعْدَ ما تَطَهَّرَ فَاَلْصَقَها بِصَدْرِهِ ثُمَّ قالَ: اِنَّما اَنْتَ مُنْذِرٌ، وَيَعْنى نَفْسَهُ، ثُمَّ رَدَّها اِلی صَدْرِ عَلِيٍّ، ثّمَّ قالَ: وَلِكُلِّ قَوْمٍ هادٍ، ثُمَّ قالَ لَهُ اَنْتَ مَنارُ الْاَنامِ وَغايَةُ الْهُدى وَاَميرُ الْقُرّاءِ اَشْهَدُ عَلى ذالِكَ اِنَّكَ كَذالِكَ:

Bir dəfə Allahın Rəsulu (s) dəstəmaz almaq üçün su istədi. Əli ibn Əbi Talib də onun“ yanında idi. Dəstəmaz aldıqdan sonra Əlinin əlindən tutub, öz sinəsinə qoyaraq buyurdu: “Qorxudan sənsən! (Həzrət özünü nəzərdə tuturdu.) Sonra öz əlini Əlinin sinəsinə qoyub buyurdu: “Hər tayfanın bir hidayət edəni vardır!” Sonra əlavə edərək buyurdu: “Sən camaatın işıqlı çırağı, hidayətə yönəldəni və Quran qarilərinin əmirisən. (Mən şəhadət verirəm ki, doğrudan da sən beləsən!”(۱

Peyğəmbəri-Əkrəm (s)-in bu hədisinin müxtəlif ifadələrlə bəyanı onun dəfələrlə təkrarlanmasını göstərir. Qeyd etdiyimiz hədislərdə nəzərə çarpan ifadə müxtəlifliyi .buna canlı şahiddir

Əhli-beyt məktəbinin ardıcıllarından da bu zəmində müxtəlif hədislər qeyd :olunmuşdur ki, biz burada yalnız birinə işarə etməklə kifayətlənirik

Nurus-səqəleyn” kitabında bu məsələ ilə əlaqədar beş yüzə yaxın hədis nəql“ olunmuşdur.(۲) O cümlədən, imam Baqir (ə) və imam Sadiqdən (ə) belə nəql olunur: “Hər bir (məsum) imam öz zamanının hidayətçisidir.” Başqa bir hədisdə belə buyurulur: (“Hər bir imam öz zamanında yaşayan qövmlərin hidayətçisidir.”(۳

Maraqlıdır ki, bəzi təfsirçilər bu hədislərin hamısını unudaraq, bəzi səhabələrin Peyğəmbəri-Əkrəm (s)-ə istinad edilmədən nəql etdikləri hədisləri dəlil gətirməklə başqa mənalar yürütmüşlər. O cümlədən, Mücahiddən belə nəql olunmuşdur: “Qorxudan”dan məqsəd Mühəmməd (s), “hər tayfanın bir hidayət edəni vardır” ibarəsindən məqsəd isə budur: “Hər qövmün bir peyğəmbəri vardır ki, onları Allaha .doğru dəvət edir!” Bu təfsir isə olduqca yaddır

(Səid ibn Cübeyrdən isə belə nəql olunmuşdur: “Mühəmməd (s

---

۱- [۱] . “Əl-mizan”, ۱۱-ci cild, səh. ۳۲۷, bəhs etdiyimiz ayənin təfsirində.

۲- [۲] . “Nurus-səqəleyn”, ۲-ci cild, səh. ۴۸۲-۴۸۵.

۳- [۳] . Yenə orada, səh. ۴۸۳, hədis: ۱۹-۲۰.

qorxudan, Allah isə hidayət edəndir.” Halbuki ayənin zahirinə görə, hər tayfanın öz .hidayət edəni vardır. Bir də ki, Allah-taala bütün tayfaların hidayətçisidir

Görəsən, şiələrə qarşı çıxmaq üçün Allahın Rəsulundan “mütəzafir”(١) şəkildə nəql ?olunan mötəbər rəvayətləri buraxıb, uyğunsuz təfsirlərə istinad etmək rəvadırmı

### SADİQİN” (DOĞRUÇULAR) AYƏSİ“

يَا أَيُّهَا الَّذِينَ آمَنُواْ اتَّقُواْ اللّهَ وَكُونُواْ مَعَ الصَّادِقِينَ

Bu ayədə möminlər təqvaya, Allahın əmrindən çıxmamağa çağırılır və göstəriş verilir .ki, (azğınlığa düşməsinlər deyə,) sadiqlər və doğru danışanlarla birgə olsunlar

Ayədə qeyd olunan “sadiqin” sözündən məqsəd kimlərin olduğu barədə müxtəlif :təfsirlər mövcuddur

Bəzilərinin ehtimalına görə, məqsəd Peyğəmbəri-Əkrəm (s)-dir və bu ayə də o həzrətin öz dövrünə aiddir. Halbuki aydın görünür ki, bu ayə Qurani-Kərimin digər xitabları kimi ümumi olub, hər bir dövr və hər bir məntəqədə yaşayan möminlərə .aiddir

Bəziləri isə belə demişlər: Ayədə qeyd olunan “məə” (birgə) bağlayıcısı “min” (dan, dən) mənasındadır, yəni siz sadiqlərdən və doğru danışlardan olun! Halbuki belə yozumlara heç bir zərurət yoxdur və ərəb ədəbiyyatında və ədiblərin kəlamlarında “məə” .bağlayıcısının “min” mənasında işlənməsi görünməmişdir

Ayənin zahiri mənasına əsasən, bütün müsəlmanlar hər bir dövr və əsrdə sadiqlərin sırasında və onlarla birgə olmağa əmr olunurlar. Buradan məlum olur ki, hər bir dövrdə sadiq, yaxud sadiqlər vardır ki, camaat təqva və pərhizkarlıq yolunu tutmaq .üçün mütləq onlarla birgə olmalıdırlar

Yaxşı olar ki, “sadiqin” sözünün mənasını və onların hansı xislətlərə malik olduğunu bilmək üçün Qurani-Kərimin özünə müraciət edək. Qurani-Kərimin “Hücurat” :surəsində buyurulur

إِنَّمَا الْمُؤْمِنُونَ الَّذِينَ آمَنُوا بِاللَّهِ وَرَسُولِهِ ثُمَّ لَمْ يَرْتَابُوا وَجَاهَدُوا بِأَمْوَالِهِمْ وَأَنفُسِهِمْ فِی سَبِيلِ اللَّهِ أُوْلَئِكَ هُمُ الصَّادِقُونَ

Möminlər yalnız Allaha və Peyğəmbərinə iman gətirən, sonra isə heç“

səh:۳۶

---

Müxtəlif sənədlərlə nəql olunan, lakin “təvatür” həddinə çatmayan rəvayətə . [۱] -۱ .deyilir

bir şəkk-şübhəyə düşməyən, Allah yolunda malları və canları ilə cihad edənlərdir. (Məhz beləlri sadiq olanlardır!”(١)

Bu ayədə “sidq” sözü bütünlüklə hər bir şəkk-şübhə və tərəddüddən uzaq olan “iman” .və “əməl”dən ibarətdir

Bəqərə” surəsinin ١١٧-ci ayəsində yaxşılıq və xeyirxahlığın həqiqəti Allaha, qiyamət“ gününə, mələklərə, səmavi kitablara və peyğəmbərlərə imandan, mal-dövləti Allah yolunda yoxsullar və kölələr üçün xərcləməkdən, habelə namaz qılmaq, zəkat vermək, əhdə vəfa etmək, çətinliklər və cihad zamanı dözümlü, səbirli olmaqdan ibarət olduğu açıqlandıqdan sonra buyurulur: “Beləlri sadiq olanlardır!” Beləliklə, sadiqlərin əsas nişanə və əlaməti bütün müqəddəs şeylərə kamil iman gətirmək, hər bir halda Allahın əmrinə tabe olmaq, xüsusilə namaz qılmaq, zəkat vermək, infaq etmək və çətinliklərdə səbir edib dözməkdir. Bu məna “Həşr” surəsinin ٨-ci ayəsində də gözə .dəyir

Bu ayələrin toplusu, eləcə də bəhs etdiyimiz ayənin ümumi məna daşımasından – sadiqlərlə birgə olmağın qeydsiz-şərtsiz gətirilməsindən – nəticə alırıq ki, müsəlmanlar iman və təqva, elm və əməl, səbir və dözüm baxımından ən yüksək dərəcəli kəslərlə birgə olmaqda məsuliyyət daşıyırlar. (Diqqət yetirmək lazımdır ki, ayədə “sadiqlər zümrəsindən olun!” – deyə buyurulmur, əksinə “onlarla birgə olun!” – deyilir. Bu da insanların nail ola biləcəyi ən yüksək mərhələni göstərir. (Məsumlar isə onlara nümunə (.və örnəkdirlər

Digər tərəfdən isə sadiqlərlə birgə olma əmrinin ümumi, mütləq və qeydsiz-şərtsiz olması onların (sadiqlərin) məsum olduqlarına başqa bir dəlildir. Çünki məsum .olmayanlara qeydsiz-şərtsiz tabe olma əmri düzgün deyildir

Diqqəti cəlb edən məsələ budur ki, Fəxri-Razi burada bir müqəddiməni qeyd etdikdən sonra ayənin məqsədini belə açıqlayır: “Səhv və xətaya yol verən kəsin məsum şəxsə itaət etməsi vacibdir. Allah-taala da “sadiqlər”i məsum hesab etmişdir. Buna əsasən, səhv və xətaya yol verən kəslərin məsumlarla birgə olması vacibdir və məsumlar onların

xəta və səhvlərinin qarşısını alırlar. Bu əmr hər bir zamana aid və danılmazdır. Deməli, ".hər dövrdə məsum bir insanın varlığı zəruridir

Sonra əlavə edərək yazır: "Biz hər dövrdə məsum və günahsız şəxsin olmasını qəbul edirik, lakin biz məsum dedikdə, bütün ümməti nəzərdə tuturuq. Halbuki siz (şiələr) (deyirsiniz ki, məsum, yalnız bir nəfər olmalıdır."(۱

Fəxri-Razi ayənin məzmununun çox aydın olmasına baxmayaraq, Əhli-beyt (ə) məktəbinin ardıcıllarının əqidəsini danmaqla bütün ümmətin məsum olmasından, yaxud "ümmətin icması"ndan söz açmışdır. Halbuki bütün ümmətin yekdil fikirdə olduqları məsələlər məhdud olduğu halda, sadiqlərlə birgə olma məsələsi ümumi bir vəzifəni göstərir. Hətta bu ayənin nazil olduğu zaman heç bir ərəbdilli şəxs "sadiqin" sözündən bütün ümməti düşünmürdü. Belə isə onu bu mənaya yozmaq mümkündürmü? Etiraf etməliyik ki, hər bir dövrdə sözlərində əsla xilaf olmayan, səhv və xətaya yol verməyən sadiq şəxsin vücudu zəruridir və insanlar da ona itaət .etməlidirlər

Sual: Burada belə bir şübhə qarşıya çıxır ki, "sadiqin" (sadiqlər) cəm formasında olduğundan, hər dövrdə məsumun yaşamasınımı göstərir? Bu isə Əhli-beyt (ə) ?məktəbinin ardıcıllarının əqidəsi ilə uyğun gəlmir. Bunun cavabını necə vermək olar

Cavab: Burada bir incəliyə diqqət yetirməklə şübhənin cavabı aydınlaşır. O da budur ki, cəm formasını bütün zamanlara aid etmək olar və burada "sadiqlər" başqa-başqa zamanlara təsadüf etməklə müəyyən bir qrupu təşkil edirlər. Bu, eynilə bu ifadəyə bənzəyir: "Hər dövrün camaatı ilahi peyğəmbərlərə tabe olmalıdır." Bunun mənası bir zamanda neçə peyğəmbərin yaşaması deyil, əksinə hər dövrün insanlarının öz zamanının peyğəmbərinə tabe olmasıdır və yaxud "insanlar öz vəzifələrini alim və mərcəi-təqlidlərdən öyrənməlidirlər" – ibarəsinin mənası hər kəsin öz zamanında .yaşayan alim və mərcəi-təqlidə itaət etməsidir

Bunun canlı şahidi Peyğəmbəri-Əkrəm (s)-in özüdür. Belə ki, onun dövründə o həzrətdən başqa itaəti vacib olan bir kəs yox idi və ayədəki

hökm qəti şəkildə o həzrətə də şamil olur. Buna əsasən, məlum olur ki, “sadiqlər” sözünün cəm forması təkcə bir zamana aid deyil, əksinə bütün zamanları əhatə edir. .Bu təhlil isə ayədən çox gözəl düşünülür

Rəvayətlər baxımından bir çox sünnü təfsirçi və mühəddisləri İbn Abbasdan nəql etmişlər ki, yuxarıda qeyd olunan ayə Əli ibn Əbi Talibə (ə) aiddir. O cümlədən, Əllamə :Sələbi öz təfsirində İbn Abbasın bu ayə barəsində belə dediyini nəql edir

مَعَ الصّا دِقِينَ يَعْنى مَعَ عَلِىِّ بْنِ اَبِيطالِبٍ وَ اَصْحابِهِ

Ayədə buyurulan) “Sadiqlərlə birgə olun!” – ifadəsindən məqsəd Əli ibn Əbi Talib və )“ (onun səhabələrilə birgə olmaqdır!”(١

Həmçinin Əllamə Gənci “Kifayətut-talib” və Əllamə Sibt ibn Cövzi “Təzkirə” kitabında bir qrup alimdən belə nəql etmişlər: “Alimlərin dediklərinə görə, bu ayənin mənası Əli (ə) və onun xanədanı ilə birgə olmaqdır.” İbn Abbas əlavə edərək deyir: “Əli (ə) (sadiqlərin rəhbəri və sərvəridir.”(٢

Əhli-beytdən (ə) bizə gəlib çatan müxtəlif rəvayətlərdə də bu məna eynilə qeyd olunmuşdur, o cümlədən, Cabir ibn Abdullah Ənsarinin imam Baqirdən (ə) nəql etdiyi bir rəvayətdə deyilir ki, o həzrət “Sadiqlərlə birgə olun!” – ayəsinin təfsirində belə (Məqsəd, Məhəmməd (s)-in övladlarıdır!”(٣” (اى آلُ مُحَمَّدٍ) :buyurdu

Başqa bir rəvayətdə Büreyd ibn Müaviyə həmin ayənin təfsiri ilə əlaqədar o həzrətdən (belə nəql edir: “Məqsəd bizik!”(۴

Burhan” təfsirində “Nəhcül-bəyan” kitabından belə nəql edilir: “Rəvayət olunmuşdur“ ki, Peyğəmbəri-Əkrəm (s)-dən “sadiqlər” barəsində sual olunduqda, “Onlar qiyamətə qədər Əli, Fatimə, Həsən, Hüseyn və onların məsum, günahsız övladlarıdır!” – (buyurmuşdur.(۵

Məlum olduğu üzrə, bütün bu rəvayətlər həqiqətdə (sadiqlərin) xaricdəki fərdlərini açıqlamışdır və ayənin ümumi məfhumu ilə heç

١- [١] . “Ehqaqul-həqq”, ٣-cü cild, səh. ٢٩٧.

٢- [٢] . Yenə orada.

٣- [٣] . “Nurus-səqəleyn”, ٢-ci cild, səh. ٢٨٠, hədis: ٣٩٢-٣٩٣.

٤- [٤] . Yenə orada.

٥- [٥] . “Burhan” təfsiri, ٢-ci cild, səh. ١٧٠.

bir ziddiyyət təşkil etmir. Çünki bura ilk növbədə Peyğəmbəri-Əkrəm (s)-in özü, sonra isə müxtəlif zamanlarda yaşayan məsum imamlar aiddir. Beləliklə, bu ayə həm .ümumi, həm də xüsusi imamət və vilayəti sübut etmək üçün aydın dəlildir

### ULİL–ƏMR” (ƏMR SAHİBLƏRİ) AYƏSİ“

Bu ayədə Allaha, Peyğəmbərə və əmr sahiblərinə tabe olmağın vacibliyindən söz :açılaraq buyurulur

يَا أَيُّهَا الَّذِينَ آمَنُواْ أَطِيعُواْ اللّهَ وَأَطِيعُواْ الرَّسُولَ وَأُوْلِي الأَمْرِ مِنكُمْ

”!Ey iman gətirənlər! Allaha, Peyğəmbərə və sizlərdən olan əmr sahiblərinə tabe olun“

Allah və Peyğəmbər (s)-ə tabe olmağın vacibliyi məlum məsələdir. Amma tabe olmağın vacibliyində Allah və Peyğəmbər (s)-lə bərabər sayılan “ulil-əmr”dən (əmr sahiblərindən) məqsədin kim olduğu barədə təfsirçilər arasında fikir ayrılığı .mövcuddur

Şiə və Əhli-beyt (ə) məktəbinin bütün alim və təfsirçilərinin yekdil nəzərinə əsasən, “əmr sahibləri”ndən məqsəd, İslam ümmətinin maddi və mənəvi rəhbərləri olan məsum imamlardır. Çünki ayədəki Allah və Peyğəmbər (s)-in itaəti ilə eyni səviyyədə qeydsiz-şərtsiz sayılan itaəti yalnız məsum imamlar haqda təsəvvür etmək olar. Lakin itaəti vacib olan digər kəslər həmişə müəyyən qeyd və şərtlə məhdudlaşır və onlar .haqqında mütləq itaət əsla mövcud deyildir. Bu isə gün kimi aydın bir məsələdir

Halbuki sünnü alim və təfsirçiləri arasında “əmr sahibləri”nin mənası barəsində çoxlu ixtilaf və fikir ayrılığı gözə dəyir. Bəziləri onu “səhabə”, bəziləri “ordu sərkərdələri”, bəziləri də “dörd xəlifə”yə (raşidin xəlifələrinə) aid etmiş və bu üç təfsir üçün tutarlı bir .dəlil əsla gətirməmişlər

Başqa bir qrup isə “əmr sahibləri”ni alimlərə yozmuş və bu barədə “Nisa” surəsinin ٨٣-:cü ayəsinə istinad etmişlər

وَإِذَا جَاءهُمْ أَمْرٌ مِّنَ الأَمْنِ أَوِ الْخَوْفِ أَذَاعُواْ بِهِ وَلَوْ رَدُّوهُ إِلَى الرَّسُولِ وَإِلَى أُوْلِي الأَمْرِ مِنْهُمْ لَعَلِمَهُ الَّذِينَ يَسْتَنبِطُونَهُ مِنْهُمْ

Onlara qələbə və ya məğlubiyyət xəbəri çatdıqda, dərhal (araşdırmadan) onu“

yayarlar. Halbuki əgər bunu Peyğəmbərə və ya özlərindən olan əmr sahiblərinə demiş olsaydılar, əlbəttə, həmin xəbəri onun mahiyyətinə varan

".şəxslər bilərdilər

Sözügedən ayədə itaətin qeydsiz-şərtsiz gətirilməsi və "Nisa" surəsinin ٨٣-cü ayəsinin hər hansı bir xəbərin araşdırılması barəsində nazil olduğuna diqqət yetirməklə iki fərqli məsələ qarşıya çıxır və onların hər ikisini bir mənaya yozmaq olmaz. Bir şeyi araşdırmaq qeydsiz-şərtsiz itaətlə tam fərqlənir. İkincinin yalnız məsumlar barəsində .təsəvvürü düz olduğu halda, birinci məsələ isə daha geniş mənaya malikdir

Bəzi sünnü təfsirçiləri beşinci bir ehtimalı da vermişlər ki, o da bundan ibarətdir: "Əmr sahibləri"ndən məqsəd xalq nümayəndələri, hakimlər, rəislər, alimlər və müxtəlif vəzifə sahibləridir. Başqa sözlə desək, "sadiqlər"dən məqsəd ixtilafları aradan qaldıran və camaatın işlərini tənzim edənlərdir və hər zaman onlar müəyyən bir məsələ üzrə yekdil fikrə gəlsələr, onlara qeydsiz-şərtsiz itaət vacibdir, (bu şərtlə ki, ayədə "minkum" ifadəsinə əsasən, onlar bizdən olsun, Peyğəmbər (s)-in sünnəsinə qarşı çıxmasın, başqaları tərəfindən məcbur edilməsin, hamısı bir fikirdə olsun və həll olunan məsələ də ümumi məsələlərdən olsun.) Bu zaman onlara tabe olmaq müqəddəs şəriət tərəfindən dəlil gəlməyənə qədər vacibdir. Demək olar ki, onların hamısı bu zaman məsum və günahsızdırlar. Buna görə də onlara qeydsiz-şərtsiz itaət (əmr olunmuşdur.(١)

Bütün bu təfsirlərə əsasən, "əmr sahibləri" beş şərtə malik olan alim, hakim və vəzifə sahiblərinə aid edilmişdir: ١) müsəlman olsun; ٢) Peyğəmbər (s) sünnəsinə qarşı çıxmasın; ٣) rəyində məcbur olmasın; ۴) şəriətdə onların nəzərinə qarşı bir hökm olmasın; ۵) yekdil qənaətə gəlsinlər. Onlar bu şərtlərə malik olan şuranı məsum və .günahsız hesab edirlər

Doğrudan da görəsən, ayədə qeyd olunan "əmr sahibləri"ndən məqsəd budurmu? Görəsən, müsəlmanlar və Peyğəmbər (s)-in səhabələri bu ayəni eşitdikdə, yuxarıdakı mənanımı başa düşürdülər, yoxsa bu məna çoxlu zəhmətdən sonra ayəyə yüklənmiş və zorla qəbul etdirilmişdir ki, şiələrin qəti inandıqları məsum imamlara təfsir !?olunmasın

Zahirən, “Əl-mənar” kitabının müəllifi bu ehtimalı Fəxri-Razidən götürmüşdür. Belə ki, Fəxri-Razi yazır: “Bizim nəzərimizcə, bu ayə (sizlərdən olan əmr sahibləri) ümmətin (yekdil fikrinin) höccət olmasına dəlalət edir! Çünki Allah-taala əmr sahiblərinə itaət etməyi qəti və qeydsiz-şərtsiz əmr etdiyindən, onlar günahsız və xətadan uzaqdırlar. Əgər belə olmasaydı, xətaya yol verə biləcəkləri təqdirdə, mütləq itaət əmrində şübhə yaranardı. Belə isə xəta etdikləri zaman harama düşdükləri üçün bir işdə həm əmr, həm də nəhy qarşıya çıxır ki, bu da qeyri-mümkündür. Deməli, məlum olur ki, əmr sahiblərinə itaət mütləq şəkildə qeyd edildiyi üçün onların məsum və günahsız ”.olduğunu göstərir

Sonra əlavə edərək belə yazır: “Bu məsumlar ya ümmətin hamısı, ya da onların bir qismidir. İkinci ehtimal düzgün deyildir, çünki biz mütləq o qismi tanımalı və onlardan faydalanmalıyıq. Halbuki hər bir zamanda məsum imamı tanımaqda acizik. Buna əsasən, qeydsiz-şərtsiz itaəti vacib olan məsum şəxs bir fərd, yaxud müəyyən bir qrup (deyildir. Deməli, labüd məqsəd bütün ümmətdir.”(۱

Fəxri-Razi, “Əl-mənar” kitabının müəllifi kimi şəxslərin birbaşa bu ayəni Peyğəmbər (s)-in heç bir səhabəsinin qəbul etmədiyi belə təfsirə vadar etməsinin səbəbi onun məfhumunun Əhli-beyt məsumlarına aid edilməsilə əlaqədardır. Ayəyə görə, əmr sahiblərinin məsum və günahsız olması aydın ikən, müəyyən bir şəxsi məsum imam kimi qəbul etmək istəmirlər. Beləliklə, Peyğəmbər (s)-in səhabələrinin bu ayədən başa .düşmədikləri təfsirlərə əl atırlar

Bütün bu təfsirlərdən daha qəribəsi isə budur ki, bəzi sünnü təfsirçilərinin əqidəsinə görə, “əmr sahibləri”ndən məqsəd padşahlar, hakimlər və əmirlərdir. Müsəlmanlara hökmranlıq edən hər bir hakimə – istər ədalətli olsun, istərsə də zülmkar, istər doğru yolda olsun, istərsə də azğın, istər Allaha itaətə dəvət etsin, istərsə də Ona qarşı çıxsın, – itaət etmək vacibdir. Necə ki, “Əl-mənar” kitabının müəllifi üstüörtülü şəkildə belə yazır: “Bəziləri bu ayəyə görə, bütün hakimlərə itaət etməyi qeyd edir və onların ”.itaətini vacib bilirlər

Bundan da qəbahətlisi yuxarıdakı təfsirin sübutu üçün Peyğəmbəri-Əkrəm (s)-ə aid edilən şübhəli və saxta rəvayətlərdir. Guya, bu rəvayətlərin birində Yezid Cofi Peyğəmbəri-Əkrəm (s)-dən "Ya Peyğəmbər! Əgər haqqımızı əlimizdən alan, onu bizə qaytarmayan (zalım) hakimlər bizə rəhbərlik etsə, onda nə edək?..." – deyə soruşduqda, o həzrət buyurmuşdur: "Onların əmrinə qulaq asın və itaət edin!"(1)

Həmin kitabda qeyd olunan başqa bir rəvayətdə Əbuzərin belə dediyi nəql olunur:

اِنَّ خَلِيلِى اَوصانِى اَنْ اَسْمَعَ وَاَطِيعَ وَاِنْ كانَ عَبْداً مُجَدَّعُ الاَطْرافِ

"Mənim dostum (Peyğəmbər) mənə (hakim və əmirlərə) əl-ayaq kəsən olsa da belə, tabe olmağı tövsiyə etdi."(2) (Bəziləri hədisdə göstərilən "mücəddəul-ətraf" ifadəsini "əl-ayaq kəsən şəxs" deyil, "alçaq və çirkin ailədə dünyaya gələn şəxs" mənasına təfsir etmişlər.)

Şübhəsiz, əziz İslam Peyğəmbərinin (s) əql və şəriətlə uyğun gəlməyən belə bir göstəriş verməsi qeyri-mümkündür. Halbuki o həzrətdən belə bir hədis nəql olunmuşdur:

لا طاعَه لِمَخْلوُقٍ فِى مَعْصِيَهِ الْخالِقِ

"Xaliqə qarşı günah və məsiyət edən məxluqa itaət etmək caiz deyildir!"

Əbuzərin adından Peyğəmbər (s)-ə nisbət verilən saxta hədislərə ən tutarlı dəlil Əbuzərin öz həyat tərzidir. Belə ki, o, həyatında həmişə zülmkar, azğın hakim və əmirlərlə mübarizə aparmış, elə bu yolda da ömrünü başa vurmuşdur. Halbuki Peyğəmbər (s)-in məqamı lap üstündür. Heç bir ağıllı insan xilafkar və zülmkar hakimə itaətin vacibliyini dilinə belə gətirməz. Xüsusilə, bu hədis həm şiə, həm də sünnü alimləri arasında məşhurdur: "Xaliqə qarşı günah və məsiyət edən məxluqa itaət etmək caiz deyildir!"(3)

Beləliklə, bu ayəni hər hansı mənaya yozmağa bir bəhanə yeri yoxdur.

Burada daha iki irad qalır:

۱- [۱] . “Səhihi-Müslüm”, ۳-cü cild, “əmarə” kitabı, “vücubu taətil-umərə...” bölümü, səh. ۴۷۴.

۲- [۲] . Yenə orada, “vücubu taətil-umərə...” bölümü.

۳- [۳] . “Nəhcül-bəlağə”, “qısa kəlamlar”: ۱۶۵.

Əgər “əmr sahibləri”nin məfhumu məsum imamlara şamildirsə, bu isə cəm . ١ formasında işlənən “uli” (sahiblər) sözü ilə uyğun gəlmir. Çünki şiənin əqidəsinə .əsasən, məsum imam eyni zamanda bir nəfərdən çox ola bilməz

Cavab: Bu irada ötən bəhslərdə cavab verildi. Belə ki, eyni zamanda məsum imamın bir nəfərdən artıq olmaması doğrudur, lakin ayənin bütün zamanlara ümumi aid edilməsi ilə əlaqədar məsum imamlar bir qrupu təşkil edirlər. Ərəb dilində buna bənzər ifadələr çoxdur. Məsələn, “Əssəlamu əleykum və əla ərvahikum və əcsadikum” (Sizə, sizin ruh və cismlərinizə salam olsun!) – deyilərkən, kimsə bu salama irad tutub, “insan bir ruh və bir cisimdən ibarət olduğu halda, nə üçün ruh və cisim cəm formasında .işlənmişdir?” – demir. Çünki buradakı cəm forması onların məcmusuna işarədir

Deməli, Peyğəmbəri-Əkrəm (s)-in hər dövrdə bir məsum canişini olmasına baxmayaraq, bütün zamanları nəzərə almaqla (onların sayı çox olduğundan) ayədə .“əmr sahibləri” cəm formasında işlədilmişdir

Peyğəmbəri-Əkrəm (s)-in dövründə məsum imam olmadığından, ona itaət əmri . ٢ ?necə mümkündür

Cavab: Əgər bu ayə yalnız Peyğəmbəri-Əkrəm (s)-in öz dövrünə aid olsaydı, belə bir irad mümkün idi. Lakin onun bütün müsəlmanlar üçün qiyamət gününə qədər ümumi bir göstəriş olduğuna diqqət yetirməklə, bu şübhə aradan qalxır. Peyğəmbəri-Əkrəm (s)-in dövründə əmr sahibi o həzrətin özü, sonrakı dövrlərdə isə məsum imamlardır. Bu eynilə bu ifadəyə bənzəyir: “Peyğəmbər və onun canişinlərinə itaət etmək müsəlmanların vəzifəsidir!” Bu isə canişinlərin mütləq o həzrətin dövründə olduğunu .göstərmir

Qeydlərimizi şiə və sünnülərin kitablarında bu ayənin təfsirində Əli (ə) və digər məsum .imamlara aid gələn bir neçə hədisə qısa şəkildə işarə etməklə sona yetiririk

Şeyx Süleyman Qunduzi Hənəfi “Yənabiul-məvəddət” kitabında Mücahidin təfsir kitabından belə nəql edir: “Allaha, Peyğəmbərə və sizlərdən olan əmr sahiblərinə itaət edin!” – ayəsi Əli (ə) barəsində nazil olmuşdur. Bu ayə nazil olarkən Peyğəmbəri-Əkrəm (s) onu

(“Təbuk” müharibəsində) Mədinədə öz canişini təyin etmişdi.

Həmçinin imam Əlidən (ə) belə nəql edir ki, o həzrət mühacir və ənsar(1) qrupları ilə söhbət zamanı bu ayəni onlara dəlil gətirdikdə, onlar Əliyə (ə) heç bir etiraz etməyib susdular.(2)

“Şəvahidut-tənzil” kitabında Hakim Həskaninin “əmr sahibləri”nin təfsiri ilə əlaqədar imam Əlidən (ə) belə bir hədis nəql etdiyi gözə dəyir:

يا نَبِيَّ اللهِ مَنْ هُمْ؟ قالَ اَنْتَ اَوَّلُهُمْ

Mən Peyğəmbəri-Əkrəm (s)-dən “Ya Peyğəmbər! Onlar kimlərdir?” – deyə soruşduqda, o həzrət buyurdu: “Sən onların birincisisən!”(3)

Bu ayənin məsum imamlara aid olması ilə əlaqədar Əhli-beytdən (ə) çoxlu rəvayət nəql olunmuş, onların hamısında “əmr sahibləri”nin məsum imamlardan ibarət olduğu açıqlanmışdır.(4)



---

1- [1] . İslam Peyğəmbərinin (s) Mədinə şəhərinin yerli sakinlərindən olan səhabələri “ənsar” (yardımçılar) və Məkkə şəhərindən gələn səhabələrə isə “mühacirlər” (hicrət və köç edənlər) adlandırılmışlar. (Müt.)

2- [2] . “Yənabiul-məvəddət”, səh. 114-116.

3- [3] . “Şəvahidut-tənzil”, 1-ci cild, səh. 148, “Beyrut” çapı.

4- [4] . Əlavə məlumat əldə etmək istəyənlər “Burhan” təfsirinin 1-ci cildinin 381-387 və “Kənzüd-dəqaiq” kitabının 3-cü cildinin 437-452-ci səhifələrinə müraciət edə bilərlər.

## II .RƏVAYƏTLƏRDƏ ÜMUMİ İMAMƏT VƏ VİLAYƏT

### İşarə

Bu mövzu Peyğəmbəri-Əkrəm (s)-in sünnə və rəvayətlərinin böyük bir qismini təşkil edir. Bu zəmində o həzrətdən ən məşhur və mötəbər mənbələrdə çoxlu rəvayət vardır ki, onları qərəzsiz və diqqətlə araşdıraraq, uzun illər boyu bu məsələyə qaranlıq gətirən pərdələri insaf və ixlasla götürəcək, heç bir təəssübkeşliyə yol vermədən onun həqiqi simasını üzə çıxaracaq və İslamın bu mühüm əmri qarşısında öz ilahi vəzifəmizi .yerinə yetirəcəyik

Hər şeydən əvvəl burada ümumi şəkildə imamət və vilayət məsələsi ilə əlaqədar məşhur hədislərin bir qisminin məfhum və möhtəvasının qısa şərhini məqsədəuyğun görürük. Oxuculardan xahiş edirik, verilən hədislərə, onların sənəd və mənbələrinə, .sonra isə möhtəvasına diqqət yetirsinlər ki, nəticəni onların özünə həvalə edəcəyik

Bizim əqidəmizə görə, bu qədər aydın hədislərə ötəri yanaşmaq və onların üzərindən sadəcə keçmək olmaz; həqiqətləri ört-basdır etməklə məsuliyyətimizi artırmaqdan .başqa bir şey qazanmırıq

### SƏQƏLEYN" HƏDİSİ"–١

### İşarə

Bu söz (səqəleyn) Peyğəmbəri-Əkrəm (s)-in buyruğunda gəldiyi üçün “səqəleyn” :hədisi adlanmışdır. Belə ki, Həzrət buyurmuşdur

اِنّی تارِکٌ فیکُمُ الثِّقْلَیْنِ...

(Mən sizi tərk edərək aranızda iki ağır əmanət qoyuram...”(١)“

səh:۴۷

---

Səqəleyn” sözünü iki cür oxumaq olar: ١-”Səqəleyn”, onun tək forması" !“ . [١] -١ “səqəl”dir, qiymətli və dəyərli, eləcə də müsafirin əmtəəsi mənasını daşıyır. ٢-” Siqleyn”, onun tək forması “siql”dir, bu da ağır şey mənasını verir. “Ət-təhqiq” kitabının

müəllifinin əqidəsinə əsasən, birinci məna mənəvi baxımdan qiymətli şeyə deyilir, ikincisi isə ümumi məna kəsb edir. Yeri gəlmişkən, diqqət yetirmək lazımdır ki, "səqəl" sözü "sifəti-müşəbbəhə", "siql" sözü isə məsdər formasında olan isimdir.

Bu hədis şiə və sünnülərin mötəbər kitablarında Peyğəmbəri-Əkrəm (s)-dən geniş şəkildə nəql olunmuşdur. Belə ki, onun o həzrətdən nəql olunmasında heç bir şəkk-şübhə yoxdur. Hədislərin məcmusundan açıq-aşkar başa düşülür ki, Peyğəmbər (s) bu hədisi bir dəfə bəyan etməmiş, əksinə onu müxtəlif yerlərdə dəfələrlə buyurmuşdur .və rəvayətlər də tamamilə bir-birindən fərqlənir

:Burada hədisin ravilərinə və onu nəql edən mötəbər kitablara işarə edirik

Əhli-sünnənin birinci dərəcəli və ən məşhur mənbə kitabı sayılan, eləcə də altı səhih .١ :kitabdan biri olan “Səhihi-Müslüm”də Zeyd ibn Ərqəmdən belə nəql edilir

قامَ رَسوُل اللهِ (ص) يَوْماً فِينا خَطِيباً بِماءٍ يُدْعى خُمّاً، بَيْنَ مَكَّه وَالْمَدينَه، فَحَمَدَاللهَ وَاَثْنى عَلَيْهِ، وَوَعَظَ وَذَكَرَ، ثُمَّ قال: اَمّا بَعْدُ اَلا اَيُّها النّاسُ فَاِنَّما اَنا بَشَرٌ يُوشَكُ اَنْ يَأتِيَ رَسُولُ رَبِّى فَاُجِيبُ، وَاِنِّى تارِكٌ فِيكُمْ ثِقْلَيْنِ: اَوَّلُهُما كِتابُ اللهِ، فِيهِ الهُدى وَالنُّورُ، فَخُذُوابِكِتابِ اللهِ وَاسْتَمْسِكُوا بِهِ، فَحِثَّ عَلى كِتابِ اللهِ وَرَغَّبَ فِيهِ، ثُمَّ قالَ وَاَهْلِبَيْتى، اُذَكِّرُكُمُ اللهَ فِى اَهْلِبَيْتى، اُذَكِّرُكُمُ اللهَ فِى اَهْلِبَيْتى، اُذَكِّرُكُمُ اللهَ فِى اَهْلِبَيْتى...

Bir gün Allahın Rəsulu (s) bizimlə birgə olarkən, Məkkə ilə Mədinə arasında yerləşən“ rütubətli “Xum” (Qədir-Xum)(١) adlı bir məntəqədə ayağa qalxıb, Allaha həmd-səna edəndən, moizə edib öyüd-nəsihət verəndən sonra buyurdu: “Ey camaat! Mən də insanam, Allahın elçisinin gəlişi və onun dəvətini qəbul etməyimin vaxtı yaxınlaşmışdır. Mən sizin aranızda iki ağır və qiymətli şeyi əmanət qoyuram: Birincisi hidayət və nurla dolu olan Allahın kitabıdır, ondan bərk yapışın.” Peyğəmbər (s) Quranla bağlı çoxlu tapşırıq verəndən sonra buyurdu: “(İkincisi) Əhli-beytimdir. Sizə tövsiyə edirəm ki, Allaha xatir Əhli-beytimi unutmayın! Sizə tövsiyə edirəm ki, Əhli-beytimi unutmayın. ”!Sizə tövsiyə edirəm ki, Əhli-beytimi unutmayın

Peyğəmbəri-Əkrəm (s)-in Əhli-beyti (ə) iki ağır və qiymətli əmanətdən biri kimi Qurani-Kərimlə yanaşı bəyan etməsi və onlara qarşı ilahi məsuliyyətin unudulmaması ilə əlaqədar bunu üç dəfə təkrarlaması göstərir ki, bu iş müsəlmanların müqəddəratı, hidayəti



---

Su yığılıb qalan bir torpağın yerləşdiyi məntəqəyə deyilir. (“Fərhəngi-muin.” . [١] -١

və İslamın əsasları ilə sıx bağlıdır. Bu isə onların Qurani-Kərimlə yanaşı qeyd .edilməsindən başa düşülür

Yenə həmin kitabda Zeyd ibn Ərqəmdən azacıq fərqlə başqa bir rəvayət də nəql .٢ .olunmuşdur

Diqqəti cəlb edən məsələ budur ki, bu hədisin davamında Zeyd ibn Ərqəmdən "Peyğəmbər (s)-in Əhli-beytindən məqsəd onun zövcələridirmi?" – deyə soruşulduqda, o "Xeyr, məqsəd, onun nəsəbi qohumlarıdır ki, sədəqə onlara .haramdır!" – deyə cavab vermişdir

Məşhur "Sünəni-Termizi" ("Səhihi-Termizi" adı ilə də məşhurdur) kitabının "Əhli- .٣ beytin fəzilətləri" bölümündə Cabir ibn Abdullahdan belə nəql olunur: "Həcc zamanı – "Ərəfə" günü Allahın Rəsulunu (s) gördüm ki, öz dəvəsinə minib xütbə deyirdi. Bu :zaman onun belə buyurduğunu eşitdim

يا اَيُّها النّاسُ اِنّى قَدْ تَرَكْتُ فِيكُمْ ما اَخَذتُمْ بِهِ كِتابَ اللهِ وَ عِترَتِى، اَهْلَبَيْتِى:

Ey camaat! Mən sizin aranızda iki şeyi əmanət qoyuram, əgər onlardan yapışsanız" (onlara sarılsanız), heç vaxt zəlalətə düşməzsiniz. (O iki əmanət) Allahın kitabı və Əhli-(beytimdir!"(١)

Termizi əlavə edərək yazır: "Bunu Əbuzər, Əbu Səid Xudri, Zeyd ibn Ərqəm və .Hüzeyfə də nəql etmişlər

Yenə həmin kitabda Əbu Səid və Zeyd ibn Ərqəmdən belə nəql olunur: "Allahın .۴ :Rəsulu (s) belə buyurmuşdur

اِنّى تارِكٌ فِيكُمْ ما اِنْ تَمَسَّكْتُمْ بِهِ لَنْ تَضِلُّوا بَعْدِى: اَحَدُهُما اَعْظَمُ مِنَ الْآخَرِ، كِتابُ اللهِ حَبْلٌ مَمْدُودٌ مِنَ السَّماءِ اِلَى الْاَرْضِ، وَعِتْرَتِى اَهْلُبَيْتِى، وَلَنْ يَفْتَرِقا حَتّى يَرِدا عَلَىَّ الْحَوْضَ، فَانْظُرُوا كَيْفَ تُخْلِفُونِى فِيهِما:

Mən sizin aranızda iki şeyi əmanət qoyuram ki, əgər onlardan yapışsanız, heç vaxt" zəlalətə düşməzsiniz: Biri səmadan yer üzünə uzanmış ip olan Allahın kitabı, digəri isə itrətim(٢) olan Əhli-beytimdir! Onlar

.Səhihi-Termizi", ٥-ci cild, səh. ٦٦٢, "Əhli-beytin fəzilətləri" bölümü, hədis: ٣٧٨٦" . [١] -١

İnsanın "itrəti" dedikdə, onun övladı, nəvə-nəticəsi və nəslindən olan ən yaxın . [٢] -٢ ailə üzvləri nəzərdə tutulur. Bu söz əslində ceyranın göbəyindəki qandan yaranmış ətirli " ! müşkün böyük bir qisminə deyilir. Əhli-beytin və məsum imamların "itrət" adlanması onların "Bəni-Haşim" qəbiləsindən və cənab Əbu Talibin bütün övladları içərisində ətirli müşk parçalarının böyük və qiymətli hissəsinə bənzədilməsidir. Allahın tam və kamil vilayəti də ətirli müşkün yerləşdiyi ceyran göbəyinə bənzəyir. Müşk parçaları damarcıqlar vasitəsilə bir-birlərinə birləşdikləri kimi, bütövlükdə həmin damarcıqlarla ceyran göbəyinə birləşərək böyüyüb inkişaf edir. Məsum imamlar da vilayət ipləri vasitəsilə həm bir-birilə, həm Peyğəmbəri-Əkrəm (s)-lə, həm də Allah-taalanın kamal vilayəti ilə əlaqə yaradırlar. Elə bu bağlılıq və əlaqənin səbəbinə də inkişaf və təkamül tapıb ən yüksək məqamlara çatırlar. ("Ədəb finayi-müqərrəban", (.Cavadi Amoli, ١-ci cild, səh. ٣٢٣.) (Müt

Kövsər”(1) hovuzunda mənə qovuşana qədər, heç vaxt bir-birindən ayrılmazlar. Belə“
(isə baxın görün, məndən sonra onlarla necə rəftar edəcəksiniz!”(2

Məşhur kitablardan biri olan “Sünəni-Darəmi”də Peyğəmbəri-Əkrəm (s)-dən Zeyd .5
ibn Ərqəmin rəvayətinə oxşar bir hədis nəql olunmuş və orada açıq-aşkar “səqəleyn”,
(“Allahın kitabı” və “Əhli-beyt” ifadələri işlənərək, mətləb sona çatdırılmışdır.(3

Unutmayaq ki, Darəmi bəzi alimlərin dediyinə əsasən, Müslümün, Əbu Davudun və Termizinin müəllimi olmuşdur. “Sünəni-Darəmi” sünnülərin məşhur və mötəbər olan altı kitabından biridir. (Hərçənd, bəziləri onun yerinə “Sünəni-İbn Macəni” qeyd
(.etmişlər

Əhli-sünnənin dörd imamından biri olan Əhmədin “Müsnəd” kitabında Zeyd ibn .6
:Sabitdən nəql olunan bir hədisdə belə deyilir: “Allahın Rəsulu buyurmuşdur

اِنّی تـارِکٌ فِیکُمْ خَلیفَتَیْنِ: کِتابُ اللهِ حَبْلٌ مَمْـدُودٌ ما بَیْنَ السَّماءِ وَالاَرْضِ اَوْ ما بَیْنَ السَّماءِ اِلَی الْاَرْضِ، وَعِتْرَتِی اَهْلُبَیْتِی وَاِنّهُما لَنْ یَفْتَرِقا حَتّی یَرِدا عَلَیَّ الْحَوْضَ:

Mən sizin aranızda iki xəlifəni (canişini) yadigar olaraq qoyuram; yerlə göy arasında“
uzanmış ip olan Allahın kitabı və itrətim olan Əhli-beytim. Bu iki (yadigar) (Kövsər)
(hovuzunda mənə qovuşana qədər, heç vaxt bir-birindən ayrılmazlar.”(4

Diqqət yetirmək lazımdır ki, bu rəvayətlərin bəzisində (“Səhihi-Müslüm” kitabında qeyd olunduğu kimi,) “səqəleyn” (iki ağır və qiymətli şey), bəzisində (“Sünəni-Əhməd”də nəql olunduğu kimi, qeyd etdiyimiz sonuncu rəvayətdə) “xəlifəteyn” (iki canişin) ifadələri işlənmişdir, bəzisində isə onların heç biri qeyd olunmasa da, həmin mənanı çatdırır.
.Həqiqətdə bu hədislərin hamısı eyni mənanı daşıyır

səh:50

---

Behiştdə bulaq adıdır, lüğətdə firavan, bol, böyük nemət və xeyir-bərəkət . [1] -1
mənalarını daşıyır. Quran surələrindən birinin adı “Kövsər”dir. Təfsirçilər bu surənin Peyğəmbəri-Əkrəm (s)-in pak övladları – həzrət Fatimeyi-Zəhra (ə.s) və məsum imamlar barəsində nazil olduğunu qeyd etmişlər. (“Nəsri-tuba”, 2-ci cild, səh. 330.)

(.(Müt

.Yenə orada, səh. ۶۶۳, hədis: ۳۷۸۸ . [۲] -۲

.Sünəni-Darəmi", ۲-ci cild, səh. ۴۳۲, Beyrutun "Darul-fikr" çapı" . [۳] -۳

.Müsnədi-Əhməd", ۵-ci cild, səh. ۱۸۲, Beyrutun "Darus-sadir" çapı" . [۴] -۴

۷. Əhli-sünnənin böyük alimlərindən, sünnülərin altı səhih və mötəbər kitablarından (sayılan "Sünən" adlı kitabın müəllifi) Əhməd ibn Şüeyb Nisai "Xəsais" kitabında Zeyd ibn Ərqəmdən belə nəql edir: "Peyğəmbər (s) "Həccətül-vida"dan (vida həccindən) qayıdarkən, "Qədir-Xum" adlı məntəqəyə daxil olduqda, kölgəlik üçün bir yer hazırlanmasını göstəriş verdi. Bundan sonra buyurdu:

كَاَنّى دُعِيتُ فَاَجَبْتُ وَاِنّى تارِكٌ فِيكُمُ الثِّقْلَيْنِ اَحدُهُما اَكْبَرُ مِنَ الآخَرِ، كِتابَ اللهِ وَعِتْرَتِى فَانْظُرُوا كَيْفَ تُخْلِفُونِى فِيهِما، فَاِنَّهُما لَنْ يَفْتَرِقا حَتّى يَرِدا عَلَىَّ الْحَوْضَ، ثُمَّ قالَ: اِنَّ اللهَ مَوْلاىَ وَاَنَا مَولى كُلِّ مُؤمِنٍ، ثُمَّ اَخَذَ بِيَدِ عَلِيٍّ عَلَيْهِ السَّلامُ، فَقالَ: مَنْ كُنْتُ مَوْلاهُ فَهذا وَلِيُّهُ، اَللّهُمَّ والِ مِنْ وَالاهُ وَعادِ مَنْ عاداهُ:

"Mən (Allah tərəfindən) dəvət olunmuş və bu dəvəti qəbul etmişəm (tezliklə sizin aranızdan gedəcək və dünyamı dəyişəcəyəm). (Buna görə də) sizin aranızda iki qiymətli şeyi əmanət qoyuram. Biri digərindən daha böyük olan Allahın kitabı, o birisi isə itrətim olan Əhli-beytimdir. Belə isə baxın görün, məndən sonra onlarla necə rəftar edəcəksiniz. Onlar (Kövsər) hovuzunda mənə qovuşana qədər, heç vaxt bir-birindən ayrılmazlar." Sonra buyurdu: "Allah mənim mövlamdır, mən isə hər bir möminin mövlasıyam!" Sonra Əlinin əlindən tutub buyurdu: "Mən hər kəsin mövlası və rəhbəriyəmsə, bu da onun mövlası və rəhbəridir. İlahi! Hər kəs onu sevirsə, Sən də onu sev; hər kəs ona düşməndirsə, Sən də onunla düşmən ol!"

Hədisin sonunda qeyd olunduğu kimi, ikinci ravi Əbu Tüfeyl deyir: Mən, Zeyd ibn Ərqəmdən "Sən özün bu hədisi Allahın Rəsulundanmı (s) eşitmisən?" – deyə soruşduqda, o dedi: "Kölgəliyin altında olan hər bir kəs bu səhnəni gözlərilə görüb, qulaqları ilə Həzrətin sözlərini eşitdi!"(۱)

Bu hədis açıq-aşkar göstərir ki, Peyğəmbəri-Əkrəm (s) onu "Qədir-Xum"da müsəlmanların qarşısında söyləmiş və hamı da bunu qulaqları ilə eşitmişdir.

۸. Hicri qəməri tarixi ilə ۴-cü əsrin böyük sünnü alimlərindən olan Hakim Nişapurinin "Müstədrəküs-səhiheyn" adlı məşhur kitabında "Səhihi-Buxari" və "Səhihi-Müslüm" kitablarında olmayan bir çox hədislər qeydə alınmışdır. O cümlədən, "səqəleyn" hədisi İbn Vasilədən belə nəql edilir: "Mən Zeyd ibn Ərqəmdən eşitdim ki,

Peyğəmbəri-Əkrəm (s) Məkkə ilə Mədinə arasındakı bir ağaclığa çatdıqda, dayandı. Camaat oturmaq üçün ağacların altını səliqəyə saldılar. Sonra Peyğəmbər (s) əsr namazından sonra xütbə söyləyərək, Allaha həmd-səna dedi və öyüd-nəsihət verdikdən sonra buyurdu:

اَيُهَا النّاسُ اِنّی تارِكٌ فِيكُمْ اَمْرَيْنِ لَنْ تَضِلُّوا اِنِ اتَّبَعْتُمُوهُما: وَهُما كِتابُ اللهِ وَ اَهْلُبَيْتِی عِتْرَتِی:

"Ey camaat! Mən sizin aranızda iki şeyi əmanət qoyuram. Əgər onlara itaət etsəniz, heç vaxt azğınlığa düşməzsiniz. Onlar Allahın kitabı və itrətim olan Əhli-beytimdir."(١)

Sonra Hakim əlavə edərək yazır: "Bu hədis Buxari və Müslümün şərtinə əsasən, səhih və düzgündür.(٢)

٩. Şiələrin qatı müxaliflərindən və Hicazın müftisi olan İbn Həcər Heysəmi "Əs-səvaiqul-muhriqə" kitabında yazır ki, səhih bir rəvayətə əsasən, Peyğəmbər (s) buyurmuşdur:

قَدْ دُعِيتُ فَاَجَبْتُ، اِنّی قَدْ تَرَكْتُ فِيكُمُ الثَّقَلَيْنِ اَحَدُهُما آكَدُ مِنَ الْآخَرِ: كِتابَ اللهِ عَزَّوَجَلَّ وَعِتْرَتِی اَهْلُبَيْتِی، فَانْظُرُوا كَيْفَ تُخْلِفُونِی فِيهِما فَاِنَّهُما لَنْ يَفْتَرِقا حَتّی يَرِدا عَلَیَّ الْحَوْضَ:

"Mən Allah tərəfindən dəvət olunmuşam və bu ilahi dəvəti qəbul edəcəyəm. (Buna görə də) sizin aranızda iki ağır və qiymətli şeyi əmanət qoyuram: Allahın kitabı və itrətim olan Əhli-beytimi! Belə isə baxın görün, məndən sonra onların haqqını necə ödəyəcəksiniz. Bu iki əmanət (Kövsər) hovuzunda mənə qovuşana qədər, heç vaxt bir-birindən ayrılmayacaqlar!"

Sonra əlavə edərək yazır: Başqa bir rəvayətdə bu hissə də qeyd olunmuşdur: "Mən bu məqamı onlar üçün Allah-taaladan istəmişəm. Belə isə onlardan qabağa keçməyin, yoxsa həlak olarsınız; geridə də qalmayın ki, (yenə) həlak olarsınız! Onlara bir şey öyrətməyin, çünki onlar sizdən elmli və biliklidirlər!"

Sonra yazır ki, bu hədisin iyirmidən artıq ravisi vardır və onu

.Müstədrəküs-səhiheyn”, ٣-cü cild, səh. ١٠٩“ . [١] -١

Buxari və Müslümün şərtindən məqsəd budur ki, onlar yalnız sənədi İslam . [٢] -٢ Peyğəmbərinə (s) çatan hədisləri nəql edirdilər. Onların nəzərində belə hədislərin raviləri etimadlı şəxslər olmuşlar. Onlar bu şərtə əsaslanan bütün hədisləri nəql etmədiklərindən, Hakim Nişapuri onları “Müstədrəküs-səhiheyn” kitabında toplamışdır. Buna görə də bu kitabı “Səhihi-Buxari” və “Səhihi-Müslüm” kitabları ilə .eyni səviyyədə hesab etmək olar

izah etməyə ehtiyac yoxdur.(۱)

Vilayət və imamət məsələsində şiələrə qarşı qatı əks olan şəxsin “səqəleyn” hədisini belə aşkar etirafla qeyd etməsi doğrudan da diqqəti özünə cəlb edir!

۱۰. “Usdul-ğabə” kitabının müəllifi İbn Əsir (Məhəmməd ibn Məhəmməd ibn Əbdülkərim), Abdullah ibn Hintəbin tərcümeyi-halında onun belə dediyini nəql etmişdir: “Allahın Rəsulu (s) (Məkkə ilə Mədinə arasında yerləşən) Cöhfə məntəqəsində bizə bir xütbəsində buyurdu: “Mən sizə özünüzdən daha artıq ixtiyar sahibi deyiləmmi?” Camaat dedi: “Bəli, ey Allahın Rəsulu (s)!” Həzrət buyurdu: “Mən (qiyamətdə) sizdən iki şeyi soruşacağam: “Quran və Əhli-beytimi!”(۲)

۱۱. Cəlaləddin Əbdür-Rəhman Süyuti(۳) “Ehyaul-məyyit” kitabında İbn Əsirin “Usdul-ğabə”də yazdığı mətləbləri qeyd etmişdir.(۴)

۱۲. Zəməxşəri, Beyhəqinin (Əbu Bəkr Əhməd ibn Hüseyn) barəsində yazır: “Şafei məzhəbinin rəhbəri və imamının onun məzhəbinə əqidə bəsləyən bütün şəxslərin boynunda haqqı varsa, Beyhəqinin isə yazdığı kitablarına görə, həm Şafeinin, həm də bu məzhəbdə olanların boynunda haqqı vardır.”(۵)

Beyhəqi bu hədisi “Əs-sünənül-kubra” adlı mühüm kitabında (“Səhihi-Müslüm”də nəql olunan hədisin oxşarını, xüsusilə, “Əhli-beyt” sözünü üç dəfə təkrar etdiyi halda) nəql etmişdir.(۶)

۱۳. Hafiz Təbərani əhli-sünnənin məşhur mühəddislərindən olub, ۳-cü və ۴-cü əsrlərdə yaşamış və bəzilərinin dediyinə görə, hədis elmində mindən artıq ustadı olmuşdur. O da “Əl-möcəmül-kəbir” adlı məşhur kitabında bir hədisdə Peyğəmbəri-Əkrəm (s)-dən nəql edir ki, o həzrət camaatı “səqəleyn”ə itaətə dəvət edərkən, bir nəfər ayağa qalxıb, “Ey Allahın Rəsulu! “Səqəleyn nədir?” – deyə



---

۱- [۱]. “Əs-səvaiqul-muhriqə”, səh. ۲۲۶, Misirin “Əbdüllətif” çapı.

۲- [۲]. “Usdul-ğabə fi mərifətis-səhabə”, ۳-cü cild, səh. ۴۷.

[۳] O, bir çox dəyərli kitablar yazmış və beş yüzdən çox kitab yazdığı nəql olunmuşdur. (“Əl-kuna vəl-əlqab”, ۱-ci cild, səh. ۲۰۷).

[۴] “Ehyaul-məyyit” (“Əl-ithaf”ın haşiyəsində), səh. ۱۱۶.

[۵] “Əl-kuna vəl-əlqab”, ۲-ci cild, səh. ۱۱۴.

[۶] “Sünəni-Beyhəqi”, ۱۰-cu cild, səh. ۱۱۴.

:soruşduqda, Həzrət buyurdu

اَلاَكْبَرُ كِتابُ اللهِ، سَبَبٌ طَرَفُهُ بِيَدِاللهِ، وَطَرَفُهُ بِاَيْدِيكُمْ، فَتَمَسَّكُوا بِهِ لَنْ تَزالُوا وَلا تَضِلُّوا، وَالاَصْغَرُ عِتْرَتِى وَاَنَّهُما لَنْ يَفْتَرِقا حَتّى يَرِدا عَلَيَّ الْحَوْضَ:

Böyük və ağır əmanət Allahın kitabıdır ki, bir tərəfi Allahın əlində (qüdrətində), digər“ tərəfi isə sizin əlinizdədir. Əgər ondan yapışsanız, birliyiniz itməz, azğınlığa düşməzsiniz. Kiçik əmanət isə itrətimdir. Onlar (Kövsər) hovuzunda mənə qovuşana ”.qədər, heç vaxt bir-birindən ayrılmazlar

Sonra əlavə edərək buyurdu: “Mən bu iki əmanəti Allahdan istəmişəm. Onlardan qabağa keçməyin ki, həlak olarsınız; onlara bir şey öyrətməyin; çünki onlar sizdən (elmli və biliklidirlər.”(١

Hazırda vəhhabiliyin banisi kimi tanıtdırılan İbn Teymiyyə (Əhməd ibn Əbdülhəlim .١۴ Hənbəli, ölümü: ٧٢٧ h.q) “Minhacus-sünnə” kitabında bu hədisi “Səhihi-Müslüm”də qeyd (olunduğu kimi nəql etmişdir.(٢

Sünnülərin digər məşhur və tanınmış alimləri də “səqəleyn” hədisini öz əsərlərində :gətirmişlər. O cümlədən

Hicri-qəməri tarixi ilə ۵-ci əsrin alimlərindən olan İbn Məğazili (Əli ibn Məhəmməd .١۵ (Fəqih Şafei) bu hədisi geniş şəkildə Zeyd ibn Ərqəmdən nəql etmişdir.(٣

cı (h.q) əsrin məşhur alim, mühəddis, xətib və şairlərindən olan Xarəzmi də onu-۶ .١۶ (“Mənaqib” kitabında qeyd etmişdir.(۴

ci əsrin alimlərindən və məzhəbcə təəssübkeşliyi ilə məşhur olan Zəhəbi-٧-٨ . ١٧ (Məhəmməd ibn Əhməd ibn Osman Dəməşqi Şafei) də bu hədisi “Təlxisul-müstədrək” kitabında qeyd etmişdir.(۵) Tacəddin Səbki “Təbəqatuş-şafei” kitabında Zəhəbi barəsində belə yazır: “O, öz zamanının dahi və görkəmli mühəddisi, böyük hafiz (hədis əzbərçisi), əhli-sünnə məzhəbinin bayaraqdarı, əsrinin rəhbər

Əl-möcəmül-kəbir”, səh. ۱۳۷, (“Ehqaqul-həqq” kitabından nəqlən, ۹-cu cild, səh.“ . [۱] -۱
(.۳۲۲

.Minhacus-sünnə”, ۴-cü cild, səh. ۱۰۴, Qahirə çapı“ . [۲] -۲

.(Ehqaqul-həqq”, ۴-cü cild, səh. ۴۳۸ (dəstixətt nüsxədən nəqlən“ . [۳] -۳

.Mənaqib”, səh. ۹۳“ . [۴] -۴

Təlxisul-müstədrək” (Hakimin “Müstədrək” kitabının haşiyəsində), ۳-cü cild, səh.“ . [۵] -۵
.۱۰۹, “Heydərabad” çapı

".və qabaqcılı idi

۱۸ . ۱۱--ci əsrin alimi və məşhur tarixçisi Əli ibn Burhan Hələbi Şafei özünün "Sireyi-Hələbi" adı ilə tanınan "İnsanul-üyun" kitabında "səqəleyn" hədisi və "Qədir-Xum" hadisəsini açıq-aşkar nəql etdikdən sonra belə yazır: "Bu hədis səhih və düzgündür, (səhih(۱) və "həsən"(۲) sənədlərilə nəql olunmuşdur."(۳

۱۹ . -İbn Həyyan Maliki "Əl-muqtəbəsu fi əhvalil-Əndəlus" kitabında bu hədisi "Səhihi-Müslüm"də olduğu kimi qeyd etmişdir; bu fərqlə ki, Məkkə ilə Mədinə arasındakı (məkanın adını "qalalar" mənasını ifadə edən "Həsain" adlandırmışdır.(۴

۲۰. ۸-ci (h.q) əsrin alimlərindən olan, Xazin adı ilə tanınmış Əlauddin Əli ibn Məhəmməd-Bağdadi bu hədisi "Təfsir" kitabında "Səhihi-Müslüm" və "Səhihi-Termizi"də qeyd (olunduğu kimi nəql etmişdir.(۵

۲۱ . ۷--ci əsrin məşhur alimi İbn Əbil-Hədid Mötəzili (İzzəddin Əbdülhəmid) "Nəhcül-bəlağə"nin şərhində "səqəleyn" hədisini nəql etdikdən sonra yazır: "Peyğəmbər (s) öz :itrətini tanıtdıraraq belə buyurmuşdur

قَدْ بَيَّنَ رَسُولُ اللهِ (ص) عِتْرَتَهُ مَنْ هِىَ؟ لَمّا قالَ: اِنّى تارِكٌ فِيكُمُ الثِّقْلَيْنِ، فَقالَ عِتْرَتى اَهْلُبَيْتِى:

Mən sizin aranızda iki böyük və ağır əmanət qoyuram." Sonra buyurmuşdur: "İtrətim,"
".yəni Əhli-beytim

O yazır: "Peyğəmbər (s) başqa bir yerdə öz Əhli-beytini əbasının altına yığaraq tanıtdırmış və "Təthir" ayəsi nazil olduqda, demişdir: "İlahi, bunlar mənim Əhli-(beytimdir, çirkinliyi onlardan uzaq et!"(۶

۲۲ . ۱۳-cü əsrin alimlərindən və Məkkənin müftisi olan Zeyni Dehlan Şafei (Seyid-Əhməd) "Sireyi-Hələbi"nin haşiyəsində çap olunan "Sireyi-Nəbəvi" kitabında bu hədisi "Səhihi-Müslüm"də



---

۱- [۱] . Sənədi məsumlara çatan, raviləri ədalətli və on iki imamçı olan hədisə "səhih

.hədis” deyilir

.Raviləri şiə olmasa da belə, ədalətli olan hədisə “həsən hədis” deyilir . [۲] -۲

.Sireyi-Hələbi”, ۳-cü cild, səh. ۲۷۴, Qahirə çapı“ . [۳] -۳

.Əl-muqtəbəsu fi əhvalil-Əndəlus” səh. ۱۶۷, Paris çapı“ . [۴] -۴

.Xazin” təfsiri, ۱-ci cild, səh. ۴, Qahirə çapı“ . [۵] -۵

Nəhcül-bəlağə”nin şərhi, ۲-ci cild, səh. ۴۳۷, Qahirə çapı, ۶-cı cild, səh. ۳۷۵,“ . [۶] -۶
.Beyrutun “Hələbi” çapı, xütbə: ۸۶

olduğu kimi yazmış, eləcə də “Müsnədi-Hənbəl”də Əbu Səid Xudrinin hədisini eynilə (nəql etmişdir.(1)

Xülasə və nəticə: Qeyd etdiyimiz şəxslər “səqəleyn” hədisini öz əsərlərində nəql edən əhli-sünnənin məşhur və tanınmış alimləridir. Əlbəttə, bunu da unutmaq olmaz ki, burada adı çəkilənlər alimlərin az bir qismini təşkil edir. Mərhum Mirhamid Hüseyn Hindi “Əbəqatul-ənvar” kitabının xülasəsində “səqəleyn” hədisini yüz iyirmi altı mənbədən ibarət məşhur kitablarda nəql olunduğunu yazmış, habelə ibarələrilə (yanaşı, hər bir kitabın cildi və səhifəsini də göstərmişdir.(2)

Qeyd etmək lazımdır ki, bu hədis yalnız Cabir ibn Abdullah Ənsari, Əbu Səid Xudri və Zeyd ibn Ərqəmdən deyil, demək olar, Peyğəmbər (s)-in iyirmi üç səhabəsindən :vasitəsiz nəql olunmuşdur ki, onların adları aşağıdakılardan ibarətdir

Zeyd ibn Ərqəm; ٢-Əbu Səid Xudri; ٣-Cabir ibn Abdullah Ənsari; ٤-Hüzeyfə ibn-١ Üseyd; ٥-Xüzeymə ibn Sabit; ٦-Zeyd ibn Sabit; ٧-Səhl ibn Səd; ٨-Zəmurətul-Əsləmi; ٩-Amir ibn Leyli; ١٠-Əbdür-Rəhman ibn Ovf; ١١-Abdullah ibn Abbas; ١٢-Abdullah ibn Ömər; ١٣-Ədiyy ibn Hatəm; ١٤-Əqəbə ibn Amir; ١٥-Əli ibn Əbi Talib (ə); ١٦-Əbuzər Qifari; ١٧-Əbu Rafe; ١٨-Əbu Şüreyh Qazi; ١٩-Əbu Qüdamə Ənsari; ٢٠-Əbu Hüreyrə; .٢١-Əbu Heysəm ibn Teyhan; ٢٢-Ümmü Sələmə; ٢٣-Ümmü Hani

### SƏQƏLEYN” HƏDİSİ PEYĞƏMBƏRİ-ƏKRƏM (S)-İN DİLİNDƏ TƏKRARLANIR“

Diqqət yetirmək lazımdır ki, Peyğəmbəri-Əkrəm (s) bu hədisi yalnız bir dəfə deyil (buna Peyğəmbər (s)-in yalnız bir dəfə buyurduğu “Qədir-Xum” hədisini misal göstərmək olar ki, onu müsəlmanlar o həzrətin dilindən eşitmiş və nəql etmişlər), həm də müxtəlif .zaman və münasibətlərdə bəyan etmişdir

-(Əhli-sünnə mənbələrinə görə, bu hədisin Peyğəmbəri-Əkrəm (s



---

Sireyi-nəbəviyyə”, ٢-ci cild, səh. ٣٠٠ – “Sireyi-Hələbi”nin haşiyəsində, səh. ٣٣,“ . [١] -١ .Misir çapı

.Əbəqatul-ənvar”ın xülasəsi, ٢-ci cild, səh. ١٠٥-٢٤٢, “Müəssəsətul-bəsə” çapı“ . [٢] -٢

:dən nəql olunduğu məntəqələr aşağadakılardan ibarətdir

Qədir-Xum”: Peyğəmbəri-Əkrəm (s) sonuncu həcc mərasimindən qayıdarkən“ .١ .“Qədir-Xum”da geniş söhbətdən sonra “səqəleyn” hədisini buyurmuşdur

Ərəfat”: Peyğəmbəri-Əkrəm (s) həcdə olarkən “Ərəfə” günü dəvəsinin belində bir“ .٢ xütbə söylədikdən sonra bu hədisi demişdir. Ötən səhifələrdə qeyd etdiyimiz kimi, “Səhihi-Termizi”də Cabir ibn Abdullah Ənsaridən nəql olunan hədis (٢-ci hədis) Ərəfə .gününə aid idi

Cöhfə”: Peyğəmbəri-Əkrəm (s) həccin “miqat”larından sayılan, Məkkə ilə Mədinə“ .٣ arasında yerləşən “Cöhfə” adlı məntəqədə “səqəleyn” hədisini buyurmuşdur. Bunu İbn .Əsir “Usdul-ğabə” kitabında Abdullah ibn Hintəbin tərcümeyi-halında nəql etmişdir

Peyğəmbəri-Əkrəm (s) vəfatına səbəb olan xəstəliyi zamanı sonuncu vəsiyyətində .۴ belə buyurmuşdur: “Ey camaat! Mən tezliklə sizin aranızdan gedəcəyəm və artıq sizə mənim höccətim tamamlandı. Agah olun! Mən sizin aranızda böyük Allahın kitabını və itrətim olan Əhli-beytimi yadigar qoyuram.” Sonra Əlinin (ə) əlindən tutub qaldıraraq buyurdu: “Bu Əli Quranla, Quran da Əli ilədir. Onlar (Kövsər) hovuzunda mənə qovuşana qədər, heç vaxt bir-birindən ayrılmazlar. Bu iki əmanətdə yadigar (qoyduqlarımdan soruşun!”(١

.Bu hədisdə düşünənlər üçün bir sıra zərif-incəliklər vardır

Həccətül-vida” (“Vida həcci”): Peyğəmbəri-Əkrəm (s) “Vida həcci”ndə “Xif”“ .۵ məscidində belə buyurmuşdur: “Agah olun! Mən sizdən iki ağır əmanət haqda soruşacağam.” O həzrətdən “Ey Allahın Rəsulu! İki ağır əmanət nədir?” – deyə soruşulduqda, buyurdu: “Böyük, ağır əmanət Qurani-Kərimdir. Onun bir tərəfi Allahın əlində (ixtiyarında), digəri isə sizin əlinizdədir. Belə isə ondan yapışın ki, heç vaxt azğınlığa düşməz və həlak olmazsınız. Kiçik ağır əmanət isə mənim itrətim və Əhli-beytimdir. Hər şeyi bilən Allah mənə xəbər vermişdir ki, bu iki əmanət eynilə bir-birinə yapışan mənim bu iki üzüyüm kimi, “Kövsər” hovuzunda mənə qovuşana qədər, heç vaxt

(bir-birindən ayrılmayacaqlar.”(۱)

Peyğəmbəri-Əkrəm (s) (Məkkənin fəthindən sonra) Taifdən qayıdan zaman bu .۶ hədisi buyuraraq mühüm bir məsələni açıqlamışdır.

Peyğəmbəri-Əkrəm (s)-in “səqəleyn” hədisini müxtəlif yerlərdə – Mədinədə, həcc mərasimində, “Ərəfə” günündə, “Xif” məscidində (“Mina”da), Məkkə ilə Mədinə arasında və digər məntəqələrdə müsəlmanların zəlalətə düşməmələri üçün təkidlə təkrarlaması o iki əmanətin yüksək əhəmiyyət daşıdığına aydın bir sübutdur. Doğrudan da bu qədər təkid və təkrardan sonra Peyğəmbər (s)-in yadigar qoyduğu Quran və Əhli-beytdən uzaqlaşmağımız, yaxud yanlış yozumlara əl atmağımız aşkar zəlalət və azğınlıq deyildirmi?! Peyğəmbər (s)-in iyirmidən artıq səhabəsindən iki yüzə yaxın məşhur və birinci dərəcəli İslam mənbəyində nəql olunan, sənədində heç bir şəkk-şübhə, dəlalətində heç bir qeyri-müəyyənlik olmayan belə hədisin üzərindən asanlıqla keçmək olarmı?! Şübhəsiz, belə bir inadkarlıq məsuliyyət daşıyır.

İslam Peyğəmbərini (s) Allahın rəsulu, peyğəmbərlərin sonuncusu, ilahi vəhyin əmanətdarı kimi tanıyan şəxs bilməlidir ki, o həzrətin Quran və Əhli-beyt (ə) adlı iki böyük və ağır əmanətə sarılmağın vacibliyi, eləcə də onlardan uzaqlaşanların azğınlığa düşdüklərini təkidlə vurğulamasında mühüm bir sirr, İslamın əsası ilə bağlı danılmaz bir həqiqət vardır.

### “SƏQƏLEYN” HƏDİSİNDƏN BAŞA DÜŞÜLƏN MÜHÜM İNCƏLİKLƏR

Bu hədis müsəlmanların qarşısına neçə mühüm üfüq açır ki, burada onların bir neçəsinə qısa şəkildə toxunacağıq:

۱. Quran və Əhli-beyt (ə) həmişə birgədir və heç vaxt bir-birindən ayrılmayacaqlar. Quranın həqiqətlərilə tanış olmaq istəyənlər Əhli-beytdən (ə) yapışmalıdırlar.



---

۱- [۱] . “Təfsiri-Əli ibn İbrahim”, “Biharul-ənvar”, ۲۳-cü cild, səh. ۱۲۹, hədis: ۶۱, “Təfsiri-Əli ibn İbrahim”dən nəqlən.

Qurani-Kərimin hökmlərinə itaət etmək müsəlmanlara qeydsiz-şərtsiz vacib olduğu .۲ kimi, Əhli-beytə (ə) itaət də qeydsiz-şərtsiz vacibdir.

Əhli-beyt (ə) məsum və günahsızdırlar; çünki onların Qurandan ayrılmaması, həm .۳ də onlara qeydsiz-şərtsiz itaətin vacibliyi onların məsum olduğunu, günah, xəta və səhvə yol vermədiyini göstərir. Əgər onların bir günah, yaxud xətası olsa, Qurandan ayrılar, onlara itaət müsəlmanları azğınlıqdan saxlamaz. Hədisdə qeyd olunduğu kimi, Əhli-beytə (ə) itaətlə günahlardan uzaqlaşmaq, onların günahsız olduğuna başqa bir dəlildir.

Daha mühüm məsələ budur ki, Peyğəmbəri-Əkrəm (s)-in buyruğu qiyamətə qədər .۴ bütün müsəlmanlar üçün nəzərdə tutulmuşdur: "Bu iki əmanət "Kövsər" hovuzunda mənə qovuşana qədər, heç vaxt bir-birindən ayrılmayacaqlar." Bu isə açıq-aşkar göstərir ki, tarix boyu Əhli-beytdən (ə) bir nəfər məsum və günahsız rəhbər həmişə həyatda olacaqdır. Qurani-Kərim həmişə hidayət çırağı olduğu kimi, onlar da həmişə hidayət çıraqlarıdır. Buna görə də hər əsrin ilahi imam və rəhbərini tanımaq lazımdır.

Bu hədisdən başa düşülür ki, Əhli-beytdən (ə) ayrılmaq, yaxud qabağa keçmək .۵ azğınlıqla nəticələnir. Heç vaxt bir istəyi onların istəyindən üstün tutmaq olmaz.

Onlar hamıdan üstün və fəzilətli, elmli və biliklidirlər .۶

Bəli, bu incə həqiqətələr verilən hədisdən başa düşülür. Diqqəti cəlb edən məsələ budur ki, hicri qəməri tarixi ilə ۹-۱۰-cu əsrin alimi və "Vəfaul-vəfa" kitabının müəllifi Səmhudi Şafei "Cəvahirul-əqdeyn" kitabında "səqəleyn" hədisi barəsində yazır: "Bu hədis göstərir ki, qiyamətə qədər hər bir dövrdə Əhli-beytdən bir nəfər vardır ki, ona itaət edilməlidir. Necə ki, Qurani-Kərimdə bu belədir."(۱)

### YALNIZ BİR SUAL

Araşdırdığımız mövzu ilə əlaqədar yalnız bir sual qalır ki, bəzi rəvayətlərdə – sayca az da olsa – "və itrəti Əhli-beyti" (itrətim olan

Əhli-beytim) ifadəsinin yerinə "və sünnəti" (mənim sünnəm) qeyd olunmuş və bu, "Sünəni-Beyhəqi" kitabında iki yerdə qələmə alınmışdır. Bir yerdə İbn Abbas Peyğəmbəri-Əkrəm (s)-dən nəql edir ki, o həzrət sonuncu həcc mərasimindəki xütbəsində buyurdu: "Sizin aranızda iki ağır əmanət qoyuram ki, əgər onlardan yapışsanız, heç vaxt azğınlığa düşməzsiniz: "Kitabəllah və sünnətə nəbiyyihi", yəni "Allahın kitabı və Peyğəmbərinin sünnəsi!"(۱) Başqa bir yerdə isə eynilə bu məzmunda (bir hədis Əbu Hüreyrədən nəql edilmişdir.(۲

Məlum olduğu kimi, Əhli-beytin (ə) açıq-aşkar bəyanlarını, hətta bəzi hədislərdə bu sözün üç dəfə təkrar və təkid olunduğu, bəzi hədislərdə isə imam Əlinin (ə) adının çəkildiyi, eləcə də Peyğəmbəri-Əkrəm (s)-in o həzrəti öz Əhli-beyti kimi tanıtdırdığı o qədər hədisləri kənara qoyub, təkcə belə nadir rəvayətə istinad etmək qətiyyən düzgün deyildir. Görünür ki, dövrün hakim dairələri öz mənafelərini qorumaq üçün bu hədisdə bir sıra dəyişikliklərə əl atsalar da, onu tamamilə təhrif edə bilməmişlər. Bir də bu iki hədis ("sünnəti" sözünün düzgünlüyünü fərz etsək belə,) bir-birilə heç bir ziddiyyət təşkil etmir: Peyğəmbəri-Əkrəm (s) bir yerdə "kitab" və "sünnə"yə, digər bir yerdə isə "kitab" və "Əhli-beyt"ə (ə) işarə etmişdir. Çünki öncə qeyd etdiyimiz kimi, o həzrət bu hədisi (əhli-sünnənin məşhur mənbələrindəki çoxlu rəvayətə əsasən,) müxtəlif məntəqələrdə – "Vida həcci"ndə, "Xif" məscidində, "Ərəfə"də, "Cöhfə"də, "Qədir-Xum"da, Taifdən qayıdanda, Mədinədə mənbərdə və vəfatına səbəb olan xəstəliyi zamanı bəyan etmişdir. Beləliklə, Həzrətin bir yerdə "Əhli-beyt", digər bir .yerdə isə "sünnəti" – deyə buyurmasında heç bir ziddiyyət yoxdur

Əsas etibarilə heç kim Peyğəmbər (s)-in sünnəsinin mühüm bir yadigar və əmanət olduğunu inkar etmir. Mümkündür, müsəlman bir şəxs Qurani-Kərimin "ma atakumur-Rəsul fə-xuzuhu və ma nəhakum ənhu fəntəhu" (Peyğəmbərin sizə gətirdiklərinə əməl edin, qadağan etdiklərindən isə çəkinin!) – ayəsilə təsdiq olunan



---

.Sünəni-Beyhəqi", ۱۰-cu cild, səh. ۱۱۴" . [۱]-۱

.Sünəni-Beyhəqi", ۱۰-cu cild, səh. ۱۱۴" . [۲]-۲

Peyğəmbəri-Əkrəm (s)-in sünnəsinə əməl etməsin, lakin bu məna Əhli-beytə (ə) tabe olmağa və onlardan yapışmağa təkid edən hədislərlə heç bir ziddiyyət təşkil etmir. Başqa sözlə desək, iki rəvayətdən birinə o zaman üstünlük verilir ki, onlar bir-birilə ziddiyyət təşkil etsin. Halbuki geniş mənanı ifadə edən bu iki rəvayət arasında heç bir ziddiyyət yoxdur. Ümumiyyətlə, Əhli-beytə (ə) tabe olmağın özü Peyğəmbər (s)-in sünnəsinə tapınmağın bariz nümunələrindən biridir. Hər kim Əhli-beytə (ə) itaət etsə, sünnəyə əməl etmiş, hər kim itaət etməyib, onlardan üz çevirərək öz nəzərini Peyğəmbər (s)-in əmrindən üstün tutsa, sünnəni tərk etmiş və Allahın Rəsuluna (s) .itaətdən boyun qaçırmışdır

Doğrusu, bu bəhanələrlə "səqəleyn" hədisinin biz müsəlmanların öhdəsinə qoyduğu mühüm məsuliyyətdən boyun qaçıra bilmərik. Şübhəsiz, bu hədislər "təvatür"(١) .həddində olub, sənəd və dəlalətində də heç bir irad yoxdur

:Qeydlərimizi Şafeinin (şafei məzhəbinin banisi) bu barədəki mədhilə sona çatdırırıq

,Və ləmma rəəytun-nasə qəd zəhəbət bihim

.Məzahibuhum fi əbhuril-ğəyyi vəl-cəhli

,Rəkibtu əla ismillahi fi sufunin-nəcati

.Və-hum alu-bəytil-Mustəfa xatəmir-rəsuli

,Və əmsəktu həbləllahi və huvə vilauhum

...Kəma qəd umirna bit-təməssuki fil-həbli

Camaat məzhəb və təriqətlərilə azğınlıq və nadanlıq dəryasında batdıqlarını" gördükdə, mən Allahın adı ilə "nicat gəmisi"nə sığındım. O gəmi sonuncu Peyğəmbərin Əhli-beytidir. İlahinin (uzatdığı) vilayət ipindən yapışmışam. Necə ki, Allahın ipindən (Qurani-Kərimdən) yapışmağa əmr olunmuşuq. Nə yaxşı olar ki, hamı hər



---

Üç və ya daha artıq ravilər silsiləsi vasitəsilə nəql olunub, yəqin hasil edilən hədis .[١]-١

qisminə “mütəvatir” və “təvatür həddinə çatmış” hədis deyilir. Bu növ hədislər, silsilə və təbəqəsinin müxtəlifliyi, ravilərinin çoxluğu və bir-birilə əlaqələrinin olmaması üzündən (.həm şiə, həm də sünnülərin hədis alimləri tərəfindən tam surətdə qəbul olunur. (Müt

(işdə onlara sığınıb, haqqı onlarda arayaydılar!"(١)

Ötən rəvayətlərin çoxunda "Kövsər" hovuzunun adının çəkilməsindən belə məlum olur ki, bu hovuz behişt qapılarının arxasında və behiştin girişində yerləşir. Möminlər, əməlisalehlər və pərhizkarlar Peyğəmbəri-Əkrəm (s) və Əhli-beytlə (ə) orada .görüşəcəklər

## SƏFİNƏ (GƏMİ) HƏDİSİ-٢

### İşarə

Əhli-beyt (ə) və məsum imamlar barəsində buyurulan, həm şiə, həm də sünnülərin mötəbər kitablarında geniş nəql olunan məşhur hədislərdən biri də "səfinə" hədisidir. .Biz burada bu hədisin mətni, sənədi və mənbələrini qısa şəkildə bəyan edəcəyik

Deməliyik ki, bu hədisi Peyğəmbəri-Əkrəm (s)-in ən azı səkkiz səhabəsi nəql etmişdir. (Əbuzər, Əbu Səid Xudri, İbn Abbas, Ənəs, Abdullah ibn Zübeyr, Amir ibn Vasilə, ((Sələmə ibn Əkvə və imam Əli (ə

Səfinə" hədisi əhli-sünnənin onlarla məşhur kitabında nəql olunmuşdur ki, bəzilərinin" adlarını çəkməyimizi məsləhət bilirik. Əlavə məlumat əldə etmək istəyənlər isə "Ehqaqul-həqq" kitabının ٩-cu, "Xülasətul-əbəqat" kitabının ۴-cü cildinə və digər .kitablara müraciət edə bilərlər

Bir dəfə Əbuzər əli ilə Kəbə evinin qapısının halqasından tutub deyirmiş: "Məni .١ tanıyanlar (mənim kim olduğumu yaxşı) bilir, tanımayanlar da bilsinlər ki, mən Əbuzər :Qifariyəm! Allahın Rəsulundan (s) eşitmişəm ki, belə buyurmuşdur

مَثَلُ اَهْلِبَيْتِى فِيكُمْ كَمَثَلِ سَفِينَهِ نُوحٍ فِى قَوْمِ نُوحٍ مَنْ رَكِبَها نَجى وَمَنْ تَخَلَّفَ عَنْها هَلَكَ:

Mənim Əhli-beytimin məsəli sizin aranızda Nuhun gəmisinin məsəlinə bənzəyir; hər" kəs ona minsə, nicat tapar, hər kəs ondan ayrı düşsə, həlak olar." (Başqa bir rəvayətdə (isə "qərq olar!" – ifadəsi qeyd olunmuşdur.)(٢)

.Zəxirətül-məal”, “Xülasətul-əbəqat” kitabından nəqlən, ٢-ci cild, səh. ٢٧٧“ . [١] -١

Səfinə” hədisi bu kitablarda nəql olunmuşdur: “Möcəmül-kəbir vəl-möcəmüs-“ . [٢] -٢ səğir”, Hafiz Təbərani, səh. ٧٨, Dehli çapı; “Üyunul-əxbar”, İbn Qüteybə Dinəvəri, ١-ci cild, səh. ٢١٢, Misir çapı; “Müstədrək”, Hakim Nişapuri, ٣-cü cild, səh. ١٥٠; “Mizanul-.etidal”, Zəhəbi, ١-ci cild, səh. ٢٢۴; “Tarixul-xüləfa”, Süyuti, səh. ۵٧٣ və s

.Burada Əhli-beyt (ə) həyatın tufanlı dəryasında nicat gəmisinə bənzədilmişdir

İbn Abbas, eləcə də Sələmə ibn Əkvə (İbn Məğazili adı ilə tanınan Əbül-Həsən Əli ibn .٢ Məhəmməd Şafeinin “Mənaqib” kitabındakı nəqlinə əsasən,) Peyğəmbəri-Əkrəm (s)-in :belə buyurduğunu nəql etmişlər

مَثَلُ اَهْلِبَيْتِى فِيكُمْ مَثَلُ سَفِينَهِ نُوحٍ، مَنْ رَكِبَها نَجى وَمَنْ تَخَلَّفَ عَنْها هَلَكَ:

Mənim Əhli-beytim sizin aranızda Nuhun gəmisinə bənzəyir; hər kəs ona minsə, nicat“ ”.tapar, hər kəs ondan ayrı düşsə, həlak olar

Hədisin bu deyilişi İbn Abbasdan nəql olunmuşdur. Sələmə ibn Əkvədən nəql olunan :hədis isə belədir

مَثَلُ اَهْلِبَيْتِى مَثَلُ سَفِينَهِ نوحٍ مَنْ رَكِبَها نَجى:

”!Əhli-beytim Nuhun gəmisinə bənzəyir; ona minən şəxs nicat tapar“

Limaza-əxtərtu məzhəbə Əhlil-beyt?” (“Nə üçün Əhli-beyt məzhəbini seçdim?”)“ kitabının müəllifi Şeyx Məhəmməd ibn İntaki “səfinə” hədisinin şərhində yazır: “Bütün İslam alimlərinin yekdil fikrinə əsasən, bu hədis “təvatür” həddinə yaxın “səhih” və “müstəfiz”(١) hədislərdən olub, təxminən, yüz nəfərdən ibarət hafiz və hədis əzbərçiləri, tarixçi və “sirə”(٢) yazanlar öz kitablarında onu nəql və qəbul etmişlər.” Sonra əlavə edərək yazır: “Bu hədisi qeyri-müsəlmanlar belə, islami bir hədis kimi nəql (etmişlər.”(٣

Əbəqatul-ənvar” kitabında bu hədis əhli-sünnənin doxsan iki məşhur aliminin doxsan“ iki kitabından bütün təfərrüatı ilə birgə nəql olunur. “Əbəqatul-ənvar” kitabının xülasəsinin müəllifi isə onun haşiyəsində bu hədisi səkkiz nəfər səhabə, səkkiz nəfər tabein, üç nəfər ٢-ci əsrin, səkkiz nəfər ٣-cü əsrin, on dörd nəfər ٤-cü əsrin (alimlərindən və bu minvalla hər əsrin alimlərini adları ilə birgə qeyd etmişdir.(٤

S

## ?ƏFİNƏ HƏDİSİ NƏ DEMƏK İSTƏYİR

Bu hədisin mənasını dərk etmək üçün Nuh peyğəmbərin macərasına



---

Təvatür həddinə çatmayan və ravilərinin sayı üçdən az olmayan rəvayətə . [۱] -۱
(.deyilir. (Müt

.Sirə” – Peyğəmbəri-Əkrəm (s)-in əməli rəftar və davranışlarına deyilir“ . [۲] -۲

.Limaza əxtərtu məzhəbə Əhlil-beyt”, səh. ۱۶۶“ . [۳] -۳

.Xülasətül-əbəqatil-ənvar”, ۲-ci cild, səh. ۱۲۶-۱۹۵“ . [۴] -۴

:qısa bir nəzər salırıq. Allah-taala Qurani-Kərimdə buyurur

فَفَتَحْنَا أَبْوَابَ السَّمَاء بِمَاء مُّنْهَمِرٍ وَفَجَّرْنَا الْأَرْضَ عُيُونًا فَالْتَقَى الْمَاء عَلَى أَمْرٍ قَدْ قُدِرَ

Biz göyün qapılarını sel kimi axan bir yağışla açdıq (və dayanmadan yağış yağdı). Yeri “ yarıb (oradan) bulaqlar qaynatdıq. Nəhayət, (göydən axan və yerdən qaynayan) sular (müəyyən edilmiş miqdarda bir-birinə qarışdı.”(١)

Bu tufan və sel bir yerdən başqa hər yeri əhatəsinə aldı. O da Nuhun (ə) gəmisi idi və Allah-taala onun sərnişinlərinə nicat verdi. Hətta Nuhun (ə) oğlu qürurla “Mən bir dağa sığınaram, o da məni seldən qoruyar!” – dediyi zaman atasının “Allahın rəhm etdiklərindən başqa, bu gün heç kim Onun əzabından qoruya bilməz!” – tutarlı cavabı ilə üzləşdi. (Həzrət Nuh (ə) gəmiyə minib nicat tapan möminləri nəzərdə tuturdu.) Nuhun (ə) sözü dərhal həqiqət tapdı. Çünki: “böyük bir dalğa ata ilə oğulun arasına girib (onları bir-birindən ayırdı və o (Nuhun oğlu) da suda boğuldu!”(٢)

Belə isə Əhli-beytin (ə) həmin gəmiyə bənzədilməsi dərin mənaya malik olub, bizə bir :çox həqiqətləri aşılayır. O cümlədən

İslam Peyğəmbərindən (s) sonra ümmət bir sıra tufanlara düçar olacaq ki, çoxlarını .١ .özü ilə aparacaq və dalğalar arasında boğub həlak edəcəkdir

İnsanları dini, imanı, ruhu və canını hədələyən təhlükələrdən qoruyub-saxlamaq .٢ üçün yeganə ümid yeri Əhli-beyt (ə) adlı “nicat gəmisi”dir. Şübhəsiz, hər kəs ondan .uzaq düşərsə, həlakətə uğrayacaqdır

Səhralıqda karvandan ayrı düşmək həmişə ölümlə nəticələnmir, mümkündür insan .٣ şiddətli çətinliklərdən sonra nicat tapsın. Lakin tufanlı bir dəryada “nicat gəmisi”ndən .ayrı düşmək, mütləq həlakət və ölüm deməkdir

Nuh peyğəmbərin gəmisinə minməyin şərti iman və saleh əməl olduğu üçün Nuh (ə) .۴ öz oğluna iman gətirib kafirlərdən ayrılmağı təklif edir. Beləliklə, İslam ümməti də tufan, bəla və azğınlıqlardan nicat tapmaq üçün Əhli-beytə iman gətirib, onlara tabe .olmalıdır

Nicat tapmaq üçün təkcə onlara məhəbbət bəsləmək kafi deyildir. Bəzi alimlərin .۵ dediyi kimi, bütün müsəlmanlar Əhli-beyti (ə) sevir, hörmətlə yad edirlər. Buna əsasən, hamı nicat əhlidir. Əksinə, rəvayətdə bəyan olunduğu kimi, əsas məsələ onlara tabe olmaq və əks çıxmamaqdır. Nuhun (ə) oğlu atasını sevsə də, ona tabe olmadığından .onun məhəbbəti qurtuluşa səbəb olmadı

Ötən bəhsdə qeyd olunduğu kimi, "səqəleyn" hədisindən başa düşülür ki, Əhli-beytə .۶ (ə) tabe olmaq üçün müəyyən şərt təyin edilməmişdir. Quranla Əhli-beyt (ə) həmişə birgə olacaq, heç vaxt bir-birindən ayrılmayacaq və nəhayət, behiştdə ("Kövsər" hovuzunda) Peyğəmbəri-Əkrəm (s)-ə qovuşacaqlar. "Səfinə" hədisindən də belə başa düşülür ki, dünyanın sonuna qədər bu minvalla davam edəcəkdir. Çünki dünya həmişə tufanlı və təlatümdədir, yəni nə qədər ki, şeytanlar, zəlalət carçıları və heyrət vadisində batanlar vardır, bu tufanlar da yatmayacaq və qiyamətə qədər bərpa olacaq. Allah-taalanın Öz bəndələri arasında qəzavət edəcəyi, Qurani-Kərimin buyurduğu kimi, ixtilafların aradan qaldırılacağı(۱) vaxta qədər davam edəcəkdir. Buna əsasən, hər bir dövrdə "nicat gəmisi"nin varlığı zəruridir və ondan üz döndərənlər .həlakətə məhkumdur

Əhli-beytə (ə) qeydsiz-şərtsiz itaət hər bir dövrdə məsum və günahsız bir imamın .۷ varlığına gözəl şahiddir və ona itaət nicat tapmaq, ondan üz döndərmək isə həlakətə .səbəbdir

۸. "Səfinə" hədisi Peyğəmbəri-Əkrəm (s)-in buyurduğu" ( سَتُفَرِّقُ اُمَّتِی عَلی ثَلاثٍ وَسَبْعِینَ فِرْقَهٍ، فِرْقَهٌ ناجِیَهٌ وَالباقُونَ فِی النّارِ:) "Tezliklə ümmətim yetmiş üç firqəyə ayrılacaq, (onların) biri nicat, .qalanları isə cəhənnəm əhlidirlər!"(۲) – məşhur hədisin təfsiridir

Bu hədisdən məlum olur ki, "firqətun naciyə" (nicat əhli olan



---

Qurani-Kərimdə və çoxlu rəvayətdə buyurulduğu kimi, qiyamət günü ixtilafların . [۱] -۱ aradan qaldırılacağı və Allah-taalanın ümmətlər arasında qəzavət və hökm kəsəcəyi .bir gündür

Bu rəvayəti bir çox şiə və sünnü alimləri nəql etmiş, hətta bəzi rəvayətlərdə . [۲] -۲

göstərilmişdir ki, imam Əli (ə) Peyğəmbəri-Əkrəm (s)-dən “Nicat əhli olan firqə hansıdır?” – deyə soruşduqda, o həzrət buyurmuşdur: “Əl-mutəməssiku bima əntə və şiətukə və əshabukə!” – (Sənin, şiələrinin və səhabələrinin yolundan yapışanlar!) (.(“Ehqaqul-həqq”, ٧-ci cild, səh. ١٨٥

firqə) Əhli-beyt (ə) məktəbinin üzvləri, İslamın üsul və füruatında onların hidayət .çərçivəsində qərar tutan firqədir

Bu məşhur hədisin ətrafındakı bütün bu qeydlərdən belə nəticə alırıq ki, İslam ümmətində Əhli-beytin (ə) adı çox yüksək olub, onların kənarından sadə məhəbbətlə .ötüb keçməməliyik

### NÜCUM" (ULDUZLAR) HƏDİSİ"–۳

#### İşarə

İslam mənbələrində Peyğəmbər (s)-in Əhli-beyti barəsində nəql olunan və hər bir dövrdə müsəlmanların rəhbər və hidayətçisi olduğu göstərilən başqa bir hədis "nücum" hədisidir. Bu hədisi Peyğəmbər (s)-in bir çox səhabəsi (ən azı yeddi nəfər – imam Əli (ə), Cabir ibn Abdullah, Əbu Səid Xudri, Ənəs ibn Malik, Münkədir ibn Abdullah(۱), Sələmə ibn Əkvə və İbn Abbas) nəql etmiş, əhli-sünnə hafizləri və mühəddislərinin onlarla kitabında qeyd edilmişdir ki, burada onların bir qisminə qısa :şəkildə toxunacağıq

Hakim Nişapuri "Müstədrək" kitabında İbn Abbasdan İslam Peyğəmbərinin (s) belə :buyurduğunu nəql edir

النُّجومُ اَمانٌ لِاَهْلِ الْاَرْضِ مِنَ الْغَرْقِ، وَاَهْلُ بَيْتِى اَمانٌ لِاُمَّتِى مِنَ الْاِخْتِلافِ، فَاِذا خالَفَتْها قَبِيلَةٌ مِنَ الْعَرَبِ اِخْتَلَفُوا فَصارُوا حِزْبَ اِبْلِيسِ!

Ulduzlar yer əhli üçün əmin-amanlıq və dəryada (qərq olmaqdan) nicata səbəb" olduğu kimi(۲), mənim Əhli-beytim də ümmətim üçün ixtilaflarda əmin-amanlıq və nicat yeridir. Belə isə ərəb qəbilələrindən hər hansı biri onlara qarşı çıxsa, ümmətin "!arasında ixtilaf yaranar. Bilin ki, onlar (müxalifət edənlər) Şeytanın qoşunundandırlar

Hakim Nişapuri bu hədisi qeyd etdikdən sonra yazır: "Bu hədisin sənədi səhih və (düzgündür."(۳

Əllamə Həmzavi "Məşariqul-ənvar" kitabında "Hakim

۱- [۱] . İbn Əsirin “Usdul-ğabə” kitabında qeyd etdiyinə əsasən, Məhəmməd ibn Münkədirin atası Münkədir ibn Abdullah Peyğəmbər (s)-in səhabələrindən olmuşdur.

۲- [۲] . Keçmiş zamanlarda cəhətlərin təyini mümkün olmadığından dəniz səfərlərində onları bilmək üçün ən gözəl vasitə səma ulduzları idi.

۳- [۳] . “Müstədrək”, Hakim Nişapuri, ۳-cü cild, səh. ۱۴۱, “Heydərabad” çapı, “Ehqaqul-haqq” kitabından nəqlən, ۹-cu cild, səh. ۲۹۴.

Nişapurinin səhih və düzgün hesab etdiyi rəvayətdə belə gəlmişdir!”(۱) – deyərək .yuxarıdkı hədisi olduğu kimi qeyd edir

Bu hədisi İbn Həcər “Əs-səvaiqul-muhriqə”, Əllamə Əli Müttəqi “Müntəxəbu Kənzül-ümmal”, Bədəxşi “Miftahun-nicah”, Şeyx Məhəmməd Səbban Maliki “İsğafur-rağibin”, Əllamə Burhani “Əş-şərəful-muəyyəd” və “Cəvahirul-bihar” kitablarında nəql (etmişlər.(۲

Bu hədisi digər ravilər də Peyğəmbəri-Əkrəm (s)-dən nəql etmiş, onların hədisləri şiə və sünnülərin məşhur kitablarında qələmə alınmışdır. (Əlbəttə, bu rəvayətlərin (.sözlərində azıcıq fərqlər gözə dəysə də, əsas məqsədi birdir

Məsələn, Sələmə ibn Əkvənin rəvayətində belə oxuyuruq: “Allahın Rəsulu :buyurmuşdur

النُّجُومُ اَمانٌ لِاَهْلِ السَّماءِ وَاَهْلُ بَيْتِى اَمانٌ لِاُمَّتِى

Ulduzlar səma əhlinin əmin-amanlıq və asudəliyinə, mənim Əhli-beytim isə“ (ümmətimin əmin-amanlığına səbəbdir!”(۳

Bu hədisi azacıq fərqlə Cabir ibn Abdullah Ənsari, eləcə də Münkədir, Əbu Səid Xudri .və Ənəs ibn Malik Peyğəmbəri-Əkrəm (s)-dən nəql etmişlər

:İmam Əlinin (ə) Peyğəmbəri-Əkrəm (s)-dən nəql etdiyi başqa bir hədis isə belədir

النُّجُومُ اَمـانٌ لِاَهْـلِ السَّمـاءِ فَـاِذا ذَهَبَتِ النُّجُومُ ذَهَبَ اَهْـلُ السَّمـاءِ، وَاَهْـلُ بَيْتِى اَمـانٌ لِاَهْـلِ الْاَرْضِ فَاِذا ذَهَبَ اَهْلُ بَيْتِى ذَهَبَ اَهْلُ الْاَرْضِ!

Ulduzlar səma əhlinin asudəliynə səbəbdir, onlar tökülsə, səma əhli də aradan gedər;“ mənim Əhli-beytim də yer əhlinin asudəliyini təmin edir. Əgər Əhli-beytim aradan ”!getsə, yer əhli də aradan gedər

Bu hədisi Muhibbuddin Təbəri “Zəxairul-uqba” kitabında Əhməd

۱- [۱]. Əllamə Həmzavinin qeydi belədir: “Buxari və Müslümün hədislərin düzgünlüyündəki şərtinə əsasən, bu hədis səhih və düzgündür. (“Məşariqul-ənvar”, səh. ۹۰, Misirin “Şərqiyyə” çapı).

۲- [۲]. Əlavə məlumat əldə etmək istəyənlər “Ehqaqul-həqq” kitabının ۹-cu cildinin ۲۹۴-۲۹۶-cı səhifələrinə müraciət edə bilərlər.

۳- [۳]. !" Bu hədis “Camius-səğir” (Süyuti) (səh. ۵۸۷, Misir çapı), “Zəxairul-üqba” (Muhibbuddin Təbəri), “Əs-səvaiqul-muhriqə” (İbn Həcər) və s. kitablarda nəql olunmuşdur.

ibn Hənbəlin “Mənaqib” kitabından nəql etmişdir.(۱) Həmçinin digər kitablarda, o cümlədən, Həməvininin “Fəraidus-səmteyn”, İbn Həcərin “Əs-səvaiqul-muhriqə”, Məhəmməd Səbbanın “İsğafur-rağibin”, Xarəzminin “Məqtəlul-Hüseyn”, Nəbhaninin .“Əşşərəful-muəyyəd” kitablarında da qeyd edilmişdir

### NÜCUM” HƏDİSİNİN MÖHTƏVASI“

:Bu hədis müxtəlif məsələləri açıqlayır

Bu hədis həqiqətdə Qurani-Kərimin səma ulduzlarının iki mühüm təsirə malik . ۱ olduğunu göstərən bir neçə ayəsindən qaynaqlanmışdır. Bir ayədə belə buyurulur: “Onlar ulduzlar vasitəsilə hidayət olunarlar!”(۲) Başqa bir ayədə isə belə buyurulur: (“Allah sizin üçün suyun və qurunun zülmətində hidayət olmaq üçün ulduzlar yaratdı!”(۳

Bu isə həqiqətdə ulduzların ən mühüm faydalarından biridir. Çünki “cəhətölçən”in (qütbnəma) ixirasından öncə dağ, yaxud ağac kimi heç bir əsər-əlaməti olmayan dəniz yollarını tapmaq üçün yeganə vasitə ulduzlar idi. Gecələr bulud səmanı örtdükdə, gəmilər hərəkətdən dayanır, yollarına davam etmək istəyənlər isə ölüm təhlükəsi ilə üzləşirdilər. Bunun səbəbi beş planeti (Merkuri, Venera (dan ulduzu), Mars, Yupiter və Saturn) müstəsna etməklə, qalan ulduzların öz yerlərini dəyişməsi sanki qara parça üzərində toxunan, bir tərəfdən başqa təfərə çəkilən mirvaridlərə bənzəməsilə əlaqədardır. Qalan beş planeti isə “səvabit” adlandırırdılar. Bunlardan və həmişə yeri sabit olub çıxıb-batmaqda digər ulduzlardan fərqlənən “qütb” ulduzundan əlavə, qalan ulduzları tanıyıb, ilin müxtəlif fəsillərində onların yerini təyin etməklə əllərindəki xəritə .ilə hər hansı məqsədi tapmalı idilər

Ulduzların başqa bir faydası isə Qurani-Kərimdə buyurulduğu kimi, onların şeytanlara qarşı oxlara bənzədilməsidir. Belə ki, onların şeytanlara atılan və səmalara nüfuz etməyin qarşısını alan oxları əvəz



---

.Zəxairul-üqba”, səh. ۷, Qahirənin “Qudsi” çapı“ . [۱]-۱

.Nəhl” surəsi, ayə: ۱۶“ . [۲]-۲

:edir. Qurani-Kərimdə buyurulur

إِنَّا زَيَّنَّا السَّمَاء الدُّنْيَا بِزِينَةٍ الْكَوَاكِبِ وَحِفْظًا مِّن كُلِّ شَيْطَانٍ مَّارِدٍ لَا يَسَّمَّعُونَ إِلَى الْمَلَإِ الْأَعْلَى وَيُقْذَفُونَ مِن كُلِّ جَانِبٍ دُحُورًا وَلَهُمْ عَذَابٌ وَاصِبٌ

Biz səmanı ulduzlarla zinətləndirdik, xəbis və itaətdən çıxmış şeytanlardan qoruduq.“ Onlar yüksək aləmə (mələklərin söhbətlərinə) qulaq asa bilməzlər. (Bu işi görmək istəsələr,) hər tərəfdən oxlar (axan ulduzlar) vasitəsilə qovulub atılar və şiddətlə (geriyə qaytarılarlar. Onlar üçün daimi bir əzab vardır!”(١)

Bu və digər ayələrdən ulduzların səma əhli üçün müdafiə silahı olduqları məfhumu başa düşülür. “Ulduzlar (yaxud metoeroidlər) şeytanların yolunu necə bağlayır və səmalara daxil olmağa icazə vermirlər?” – sualı ayrıca bir izaha ehtiyac duyur. Biz onu “Təfsiri-nümunə” kitabında həmin ayənin təfsirində şərh etmişik. Burada diqqəti cəlb edən məsələ süzən ulduzlar vasitəsilə şeytanların yüksək aləmdən, mələklərin pak, ali .məqamından qovulması hadisəsidir ki, “nücum” hədisinin təfsiri üçün kifayətdir

Bəli, bir tərəfdən Peyğəmbər (s)-in Əhli-beyti (ə) səma ulduzları kimi insanları küfr, fitnə-fəsad və günahın zülmətindən qoruyub, onları ali məqsədə doğru yönəldirsə və Allah yolunun yolçularını azğınlıq dalğalarında boğulmaqdan xilas edirsə, digər tərəfdən isə insan və cinlərdən olan şeytanların İslam hüdudlarına nüfuz, Quranın hökmləri və sünnəni təhrif etməsinin qarşısını alır, metoeroid oxları kimi onları dəf edir, yadların sinəsinə qeyb əllərilə zərbə endirir və onları səmavi sirlərdən agah olmağa .qoymurlar

Diqqət yetirmək lazımdır ki, bu hədisdə xüsusi olaraq Əhli-beyt (ə) İslam ümmətindəki ixtilafların qarşısını alan qoruyucu kimi göstərilir və əgər ixtilaflar davam edərsə, insanlar İblisin qoşunu sıralarına daxil olarlar. Bu isə doğrudan da dolğun bir mənanı .yetirir

Nücum” hədisindən belə başa düşülür ki, ulduzların səma, yaxud yer əhlinin“ .٢ keşiyində durmasının davam etdiyi kimi, Əhli-beytin (ə) də hidayət yolu dünyanın .sonuna qədər davam edəcəkdir

sübuta yetir. Əgər onlar xəta və günaha yol versəydilər, yer əhlini ixtilaf və azğınlıqlardan qoruyan kamil və mütləq dayaq kimi tanıtdırılmazdılar.

۴. Səma ulduzlarının birinin batıb digərinin çıxdığı, bir qisminin üfüqdə görünməz olduğu və digər bir qisminin yenidən parladığı kimi, Peyğəmbər (s)-in Əhli-beyti (ə) də belə xislətə malikdirlər. İmam Əli (ə) bu məsələni "Nəhcül-bəlağə"də aydın bəyan edərək buyurmuşdur: "Agah olun! Mühəmməd (s)-in Əhli-beyti səma ulduzlarına bənzəyir; onların biri batdıqda, digəri çıxır!"(۱)

Şübhəsiz, bu rəvayətlərdə adı çəkilən Əhli-beyti (ə) Peyğəmbər (s)-in zövcələri kimi təfsir etmək düzgün deyildir; çünki bu rəvayətlərdə hər bir dövr və əsrdə ümmətin hidayəti, azğınlıq dalğalarından nicatı və ixtilafların qarşısının alınması kimi mühüm məsələlərdən söz açılır. Bildiyiniz kimi, Peyğəmbər (s)-in zövcələri isə müəyyən bir dövrdə yaşamış və bundan əlavə, ixtilafların qarşısının alınmasında da xüsusi bir rol oynamamışlar.(۲)

**SUAL**

Sual olunur ki, bəzi kitablarda Peyğəmbəri-Əkrəm (s)-in (اَصْحابِی بِمَنْزِلَهِ النُّجُومِ فِی السَّماءِ فَاَیُّما اَخَذْتُمْ بِهِ اِهْتَدَیْتُمْ) "Mənim səhabələrim səma ulduzları kimidir. Onların

səh:۷۰

---

۱- [۱]. "Nəhcül-bəlağə", xütbə: ۱۰۰.

۲- [۲]. Hətta Peyğəmbər (s)-in zövcəsi Ayişənin ixtilafların daha da artmasındakı rolu inkaredilməz bir həqiqətdir. ! " İzah: Peyğəmbər (s)-in vəfatından sonra camaat Əbu Bəkrlə beyət etdilər. Ayişənin rəvayətinə görə, "Əli və Bəni-Haşimin hamısı altı ay müddətində – Fatimə dünyadan gedən vaxta qədər – onunla beyət etmədilər. Bundan sonra imam Əli (ə) Osmanın xilafətinin son vaxtlarına qədər siyasət səhnəsindən uzaqlaşdırıldı, nəhayət, Ayişə Osmanla qarşılaşmaq üçün onun əleyhinə qiyam edənlərin – Təlhə, Zübeyr və başqalarının rəhbərliyini öz öhdəsinə aldı. Bu işləri də yalnız Osmandan sonra öz əmisi oğlu Təlhəni xilafətə çatdırmaq ümidi ilə görürdü. Osman qətlə yetirildikdən və müsəlmanlar imam Əli (ə) ilə beyət etdikdən sonra o həzrətin əleyhinə "Cəməl" müharibəsini başladı və axırda da məğlub oldu. İmam Əli (ə)

onu Mədinəyə qaytardı. O həzrət şəhid olduğu vaxta qədər ona qarşı kin-küdurət bəsləyirdi. Bundan sonra Müaviyə hakimiyyətə gəldi. Onların hər ikisi (Müaviyə və Ayişə) imam Əlinin (ə) qarşısında eyni mövqe tutduqları üçün aralarında yaxşı əlaqə bərqərar oldu və bu əlaqə Hücr ibn Ədinin Müaviyənin vasitəsilə qətlə yetirildiyi vaxta qədər davam etdi. ("Məalimul-mədrəsəteyn", Əllamə Əskəri, ٢-ci cild, səh. ٦٩.) (Müt.)

hər hansı birindən yapışsanız (itaət etsəniz), hidayət olar və doğru yola yönələrsiniz!” – buyurduğu da nəql olunmuşdur. Görəsən, bu hədis Əhli-beyt (ə) barəsində nəql olunan ?yuxarıdakı hədislərlə ziddiyyət təşkil edirmi

:Bu sualın cavabı ilə bağlı bir neçə məsələyə diqqət yetirmək lazımdır

Bu hədisin mötəbər oluğunu fərz etsək belə, Əhli-beytin (ə) barəsində deyilən .١ hədislərlə heç bir ziddiyyət təşkil etmir. Çünki İslamın əsaslarının bəyanında bir örnəyin başqa bir örnəklə heç bir ziddiyyəti yoxdur. Xüsusilə “Əhlu-beyti kən-nücum!” (Əhli-beytim ulduzlar kimidir!) – hədisində bu vəsf Qurani-Kərimə aid edilməsə də, .Qurani-Kərimin müsəlmanlar üçün ən gözəl istinad yeri olması sözüdür

Əhli-sünnə alimləri bu hədisi sənəd baxımından “saxta”, “məkzub” (yalan) və yaxud .٢ “məşkuk” (şübhəli) adlandırmışlar. Bunu açıqlayanların arasında əhli-sünnənin dörd imamından biri olan Əhməd ibn Hənbəl, eləcə də İbn Həzm, Əbu İbrahim Məzəni (Şafeinin ardıcıllarından biri), Hafiz Bəzzaz, Daru-Qutni, Zəhəbi, və s. alimlər vardır ki, burada onların hər birinin ayrı-ayrılıqda nəzərini nəql etməyə ehtiyac yoxdur. Lakin bu alimlərin fikirləri barədə məlumat əldə etmək istəyənlər “Xülasətu əbəqatil-ənvar” (kitabına müracət edə bilərlər.(١)

Səhabələrə aid edilən hədisin möhtəvası məntiqlə uyğun gəlmir. Bildiyimiz kimi, .٣ Peyğəmbər (s)-in vəfatından sonra səhabələr arasında (geniş mənada səhabə; yəni Peyğəmbər (s)-i görən və həzrətlə birgə olan hər bir şəxsi nəzər almaqla) böyük ixtilaflar yarandı. Bu ixtilaflar üstündə çox qanlar axıdıldı, dəhşətli müharibələr baş verdi. Belə isə hansı məntiqlə qəbul etmək olar ki, bir-birinin qanını tökən hər iki əks qrup hidayət örnəyidir və insanları onların hər hansı birini seçməkdə azad buraxıb :deyək



---

Xülasətu əbəqatil-ənvar”, ٣-cü cild, səh. ١٢۴-١۶٧. (Burada qeyd etdiyimiz hədisin . [١] -١ sənədinin etibarsızlığı ravilərin tərcümeyi-halı ilə birgə əhli-sünnənin otuz nəfərdən (.çox alimi nəql etmişdir

Özünüz bilərsiniz, ya Əmirəlmöminin Əlinin (ə), ya da Müaviyənin qoşunundan olun;" Cəməl müharibəsində ya Əliyə (ə) qoşulun, ya da Təlhə və Zübeyrə. Onların hər hansı birinə qoşulsanız, hidayət tapacaq və sizi behiştə aparacaqlar." Xeyr, belə deyildir! Heç bir ağıllı insan bunu qəbul etməz. Allah Rəsulunun (ə) məqamı isə çox üstündür və o .həzrətə belə hədisləri nisbət vermək rəva deyildir

Tarixdə göstərilir ki, Əməvi hakimləri öz mövqelərini möhkəmlətmək, "nücum" hədisini etibardan salmaq və Əhli-beytin (ə) məqamını kiçiltmək üçün belə saxta hədisləri İslam Peyğəmbərinə (s) nisbət vermiş, bununla da Şam əhalisi və qeyrilərini inandırmağa çalışmışlar ki, Əlinin (ə) hökuməti haqq olduğu kimi, səhabələr zümrəsindən olan Müaviyənin hökuməti də haqq və hidayətin keşiyindədir.(۱) Beləliklə, .hər iki qrup arasındakı fərqi götürməyə çalışmışlar

### ON İKİ İMAM" HƏDİSİ"–۴

#### İşarə

Ümumiyyətlə, Əhli-beytin (ə) mövqeyini imamət və vilayətlə əlaqələndirən və bir sıra şübhəli sualları cavablandıran hədislərdən biri də "on iki imam" hədisidir. Bu hədis İslamın ən məşhur hədislərindən biri olub, səhih və mötəbər kitabların əksəriyyətində nəql olunmuş və həqiqətdə bu hədis barəsində əksər alimlər yekdil fikirdədirlər. :Əvvəlcə, hədisin sənədini, sonra isə onun möhtəvasını qısa şəkildə araşdıracağıq

Bu hədisi Peyğəmbər (s)-in səhabələrindən bəziləri nəql etmişdir ki, onun əksər raviləri Cabir ibn Sumrəyə, ondan sonra Abdullah ibn Məsuda, Abdullah ibn Ömərə, Abdullah ibn Əmr ibn Asa, Əbdül-Məlik ibn Ümeyrə, Əbul-Cildə və Əbu Cüheyfəyə gedib çıxırlar. .Lakin hədis hafizləri onu sayı ondan çox olan kitabda qeydə almışlar



---

Əhli-sünnə firqəsinin nəzərinə görə, Peyğəmbəri-Əkrəm (s)-ə iman gətirən və o . [۱] -۱ həzrəti günün yarı hissəsini belə, görənlər səhabə adlanırlar və səhabə adını daşıyan hər bir kəs isə ədalətlidir. Lakin Əhli-beyt məktəbinin ardıcılları o kəsə səhabə deyirlər ki, daim və uzun müddət Peyğəmbəri-Əkrəm (s)-lə birgə olsun. Onların nəzərinə görə,

:İndi isə diqqətinizi həmin hədisin bir qisminə yönəldirik

Səhihi-Müslüm" kitabında Cabir ibn Sumrənin belə dediyi nəql olunur: "Allahın" .۱ :Rəsulundan (s) eşitdim ki, belə buyurdu

لا يَزالُ الْاِسْلامُ عَزيزاً اِلى اِثْنى عَشَرَ خَليفَةً – ثُمَّ قالَ كَلِمَةً لَمْ اَفْهَمْها! فَقُلْتُ لِاَبى ما قالَ؟ فَقالَ كُلُّهُم مِنْ قُرَيْشٍ!:

On iki xəlifə müsəlmanlara rəhbərlik etdiyi vaxta qədər İslam həmişə izzətli olacaq." "Sonra o həzrət bir söz dedi ki, mən başa düşmədim. Atam Peyğəmbər (s)-ə yaxın olduğundan, sonra atamdan "Peyğəmbər (s) nə buyurdu?" – deyə soruşduqda, atam ((Peyğəmbər (s)-in belə buyurduğunu) dedi: "Onların hamısı Qüreyş tayfasındandır!"(۱

Həmin kitabda başqa bir sənədlə Cabir ibn Abdullah Ənsaridən "La yəzalul-İslamu əzizən!" (İslam dini həmişə əziz olacaqdır!) ibarəsinin yerində "La yəzalu hazəl-əmr!" .(Bu iş həmişə davam edəcəkdir!) – ibarəsini nəql etmişdir

Başqa bir hədisdə isə "La yəzalu hazəd-din əzizən məniən!" (Bu din həmişə izzətli və .yenilməz olacaqdır!) – deyə buyurulmuşdur

Daha başqa bir hədisdə Amir ibn Səd ibn Əbi Vəqqasdan belə nəql edilir: "Cabir ibn Sumrəyə məktub yazıb bildirdim ki, Peyğəmbəri-Əkrəm (s)-dən eşitdiyi hədisləri mənə yazıb göndərsin. O da mənə belə yazmışdı: "Mən Peyğəmbər (s)-in belə buyurduğunu eşitdim: "İslam dini qiyamətə qədər yaşayacaq və mütləq sizə Qüreyş tayfasından olan on iki xəlifə rəhbərlik edəcəkdir!" Həmçinin o həzrət belə buyurmuşdu: "Müsəlmanların kiçik bir qismi "Ağ" evi, "Kəsra" evini, yaxud da "Kəsra" övladlarını fəth edəcəklər!" O həzrət belə də buyurdu: "Qiyamətdən qabaq yalançılar meydana (çıxacaqlar ki, onlardan uzaqlaşın!"(۲

Yenə "Səhihi-Müslüm"də başqa bir "təriq"lə (ravilərin sırası) Cabir ibn Abdullah Ənsaridən belə nəql olunur: "On iki xəlifənin hökuməti durduqca, bu din izzətli, qüdrətli və yenilməz olacaqdır!" Bu hədisin sonunda da "Kulluhum min Qureyş!" (Onların hamısı



---

.Səhihi-Müslüm", ۳-cü cild, səh. ۱۴۵۳, Beyrutun "Daru ihyai-turasil-ərəbi" çapı" . [۱] -۱

(Qüreyş tayfasındandır!” – ibarəsi görünür.(١)

Bu hədis “Səhihi-Buxari” kitabında oxşar ibarələrlə Cabir ibn Abdullah Ənsarinin .٢ :Peyğəmbəri-Əkrəm (s)-dən belə eşitdiyi nəql olunmuşdur

يَكُونُ اِثْنى عَشَرَ اَميراً فَقالَ كَلِمَةً لَمْ اَسْمَعْها! فَقالَ اَبى اِنَّهُ قالَ: كُلُّهُم مِنْ قُرَيْشٍ!:

Məndən sonra on iki əmir olacaq.” Sonra o həzrət bir söz buyurdu ki, mən eşitmədim.“ (Atam dedi ki, o həzrət deyirmiş: “Onların hamısı Qüreyş tayfasındandır!”(٢)

Bunun oxşarı “Səhihi-Termizi” kitabında da azacıq fərqlə qeyd olunmuş və Termizi .٣ (onu nəql etdikdən sonra yazmışdır: “Bu hədis “həsən” və səhihdir!”(٣)

Səhihi-Əbi Davud” kitabında da bu hədis azacıq fərqlə qeyd edimişdir. Hədisin“ .۴ deyilişindən başa düşülür ki, Peyğəmbər (s) onu böyük bir cəmiyyətin qarşısında buyurmuşdur. Rəvayətdə göstərildiyi kimi, Peyğəmbər (s) “Bu din on iki xəlifənin rəhbərlik etdiyi vaxta qədər, həmişə izzətli, qüdrətli və yenilməz olacaqdır!” – deyə (buyurduqda, camaat uca səslə “Allahu-Əkbər!” – demişdilər.(۴)

On iki imamlar” hədisi Əhməd ibn Hənbəlin “Müsnəd” kitabının bir neçə yerində“ .۵ (qeyd edilmişdir ki, bəzi təhqiqatçılar onu otuz dörd vasitə ilə Cabirdən nəql etmişlər.(۵)

Bir yerdə Məsruqun belə dediyini görürük: “Biz Abdullah ibn Məsudun yanında oturmuşduq və o, bizə Quran oxuyurdu. Bir nəfər ondan “Heç Peyğəmbər (s)-dən öyrənmisinizmi ki, bu ümmətə neçə nəfər xəlifəlik edəcəkdir?” – deyə soruşduqda, “İraqa gəldiyim vaxtdan səndən əvvəl heç kəs məndən bu sualı soruşmamışdır!” – :deyərək belə əlavə etdi: “Bəli, bunu Allahın Rəsulundan (s) soruşduqda, buyurdu



---

.Səhihi-Müslüm”, ٣-cü cild, səh. ١۴۵٣“ . [١] -١

.Səhihi-Buxari”, ٣-cü cild, səh. ١٠١, Beyrutun “Darul-ceyl” çapı“ . [٢] -٢

Səhihi-Termizi”, ۴-cü cild, səh. ۵٠١, Beyrutun “Daru ehyai-turasil-ərəbi” çapı, “ . [٣] -٣ .“ma caə fil-xüləfa” bölümü, hədis: ٢٢٢٣

Səhihi-Əbi Davud”, ۴-cü cild, “Əl-Mehdi” bölümü, Beyturun “Daru ehyais-“ . [۴] -۴

.sünnətin-nəbəviyyə” çapı

Müntəxəbul-əsər” kitabının ١٢-ci səhifəsinə və “Ehqaqul-həqq” kitabının ١٣-ü“ . [٥] -٥

!cildinə müraciət edin

اِثْنی عَشَرَ کَعِدَّهِ نُقَباءِ بَنِی اِسْرائِیلَ:

(Bəni-İsrailin (saleh) rəhbərlərinin sayı qədər on iki nəfərdirlər!”(١)“

Yuxarıda qeyd etdiyimiz hədislər əhli-sünnənin ən məşhur və mötəbər kitablarında bir çox ravi silsilələrinin nəqlindən əlavə, digər kitablarda da qeyd edilmişdir ki, məqsəddən yayınmamaq üçün onların bir qisminə işarə edəcəyik. Əlavə izahat üçün “Ehqaqul-həqq”, “Fəzailul-xəmsə”, “Müntəxəbul-əsər” və digər kitablara müraciət edə .bilərsiniz

### ON İKİ İMAM” HƏDİSİNİN MÖHTƏVASI“

Bu rəvayətlərin ibarələri müxtəlif olduğundan, bəzilərində “isna əşərə xəlifətən” (on iki xəlifə), bəzilərində “isna əşərə əmirən” (on iki əmir) və bəzilərində isə on iki nəfərin vilayət və hökumətindən söz açan – “ma vəlahum isna əşərə rəculən” (on iki nəfərin vilayəti) – ifadələri qeyd olunmuşdur. Bu rəvayətlərin əksəriyyətində on iki nəfərin xəlifəliyindən söz açılır. Bəzi rəvayətlərdə təkcə onların neçə nəfərdən ibarət olduğuna işarə edilərək buyurulur: “İsna əşərə kə-iddəti nuqəbai Bəni-İsrail!” (Onlar Bəri-İsrail tayfasının (saleh) rəhbərlərinin sayı qədər on iki nəfərdirlər!) Bəzilərində isə, “on iki .başçı” – ifadəsi işlədilmişdir

Məlum olduğu kimi, bütün bunlar xilafət, vilayət və hökumət işlərinə aid olub, nəticə .etibarilə eyni mənanı çatdırır

Digər tərəfdən, bəzi rəvayətlərdə “Bu din həmişə qüdrətli və yenilməz olacaqdır…!”, bəzilərində “Mənim ümmətimin işi həmişə məsləhət üzündəndir, əgər…”, bəzilərində “Bu ümmətin işi həmişə uğurlu olacaqdır, əgər…!”, bəzilərində “Bu ümmətin işi yaxşılığa doğru olacaqdır, əgər…”, bəzilərində də “Heç kəs bu ümmətə zərər yetirə və onları xar edə bilməz” – kimi ibarələr verilmişdir. Bu qəbildən olan digər rəvayətlər də vardır ki, onlarda da bir növ bu həqiqətə toxunulmuş və İslam ümmətinin qüdrəti, qələbə və uğurundan söhbət açılmışdır. Bundan əlavə, bu rəvayətlərin əksər ravi silsilələri .fərqlidirlər

Üçüncüsü isə bu rəvayətlərdə “kulluhum min Qureyş!” (Onların

hamısı Qüreyş tayfasındandır!) – ibarəsi gözə çarpır. Yalnız Qunduzi Hənəfinin “Yənabiul-məvəddət” kitabında nəql etdiyi bir rəvayətdə isə Peyğəmbər (s) belə buyurmuşdur: “Kulluhum min Bəni-Haşim!” (Onların hamısı Bəni-Haşimdəndir!) O da (bunu “Məvəddətül-qurba” kitabından Cabir ibn Səmərədən nəql etmişdir.(۱)

Bu hədislərin çoxunda göründüyü kimi, Peyğəmbəri-Əkrəm (s) sonuncu cümləni bəyan edərkən səsini alçaldaraq onu gizli buyurmuşdur. Bu da açıq-aşkar göstərir ki, həmin vaxt orada Peyğəmbər (s)-in Qüreyş, yaxud “Haşimi” tayfasından olan on iki nəfər canişinin elanı ilə müxalif olanlar var imiş və o həzrət də sonuncu cümləsini !məxfi şəkildə, yavaş səslə bəyan etmişdir

Ümumiyyətlə, bu hədis məşhur və birinci dərəcəli mənbələrdə nəql olunmuş və bütün İslam alimləri də onu qəbul etmişlər. Bu hədisin mənası Əhli-beyt (ə) məktəbinin ardıcılları üçün çox aydındır və onun məfhumunu yalnız on iki məsum və günahsız imamlara aid edirlər. Lakin onun izahı digər İslam məzhəblərinin ardıcılları üçün naməlum bir məsələyə çevrilmişdir. Belə ki, şəkk-şübhə etmədən deməliyik ki, digər məzhəblərin alimləri bu haqda aydın bir söz deməmişlər. Bunun səbəbi də məlumdur; çünki ilk xəlifələrin sayı dörd, Əməvi xəlifələrin sayı on dörd(۲), Abbasi xəlifələrin də sayı otuz yeddi nəfərdən ibarət olmuşdur. Bunların da heç biri Peyğəmbər (s)-in buyurduğu on iki nəfər xəlifə ilə uyğun gəlmir. Burada biz Hafiz ibn Süleyman ibn İbrahim Qunduzi Hənəfinin etirafını həqiqətlə uyğun bilməliyik. Belə ki, o, “Yənabiul-:məvəddət” adlı məşhur kitabında yazır

Bəzi tədqiqatçılar Peyğəmbər (s)-dən sonrakı on iki nəfər xəlifəyə dəlalət edən“ hədislərin məşhur, eyni zamanda çoxsaylı təriq və vasitələrlə nəql olunduğunu demişlər. Zaman ötdükcə, məlum olacaq



---

.Yənabiul-məvəddət”, səh. ۴۴۵, ۷۷-ci bölüm“ . [۱] -۱

Onların adları belədir: ۱) Birinci Müaviyə, ۲) Birinci Yezid, ۳) İkinci Müaviyə, ۴) . [۲] -۲ Birinci Mərvan, ۵) Əbdül-Məlik, ۶) Birinci Vəlid, ۷) Süleyman ibn Əbdül-Məlik, ۸) Ömər ibn Əbdül-Əziz, ۹) İkinci Yezid, ۱۰) Hişam ibn Əbdül-Məlik, ۱۱) İkinci Vəlid, ۱۲) Üçüncü

Yezid, ۱۳) İbrahim ibn Vəlid, ۱۴) İkinci Mərvan. Əndəlus əməvilərinə gəldikdə isə, (.onların sayı bundan da artıqdır. ("Dairətul-məarif" Dehxuda

ki, Allahın Rəsulunun (s) bu hədisdən məqsədi on iki nəfərdən ibarət Əhli-beyt imamlarıdır. Çünki bunu o həzrətdən sonrakı ilk xəlifələrə tətbiq etmək olmaz və səbəbi də aydındır (çünki onların sayı dörd nəfərdir). Həmçinin onu Əməvi hakimlərinə də aid etmək olmaz, çünki onların sayı on iki nəfərdən çoxdur, digər tərəfdən də Ömər bin Əbdül-Əzizi müstəsna etməklə, onların hamısı aşkar zülm və haqsızlıqla tanınmışlar. Həm də onlar Bəni-Haşim tayfasından deyillər. Halbuki bu hədisin bəzi silsilələrində on iki xəlifənin Bəni-Haşim tayfasından olduğu nəql olunmuşdur. Bu rəvayət (on iki nəfərin Bəni-Haşim tayfasından olması), xüsusilə sonuncu cümlənin Peyğəmbəri-Əkrəm (s) tərəfindən yavaş söylənilməsi ilə daha uyğundur. Peyğəmbəri-Əkrəm (s)-in sonuncu cümləni astadan söyləməsinin səbəbi bir çoxlarının Bəni-Haşimin xilafətə gəlişi ilə razılaşmamaları olmuşdur.

Eləcə də hədisdə buyurulan on iki nəfəri abbasilərə tətbiq etmək olmaz. Çünki onların da sayı on iki nəfərdən çoxdur. Bundan əlavə, onlar "Qul la əsəlukum ələyhi əcrən, illəl-məvəddətə fil-qurba" (Ya Peyğəmbər! (Camaata) de: "Sizdən ən "yaxınlarım"a məhəbbət bəsləməkdən başqa heç bir mükafat istəmirəm!") – ayəsinin və "Kisa" hədisinin ehtiramını saxlamadılar. Buna əsasən, bu hədisi Peyğəmbər (s)-in Əhli-beytindən ibarət on iki imamdan başqalarına tətbiq etmək mümkün deyildir. Çünki onlar öz zəmanələrinin ən elmli, bilikli, təqvalı və alicənab şəxsləri olmuş, əsil-nəsəbcə hamıdan fərqlənmişlər."(١)

Əvvəlcə əhli-sünnədən olub, sonra isə şiəliyi seçən doktor Məhəmməd Ticani Səmavi şiə olmasının səbəbi barədə yazdığı "Lə əkunə məəs-sadiqin" (Düz danışanlarla birgə olam) adlı kitabında bu məsələ ilə əlaqədar qısa və eyni zamanda dolğun mənalı qeydlərini belə yazır: "On iki imam barəsində olan hədisləri imamiyyə şiələrinin qəbul etdikləri on iki nəfərdən ibarət Əhli-beyt imamlarından başqasına aid etmək və yozmaq düzgün deyildir. Əhli-sünnə alimləri və şəxsiyyətləri bu müəmmanı həll etməlidirlər. Çünki onların səhih



---

١- [١]. "Yənabiul-məvəddət", səh. ۴۴۶, ٧٧-ci bölümün davamı.

kitablarında nəql olunan on iki imamın kimlərə aid olması indiyə qədər hələ müəmmalı (qalmış və ona heç bir cavab tapmamışlar.”(١)

Maraqlıdır ki, bəziləri bu hədisi Əhli-beytdən (ə) başqalarına aid etmək istədikdə, qəribə zəhmətlərə düçar olmuş; biri Yezid və onun kimilərini, guya İslamı qüdrətli və izzətli etdiyinə görə on iki nəfərdən hesab etmişsə, digəri isə on iki nəfərin sayını .düzəltmək üçün bəzi xəlifələrin adını istədikləri kimi silmişlər

Bizim nəzərimizcə, onlar heç olmazsa, sakit qalıb bu hədis barəsində bir söz deməsəydilər, daha abırlı olardı. Bundan da qəribəsi və maraqlısı budur ki, həcc səfərlərinin birində Məscidül-Həramda Məkkə alimlərinin birindən bu hədislə əlaqədar belə bir fikri eşitdim: “On iki imamın dörd nəfəri ilk dörd xəlifədir, səkkiz nəfəri isə ”!gələcək zamanlarda zühur edəcəkdir

Halbuki bu hədisi oxuyan hər kəs on iki imamın varlığının hər bir zamanda, ardıcıl olduğunu başa düşür. “Bu din aradan getməyəcək, həmişə izzətli və yenilməz olacaqdır!”, yaxud “Bu din aradan getməyəcək və qiyamət gününə qədər duracaqdır!” – kimi ibarələr açıq-aşkar göstərir ki, Peyğəmbəri-Əkrəm (s)-in on iki nəfərdən ibarət .xəlifələr silsiləsi dünyanın sonuna qədər davam edəcəkdir

Bu bəhsimizi də Hafiz Əbu Nəim İsfahaninin “Hilyətül-övliya” adlı kitabında nəql olunan bir hədislə sona yetiririk. İbn Abbas Peyğəmbəri-Əkrəm (s)-dən belə nəql etmişdir: “Hər kim mənim kimi yaşayıb, mənim kimi ölmək və Rəbbimin saldığı “Ədn” bağında məskunlaşmaq istəyirsə, məndən sonra Əlini, onun vəlisini (dostunu) sevsin və (məndən sonra gələn imamlara tabe olsun. Çünki onlar mənim Əhli-betimdirlər!”(٢)

### BİR İNCƏLİK

Burada mühüm bir məsələyə də qısa işarə edərək geniş izahını gələcək bəhslərə həvalə edirik. Şiə və sünnü “təriqi”lə nəql olunan rəvayətlərin çoxunda on iki imamın adı Əhli-beyt məktəbinin



---

.Lə əkunə məəs-sadiqin”, səh. ١۴۶“ . [١] -١

ardıcıllarının qəbul etdiyi kimi gəlmiş, bəzisində isə yalnız onların birincisi olan imam Əli (ə) və axırıncısı olan imam Məhdi (ə)-ın "Əvvəluhum Əliyyun və axiruhum Məhdiyy!" (onların birincisi Əli, sonuncusu isə Məhdidir!) – adları çəkilmiş, bəzilərində də üçüncü imam – həzrət Hüseynin (ə) adına işarə edilmişdir. O həzrət barəsində Peyğəmbəri-Əkrəm (s)-dən belə nəql olunmuşdur:

هذا اِبْنِی اِمامٌ، اِبْنُ اِمامٍ، اَخُ اِمامٍ، اَبُوا اَئِمَّهٍ تِسْعَهٍ:

"Mənim bu övladım (Hüseyn (ə)) imam, imam övladı, imam qardaşı və doqquz imamın atasıdır!"(۱)

Hətta bu hədisdə də bütün on iki imama işarə edilmişdir.

## YER ÜZÜ İLAHİ HÖCCƏTDƏN BOŞ QALMAZ

Rəvayətlərdə təkid edilən mühüm məsələlərdən biri də yer üzünün ilahi höccətsiz qalmamasıdır. Əhli-beyt imamlarından bizə gəlib çatan çoxlu rəvayətlərdə bu məzmuna dəfələrlə toxunulmuş və yer üzünün imamsız (yaxud peyğəmbərsiz), ümumiyyətlə, ilahi höccətsiz qalmayacağı göstərilmişdir. "Üsuli-kafi" kitabının iki bölümü bu məsələyə həsr edilmişdir: bir bölümdə "İnnəl-ərzə la təxlu min höccətin" (Həqiqətən yer üzü höccətsiz qalmaz!) – adı ilə imam Baqir (ə), imam Sadiq (ə), imam Riza (ə) və digər imamlardan on üç rəvayət, ikinci bölümdə isə "İnnəhu ləv ləm yəbqə fil-ərzi rəculani lə-kanə əhəduhuməl-höccətə" (Həqiqətən, yer üzündə yalnız iki nəfər insan qalsa, onların biri ilahi höccətdir!) – adı ilə beş rəvayət qeyd edilmişdir(۲) ki, aşağıda hər iki bölümün rəvayətlərinin bir qisminə işarə edəcəyik:

İmam Sadiqdən (ə) nəql olunan bir hədisdə belə buyurulur:

اِنَّ الْاَرْضَ لا تَخْلُوا اِلاّ وَفیها اِمامٌ کَیْما اِنْ زادَ الْمُؤْمِنُوا شَیْئاً رَدَّهُمْ وَاِنْ نَقَصُوا شَیْئاً اَتَمَّهُ لَهُمْ:

"Yer üzü heç vaxt imamsız qalmaz; əgər möminlər (səhvən ilahi təlimlərdə) bir şeyi artırsalar, onların qarşısını alar, əgər bir şeyi azaltsalar,

Mərhum Əllamə “Kəşfül-murad” (“Şərhu təcridil-əqaid”) kitabında yazır: “Bu . [۱] -۱ hədis “təvatür” həddində Peyğəmbəri-Əkrəm (s)-dən nəql olunmuşdur.” (“Kəşfül-murad”, ۱-ci cild, səh. ۱۷۸-۱۷۹.)

.Üsuli-kafi”, ۱-ci cild, səh. ۱۷۸-۱۷۹“ . [۲] -۲

(onu bərpa edər."(١)

Yenə o həzrətdən nəql olunan başqa bir hədisdə buyurulur: "Allah-taalanın yer üzünü ədalətli bir imamsız qoyması qeyri-mümkündür!"(٢)

Hətta bəzi hədislərdə göstərilir ki, əgər yer üzü bir an belə, imam və ilahi höccətsiz qalsa, zəlzələ baş verərək yer əhlini özünə çəkər.(٣)

İmam Sadiqin (ə) buyurduğu bir hədis belədir:

لَوْ کانَ النّاسُ رَجُلَیْنِ لَکانَ اَحَدُهُما الْاِمامُ:

"Əgər dünyada yalnız iki nəfər belə qalsa, onların biri mütləq imamdır!"

Başqa bir hədisdə isə belə buyurmuşdur:

وَاِنَّ آخِرَ مَنْ یَمُوتُ اَلْاِمامُ

"Həqiqətən, (dünyada) hamıdan axırda ölən şəxs imam olacaq!"(٤)

"Üsuli-kafi" kitabında nəql olunan on səkkiz rəvayətdən başqa "Nəhcül-bəlağə"də də buna aydın işarə edilmiş, imam Əlinin (ə) Kumeyl ibn Ziyada buyurduğu mühüm bəyanatında belə göstərilmişdir:

اَللّهُمَّ بَلی لا تَخْلُوا الْاَرْضُ مِنْ قائِمٍ لِلّهِ بِحُجَّةٍ، اِمّا ظاهِراً مَشْهُوراً وَاِمّا خائِفاً مَغْمُوراً، لِئَلّا تَبْطُلَ حُجَجُ اللهِ وَبَیِّناتُهُ:

"Yer üzü heç vaxt (dinin dayağı olan) ilahi höccətsiz qalmaz, mümkündür o, aşkara çıxaraq tanınsın, yaxud da gizli qalaraq məxfi dolansın. Səbəbi də budur ki, Allahın dəlil və aydın nişanələri aradan getməməli, həmişə yer üzündə mövcud olmalıdır!"(٥)

Mərhum Əllamə Məclisi "Biharul-ənvar" kitabının ٢٣-cü cildinin "Əl-iztiraru iləl-höccəti" (İlahi höccətin vücudunun zəruriliyi) bölümündə bu məsələ ilə əlaqədar on səkkiz hədis nəql etmişdir ki, onların bir qismini "Üsuli-kafi"dən, çox hissəsini də digər kitablardan nəql etmişdir.(٦)

Beləliklə, hər bir əsr və dövrdə yer üzü ilahi höccətsiz deyildir və

---

.Yenə orada, ۱-ci bölüm, hədis: ۲ və ۶ . [۱] -۱

.Yenə orada . [۲] -۲

.Yenə orada, hədis: ۱۱-۱۳ . [۳] -۳

Yenə orada, “Ənnəhu lov ləm yəbqə illa rəculani lə kanə əhəduhuməl-imam” . [۴] -۴
.bölümü, hədis: ۳

.Nəhcül-bəlağə”, xütbə: ۱۴۷“ . [۵] -۵

.Biharul-ənvar”, ۲۳-cü cild, səh. ۱-۵۶“ . [۶] -۶

bu məsələ Əhli-beyt (ə) məktəbinin şübhəsiz etiqadlarındandır. Hətta imam Kazimdən (ə) nəql olunan bir hədisdə belə buyurulur: “Yer üzü bir göz qırpımı qədər belə, ilahi höccətsiz qalmayacaq, istər aşkar tanınsın, istərsə də gizli yaşasın!”(١)

### İLAHİ HÖCCƏTİN ZƏRURİLİYİNƏ AİD QURAN AYƏLƏRİ VƏ MƏNTİQLİ DƏLİLLƏR

Yuxarıda qeyd edilən rəvayətlər əqli sübutlarla da uyğun gəlir. Çünki bəhsimizin əvvəlində hər bir əsr və dövrdə bir imam, yaxud bir peyğəmbərin vücudunun zərurəti, habelə onların vücudu olmadığı təqdirdə, fitnə-fəsadların yaranması ilə əlaqədar “lütf qanunu”(٢) yer kürəsində yalnız iki nəfər olsa belə, həmişə öz qüvvəsini daşıyır.

Lütf qanunu”nda belə deyilir: “İnsanı səadət və təkamülə yetirmək məqsədilə“ yaradan, onun boynuna müəyyən vəzifələr qoyan Xaliqə onun hidayət və tərbiyəsi ilə əlaqədar qabaqcadan bir sıra hazırlıq görmək və o yüksək hədəfə nail olmaq üçün onun ixtiyarına kifayət qədər vəsait vermək vacibdir. Əgər O, belə etməzsə, məqsədində nöqsana yol vermiş olar, halbuki mütləq hikmət sahibindən heç vaxt belə bir iş gözlənilmir!”

Şübhəsiz, insan yalnız əql, yaxud adi rəhbərin varlığı ilə xəta, səhv və günahlardan qoruna bilməz. Başqa sözlə desək, insan tək özü həmin məqsədə – ilahi itaət və əbədi səadətə nail ola bilməz, hətta bu zərurətdən əlavə, ilahi elmə yiyələnən, xəta, səhv və günahdan uzaq olan örnəyə də möhtacdır ki, haqq qəti aydınlaşsın və həqiqət yolu bilinsin.

Bu dəlil hər bir əsr və dövrə böyük və kiçik, hətta iki nəfərdən ibarət qrupa da aiddir. Buna əsasən, əgər yer kürəsində yalnız iki nəfər qalsa belə, onlardan biri ya məsum imam, ya da ilahi peyğəmbər olmalıdır.

Ümumiyyətlə, əvvəlki hədislərə əsasən, Allah-taalanın insanları səadət və təkamülə çatdırmaq məqsədilə yaratdığı halda, onlara



---

١- [١]. “Biharul-ənvar”, ٤٧-ci cild, səh. ٤١.

٢- [٢]. Kəlam elmində Allahın mərhəmətilə əlaqədar əqli bir dəlil.

düzgün yolu göstərməməsi Onun pak və uca məqamından çox uzaqdır. Bu məna .Qurani-Kərimin bir sıra ayələrində də gözə çarpır

İnnəma əntə munzirun və li-kulli qovmin hadin!” (Ya Peyğəmbər! Sən yalnız“ qorxudansan və hər tayfanın bir rəhbəri, hidayət edəni vardır!)(١) – ayəsi göstərir ki, bütün dövrlərdə hər tayfa və qövmün bir hidayətçisi vardır. (Burada hidayətçidən məqsəd, xəta və günahdan uzaq olan şəxsdir.) İmam Baqirdən (ə) bu ayənin təfsiri ilə :əlaqədar nəql olunan bir hədisdə belə buyurulur

...وَ فِی کُلِّ زَمانٍ اِمامٌ مِنّا یَهْدِیهِمْ اِلی ما جاءَ بِهِ رَسُولُ اللهِ (ص):

Hər bir dövrdə bizim aramızdan insanlara Peyğəmbəri-Əkrəm (s)-in gətirdiklərinə...“ (yönəldən bir imam vardır!”(٢)

Nəhcül-bəlağə”də buyurulan rəvayətin ibarəsində də məntiqli bir dəlil vardır. O da“ budur ki, imamın vəzifələrindən biri Peyğəmbərin irsi və ilahi təlimlərin əsaslarını təhriflərdən qoruyub-saxlamaqdır. Başqa sözlə desək, əgər yer üzündəki bütün insanları kafir fərz etsək, yenə də ilahi təlimləri və peyğəmbərin irsini qoruyan bir kəsin varlığı zəruridir və onları hidayət proqramı kimi gələcək nəsillərə çatdırmalıdır ki, Qurani-Kərimdə buyurulduğu kimi, ilahi höccətlər, Allahın dəlil və aydın nişanələri .aradan getməsin

Burada artıq “ümumi vilayət”lə əlaqədar bəhsi sona yetirir və diqqətinizi imamın .şərtləri və xüsusiyyətlərinə yönəldirik



---

١- [١] . “Rəd” surəsi, ayə: ٧.

٢- [٢] . “Biharul-ənvar”, ٢٣-cü cild, səh ٥, hədis: ٩.

## III. İMAMA XAS OLAN SİFƏT VƏ ŞƏRTLƏR

### İşarə

İmam və Peyğəmbər (s)-in canişinin öhdəsinə düşən ən ağır məsuliyyətlərə diqqət yetirdikdə, onun çox mühüm xislətlərə də malik olması labüd görünür. İmamın malik olduğu xislətlər mütləq Peyğəmbəri-Əkrəm (s)-in spesifik xüsusiyyətlərinə az-çox oxşamalıdır. Çünki hər ikisi bir məqsədə qulluq edir və eyni məsuliyyət daşıyırlar. .Peyğəmbər (s) ilkin rəhbər, imamlar isə onun ardıcılları sayılır

Nübüvvət" məqamının tələbi və Peyğəmbər (s)-in öhdəsinə düşən ağır və mühüm" məsuliyyətə əsasən, insanları zəlalət təhlükəsindən xilas etmək, etiqad və əxlaqda, ictimai nizam-intizamda xeyir, səadət və təkamülə çatdırmaq, ilahi qayda-qanunları olduğu kimi yetirmək üçün yüksək elm və biliyə ehtiyac duyulur. Bundan əlavə, insanın cisim və ruhu, ictimai-psixoloji dünyagörüşü və bəşərin tarixi inkişaf prosesi haqqında geniş məlumata malik olmalı, bir sözlə, ümumbəşəri təlim-tərbiyə üsullarını bilməlidir. Peyğəmbərlərin elmi məlumatına uyğun olaraq onların düzgün proqramlar yürütməsi üçün gələcək hadisələrdən az-çox xəbərdar olması da lazımdır. Çünki risalət vəzifəsi .ümumbəşəri xarakter daşıyır

Bu məsələlər azacıq fərqlə məsum imamlar və peyğəmbərlərin canişinlərinə də aiddir. Çünki onlar peyğəmbərlərin məram və yolunu davam etdirirlər. Beləliklə, dini-şəri .proqramlar ilahi canişinlər vasitəsilə möhkəmləndirilir və inkişaf etdirilir

Həmçinin məsum imamlar ilahi peyğəmbərlər kimi, dini göstərişləri hər bir xəta, səhv və azğınlığa düşmədən camaata çatdırmalıdırlar. Əgər onlar xəta və günahdan uzaq .olmasalar, onların təyini faydasız olacaqdır

Eləcə də peyğəmbərlər bütövlükdə din və dünya işlərinin rəhbərliyini əlinə aldıqlarından, onlarda insanların nifrətinə səbəb olan bir sıra zahiri və batini çirkin sifət və xislətlərdən olmamalıdır ki, işlərində maneçilik törətməsin və kimlərisə məqsəddən .yayındırmasın

Bunlar eynilə məsum imamlara da şamildir. Onlar nəinki nifrət oyadan xislətlərdən uzaq, həm də düşüncə və qəlbləri cəzb edən əxlaqi səciyyə və gözəlliklələrə malik .olmalıdırlar

:Hər şeydən öncə imamın elminin hüdudları ilə tanışlıq əhəmiyyət daşıyır

**İMAMIN ELMİ**

Qurani-Kərimin bir çox ayələrində bu məsələ diqqət mərkəzində durur, o cümlədən, :bu ayədə buyurulur

وَإِذَا جَاءهُمْ أَمْرٌ مِّنَ الأَمْنِ أَوِ الْخَوْفِ أَذَاعُواْ بِهِ وَلَوْ رَدُّوهُ إِلَى الرَّسُولِ وَإِلَى أُوْلِي الأَمْرِ مِنْهُمْ لَعَلِمَهُ الَّذِينَ يَسْتَنبِطُونَهُ مِنْهُمْ وَلَوْلاَ فَضْلُ اللّهِ عَلَيْكُمْ وَرَحْمَتُهُ لاَتَّبَعْتُمُ الشَّيْطَانَ إِلاَّ قَلِيلاً

Onlara qələbə və ya məğlubiyyət xəbəri gəldikdə, dərhal (təhqiq etmədən) onu“ yayarlar. Halbuki əgər bunu Peyğəmbərə və ya özlərindən (kifayət qədər elm və qüdrətə malik) olan əmr sahiblərinə desəydilər, əlbəttə, həmin xəbəri onun mahiyyətinə varan şəxslər bilərdilər. Əgər Allahın lütf və mərhəməti üzərinizdə (olmasaydı, şübhəsiz ki, az bir qisminiz müstəsna olmaqla, Şeytana uyardınız!”(١

:Başqa bir ayədə belə buyurulur

فَاسْأَلُواْ أَهْلَ الذِّكْرِ إِن كُنتُمْ لاَ تَعْلَمُونَ

(Əgər bilmirsinizsə, elm əhlindən soruşun!”(٢“

Birinci ayədə göstərilir ki, bəzən müsəlmanlar münafiqlər və İslam düşmənləri

hərdən qələbəyə və məğlubiyyətə, hərdən də digər məsələlərə aid şayiə və xəbərləri yayırdılar. Bu da bəzən onların arasında iğtişaş törədir və ruhdan düşmələrinə səbəb olurdu. Belə hallarda Qurani-Kərim onlara belə məsləhət görür: “Müsəlmanların xəbərsiz olduqları mühüm ictimai məsələlərdə İslam Peyğəmbərinə və ya əmr ”!sahiblərinə müraciət olunsun

Ulil-əmr” – “əmr və fərman sahibləri” deməkdir. Şübhəsiz, burada bu söz ordu“ sərkərdələri mənasını daşımır. Çünki ayənin davamında buyurulur: “Əlbəttə, həmin xəbəri onun mahiyyətinə varan şəxslərə desəydilər, onlar bilərdilər.” Deməli, xəbərsiz olanlar onlara müraciət etməlidirlər. (Diqqət yetirmək lazımdır ki, “yəstənbitunəhu” “nəbət” sözündən götürülmüş, əslində “quyudan çəkilən ilk su” mənasını ifadə edir. (.Müxtəlif dəlil və şahidlərin araşdırılmasına “istinbat” deyilir

Bunu isə başçı və ordu sərkərdələrinə deyil, alimlərə aid etmək olar. Beləliklə, müsəlmanlara xəbərdarlıq edilir ki, həssas və mühüm hadisələrdə agah olan “əmr .sahibləri”nə müraciət etsinlər

Ayədə qeyd edilən “ulil-əmr”in (əmr sahiblərinin) kimlər olduğu barədə təfsirçilər arasında fikir ayrılığı vardır ki, əvvəldə qeyd etdiyimiz kimi, bəziləri onu (xüsusilə Peyğəmbər (s)-in iştirak etmədiyi müharibələrdəki) ordu sərkərdələrinə, bəziləri fəqih və alimlərə, bəziləri ilk dörd xəlifəyə, bəziləri vəzifə sahiblərinə, bəziləri də məsum .imamlara aid etmişlər

Bu beş təfsir arasında sonuncusu daha münasibdir. Çünki ayənin davamında “əmr sahibləri” üçün qeyd edilən iki xüsusiyyətə görə, onu məsumlardan başqasına aid .etmək olmaz

Birinci xüsusiyyət belə vəsf edilir: “Xəbərin mahiyyətinə varan əmr sahiblərinə müraciət etsələr, onlara yol göstərərlər!” Bunun zahiri mənası budur ki, əmr sahiblərinin elmi əsla nöqsan, şəkk-şübhə və xətaya uğramaz. Bu isə məsumlardan .qeyrisinə aid deyildir

İkinci xüsusiyyətdə, əmr sahiblərinin varlığı bir növ ilahi lütf və mərhəmət hesab edilir, .insanlar onlara itaət etməklə şeytana uymaqdan yayınırlar

şeytana uymağın qarşısını kəsir. Çünki məsum olmayanların özləri də xəta və günaha, şeytanın tələsinə düşə bilərlər!

Əhli-beyt (ə) və əhli-sünnə “təriq”ilə bizə gəlib çatan bir çox rəvayətlərdə “əmr sahibləri” məsum imamlara təfsir edilmişdir.

Mərhum Təbərsi “Məcməül-bəyan” kitabında imam Baqirdən (ə) nəql etmişdir ki, onlar məsum imamlardır.(١)

“Təfsiri-Əyyaşi”də imam Riza (ə)-dan nəql olunan bir hədisdə belə buyurulur:

يَعْنِى آلَ مُحَمَّدٍ، وَهُمُ الَّذِينَ يَسْتَنْبِطُونَ مِنَ الْقُرآنِ وَيَعْرِفُونَ الْحَلالَ وَالْحَرامَ وَهُمْ حُجَّةُ اللهِ عَلى خَلْقِهِ:

“Məqsəd Mühəmməd (s)-in övladlarıdır. Onlar Quranı izah edənlər, halal və haramı tanıyanlar və insanlar üzərində ilahi höccətlərdir!”(٢)

Şeyx Səduq “Kəmalud-din” kitabında(٣) imam Baqirdən (ə) belə nəql edir: “Allahın vilayət (rəhbərlik) və ilahi elminə yiyələnənləri Peyğəmbərin Əhli-beytindən başqasına aid edən kəs Allahın əmrinə qarşı çıxmışdır.”

İkinci ayədə (Qurani-Kərimin “Nəhl” və “Ənbiya” surələrindəki “Fəsəlu əhləz-zikr, in kuntum la tələmun” – ayəsində) isə bütün insanlara göstəriş verilir ki, bilmədiklərini elm və bilik əhlindən soruşsunlar.

Şübhəsiz, ayədə qeyd olunan “zikr” sözü “elm, bilik və məlumat” mənasını bildirir. Ümumiyyətlə, “əhləz-zikr” sözü bütün elmli, bilikli və məlumatlı şəxslərə aid ola bilər. Buna görə də təqlid məsələsində bir şəxsin alimə müraciət etməsini sübut etmək üçün bu ayəyə istinad edilir. Lakin onun tam mənada həqiqi timsalı elmini Allah və Peyğəmbər (s)-dən irs alanlardır ki, onların elmi xəta və səhvdən uzaq, ismət məqamı ilə birgədir. Məhz buna görə də həmin ayə Əhli-beyt və məsum imamlara təfsir edilmişdir. Belə ki, imam Riza (ə)-dan nəql olunan bir hədisdə bu ayə ilə əlaqədar sualın cavabını belə vermişdir: “Elm və bilik əhli bizik və (hər şeyi) bizdən soruşmaq lazımdır!”(٤)

Diqqət yetirmək lazımdır ki, bu və buna oxşar fikirlər əhli-sünnənin on ikiyə yaxın təfsir

kitabında nəql olunmuşdur. Həmin



---

.Məcməül-bəyan”, ۳-cü cild, səh. ۸۲“ . [۱] -۱

.Kənzud-dəqaiq” təfsiri, ۳-cü cild, səh. ۴۸۶“ . [۲] -۲

.Yenə orada . [۳] -۳

.Burhan” təfsiri, ۲-ci cild, səh. ۳۶۹“ . [۴] -۴

təfsir kitabları aşağıdakı alimlərin əsərləridir: Əbu Yusif, İbn Həcər, Müqatil ibn Süleyman, Vəki ibn Cərrah, Yusif ibn Musəl-Qəttan, Qəttadə, Hərbut-Tai, Südey, .Mücahid, Müqatil ibn Həyyan, Əbu Saleh və Məhəmməd ibn Musa Şirazi

Bu təfsir kitablarında İbn Abbasdan nəql olunur ki, “Elm əhlindən soruşun!” – ayəsindən məqsəd Məhəmməd (s), Əli, Fatimə, Həsən və Hüseyndir (ə). Onlar elm, (bilik və əql sahibləri, Peyğəmbərin Əhli-beytidirlər!(١

Bir sözlə, ayənin məfhumu geniş olsa da, onun kamil nümunəsi elmi xəta və səhvsiz olan məsum imamlarda təsəvvür olunur. Ayə keçmiş peyğəmbərlərin nişanələri, Tövrat, İncil, yəhudi və məsihi alimlərindən sualla əlaqədar nazil olsa da, onun mənası .deyilənlərlə heç bir ziddiyyət təşkil etmir

Bildiriş: Əvvəldə deyildiyi kimi, “peyğəmbərlərin elmi məqamı” ilə əlaqədar insanların bütün maddi və mənəvi yönlərdə hidayəti, onların cisim və can, dünya və axirətini öhdələrinə götürən ilahi elçilər vəzifələrini layiqincə yerinə yetirmək üçün mütləq qeyri-adi elm və biliyə malik olmalıdırlar. Peyğəmbərin canişinləri olan imamlar da belədir. Onların üzərinə düşən ağır məsuliyyətə görə qeyri-adi elm və biliyə yiyələnmələri zəruridir Çünki insanlar onlara etimad etməli, dinin rəhbərliyini onlara .tapşırmalıdırlar

Bu elm və bilik xəta, səhv və nöqsandan uzaq olmalıdır, əks təqdirdə insanların etimadını qazana bilməyib, istədikləri öz fikir və nəzərlərini peyğəmbər və imamın nəzərindən üstün tutacaqlar. Belə isə peyğəmbər və imamın xəta və səhvi qeydsiz-şərtsiz təslimin qarşısını alır və mütləq etimadı qazanmaq üçün onların ismət .məqamında olması zəruri görünür

:Qurani-Kərimdə Bəni-İsrailin rəhbəri seçilən Talut haqda belə buyurulur

إِنَّ اللَّهَ اصْطَفَاهُ عَلَيْكُمْ وَزَادَهُ بَسْطَةً فِي الْعِلْمِ وَالْجِسْمِ

Allah-taala sizdən ötrü onu seçmiş, elm və bədəncə (qüvvəcə) ona“

(üstünlük verilmişdir!”(١)

Allah-taala Bəni-İsrailin bəhanə axtarıb “Biz hökmdarlığa daha layiq ikən və ona var-dövlət verilmədiyi halda, o, necə bizə padşah ola bilər?”(٢) – sözləri müqabilində buyurdu ki, ilahi rəhbərlik “elm” və “güc-qüvvə” ilədir və Biz ona kifayət qədər bəxş etmişik.

Həzrət Yusif (ə) Misirin hökumət işində – “beytül-mal”ın (ümumi əmlak, maliyyə işləri) idarəsini öhdəsinə götürməyi özünə layiq gördükdə, elm, bilik və əmanətdarlığa istinad edərək buyurdu:

اجْعَلْنِي عَلَى خَزَآئِنِ الأَرْضِ إِنِّي حَفِيظٌ عَلِيمٌ

“Məni Misirin xəzinələrinə məmur təyin et, çünki mən qoruyan və bilənəm!”(٣)

Peyğəmbərlərin elmi barəsində qeyd etdiyimiz kimi, onlar öz vəzifələrini layiqincə yerinə yetirmək üçün mütləq qeyb aləmindən xəbərdar olmalıdır və bu imamlara da aiddir. Onların vəzifələri cahanşümul və dünyamiqyaslı olduğundan, dünyanın bir çox sirlərindən, o cümlədən, keçmiş və gələcəkdən də xəbərdar olmaları zəruridir. Məgər mümkün ola bilərmi ki, keçmiş və gələcəkdən xəbərdar olmadıqları halda, vəzifələrini layiqincə yerinə yetirsinlər?! Onların işi zahir və batin, daxil və xariclə birbaşa əlaqədardır. Belə mühüm işləri qeyb aləmindən xəbərsiz yerinə yetirmək qeyri-mümkündür. Bunu imam Sadiqin (ə) diqqəti cəlb edən ibarələrlə buyruğunda görmək olar:

مَنْ زَعَمَ اَنَّ اللهَ يَحْتَجُّ بِعَبْدٍ فِى بِلادِهِ ثُمَّ يَسْتُرُهُ عَنْهُ جَميعَ ما يَحْتاجُ اِلَيهِ فَقَدِ افْتَرى عَلَى اللهِ:

“Hər kəs yer üzündə bir bəndənin Allahın höccəti olduğunu, sonra isə Allahın bəndəsinin ehtiyac duyduğunu ondan gizlətdiyini güman edərsə, Allaha iftira yaxmışdır!”(٤)

Bəli, keçmiş, indiki və gələcəklə əlaqədar hadisələrin sirlərindən agah olmaq həqiqətdə ilahi höccətin xüsusiyyəti, eləcə də insanların hidayəti ilə bağlı əsas vəzifələrin yerinə yetirilməsi üçün bir alətdir. Bir sözlə, imamət məqamının ilk şərti qeyri-adi elmə yiyələnməsi,

---

۱- [۱]. “Bəqərə” surəsi, ayə: ۲۴۷.

۲- [۲]. “Bəqərə” surəsi, ayə: ۲۴۶.

۳- [۳]. “Yusif” surəsi, ayə: ۵۵.

۴- [۴]. “Bəsairud-dərəcat”, “Biharul-ənvar” kitabından nəqlən, ۲۶-cı cild, səh. ۱۳۷.

bütün dini maarifdən, cəmiyyətin ehtiyaclarından, onların təlim-tərbiyəsi, hidayət və idarəsi ilə əlaqədar məsələlərdən tam xəbərdar olmaqdır. Qeyri-adi elm və biliksiz belə ağır məsuliyyəti (imamət məqamını) kimsəyə tapşırmaq olmaz.

## İMAMLARIN ELMİ MƏNBƏLƏRİ

Məsum imamların elmilə bağlı diqqəti cəlb edən ən mühüm məsələ onların elmi mənbələridir. Görəsən, onlar din və dünya ilə əlaqədar bu qədər məlumatı haradan almışlar? Onlara vəhyin nazil olmadığı, Peyğəmbəri-Əkrəm (s)-in vəfatından sonra vəhyin kəsildiyinə heç bir şəkk-şübhə qalmadığı halda, şəriət məsələlərini, İslam və müsəlmanların məsləhətlərini, ümmətin hidayətilə bağlı zərurətlərini, eləcə də keçmiş və gələcəyi haradan bilirdilər?

Quran ayələri və rəvayətlərdəki geniş bəyanlara diqqət yetirdikdə, bir çox mənbələr gözə dəyir ki, onlar aşağıdakılardan ibarətdir:

a) Allahın kitabı Qurani-Kərim (kamil şəkildə agah olmaq şərtilə): Məsum imamlar Qurani-Kərimin bütün təfsir və "təvil"ini, zahir və batinini, "möhkəm və mütəşabih" ayələrini çox gözəl bilirdilər. Qurani-Kərimdə buyurulur:

وَيَقُولُ الَّذِينَ كَفَرُواْ لَسْتَ مُرْسَلاً قُلْ كَفَى بِاللّهِ شَهِيدًا بَيْنِي وَبَيْنَكُمْ وَمَنْ عِندَهُ عِلْمُ الْكِتَاب

Kafirlər "Sən peyğəmbər deyilsən!" – deyirlər. Onlara belə cavab ver: "Mənimlə sizin aranızda Allahın və kitabdan xəbərdar olan kəsin şahid olması kifayətdir!"(۱)

Bu ayədən aydın başa düşülür ki, Allahın kitabından agah olanlar vardır. Diqqət yetirmək lazımdır ki, "elmül-kitab" (kitabdan xəbərdar olmaq) mütləq şəkildə (qeydsiz) işlədildiyindən, bütün ilahi kitablarda mövcud olanlara şamildir. Lakin "Nəml" surəsinin ۴۰-cı ayəsində Allahın kitabından cüzi xəbərdar olan kəs haqda buyurulur:

قَالَ الَّذِى عِندَهُ عِلْمٌ مِّنَ الْكِتَابِ أَنَا آتِيكَ بِهِ قَبْلَ أَن يَرْتَدَّ إِلَيْكَ طَرْفُكَ

"Kitabdan bir qədər bilən kəs dedi: "Mən onu sənə bir göz qırpımında gətirərəm!"

Şübhəsiz, Allahın kitabı elm və bilik mənbəyi, hər işin açarıdır.

Belə ki, Süleyman peyğəmbərin vəziri Asəf ibn Bərxiya Allahın kitabından cüzi xəbərdar olduğu halda, zahirən mümkün olmayan bir işin yerinə yetirilməsini öhdəsinə götürdü və Səba padşahının taxtını bir göz qırpımında Ərəbistanın cənubundan (Yəməndən) şimalına (Suriyanın Şam şəhərinə - Süleyman peyğəmbərin hökumət mərkəzinə) gətirdi. Şübhəsiz, Allahın bütün kitabı və onda olan bütün elmlərdən agah olan şəxs hər çətin və ağılagəlməz işləri görməyə qadirdir. Amma "Görəsən, kim "kitabın elmi"nə vaqifdir və Allahın kitabını bilənlər kimdir?" – sualının cavabı Qurani-Kərimdə üstüörtülü qeyd edilmişdir.

Bəzilərinin əqidəsinə görə, həmin şəxs Allahın Özüdür. (Belə olduqda, "mən indəhu elmul-kitab" (kitabdan xəbərdar olan kəs) – cümləsi kəlamın zahirinin əksinə olan bir təfsir bağlayıcısından ibarət olacaqdır!)

Bəzi təfsirçilərin nəzərinə görə, məqsəd əvvəllər kitab əhlindən olan, İslam Peyğəmbərinin (s) nişanələrini keçmiş səmavi kitablarda görən və onun haqq olduğunu qəbul edən Salman Farsi və Abdullah ibn Salam kimi alimlərdir.

Lakin bir çox təfsir alimləri yazmışlar ki, bu ayə Əli ibn Əbi Talib (ə) (hidayət imamı) barəsindədir.

Məşhur təfsirçi Qurtubi bu ayənin təfsirilə əlaqədar Abdullah ibn Ətadan belə nəql edir: "Mən Əbu Cəfər ibn Əli ibn Hüseynə "Camaat elə güman edirlər ki, ayədə qeyd olunan "əlləzi indəhu elmul-kitab" (kitabı bilən şəxs) – ibarəsindən məqsəd Abdullah ibn Salamdır!" – dedikdə, o dedi: "O (Allahın kitabını bilən) kəs, yalnız Əli ibn Əbi Talibdir." (Bunu Məhəmməd ibn Hənəfiyyə də təsdiq etmişdir." (١)

Diqqəti cəlb edən budur ki, bu surə ("Rəd" surəsi) Məkkədə nazil olmuşdur, halbuki Abdullah ibn Salam, Salman Farsi və kitab əhlindən olan digər alimlər İslam dinini Mədinədə qəbul etmişlər.

Bu fikir Səid ibn Cübeyrdən də nəql olunmuşdur. Belə ki, ondan "ayədə qeyd olunan "mən indəhu elmul-kitab!" (Allahın kitabını bilən şəxs!) Abdullah ibn Salamdırmı?" – deyə soruşduqda, belə

(cavab vermişdi: “O deyildir, çünki bu surə Məkkədə nazil olmuşdur!”(1)

Həmçinin Şeyx Salman Qunduzi Hənəfi(2) “Yənabiul-məvəddət” kitabında Sələbi, İbn Məğazili və Abdullah ibn Ətadan nəql edir ki, Mühəmməd Baqirlə (ə) birgə məsciddə oturmuşdum. Bu zaman Abdullah ibn Salamın oğlunu görüb dedim: “Bu Allahın kitabını bilən şəxsin oğludur!” Mühəmməd Baqir (ə) buyurdu: “(Xeyr!) Bu ayə Əli ibn Əbi Talibin (ə) barəsində nazil olmuşdur.”(3)

Həmin kitabda başqa bir rəvayətdə Ətiyyə Ovfi, Əbu Səid Xudridən belə nəql edir: “Peyğəmbəri-Əkrəm (s)-dən “əlləzi indəhu elmun minəl-kitab” (“Nəml” surəsinin 40-cı) – ayəsi haqda soruşduqda, o həzrət buyurdu: “O, qardaşım Süleyman ibn Davud peyğəmbərin vəziri idi!” Sonra “De ki, Allah və Onun kitabından xəbərdar olan şəxsin mənimlə sizin aranızdakı şahidliyi mənə bəsdir!” – ayəsinin kimin haqqında nazil olduğunu soruşduqda, buyurdu: “O, qardaşım Əli ibn Əbi Talibdir!”(4)

Yenə başqa bir rəvayətdə İbn Abbasın belə dediyini görürük: “Allahın kitabını bilən şəxs yalnız Əlidir. O, Quranın təfsir və təvilini, nasix və mənsuxunu bilir!”(5)

Bir sözlə, bu ayəni kitab əhlindən olan alimlərə aid etmək əsla düzgün deyildir. Çünki bu surə Məkkədə nazil olmuşdur və onlar isə hicrətdən sonra Mədinədə İslamı qəbul etmişdilər. Yuxarıdakı rəvayətlərə əsasən, bu ayə imam Əlinin (ə) barəsində nazil olmuşdur (o həzrətdən sonrakı məsum imamlara da elmdən irs çatmışdır).

Bəli, Qurani-Kərim, onun sirr və incəlikləri, zahir və bitininə dərindən yiyələnmə məsum imamların əsas elm mənbələrindəndir.(6)



---

1- [1]. “Əd-durrul-mənsur”, 4-ü cild, səh. 69.

2- [2]. Qunduz – Əfqanıstanın şimalında yerləşən bir şəhərin adıdır və adıçəkilən əhli-sünnə alimi o şəhərə mənsubdur.

3- [3]. “Yənabiul-məvəddət”, səh. 102.

4- [4]. Yenə orada, səh. 103.

5- [5]. Yenə orada, səh. 104.

۶- [۶]. Bu barədə Əhli-beytdən (ə) da çoxlu rəvayət nəql olunmuşdur ki, əlavə məlumat əldə etmək istəyənlər "Kənzüd-dəqaiq" kitabının ۶-cı cildinin ۴۸-cı səhifəsinə, eləcə də "Burhan" təfsirinə (bu ayənin təfsirinə) müraciət etsinlər!

Buna şahid kimi gətirilən ayələrdən biri də “Ali-İmran” surəsinin “Və ma yələmu təviləhu illəllahu vər-rasixunə fil-elm!” (Quranın təvilini Allahdan və elmdə qüvvətli olanlardan başqa heç kəs bilmir!) – ayəsidir.(١)

İzah: Təfsir alimləri arasında “elmdə qüvvətli olanlar” – ibarəsinin “və” bağlayıcısı ilə “Allah” sözünə bağlanmasında fikir ayrılığı vardır. Bəzilərinin nəzərinə görə, “və” bağlayıcısı vasitəsilə “Allah” sözünə bağlanır. Belə olduqda, ayə yuxarıda qeyd etdiyimiz mənanı daşıyıcaqdır. Bəziləri isə deyirlər ki, “elmdə qüvvətli olanlar...” ayrıca, müstəqil cümlədir. Buna əsasən, ayənin mənası belə olacaq: “Quranın təvilini yalnız Allah bilir. Elmdə qüvvətli olanlar isə: “Biz onlara inandıq, onların hamısı Rəbbimiz tərəfindəndir!” – deyirlər!”

İkinci nəzər həqiqətlə uyğun gəlmir və bunun bir neçə səbəbi vardır:

١. Qurani-Kərimdə Allahdan başqa bir kəsin bilmədiyi sirlərin olması qeyri-mümkündür. Quran insanların hidayət və tərbiyəsi üçün nazil olduğundan, onda Allahdan başqa kimsənin bilmədiyi bir cümlə və ayənin olması mənasızdır.

٢. Böyük təfsir alimi Təbərsi “Məcməül-bəyan” kitabında yazdığı kimi, təfsirçilər arasında “filan ayəni Allahdan başqa heç kim bilmir!” – deyən bir təfsirçi hələ görünməmişdir, əksinə onlar həmişə ayələrin sirlərini kəşf etmək üçün müxtəlif yollara, o cümlədən, məsum imamların rəvayətlərinə əl atmışlar. Həqiqətdə, ikinci nəzər bütün təfsir alimlərinin dediklərinin əksinədir.

٣. Əgər məqsəd, elmsiz təslim olmaqdırsa, onda ayədə “elmdə qüvvətli olanlar” deyil, “imanda qüvvətli olanlar” ibarəsi işlədilməli idi. Bir şey bilməyən şəxsə “elmdə qüvvətli olan” adını vermək olarmı?!

٤. Bir çox rəvayətlərdə “elmdə qüvvətli olanlar”ın Quran ayələrinin “təvil” və batinini bildikləri nəql olunmuşdur. Bu isə həmin ibarənin “və” bağlayıcısı ilə “Allah” sözünə bağlandığını göstərir.

İmam Sadiqdən (ə) nəql olunan bir hədisdə belə buyurulur: “Elmdə qüvvətli olanlar (Əmirəlmöminin və ondan sonrakı imamlardır!”(1)

Yenə başqa bir hədisdə belə buyurmuşdur: “Elmdə qüvvətli olanlar və Quranın təvilini (bilənlər bizik!”(2)

İmam Baqir (ə) (yaxud imam Sadiq (ə)) “Quranın təvilini Allah və elmdə qüvvətli :olanlardan başqa kimsə bilməz!” – ayəsinin təfsirini belə açıqlamışdır

فَرَسُولُ اللهِ اَفْضَلُ الرّاسِـخِينَ فِی الْعِلْمِ، قَدْ عَلَّمَهُ اللهُ عَزَّوَجَلَّ جَميعَ ما اَنْزَلَ عَلَيهِ مِنَ التَّنْزِيلِ وَالتَّأوِيلِ، وَما كانَ اللهُ لِيُنَزِّلَ عَلَيهِ شَيْئاً لَمْ يُعَلِّمْهُ تَأوِيلَهُ، وَاَوْصِيائُهُ مِنْ بَعْدِهِ يَعْلَمُونَهُ كُلَّهُ:

Allahın Rəsulu (s) elmdə qüvvətli olanların ən üstünüdür. Allah-taala “tənzil”dən“ tutmuş “təvil”ə qədər nazil etdiklərinin hamısını ona öyrətdi. Allah-taalanın ona nazil etdiyi bir şeyin təfsir və təvilini öyrətməməsi qeyri-mümkündür. Peyğəmbər (s)-in (vəsiləri(3) də ondan sonra onların hamısını bilirlər!”(4)

(Bu barədə həmin məna və məfhumu yetirən hədislər də çoxdur.(5)

Qeyd etdiyimiz dörd dəlilə əsasən, “elmdə qüvvətli olanlar” ibarəsinin “Allah” sözünə bağlanmasında heç bir şəkk-şübhə qalmır və onlar Quran ayələrinin “təvil” və .batinindən agahdırlar

Diqqəti cəlb edən digər incə bir məsələ budur ki, Qurani-Kərimdə “elmdə qüvvətli olanlar” ibarəsi iki dəfə – bu ayədə (“Ali-İmran” surəsi, ۷-ci ayə), digəri isə “Nisa” surəsində (۱۶۲-ci ayə) işlədilmişdir. “Nisa” surəsinin ۱۶۲-ci ayəsində kitab əhlinin (yəhudi və məsihilərin) sələm, qarət və camaatın əmlakını mənimsəmə kimi bəyənilməz və



---

.Üsuli-kafi”, ۱-ci cild, səh. ۲۱۳, hədis: ۱ və ۳“ . [۱]-۱
.Yenə orada . [۲]-۲
Ərəb dilində “vəsi”, “vəsiyyət”, eləcə də bu kökdən alınan sair sözlərin mənası . [۳] -۳ belədir: “Həyatda olan bir insan başqa biri ilə əhd-peyman bağlayır ki, onun vəfatından

sonra nəzərdə tutduğu müəyyən işləri yerinə yetirsin. Bu vəsiyyəti edən "musi", vəsiyyətin edildiyi şəxs isə "vəsi" adlandırılır. Məsələn, vəsiyyət edən şəxs (musi) öz vəsisinə deyir: "Sənə vəsiyyət edirəm ki, vəfatımdan sonra ailəmə nəzarət et, onların barəsində filan işləri gör..." Bəzən isə başqalarını öz vəsiyyətindən agah edərək deyir: "Filankəsə vəsiyyət etmişəm", yaxud "mənim vəsim filankəsdir!" ("Məalimul-mədrəsətəyn", Əllamə Əskəri, ١-ci cild, səh. ١٧٣.) (Müt.)

[۴]-۴. Yenə orada, hədis: ٢.

[۵]-۵. Əlavə məlumat əldə etmək istəyənlər bu kitablara müraciət etsinlər: "Camiul-əhadis", ١-ci cild, səh. ٢٧; "Kənzüd-dəqaiq" təfsiri, səh. ۴٢-۴۵ və "Üsuli-kafi", ١-ci cild, səh. ۴١۵.

çirkin əməllərinə işarə edildikdən sonra buyurulur: “Lakin onların elmdə qüvvətli olanları və (Peyğəmbərin səhabələrindən olan) möminlər sənə nazil edilənə və səndən əvvəl nazil olanlara (səmavi kitablara) inanırlar!” (Yəni hər iki qrup bütün səmavi (.kitablara, həm Qurani-Kərimə, həm də əvvəlki kitablara iman gətirmişlər

Belə nəzərə çarpır ki, Abdullah ibn Salam və kitab əhlinin İslam dinini qəbul edən digər alimlərinin “elmdə qüvvətli olanlar”a aid edilməsi “Ali-İmran” surəsinin ۷-ci ayəsi ilə deyil, “Nisa” surəsinin ۱۶۲-ci ayəsi ilə əlaqədardır. Çünki bu ayədə kitab əhlinin alimləri haqda söz açıldığı halda, bəhs etdiyimiz ayədə (“Ali-İmran” surəsinin ۷-ci ayəsi) kitab .əhlindən heç bir söz yoxdur

Bir sözlə, “Ali-İmran” surəsinin ۷-ci ayəsinin zahiri mənası budur ki, Quranın “təvil”ini Allah və elmdə qüvvətli olanlar bilirlər. “Elmdə qüvvətli olanlar”ın həqiqi simaları Peyğəmbər (s) və məsum imamlar olduğundan, elə onların elmi mənbənlərindən ən .mühümü də Qurani-Kərim, onun təfsir və təvili, zahir və batinidir

:Bu hissəni Qurani-Kərimin “Ənkəbut” surəsinin ۴۹-cu ayəsi ilə sona çatdırırıq

بَلْ هُوَ آيَاتٌ بَيِّنَاتٌ فِي صُدُورِ الَّذِينَ أُوتُوا الْعِلْمَ

”.Xeyr, bu Quran elm verilmiş kəslərin sinələrində olan açıq-aydın ayələridir“

Əhli-beytin (ə) rəvayətlərinə görə, bu ayədə qeyd olunan “elm verilmiş kəslər” ünvanı (Peyğəmbər (s)-dən sonra) məsum imamlardır. Əlavə məlumat əldə etmək istəyənlər (“Biharul-ənvar” kitabına və “Burhan” təfsirinə müraciət edə bilərlər.(۱

b) Peyğəmbər (s)-in irsi: Məsum imamların elmi mənbələrinin ikincisi Peyğəmbər (s)-dən aldıqları elm irsidir. Belə ki, o həzrət bütün İslam şəriət və maarifini imam Əliyə (ə) öyrətmiş, bəzi rəvayətlərə əsasən, imam Əli (ə) də öyrəndiklərini yazmış, bu elm və bilik nəsildən – nəsilə o həzrətin övladlarına, yəni məsum imamlara



---

Biharul-ənvar”, ۲۳-cü cild, səh. ۱۸۸-۲۰۸ və “Burhan” təfsiri, ۳-cü cild, səh. ۲۵۴-۲۵۶.“ . [۱] -۱
(Bu kitablarda bəhs etdiyimiz mövzu ilə əlaqədar təxminən, iyirmi hədis nəql

keçmişdir. Başqa sözlə desək, İslam rəvayətlərində göstərildiyi kimi, Peyğəmbər (s) .imam Əliyə (ə) elmin min qapısını açdı ki, hər qapıdan min qapı açılırdı

Üsuli-kafi" kitabında bu barədə çoxlu rəvayət vardır. O cümlədən, Əbu Bəsirin belə" dediyi nəql olunur: "İmam Sadiqdən (ə) soruşdum: "Sizin ardıcıllarınız deyirlər ki, Allahın :Rəsulu (s) Əliyə (ə) elmin bir qapısını açdı ki, ondan min qapı açıldı." O həzrət buyurdu

عَلَّمَ رَسُولُ اللهِ عَلِيّاً اَلْفَ بابٍ، يُفْتَحُ مِنْ كُلِّ بابٍ اَلْفَ بابٍ:

Allahın Rəsulu (s) Əliyə (ə) elmin (bir qapı deyil,) min qapısını açdı və hər qapıdan min" ".qapı açıldı

Sonra buyurdu: "Ey Əbu Bəsir! Bizim ixtiyarımızda bir "Camiə" vardır." Əbu Bəsir "Camiə nədir?" – deyə soruşduqda, Həzrət buyurdu: "Allahın Rəsulunun "zira"sı(١) (biləkdən dirsəyə qədər olan məsafə) ilə yetmiş zira uzunluğunda bir səhifədir. O, Peyğəmbər (s)-in öz imlası və Əlinin (ə) dəstxətti ilə yazılmışdır. Onda bütün halal, haram və (qiyamət gününə qədər) insanların ehtiyac duyduqları məsələlər, hətta (bədəndə olan bir cızığın diyəsi (cəriməsi) belə mövcuddur."(٢

Diqqət yetirmək lazımdır ki, "elm şəhəri" adlı məşhur hədislə əlaqədar şiə və sünnülərin mötəbər kitablarında nəql olunan rəvayətlərin sayı olduqca çoxdur. Bu hədisin ravilərindən İbn Abbas, Cabir ibn Abdullah Ənsari, Abdullah ibn Ömər və imam Əlini (ə) misal göstərmək olar. Bu hədis Hakim Nişapurinin "Müstədrək", Əbu Bəkr Nişapurinin "Tarixul-Bağdad", İbn Məğazilinin "Mənaqibu Əmiril-möminin", Gəncinin "Kifayətut-talib", Həməvinimin "Fəraidus-səmteyn", Zəhəbinin "Mizanul-etidal", Qunduzinin "Yənabiul-məvəddət", Nəbhaninin "Fəthul-kəbir"ində və s. kitablarda nəql olunmuşdur.(٣) Bir çox rəvayətlərdə Əhli-beyt



---

Dirsəkdən barmaqların ucuna qədər olan uzunluq ölçü vahididir. Orta hesabla ١ " . [١] -١ .zira " ۴٨ sm-dir

.Üsuli-kafi", ١-ci cild, səh. ٢٣٩" . [٢] -٢

Bax: "Ehqaqul-həqq", ۵-ci cild, səh. ۴۶٨-۵٠١ və "Camiul-əhadis", səh. ١۶, qədim . [٣] -٣

imamlarının belə buyurduğunu görürük: “Biz bütün dediklərimizi Peyğəmbəri-Əkrəm (s)-dən nəql edirik. Çünki bütün bunlar bizə ata-babalarımız vasitəsilə Peyğəmbər (s)-dən çatmışdır!”

İmam Sadiqin (ə) səhabələrindən biri o həzrətə “Biz bəzən sizdən bir hədis eşidir, sonra onun sizdən, yoxsa atanızdan eşitdiyimiz barədə şəkk edirik (bu haqda nə edək?)” – dedikdə, Həzrət buyurdu: “Məndən eşitdiyini atamın və Allahın Rəsulunun (ə) adından rəvayət edə bilərsən!”(١)

Həmçinin buyurmuşdur: “Mənim sözüm atamın, atamın sözü babamın, babamın sözü Hüseynin (ə), Hüseynin (ə) sözü Həsənin (ə), Həsənin (ə) sözü Əmirəlmöminin Əlinin (ə), Əmirəlmöminin Əlinin (ə) sözü Allahın Rəsulunun (s), Allahın Rəsulunun (s) sözü isə Allahın sözüdür!”(٢)

Yenə də başqa bir hədisdə buyurmuşdur: “Hər vaxt sənə cavab versəm, bil ki, o, Allahın Rəsulundandır. Biz özümüzdən heç nə demirik!”(٣)

v) Mələklərlə əlaqə: İmamların elm mənbələrindən biri də mələklərlə rabitədən əldə etdikləridir. Əlbəttə, bu onların peyğəmbərlərin zümrəsinə qoşulduqlarını göstərmir. Bildiyimiz kimi, İslam Peyğəmbəri (s) ilahi elçilərin sonuncusu olmuş və onun vəfatı ilə ilahi vəhy də kəsilmişdir. Qurani-Kərimin ayələrinə əsasən, Xızr (ə), Zül-Qərneyn (ə) və Məryəm (ə) kimi müqəddəs şəxslər mələklərlə əlaqə saxladığı kimi, imamlar da beləcə qeyb aləminin həqiqətlərindən xəbərdar olurdular. İmam Baqirdən (ə) nəql olunan bir hədisdə buyurulur: “Həqiqətən, Əli (ə) “mühəddəs” idi.” (Yəni o, qeyb aləmindən söz alırdı.) O həzrətdən: “Əli (ə) ilə söhbət edən kim idi?” – deyə soruşulduqda, buyurdu: “Onunla mələk söhbət edirdi!” Yenə də o həzrətdən “O, peyğəmbərmi idi?” – deyə soruşulduqda, Həzrət əlini inkar əlaməti olaraq tərpədib buyurdu: “O, eynilə Süleymanın dostu (Asəf ibn Bərxiya), yaxud Musanın dostu (Yuşə



---

١- [١]. “Camiul-əhadis”, ١-ci cild, səh. ١٧, hədis: ۴, “İmamların fətvasının höccət olması” bölümü.

٢- [٢]. Yenə orada, hədis: ١.

ibn Nun və ya Xızr), yaxud da Zül-Qərneyn kimi idi."(١) (Bu barədə çoxlu rəvayət nəql (olunmuşdur.)(٢)

q) Ruhul-qudusun (müqəddəs ruhun) təlqini: İmamların elm mənbələrindən biri də .Ruhul-qudusdan aldıqları təlqinlərdir

İzah: Qurani-Kərimin bir neçə ayəsində "Ruhul-qudus"dan – üç ayədə həzrət İsa (ə)(٣), bir ayədə isə İslam Peyğəmbərinin (s)(۴) "Ruhul-qudus" vasitəsilə qüvvətlənməsindən .– söz açılmışdır

Ruhul-qudus" kimdir, yaxud nədir?" – sualı barəsində təfsirçilər arasında fikir ayrılığı" vardır. Bəziləri onu Cəbrail, bəziləri həzrət İsa (ə), bəziləri İncil, bəziləri də həzrət İsanın (ə) ölüləri diriltməkdə istifadə etdiyi Allahın böyük adı ("ismi-əzəm") kimi təfsir (etmişlər.(۵)

Lakin Qurani-Kərimin ibarələri, eləcə də bir çox rəvayətlərdən başa düşülür ki, "Ruhul-qudus"un müxtəlif mənaları vardır və hər yerdə xüsusi və fərqli məna daşıdığı mümkündür. Qurani-Kərimin bir ayəsində buyurulur: "De: "Ruhul-qudus onu Rəbbi tərəfindən haqq olaraq sənə nazil etdi!"(۶) Zahirən, burada məqsəd Quranı Allah .tərəfindən Peyğəmbəri-Əkrəm (s)-ə nazil edən Cəbrail (ə) nəzərdə tutulmuşdur

Qurani-Kərimin həzrət İsa (ə)-dan söz açan digər üç ayəsində onun başqa məna ifadə etdiyi nəzərə çarpır. Çünki ayələrdə qeyd olunan "əyyədəkə bi-ruhil-qudus!" və yaxud "və əyyədnahu bi-ruhil-qudus" (onu müqəddəs ruhla qüvvətləndirdik!) – kimi ibarələrdə İsa (ə) ilə həmişə birgə olan, onu qüvvətləndirən ruha işarə olunduğu .göstərilir

Əhli-beytdən (ə) nəql olunan rəvayətlərdən də aydın olur ki, "Ruhul-qudus" bütün peyğəmbər və məsumlarla birgə olan, müxtəlif yerlərdə ilahi yardımlar edən -müqəddəs ruhdan ibarətdir. Hətta əhli



---

Üsuli-kafi", ١-ci cild, səh. ٢٧١" .[١]-١

۲- [۲]. Yenə orada.

۳- [۳]. “Bəqərə” surəsi, ayə: ۸۷, ۲۵۳ və “Maidə” surəsi, ayə: ۱۱۰.

۴- [۴]. “Nəhl” surəsi, ayə: ۱۰۲.

۵- [۵]. Bu dörd təfsir “Kənzüd-dəqaiq”, ۲-ci cild, səh. ۷۸-də gəlmişdir. Bəzi məşhur təfsirçilər yalnız birinci təfsiri qeyd etmişlər. Fəxri-Razinin təfsirində üç təfsir görünür: “Cəbrail, İncil və Allahın böyük adı.” (“Kəbir” təfsiri, ۳-cü cild, səh. ۱۷۷).

۶- [۶]. “Nəhl” surəsi, ayə: ۱۰۲.

sünnə mənbələrində nəql olunan bir çox rəvayətlərdən də başa düşülür ki, bəzən onlar mühüm işlər gördükdə, yaxud dərin mənalı fikir və şerlər söylədikdə, onu müqəddəs və pak ruhdan ilham aldıqlarını xəbər verirdilər. O cümlədən, "Əd-durrul-mənsur" təfsirində nəql olunan bir hədisdə buyurulur ki, Peyğəmbəri-Əkrəm (s) İslamın məşhur şairi Həssan ibn Sabit haqda buyurmuşdur: "İlahi! Həssanı, Peyğəmbəri müdafiə etdiyinə görə, müqqədəs ruhla qüvvətləndir!"(١)

İmam Baqir (ə) məşhur Əhli-beyt (ə) şairi Kumeyt ibn Zeyd Əsədi haqda buyurmuşdur: "Peyğəmbəri-Əkrəm (s)-in Həssan ibn Sabit haqda buyurduğu duası sənə də aiddir. Bizi müdafiə etdiyin vaxta qədər, müqəddəs ruh həmişə səninlə olacaqdır!"(٢)

İslamın qorxmaz şairi Dibel Xüzai "Mədarisul-ayat" adlı məşhur qəsidəsindən iki beyt oxuduğu zaman imam Riza (ə) ağlayaraq buyurmuşdu: "Müqəddəs ruh bu iki beyti sənin dilinlə söylədi!"(٣)

Beləliklə, bir çox ayə və rəvayətlərdən məlum olur ki, "Ruhul-qudus" mühüm işlərdə ilahi və mənəvi yardımçı olan ruhdan ibarətdir. Əlbəttə, bu yardım bəndələrin dərəcələrini nəzərə alaraq fərqlənir; Peyğəmbər və məsum imamların işlərində daha qüvvətli və real şəkildə, başqalarında isə məqam və dərəcələri həddə özünü göstərir. (Əlbəttə, bu işin mahiyyəti və təfərrüatı barəsində geniş məlumat yoxdur!)

İmam Sadiq (ə) "Vəs-sabiqunəs-sabiqun, ulaikəl-müqərrəbun!" – ayəsinin təfsirində buyurmuşdur:

فَالسّابِقُونَ هُمْ رُسُلُ اللهِ (ع) وَخاصَّهِ اللهِ مِنْ خَلْقِهِ، جَعَلَ فِيهِمْ خَمْسَهُ اَرْواحٍ، اَيَّدَهُمْ بِرُوحِ الْقُدُسِ فَبِهِ عَرَفُوا الْاَشْياءَ...

"Burada "qabaqcıllar" yaranmışlar içərisində ilahi elçilər və Allahın xas bəndələridir. Allah-taala onlarda beş ruh qərar vermiş və (o cümlədən,) onları müqəddəs ruhla qüvvətləndirmişdir ki, onun vasitəsilə əşyaları



---

١- [١] . "Əd-durrul-mənsur", ١-ci cild, səh. ٨٧, "Bəqərə" surəsinin ٨٧-ci ayəsinin təfsirində. Bu rəvayətə oxşar iki rəvayət də "Səhihi-Müslüm"də (٤-cü cild, səh. ١٩ və ٣٢,

."Həssan ibn Sabitin fəzilətləri" bölümündə) nəql olunmuşdur

.Səfinətül-bihar", ۲-ci cild, səh. ۴۹۵۴" . [۲] -۲

.Kəşfül-ğümmə", ۳-cü cild, səh. ۱۱۸ və "Əlamul-vəra", səh. ۳۳۱" . [۳] -۳

(olduğu kimi) tanıya bilsinlər..."(1)

İmam Baqirdən (ə) nəql olunan bir hədisdə peyğəmbər və vəsilərdə mövcud olan beş ruh bəyan edildikdən sonra buyurulur: "Onlar müqəddəs ruhun vasitəsilə ərşin və yerin altında olanları bilirlər."(2)

Bu məsələ ilə əlaqədar "Üsuli-kafi" və digər kitablarda çoxlu hədis vardır ki, burada qeyd etdiklərimizlə kifayətlənirik. Bəli, müqəddəs ruh vasitəsilə ilahi yardımlar məsum imamların elmi mənbələrindən sayılır.

d) İlahi nur: Bir çox rəvayətlərdə nəql olunduğu kimi, imamların elmi mənbələrindən biri də ilahi nurdur. Həsən ibn Raşid nəql edir ki, imam Sadiqin (ə) belə buyurduğunu eşitdim:

...فَإذا مَضى الْإمامُ الَّذِی کانَ قَبْلَهُ رُفِعَ لِهذا مَنارَ مِنْ نُورٍ، یَنْظُرُ بِهِ إلی اَعْمالِ الْخَلائِقِ فَبِهذا یَحْتَجُّ اللهُ عَلی خَلْقِهِ:

"İmam dünyadan getdikdə, Allah-taala sonrakı imam üçün nurdan bir sütun düzəldir ki, onun vasitəsilə insanların əməllərini görsün. Allah-taala bu yolla "höccət"i məxluquna tamamlayır!"(3)

Bəzi rəvayətlərdə "mənarun min nur" (nurdan bir sütun) ibarəsinin yerinə "əmudun min nur" ibarəsi qeyd olunsa da, onların arasında böyük fərq yoxdur. Əlbəttə, rəvayətlərin çoxunda "mənarun min nur" ibarəsi işlədilmişdir. (Bu barədə əlavə məlumat əldə etmək istəyənlər "Biharul-ənvar" kitabının ۶-cı cildinin ۱۳۲-ci səhifəsinə müraciət edə bilərlər. Mərhum Əllamə Məclisi orada bu məsələ ilə əlaqədar on altı hədis nəql etmişdir. Həmçinin həmin kitabın ۲۳-cü cildinin ۳۳۳-۳۳۴-cü səhifələrində də bu barədə müxtəlif rəvayətlər vardır.)

Qeyd edilənlərdən açıq-aşkar məlum olur ki, məsum imamların elm mənbələri müxtəlifdir və ilk növbədə onların Qurani-Kərimin bütün hüdudlarından agahlıqları, ikinci növbədə Peyğəmbəri-Əkrəm (s)-dən öyrəndikləri, sonra isə ilahi yardımlar, qəlbi ilhamlar, mələklər və qeyb aləmi kimi əlaqələri qeydə alınmışdır. Bunların

١- [١] . “Üsuli-kafi”, ١-ci cild, səh. ٢٧١.

٢- [٢] . Yenə orada, səh. ٢٧٢.

٣- [٣] . “Üsuli-kafi”, ١-ci cild, səh. ٣٨٧, hədis: ٢.

hamısı birlikdə məsum imama İslamı, Quranı və Peyğəmbər (s)-in sünnəsini qorumağa, insanları Allaha doğru hidayət etməyə, nəfsləri paklamağa, qanunları icra etməyə, ümmətin işlərini sahmana salmağa və bir sıra vəzifə və məsuliyyətləri .layiqincə yerinə yetirməyə böyük yardım edir

Diqqəti cəlb edən məsələlərdən biri də budur ki, bir sıra rəvayətlərdə “hər cümə axşamı imamların ruhuna Allah tərəfindən yeni ilhamlar edilir!” – kimi ifadələr də görünür. İmam Sadiqdən (ə) nəql olunan bir hədisdə buyurulur: “Hər cümə axşamı bizə yeni bir sevinc gəlir!” Ravi “Allah sevincinizi artırsın, bu sevincdən məqsədin nədir?” – :deyə İmamdan soruşduqda, Həzrət buyurdu

اِذا كانَ لضـيْلَهُ الْجُمُعَهِ وافِى رَسُولُ اللهِ الْعَرْشَ وَ وافِى الاَئِمَّهُ مَعَهُ وَمَعَهُمْ، فَلا تُرَدُّ اَرْواحُنا اِلى اَبْدانِنا اِلاّ بِعِلْمٍ مُسْـتَفادٍ، وَلَوْلا ذالِكَ لَاَنْقَدْنا:

Cümə axşamı çatanda, Peyğəmbəri-Əkrəm (s) (o həzrətin müqəddəs ruhu) ilahi ərşə“ enir və imamların ruhu onunla görüşür. Mənim də ruhum onlarla birgə oraya gedir. Sonra ruhumuz yeni məlumatla bədənimizə qayıdır. Əgər belə olmasa, biliyimiz sona (yetərdi!”(١

Bu fəsildə qeyd etdiklərimizdən məlum olur ki, imamların elmi mənbələri sadə bir məsələ deyildir. Bu mənbələr onları digər insanlardan ayırır, İslamı qorumaq, Quranın təlimi və bəndələrin hidayəti ilə əlaqədar ağır vəzifələrini yerinə yetirməkdə mühüm .rola malikdirlər

## İMAMLARIN MƏSUM VƏ GÜNAHSIZ OLMASI

İşarə: Xəta, səhv, unutqanlıq və günahdan uzaq olma ilahi imamların ümumi şərtlərindəndir. Həqiqətdə, imamların məsuliyyətləri peyğəmbərlərin məsuliyyətlərinə daha yaxın olduğundan, peyğəmbərlərin məsum və günahsızlığına dəlalət edən bütün imtiyazlar onlara da aiddir. Düzdür, şəriətin sahibi Peyğəmbəri-Əkrəm (s)-dir və birbaşa vəhylə əlaqə saxlayır, lakin imamlar da onun şəriətini qoruyur, hərçənd, onlara vəhy nazil

olmur. Onlar insanların hidayəti, ilahi hökmlərin icrası və dini maarifin kamil şəkildə çatdırılmasında tamamilə Peyğəmbər (s)-in ardınca hərkət edirlər. Buna görə də imamlar Peyğəmbər (s)-lə əksər xüsusiyyətlərdə müştərəkdir və bir-birinə bənzəyirlər. Buna əsasən, "Peyğəmbərlərin isməti" ilə əlaqədar bütün dəlillər məsum .imamlara da aiddir

Bu girişlə bəhsimizi bu barədə nazil olan Quran ayələrindən bir neçəsinə istinad :etməklə başlayırıq

إِنَّمَا يُرِيدُ اللَّهُ لِيُذْهِبَ عَنكُمُ الرِّجْسَ أَهْلَ الْبَيْتِ وَيُطَهِّرَكُمْ تَطْهِيرًا

Həqiqətən, Allahın istək və iradəsi budur ki, siz Əhli-beytdən çirkinliyi uzaqlaşdırıb, sizi" ((hər cəhətdən) pak-pakizə etsin!"(١)

Ötən bəhslərdə imamət və vilayət məqamının əzəmət və böyüklüyü haqda İbrahim peyğəmbərin əhvalatını açıqlayan "Bəqərə" surəsinin ١٢۴-cü ayəsini qeyd etdik. Orada dedik ki, Allah-taala o böyük peyğəmbəri bir çox ağır sınaqlara çəkəndən və Həzrət də onların öhdəsindən layiqincə gələndən sonra buyurdu: "Həqiqətən, Mən səni insanlara imam təyin etdim." (Burada "imamət" bəşərin cisminə, canına, ruhuna və təlim-tərbiyəsinə rəhbərlik deməkdir!) İbrahim (ə) övladlarının da bu məqama yiyələnməsini istədikdə, Allah-taala şərti cavab verərək buyurdu: "Mənim (imamət) əhdim zülmkarlara çatmaz!" (Yəni sənin övladlarından yalnız pak və məsum olanlara bu (!məqam veriləcəkdir

Bu ayənin düzgün təfsiri imamların və ilahi rəhbərlərin məsum və günahsız olduğunu göstərir. Əqidəsi şirk və küfrlə dolu olan, yaxud əməllərində zülm və haqsızlıq görünənlər bu məqama layiq deyillər. Çünki zülm geniş mənada həm şirk, küfr və əqidə azğınlığına, həm də başqalarına, eləcə də bir şəxsin günah etməklə özü-özünə rəva gördüyü haqsızlığa da şamil olur. Bir sözlə, Qurani-Kərim baxımından imamlar və .ilahi rəhbərlərin əsas şərtlərindən biri ismət və günahsızlıqdır

Burada yenidən "Təthir" ayəsinə qayıdır və bu ayədə açıqlanan

:ismət məsələsini araşdırırıq

Bu ayə Peyğəmbər (s)-in zövcələrindən söz açan ayələrin arasında yerləşməsinə baxmayaraq, fərqli tona malik olub, mühüm bir hədəfi güdür. Çünki ondan əvvəl və sonrakı bütün ayələrin əvəzlikləri qadın cinsinin cəm, bu ayədə isə kişi cinsinin cəm formasında işlənmişdir. Bu ayənin başlanğıcında Peyğəmbər (s)-in zövcələrinə göstəriş verilir ki, öz evlərində otursunlar, cahillik dövrünün adət-ənənələrinə uyğun camaat arasına çıxmasınlar, iffətlərini qorusunlar, namaz qılıb zəkat versinlər, Allaha və Rəsuluna tabe olsunlar. Ayədə gələn altı əvəzliyin hamısı qadın cinsinin cəm :formasındadır. Sonra isə ayənin üslubu və deyiliş tərzi dəyişilərək buyurulur

إِنَّمَا يُرِيدُ اللَّهُ لِيُذْهِبَ عَنكُمُ الرِّجْسَ أَهْلَ الْبَيْتِ وَيُطَهِّرَكُمْ تَطْهِيرًا

Allah siz Əhli-beytdən çirkinlik və günahı uzaqlaşdırıb, sizi tamamilə pak-pakizə qərar“ ”!vermək istəyir

Ayənin bu hissəsindəki əvəzliklərin hər ikisi kişi cinsinin cəm formasındadır. Adətən, hər bir ayənin əvvəli ilə axırı eyni bir məsələni bəyan edir, lakin bu o yerdədir ki, ona qarşı dəlil olmasın. Belə isə ayənin bu hissəsinin də Peyğəmbər (s)-in zövcələrinə aid olduğunu deyənlər yanılırlar. Çünki ayənin hissələri arasında mövcud olan zahiri təfavüt tam aydındır və əvəzliklər də bir-birilə fərqlənir. Bundan əlavə, şiə və sünnülərin böyük İslam alimləri Peyğəmbəri-Əkrəm (s)-dən çoxlu rəvayət nəql etmişlər ki, hər iki firqənin məşhur və məqbul mənbələrində bunu fakt kimi göstərmək olar. Bütün bu rəvayətlərə görə, bu ayə İslam Peyğəmbərinin (s) zövcələrinə aid deyil, yalnız Həzrətin özünə, imam Əliyə (ə), Fatiməyə (ə.s), imam Həsənə (ə) və imam (.Hüseynə (ə) məxsusdur. (Bu barədə geniş izah veriləcək

Rəvayətləri araşdırmazdan öncə “Təthir” ayəsində işlədilən söz və ifadələri izah :etməyi lazım görürük

İnnəma” sözü adətən, “həsr və inhisar” üçün işlədilir və dilimizdə “yalnız, ancaq və“ .təkcə” mənalarını daşıyır

Yuridu” (Allah istəyir, iradə edir) feli Allahın “təkvini” iradəsini bildirir, yəni Allah-taala“

çirkinlikdən pak və uzaq etsin. Burada məqsəd “təşrii” iradə ola bilməz, çünki “təşrii” iradə onların çirkinliklərdən qorunmağa vəzifəli olduqlarını yetirəcəkdir ki, bu isə, təkcə .Peyğəmbər (s)-in Əhli-beytinə məxsus deyil, həm də bütün müsəlmanların vəzifəsidir

Bəzilərində belə təsəvvür yarana bilər ki, “təkvini” iradə bir növ cəbr və məcburiyyət doğurur. Belə olan təqdirdə, məsumluq və günahsızlıqda heç bir fəzilət və fəxrdən .danışmaq olmaz

Burada qısa şəkildə deməliyik ki, məsumlar iki növ məqama malikdirlər: “zati məqam” və “iktisabi (əməllərlə qazanılan) məqam”. Bunların heç biri ixtiyarın onlardan alınmasını göstərmir. Başqa sözlə desək, ilahi iradə uca məqama nail olmaq və müvəffəqiyyət üçün zəminlər hazırlayır və bunları qazanmaq isə məsumların öz iradəsindən asılıdır. Onların günahı tərk etməsi cəbri deyil, iradi hissə əsaslanır. Məsələn, bir din aliminin şarabı özü ilə məscidə aparıb, camaatın qarşısına çıxaraq onu içməsi qeyri-mümkündür. Lakin bu iş zati qeyri-mümkünlük deyil, adi və ixtiyari qeyri-mümkünlük sayılır. Və yaxud ağıllı bir insan heç vaxt küçə-bazara çılpaq vəziyyətdə çıxmaz. Amma onun belə bir iş görməsi qeyri-mümkün deyil, əksinə onun abır-həyası, düşüncə və mərifəti bu işə icazə vermir və bu işin yerinə yetirilməsi, yaxud tərki onun öz ixtiyarındadır. Peyğəmbər və imamların da günahları tərk etməsi bu qəbildəndir. Doğrudur ki, məsum və günahsız olmaq ilahi yardım sayılır, lakin ilahi yardımlar da hesab-kitabsız deyildir. Qurani-Kərimdə İbrahim (ə) haqda buyurulduğu kimi, o həzrət ağır və mühüm sınaqlardan keçdikdən sonra yüksək imamət və rəhbərlik məqamına (nail olmuşdur.(١)

Ayədə qeyd olunan “rics” sözü lüğətdə “çirkin şey” mənasını verir, istər insanın təbiəti ilə uyğun gəlməyən və nifrət doğuran şey olsun, istərsə də əqli və şəri baxımdan, yaxud bütünlüklə hər bir çirkin şey. Rağib İsfahani “Müfrədat” kitabında “rics”i “çirkin şey” mənalandırdıqdan sonra (yuxarıda qeyd etdiyimiz kimi,) həmin dörd



---

.Bəqərə” surəsi, ayə: ١٢٤“ .[١]-١

surəti qeyd edir (insanın təbiəti ilə uyğun gəlməyən, əqli və şəri baxımdan, yaxud .(bütünlüklə hər bir çirkin şey

Əgər bəzi alimlər kəlamlarında “rics”i “günah”, yaxud “şirk”, yaxud “batil əqidələr”, yaxud da “paxıllıq və həsəd” kimi mənalara yozmuşlarsa, həqiqətdə bu sözün geniş mənada xarici nümunələrini göstərmişlər. Ümumiyyətlə, ayədə qeyd olunan “ər-rics” sözündəki “əlif və lam” artiklı ümumi cinsi bildirməklə ayənin mənası belə olacaq: “Allah ”.siz Əhli-beytdən hər növ çirkinliyi uzaqlaşdırıb, sizi pak-pakizə qarar vermək istəyir

Və yutəhhirəkum təthirən” – cümləsi (“təthir” sözünün “pak-pakizə etmək” mənasına“ diqqət yetirməklə) Əhli-beytin pak-pakizə və çirkinlikdən uzaq olmasına əlavə təkiddir. .Məsdərin təkidi formasında işlədilən “təthirən” sözü bu mənanı bir daha təkid edir

Nəticə: Allah-taala müxtəlif təkidlərlə İslam Peyğəmbərinin (s) Əhli-beytini hər bir çirkinlik və aludəlikdən pak-pakizə etdiyini bildirir. Şübhəsiz, ilk növbədə evin əsl sahibi Peyğəmbəri-Əkrəm (s)-in özüdür, lakin Əhli-beytin üzvlərinin kimlər olduğu haqda .geniş izaha ehtiyac duyulur

**?ƏHLİ–BEYT KİMLƏRDİR**

Əhli-sünnə təfsirçilərinin bir qrupu “Əhli-beyt”i Peyğəmbər (s)-in zövcələri kimi təfsir etmişlər. Lakin qeyd etdiyimiz kimi, ayənin üslub və deyiliş tərzinin dəyişilməsi, əvəzliklərin əvvəli ilə axırının fərqlənməsi bu hissənin tamamilə ayrı möhtəvaya dəlalət etdiyini və başqa bir məqsəd güddüyünü göstərir. Məgər Allahın bütün işlərinin hikmət !?üzrə, Quran ayələrinin tam fəsahət və bəlağətdə olduğu qəti deyilmi

Digər təfsirçilər isə Əhli-beytin Peyğəmbəri-Əkrəm (s), Əli (ə), Fatimə (ə.s), imam Həsən (ə) və imam Hüseyndən (ə) ibarət olduğunu qeyd etmişlər. Şiə və sünnü mənbələrində nəql olunan bir çox rəvayətlər bunu təsdiq edir. Hətta bu rəvayətlərə görə, bəziləri onun geniş məna daşıdığını söyləyərək həm bu beş nəfərə, həm də Peyğəmbər (s)-in zövcələrinə şamil olduğunu demişlər. Deməli, bu da ayənin üçüncü .təfsiri olacaqdır

Lakin Əhli-beytin beş kimsəyə xas olduğunu açıqlayan rəvayətlər olduqca çoxdur. Yalnız "Əd-durrul-mənsur" təfsirində on səkkiz rəvayət – beşi Ümmü Sələmədən, üçü Əbu Səid Xudridən, biri Ayişədən, biri Ənəs ibn Malikdən, ikisi İbn Abbasdan, ikisi Əbil-Həmradan, biri Vailə ibn Əsqədən, biri Səddən, biri Səhhak ibn Müzahimdən, biri də (Zeyd ibn Ərqəmdən nəql olunmuşdur.(١)

Əllamə Təbatəbai "Əl-mizan" təfsirində bu barədə yetmişdən çox rəvayət nəql edərək yazır: "Bu məsələ ilə əlaqədar əhli-sünnə təriqilə nəql olunan rəvayətlərin sayı şiə təriqilə nəql olunan rəvayətlərin sayından çoxdur!" Bu kitabda yuxarıda adlarını çəkdiyimiz ravilərdən başqa ("Əd-durrul-mənsur" təfsirində adları çəkilməyən) digər ravilərin adları da qeyd edilmişdir. Bəzi alimlər isə bu rəvayətlər və onların nəql .olunduğu kitabların sayını yüzə yaxın qeyd etmişlər

Burada həmin rəvayətlərin yalnız bir neçəsini qeyd edirik ki, Vahidinin bu ayənin nazil olma səbəbi barəsində "Bu ayə Peyğəmbəri-Əkrəm (s), Əli (ə), Fatimə (ə.s), Həsən (ə) və Hüseynin (ə) barəsində nazil olmuş və başqaları onlarla şərik deyildir!"(٢) – :dediklərinin eynilə həqiqət olduğu aydınlaşsın

Peyğəmbər (s)-in bəzi zövcələrindən nəql olunmuş rəvayətlərdə açıq-aşkar deyilir .١ ki, "Təthir" ayəsindən söz açaraq Peyğəmbər (s)-dən soruşduq: "Bizə də bu ayə şamil "!olurmu?" Həzrət buyurdu: "Siz də yaxşısınız, lakin bu ayə sizə şamil olmur

O cümlədən, ("Kəbir" təfsirinin müəllifi, ۴-cü və ۵-ci əsrlərin məşhur əhli-sünnə alimi) Sələbi öz təfsirində Peyğəmbər (s)-in zövcəsi olan Ümmü Sələmədən belə nəql edir: Bir gün Fatimə (ə.s) Peyğəmbər (s)-ə yemək gətirdi. O həzrət buyurdu: "Həyat yoldaşını, övladların Həsən və Hüseyni çağır, gəlsinlər!" Onlar da gəlib, yemək yedikdən sonra Peyğəmbər (s) əbasını onların üstünə atıb buyurdu: "İlahi! Bunlar mənim Əhli-beytim və itrətimdir, çirkinliyi onlardan uzaqlaşdır və onları pak-pakizə et!" Bu zaman "Təthir" ayəsi nazil



---

.Əd-durrul-mənsur", ۵-ci cild, səh. ١٩۶-١٩٩" . [١] -١

.Əl-mizan", ١۶-cı cild, səh. ٣١١" . [٢] -٢

oldu... Mən o həzrətdən “Ey Allahın Rəsulu! Mən də sizdənəmmi?” – deyə soruşduqda, (buyurdu: “Sən də yaxşısan (amma bu zümrədən deyilsən)!”(۱)

Sələbi başqa bir rəvayətdə Peyğəmbər (s)-in zövcəsi Ayişədən “Cəməl” müharibəsi və onun müharibəyə dəxalət etməsi haqda soruşduqda, dedi: “Bu, ilahi bir təqdir idi!” Ondan Əli (ə) haqda soruşduqda, dedi: “Peyğəmbər (s)-in yanında ən sevimli şəxsin kim olduğunu həzrətin ən sevimli zövcəsindən soruşursan?! Mən öz gözümlə gördüm :ki, Peyğəmbər (s) Əli, Fatimə, Həsən və Hüseyni bir libasın altına salıb buyurdu

اَللّهُمَّ هؤلاءِ اَهْلُ بَيْتِى وَحامَتِى فَاَذْهَبَ عَنْهُمُ الرِّجْسَ وَطَهِّرْهُمْ تَطْهِيراً:

İlahi! Bunlar mənim Əhli-beytim və himayəçilərimdir, çirkinliyi onlardan uzaqlaşdır və“ pak-pakizə et!” Mən isə o həzrətdən “Ey Allahın Rəsulu! Mən də onlardanammı?” – (deyə soruşduqda, buyurdu: “Xeyr, sən yaxşısan (amma onlardan deyilsən)!”(۲)

Bəli, bu rəvayətlərdə göstərilir ki, Peyğəmbər (s)-in zövcələri (yaxşı olsalar da,) ayədə .qeyd olunan Əhli-beytdən sayılmırlar

Müxtəlif ibarələrlə bir çox rəvayətlərdə nəql olunan “Kisa” (əba) əhvalatı belə . ۲ olmuşdur: “Peyğəmbər (s) Əli (ə), Fatimə (ə.s), Həsən (ə) və Hüseyni (ə) çağırıb (yaxud onların yanına gedib), üstlərinə bir əba ataraq dedi: “İlahi! Bunlar mənim Əhli-”.beytimdir, onlardan çirkinliyi uzaq et!” Bu zaman “Təthir” ayəsi nazil oldu

Diqqət yetirmək lazımdır ki, bu hədis Müslümün “Səhih” kitabında Ayişədən, Hakimin “Müstədrək”, Beyhəqinin “Sünən”, İbn Cəririn “Təfsir”, Süyutinin “Əd-durrul-mənsur”(۳), Hakim Həskaninin “Şəvahidut-tənzil”(۴), Termizinin “Səhih” kitabında isə (dəfələrlə Əmr ibn Əbi Sələmə və Ümmü Sələmədən nəql olunmuşdur.(۵



---

Məcməül-bəyan”, “Təthir” ayəsinin təfsirində; “Şəvahidut-tənzil”, Hakim“ . [۱] -۱ .Həskani, ۲-ci cild, səh. ۵۶

.Məcməül-bəyan”, “Təthir” ayəsinin təfsirində“ . [۲] -۲

Səhihi-Müslüm”, ۴-cü cild, səh. ۱۸۸۳, hədis: ۲۴۲۴, “Peyğəmbər (s)-in Əhli-beytinin“ . [۳] -۳

.fəzilətləri” bölümü

.Şəvahidut-tənzil”, ۲-ci cild, səh. ۳۳, hədis: ۳۷۶“ . [۴] -۴

Səhihi-Termizi”, ۵-ci cild, səh. ۶۹۹, hədis: ۳۸۷۱, “Fatimənin fəziləti” bölümü,“ . [۵] -۵
.“Ehyaut-turas” çapı

Fəxri-Razi “mübahilə” (“Ali-İmran” surəsinin ۶۱-ci) ayəsinin təfsirində bu hədisi (“Kisa” hədisi) nəql etdikdən sonra yazır: “Bilmək lazımdır ki, bu rəvayət səhih və düzgündür, təfsir və hədis alimlərinin səhih saydıqları hər hansı bir rəvayətlə heç bir fərqi (yoxdur!”(۱

Diqqəti cəlb edən məsələ budur ki, hətta Əhməd Hənbəl “Müsnəd” kitabında bu hədisi (müxtəlif ravilərin dilindən nəql etmişdir.(۲

Rəvayətlərin bir qismində deyilir ki, “Təthir” ayəsi nazil olduqdan sonra Peyğəmbər .۳ (s) bir neçə ay (bəzi rəvayətlərdə altı, bəzilərində doqquz ay) sübh namazını qılmağa :gedərkən Fatimeyi-Zəhranın (ə.s) evinin yanından keçərək uca səslə deyirdi

اَلصَّلوه! يا اَهْلَ بَيْتِ! اِنَّما يُرِيدُاللهُ لِيُذْهِبَ عَنْكُمُ الرِّجْسَ اَهْلَ الْبَيْتِ وَيُطَهِّرَكُمْ تَطْهِيراً:

Ey Əhli-beyt, namaz (vaxtıdır)! (Sonra bu ayəni tilavət edir:) Həqiqətən, Allah siz Əhli-“ ”!beytdən bütün çirkinliyi uzaqlaşdırıb, sizi pak-pakizə etmək istəyir

Bu hədis məşhur təfsir alimi Hakim Həskaninin “Şəvahidut-tənzil” kitabında Ənəs ibn Malikdən, başqa bir hədisdə Əbil-Həmradan nəql etmiş və Peyğəmbər (s)-in bu işi (yeddi ay, Əbu Səid Xudri isə səkkiz ay davam etdirdiyini yazmışdır.(۳

Rəvayətlərdəki ibarələrin bir-birindən fərqlənməsi təbiidir; çünki mümkündür Ənəs ibn Malik bunu altı ay, Əbu Səid Xudri səkkiz ay, Əbil-Həmra yeddi ay və İbn Abbas doqquz ay müşahidə etmiş olsun. Beləliklə, rəvayətlərdə heç bir ziddiyyət olmadan hər .kəs gördüyünü nəql etmişdir

Ümumiyyətlə, bu işin Peyğəmbər (s) tərəfindən davamlı olaraq neçə ay uzanması onun çox əhəmiyyətli olduğunu göstərir. O həzrət bu rəftar və ardıcıl təkidlərilə bir kimsənin düşüncəsində heç bir şəkk-şübhə və tərəddüd qalmasın deyə, bildirmək istəyirdi ki, Əhli-beytdən məqsəd, yalnız bu kəslərdir və “Təthir” ayəsi məhz onların şəninə nazil olmuşdur. Maraqlıdır ki, Peyğəmbər (s)-in bu qədər



---

.Kəbir” təfsiri, Fəxri-Razi, ۸-ci cild, səh. ۸۰“ . [۱] -۱

٢- [٢] . “Müsnədi-Əhməd”, ١-ci cild, səh. ٣٣٠, ٤-cü cild, səh. ١٠٧, ٦-cı cild, səh. ٢٩٢. (“Fəzailul-xəmsə” kitabından nəqlən, ١-ci cild, səh. ٢٧٦).

٣- [٣] . “Şəvahidut-tənzil”, ٢-ci cild, səh. ١١, ١٢, ١٣, ١٤, ١٥, ٢٨ və ٩٢. (bu hədis müxtəlif ravilərdən nəql olunmuşdur;) “Ehqaqul-həqq”, ٢-ci cild, səh. ٥٠٣-٥٤٨.

təkid və israrı ilə yenə bu məsələ bəzilərinə “qaranlıq” qalmışdır. Bu isə doğrudan da, !heyrətləndiricidir

Peyğəmbər (s)-in məscidinə yalnız o həzrətin və imam Əlinin (ə) evlərinin qapılarının açıq qalmasına icazə verilməsi diqqəti cəlb edən digər məsələlərdən biridir. (Çünki Peyğəmbər (s) göstəriş vermişdi ki, bu iki qapıdan başqa camaatın evlərinin məscidə açılan qapıları bağlansın!) Məlum olduğu üzrə, oradakı camaatdan bir qrupu namaz vaxtı Peyğəmbər (s)-in “Ey Əhli-beyt, namaz vaxtıdır...!” – deyə buyurduğunu eşidirdilər. Bununla belə, bəzi təfsirçilərin ayənin geniş məna daşıyaraq Peyğəmbər (s)-in zövcələrinə də aid olduğunu israr etmələri qəribə deyilmi?! Halbuki tarixdə göstərildiyi kimi, fəzilətlərini, Peyğəmbər (s)-in zamanının cüzi hadisələrini belə açıqlayan Ayişə nəinki özünü “Təthir” ayəsinə aid etmir, həm də deyir ki, Peyğəmbər ”!(s) mənə buyurmuşdu: “Sən onlardan deyilsən

***

Məşhur səhabə Əbu Səid Xudridən nəql olunan və “Təthir” ayəsinə işarə edən bir .۴ çox rəvayətlərdə açıq-aşkar belə deyilir: “Bu ayə Allahın Rəsulu, Əli, Fatimə, Həsən, (Hüseyn (əleyhimus-səlam) barəsində nazil olmuşdur!”(۱

Nəticə: İslamın məşhur mənbələrində “Təthir” ayəsi və onda qeyd olunan Əhli-beytin Peyğəmbər (s), imam Əli (ə), Fatimeyi-Zəhra (ə.s), imam Həsən (ə) və imam Hüseynə (ə) məxsus olduğunu bildirən rəvayətlər “təvatür” həddinə çatdığından, onların düzgünlüyündə heç bir şəkk-şübhə yeri qalmır. Hətta “Ehqaqul-həqq” kitabının şərhində bu rəvayətlər (Əhli-beyt ardıcıllarının məşhur mənbələrindən əlavə,) əhli-sünnənin yetmişdən çox məşhur mənbəsində nəql olunduğu göstərilərək yazılır: “Əgər (bu rəvayəti nəql edən bütün mənbələri saysaq, mindən çox olar!”(۲



---

Şəvahidut-tənzil” kitabında bu zəmində dörd hədis nəql olunmuşdur, ۲-ci cild,“ . [۱] -۱ .səh. ۲۴-۲۷, hədis: ۶۵۹, ۶۶۰, ۶۶۱ və ۶۶۴

.Ehqaqul-həqq”, kitabından iqtibas edilmişdir, ۲-ci cild, səh. ۵۰۲-۵۶۳“ . [۲] -۲

Təthir” ayəsinin təfsiri ilə əlaqədar İslamın məşhur mənbələrində nəql olunan“ rəvayətlərin “təvatür” həddinə çatdığı və bunun Əhli-beyt imamları üçün böyük fəzilət sayıldığından, onların məzhəbinin də haqq olduğu məlum olacaq. Bəzi alimlər əl-ayağa düşərək, adət üzrə müxtəlif iradlara əl atmışlar və bunlar da daha çox bəhanələrə oxşayır. Halbuki əhli-sünnə alimlərinin bir çoxu təriqətindən asılı olmayaraq, şücaətlə “Təthir” ayəsinin məsum imamlara aid olduğunu demiş və bu rəvayətləri qəbul :etmişlər. Həmin iradların bir qismi aşağıdakılardan ibarətdir

Əhli-beytdən məqsəd Peyğəmbər (s)-in öz evinin sakinləridir. Çünki “beyt” yaşayış .١ evi deməkdir və Peyğəmbər (s)-in evində yaşayanlar da o həzrətin zövcələri olduğundan, “Təthir” ayəsini başqalarına aid etmək olmaz. Ayədəki kişi cinsinin cəm əvəzliklərinin səbəbi də “əhl” sözünün kişi cinsində olmasıdır. Peyğəmbər (s)-in zövcələri müxtəlif evlərdə qalsalar da, “beyt” sözünün cəm formasında deyil, tək halda işlədilməsi o həzrətin vahid bir fərd olması ilə əlaqədardır. Buna görə də o həzrətin evi tək halda qeyd olunmuşdur. Bir sözlə, ayə yalnız Peyğəmbər (s)-in zövcələrinə aid .edilməlidir

Cavab: Bu nəzər, yaxud bəhanənin ötən bəhslərin müqabilində heç bir dəyəri yoxdur. Əgər ayədə qeyd olunan “əhl” sözündən məqsəd Peyğəmbər (s)-in zövcələridirsə, onun zahiri kişi cinsi tək, mənası isə qadın cinsinin cəm formasını yetirməsidir. Halbuki ayədəki əvəzliklər nə kişi cinsi tək, nə də qadın cinsi cəm formasındadır, əksinə kişi cinsi cəm formasında işlədilmişdir. Amma ayənin əvvəlindəki “beyt” sözü cəm formada (və qərnə fi büyutikunnə), “Əhli-beyt” sözündə isə tək halda gəlmişdir. Bu da Peyğəmbər (s)-ə xatir ola bilməz, çünki o həzrətin özünün müstəqil evi yox idi və zövcələrinə məxsus olan evlərdə yaşayırdı. Buna əsasən, ayədəki “Əhli-beyt”dən məqsəd evdə yaşayanlar deyil, Peyğəmbəri-Əkrəm (s)-lə nəsəbi qohumluğu olan şəxslərdir. Bunlardan da əlavə, əgər bütün bu iradları qəbul etsək, onda bu qədər -rəvayətlərlə nə etməliyik?! Görəsən, ayədə qeyd olunan Əhli

beyti beş kimsəyə məxsus bilən və “təvatür” həddinə çatan rəvayətlərdən üz döndərməlimi, yoxsa onları etibarsızmı bilməliyik? Deməli, bu qədər hədisləri səhih və “təvatür” həddində hesab etməsək, onda səhih və “təvatür” həddində bir hədis belə tapa bilmərik. Əgər bu rəvayətlərdə aydınlıq yoxdursa, bəs, hansı rəvayətin ibarəsini ?aydın və məlum hesab edə bilərik

Bunların hamısından da maraqlısı Əkrəmənin dedikləridir: “Hətta bir kəs mənimlə mübahiləyə hazır olsa belə, onunla mübahiləyə girib deyəcəyəm ki, bu ayə (“Təthir” ayəsi) Peyğəmbər (s)-in zövcələri barəsində nazil olmuşdur!” O vaxt Əkrəmə küçə-bazarlarda car çəkib deyirmiş ki, “Təthir” ayəsi Peyğəmbər (s)-in zövcələri haqda nazil .olmuşdur

Doğrudan da maraqlıdır! Saysız-hesabsız dəlil və şahidi olan bir məsələ barədə mübahiləyə çağırmaq, küçə-bazarlarda fəryad etməklə nəyi sübuta yetirmək istəyirmiş? Bu şübhəsizdir ki, Peyğəmbər (s) özü ilə birgə beş nəfərin üstünə əba sərərək onların adlarını və Əhli-beytdən olduqlarını söyləmiş, sonra da Ümmü Sələmə və Ayişənin onlardan olmadığını demişdir. Daha sonra altı, yaxud səkkiz, yaxud doqquz ay ardıcıllıqla sübh namazı vaxtı qızı Fatimeyi-Zəhranın (ə.s) evinin qarşısına gəlib, Əhli-beyti çağıraraq “Təthir” ayəsini söyləmişdir. Ayədəki həsr və inhisarı bildirən “innəma” (yalnız və yalnız) ədatı da göz qabağındadır. Peyğəmbər (s) özü o zaman bu qədər ardıcıl təkidlərlə bütün şübhələri aradan qaldırmışdır, lakin Əkrəmə kimilər qərəzli səbəblər üzündən küçə-bazarlarda car çəkib, həqiqəti ört-basdır etmək .istəmişlər

?Əgər Əhli-beytin üzvləri beş nəfərdirsə, bəs, bu, digər imamlara necə şamil olur .٢

Cavab: Ayənin nazil olduğu vaxt Əhli-beytin yalnız beş nəfəri həyatda idi. Qalanları isə .sonradan dünyaya gəlmiş və imamlıq xislətlərini bir-birindən irs almışlar

Əvvəldə işarə etdiyimiz kimi, ayədə qeyd olunan Allahın iradə və istəyi “təşrii” deyil, .٣ “təkvini iradə və istək”dir. Başqa sözlə desək, Allah-taala Əhli-beytə günahlardan çəkinməyi göstəriş vermir, çünki bu ilahi göstəriş (günahlardan çəkinmək) yalnız “Kisa” ,əhlinə deyil

müstəsnasız olaraq bütün müsəlmanlara aiddir. Bəs, məlum olur ki, Allahın təkvini iradə və istəyi ilə Əhli-beyt (ə) bütün günahlardan pak, şərdən və nəfsani istəklərdən uzaqdır. Bildiyiniz kimi, Allah-taala Öz iradə və istəyinə qarşı əsla çıxmaz. Allah-taalanın Öz iradəsinə qarşı çıxmasını deyən bəzi şəxslərin fikri tam nadanlıqdandır. Maddi aləmdə ilahi istəyə hansı amil mane ola bilər?! Əlbəttə, bu yalnız o zaman baş verə bilər ki, ilahi iradə və istək müəyyən bir şeylə şərtlənsin və həmin şərt də gerçəkləşsin. Məlum olduğu kimi, "Təthir" ayəsindəki ilahi iradə mütləqdir və heç bir .şeylə şərtlənməmişdir

Bəziləri də deyirlər ki, bu fikir Peyğəmbər (s)-in bütün səhabələrinin, xüsusilə "Bədr" müharibəsində iştirak edənlərin də məsum olduğunu tələb edir. Çünki Allah-taala səhabələr haqda da belə buyurmuşdur: "Allah sizi pak-pakizə qərar vermək, nemətini (sizə tam çatdırmaq istəyir. Bəlkə də Onun nemətləri müqabilində şükür edəsiniz!"(١)

Təəssüflər olsun ki, təəssübkeşlik odu şölə çəkib alovlandıqda, hər bir şeyi bürüyüb külə döndədir. Əsas etibarilə, Qurani-Kərimdə "Bədr" müharibəsi haqda belə bir ayə :yoxdur və bu müharibə ilə əlaqədar nazil olan ayə yalnız budur

وَيُنَزِّلُ عَلَيْكُم مِّن السَّمَاء مَاء لِّيُطَهِّرَكُم بِهِ وَيُذْهِبَ عَنكُمْ رِجْزَ الشَّيْطَانِ

Allah sizi pak-pakizə etmək və Şeytanın çirkinliyindən təmizləmək üçün səmadan sizə" (yağış endirdi!"(٢)

Aydındır ki, bu ayə "Bədr" müharibəsi zamanı yağışın yağması və müsəlmanların ehtiyacını ödəmək, qüsl və dəstəmaz almaları ilə bağlıdır və bizim bəhsimizə heç bir dəxli yoxdur. Lakin bu təəssübkeş alim bütün səhabələrin pak və günahsız olduqlarını sübut etmək üçün ayənin əvvəlinə diqqət yetirmədən, yalnız "li-yutəhhirəkum" (sizi təmizləmək üçün) – felini əldə əsas tutmuşdur. "Və lakin yuridu li-yutəhhirəkum..." (Allah sizi pak-pakizə qərar vermək, nemətini sizə tamamlamaq istəyir. Bəlkə də Onun nemətləri



---

Ruhul-məani" təfsiri, Alusi, ٢٢-ci cild, səh. ١٧ ("Əhzab" surəsinin ٣٣-cü ayəsinin" . [١] -١

müqabilində şükür edəsiniz!) – cümləsi isə Bədr döyüşçülərinə aid olmayıb, qüsl, dəstəmaz və təyəmmüm ayəsinin davamıdır. Məlum olduğu üzrə, İslamda qüsl, dəstəmaz və təyəmmüm də paklığın nişanəsidir. Belə isə həmin təfsir aliminin bu ayəni "Bədr" döyüşü ilə əlaqələndirməsi, qüsl, dəstəmaz və təyəmmümlə bağlı məsələni "ismət və günahsızlıq" bəhsi ilə qarışdırması çox maraqlıdır!

Burada başqa bir sual yarana bilər ki, əgər ayə beş nəfərin ismət və günahsızlığına dəlalət edirsə, bəs, nə üçün "yuridu" (istəyir) – sözü indiki zaman feli formasında işlədilmişdir? Əgər onlar məsumdurlarsa, nə üçün "Allah əzəldən sizin pak-pakizə olmağınızı istəmişdir!" deyil, əksinə "Allah sizin pak olmağınızı istəyir!" – deyə buyurulmuşdur?(1)

Əgər bu irad Quran ayələrində işlədilən "yuridu" (istəyir) ifadəsi ilə birgə araşdırılsa, əsla şübhə yeri qalmaz. Çünki Quranın əksər ayələrində bu söz keçmişdən indiyə, indidən gələcəyə qədər olan zamanın hər üçünə dəlalət edir. Başqa sözlə desək, Quranda bu söz adətən, keçmiş, indiki və gələcək zamanların hər üçünü ifadə edir və aşağıdakı ayələr də buna sübutdur:

وَمَا اللّهُ يُرِيدُ ظُلْمًا لِّلْعَالَمِينَ

"Allah aləmlərə əsla zülm etmək istəmir!"(2)

يُرِيدُ اللّهُ بِكُمُ الْيُسْرَ وَلاَ يُرِيدُ بِكُمُ الْعُسْرَ

"Allah sizin üçün çətinlik deyil, asanlıq istəyir!"(3)

يُرِيدُ اللّهُ أَن يُخَفِّفَ عَنكُمْ

"Allah üzərinizdə olan çətinliyi asanlaşdırmaq istəyir!"(4)

Məlum olduğu kimi, bu ayələrin mənası Allah-taalanın keçmişdə zülm etməsini, insanların çətinlikdə olmasını, yaxud keçmişdəki insanların yükünün ağır olmasını istəməsi və bundan sonra isə öz qərarından dönüb, onun əksinə çıxması deyildir. Əksinə bu ayələrdə Allah-taalanın istəyi bütün zamanları əhatə edir. Qurani-Kərimdə şeytan haqda belə buyurulur:

---

.Ruhul-məani”, ۲۲-ci cild, səh. ۱۷“ . [۱] -۱

.Ali- İ mran” surəsi, ayə: ۱۰۸“ . [۲] -۲

.Bəqərə” surəsi, ayə: ۱۸۵“ . [۳] -۳

.Nisa” surəsi, ayə: ۲۸“ . [۴] -۴

وَيُرِيدُ الشَّيْطَانُ أَن يُضِلَّهُمْ ضَلاَلاً بَعِيدًا

(Şeytan onları çox uzaq olan bir azğınlığa sürükləmək istəyir!”(١“

إِنَّمَا يُرِيدُ الشَّيْطَانُ أَن يُوقِعَ بَيْنَكُمُ الْعَدَاوَةَ وَالْبَغْضَاء فِي الْخَمْرِ وَالْمَيْسِرِ

Şübhəsiz ki, şeytan şərab və qumarla aranıza ədavət və kin-küdurət salmaq“ (istəyir!”(٢

بَلْ يُرِيدُ الْإِنسَانُ لِيَفْجُرَ أَمَامَهُ

(Lakin insan bundan sonra da günah etmək, pis işlər görmək istəyir!”(٣“

Bu ayələrdə də məqsəd şeytanın insanları azğınlığa sürükləməsi, yaxud şərab və qumarla onların arasında ədavət və kin yaratmasının bütün zamanlara aid və həmişə bu fikirdə olmasıdır. Üçüncü ayədə də buyurulduğu kimi, nankor insan həmişə günah .və çirkin işlərə meyillidir, buna görə də o, qiyamət gününü danır

Qurani-Kərimdə “yuridu” (istəyir) felinin bütün zamanlara aid olmasını göstərən yuxarıdakı altı ayədən əlavə, (müddəamızı təsdiqləyən) digər ayələr də vardır. Beləliklə, “Təthir” ayəsi Allahın istək və iradəsinin bütün zamanlara aid olduğunu və .“Kisa” əhlinin, məsum imamların həmişə pak-pakizəliyini göstərir

## İSMƏT” MƏSƏLƏSİLƏ BAĞLI İRADLAR“

Peyğəmbər və məsum imamların “ismət”i ilə bağlı yaranan mühüm suallardan biri budur: “Onların məsum olması cəbri (məcburiyyət) yönə malik deyilmi? Əgər ismət məqamı xüsusi bəxş edilən ilahi bir hədiyyədirsə, peyğəmbər və imamlar günah edə bilmirlərsə, yaxud Allah-taala onları günaha çəkə bilən amillərin qarşısını alırsa, onda ”?ismət məqamını necə fəzilət və fəxr hesab etmək olar

Biz burada qısa şəkildə deyirik ki, məsumların ismətinin mahiyyəti araşdırılmadan bunu qavramaq olmaz. Onların belə yenilməz təqvaya malik olması “zati” və “iktisabi” (kəsbi) yolla əldə olunan güclü iman, yüksək elm və bilikdən qaynaqlanır. Məsələn, savadlı bir həkim müxtəlif analizlər vasitəsilə mikrobla dolu olduğu

sübuta yetən bir suyu heç vaxt içməz. Halbuki adi bir insanın belə bir işə əl atması təəccüblü deyil. Həkimin belə çirkli və mikroblu suyu içməməsi tamamilə ixtiyar üzündəndir. Burada onun qəti elmi bu işə səhlənkarlıqla yanaşmasına mane olur. O, belə hallarda tam iradə azadlığına malik olub, məsum peyğəmbər və imamlara (bənzəyir.(١)

Başqa bir sual: İmamlar öz kəlamlarında xəta və günah etdiklərini etiraf edirlərsə, onları necə məsum hesab etmək olar? Onların dualarında Allahdan günahlarının bağışlanması istənilir ki, bu da onların məsum olmadığını göstərir. İmam :Əmirəlmöminin Əli (ə) "Nəhcül-bəlağə"nin ٢١۶-cı xütbəsində buyurur

اِنِّی لَسْتُ فِی نَفْسِی بِفَوْقِ اَنْ اُخْطِی وَلا آمَنُ ذالِکَ مِنْ فِعْلِی اِلّا اَنْ یَکْفِیَ اللهُ مِنْ نَفْسِی ما هُوَ اَمْلَکُ بِهِ مِنِّی:

Mən (bir insan kimi) özümü xəta və səhvə yol verməkdən üstün bilmirəm, əgər Allah" (məni qorumasa, işlərimdə səhv etməkdən amanda deyiləm!"(٢)

Bu irad Qurani-Kərimdə peyğəmbərlərin sərgüzəşti ilə bağlı bir sıra hallara da aiddir. :Biz isə burada qısa şəkildə bir neçə məsələni açıqlamalıyıq

Məsumlar əksər hallarda insanlara örnək və nümunə olaraq fikirlərini bildirmişlər. .١ Onların kəlamları təlim xarakterlidir. Amma Alusi "Ruhul-məani" kitabında imam Əli (ə) barəsində bu iradı irəli sürdükdən sonra, həmin cavabı verərək yazır: "Peyğəmbər (s)-in bəzi dualarının təlim xarakterli olması məlumdur, amma onu Əlinin kəlamlarına da (aid etmək çətindir!"(٣)

Əlbəttə, bu tanınmış təfsir aliminin belə sözləri yalnız qəti təəssübkeşlikdən .qaynaqlanır

Məsumlar belə kəlamlarla demək istəyirlər ki, biz Allahın lütf və mərhəmətinə . ٢ sığınmadan öz-özlüyümüzdə heçik, bu ilahi yardım, müvəffəqiyyət və hədiyyələrlə günahlardan qorunuruq. Başqa sözlə desək, imam Əlidən (ə) nəql olunan kəlam əslində irad tutanların

Ələvə məlumat əldə etmək istəyənlər “Peyami-Quran”, ٧-ci cild, səh. ١٩٣-١٩٧-yə . [١] -١
.müraciə t etsinlər

Alusi “Ruhul-məani” kitabında “Təthir” ayəsinin təfsirində qəribə təkidlə ayənin . [٢] -٢
məfhumunun Əhli-beytin məsum olmasını bildirməsini inkar edir və yuxarıda qeyd
(.etdiyimiz iradı irəli sürür. (“Ruhul-məani”, ٢٢-ci cild, səh. ١٧

.Ruhul-məani”, ٢٢-ci cild, səh. ١٧“ . [٣] -٣

əksinə olaraq, ilahi lütf və mərhəmət sayəsində o həzrətin məsum olmasına dəlalət edir. Çünki İmam (ə) demək istəyir ki, mənim özüm (Allahın yardımı olmadan) xəta və günahdan amanda deyiləm, bu mənəvi hədiyyə və günahdan çəkinmə hissi məhz Allahın yardımı və yaxud "Yusif" surəsində buyurulduğu kimi, yalnız "Rəbbimin burhanı .və dəlili" sayəsindədir

Adətən, ayə və dualarda gələn "günah" ifadələri "tərki-övla"dan ibarətdir. Başqa .۳ sözlə desək, bu, "həsənatul-əbrari səyyiatul-muqərrəbin" – ibarəsinin xarici nümunəsidir; yəni saleh insanların yaxşı əməlləri Allaha daha yaxın və müqərrəblər üçün günah sayılır. Bunu da qeyd etmək lazımdır ki, "tərki-övla"dan məqsəd vacib əməllər deyil, əksinə daha müstəhəb bir əməli başqa bir mübah və ya müstəhəb əməllə əvəz etməkdir. Aydındır ki üstün bir müstəhəb əməli tərk edib, başqa bir müstəhəb əməli yerinə yetirmək şəriətdə xilaf iş sayılmır, sadəcə olaraq "tərki-övla" adlanır. Lakin başqa şəxslərin belə işi nəinki xilaf deyil, əksinə müstəhəb və öz .növbəsində fəzilətdir. İlahi insanlar isə bunu özləri üçün günah hesab edirlər

Adi bir insanın qıldığı namaz onun üçün məqbul və layiqli bir iş olduğu halda, böyük bir alim üçün həmin namaz "tərki-övla"dır və məsum şəxsin namazı isə o alimin namazından daha üstün olmalıdır. (Əlavə məlumat əldə etmək istəyənlər "Peyami-(Quran" kitabının ۷-ci cildinə müracət etsinlər.)(۱)

## İMAMLARA XAS XÜSUSİYYƏTLƏR

Dəfələrlə işarə etdiyimiz kimi, məsum imamların vəzifələri bir çox yerlərdə peyğəmbərlərlə eynidir; bu fərqlə ki, onlara vəhy nazil olmur və şəriət sahibi deyillər. Onlar peyğəmbərlərin yolunu davam etdirdikləri üçün malik olduqları xüsusiyyətlərdə peyğəmbərlərlə eynidirlər. Bunlar Quran ayələrinə əsaslanmaqla "Peyğəmbərlərin ümumi xüsusiyyətləri" bölümündə geniş bəhs olunduğu üçün, artıq burada qısa izahla kifayətlənirik. İlahi rəhbərlər və məsum imamlar "elm" və "ismət" məqamından əlavə, aşağıdakı xüsusiyyətlərə də



---

.Peyami-Quran", ۷-ci cild, səh. ۱۰۳-۱۸۳" .[۱]-۱

:malikdirlər

Doğru danışmaq: Bu xüsusiyyət olmazsa, örnək seçilən şəxslə ona qoşulanlar . ۱ .arasındakı mənəvi bağlılığı təmin edən etimad baş verməyəcəkdir

Vəd və əhd-peymanlara sadiq qalmaq: Onların dəvətlərində böyük əhəmiyyət . ۲ daşıyan cəhətlər verdikləri vəd və əhd-peymanlara vəfalı qalmalarıdır. Əgər onlar .sadiq və vəfalı olmasalar, ümumxalqın etimadını itirəcəklər

Şəriətin və ilahi hökmlərin qorunmasında əmanətdarlıq: Bu da etimadın əsas . ۳ .şərtlərindən biridir

İnsanlara məhəbbət və ürək yandırmaq: Əgər bu xüsusiyyət olmazsa, camaatla, . ۴ xüsusilə nadan, təəssübkeş və inadkarlarla keçinməkdə ağır çətinliklər və əzab- .əziyyətlərə əsla sinə gərməzlər

İxlas: İlahi rəhbərlər maddi mənafeyə təmənnasızdır, onların bütün işləri ixlas və saf .۵ .niyyət üzündəndir. Əks təqdirdə isə onların dəvət və çağırışları etibarsız olacaqdır

Xeyirxahlıq və yaxşılıq: İmam yer üzündə mehribanlıq cilvəsidir. Bu isə rəhbər şəxslə .۶ .ardıcılları arasında mənəvi bağlılığı qorumaq üçün zəruridir

Şücaət: Şücaət və Allahdan qeyrisindən qorxmamaq ilahi şəxslərin əsas . ۷ xüsusiyyətlərindəndir. Ümumiyyətlə, müvəffəqiyyətin əsas rəmzi budur! Ona malik .olmayan şəxs isə rəhbərlik edə bilməz

Allaha mütləq şəkildə təvəkkül edib güvənmək: Elə vaxtlar olur ki, ilahi rəhbər tək- .۸ tənha qalır və yaşadığı mühit, ona hakim kəsilən fitnə-fəsad tam ona qarşı çıxır. Belə .hallarda əgər o, yalnız Allaha güvənməsə, yolundan dönməməyi çox çətin olacaqdır

Gözəl əxlaq və mülayimlik: Bütün ilahi rəhbərlərin (istər peyğəmbər, istərsə də . ۹ məsum imamların) xüsusiyyətlərindən biri də gözəl əxlaqa malik olmaları, camaatla mülayim davranmalarıdır. Tünd və sərt xasiyyət, daşürəklilik camaatın onlardan uzaqlaşmasına, ətrafından dağılmasına, eləcə də hədəf və məqsədə çatmamalarına .səbəb olacaqdır

Ağır sınaqlardan keçmək: Qurani-Kərimdə buyurulduğu kimi, İbrahim peyğəmbər .١٠ özü ağır imtahan və sınaqlardan keçdikdən

.sonra imamət məqamına nail oldu

Həqiqətdə, məsum rəhbərlər də çətin imtahanlardan qalib çıxmalıdırlar ki, möminlərə .cismən və ruhən rəhbərlik edə bilsinlər

**İMAM ALLAH TƏRƏFİNDƏN TƏYİN OLUNUR**

İmamın xüsusiyyətləri və peyğəmbərlərə bir çox cəhətlərdə oxşarlığından belə nəticə alırıq ki, məsum imamlar (Peyğəmbər (s)-in canişinləri) Allah tərəfindən təyin olunmalıdır. Başqa sözlə desək, burada nə camaatın, nə ümmətin icmasının, nə də xüsusi bir qrupun dəxalət etməyə haqqı yoxdur. Çünki imamın ismət məqamı, qeyri-adi elmi və Allahdan başqa kimsənin xəbərdar olmadığı digər xüsusiyyətləri vardır ki, bunlarsız imamət məqamı təsəvvür olunmur. Belə olan təqdirdə, kim deyə bilər ki, filankəs xəta və günahdan uzaqdır, onun elmi bütün şəri və insan həyatı ilə bağlı məsələləri əhatə edir?! Hətta yuxarıda qeyd etdiyimiz imamın bir neçə xüsusiyyətinin ayırd edilməsi insanların əksəriyyəti, bəzən də hamısı üçün çətin və qeyri-mümkündür. Buna əsasən, nəticə alırıq ki, imamın təyini məhz Allah tərəfindən olmalıdır. Allahın :təyini də üç yolla əldə edilir

Peyğəmbər (s), yaxud əvvəlki məsum imam öz canişinini Allahın əmrilə təyin etməli .١ və bunu insanalara çatdırmalıdır. Həqiqətdə, o da Allahın əmrini xalqa çatdırmaqda .yalnız vasitə rolunu oynayır

Nübüvvət"in şərtlərində qeyd olunduğu kimi, möcüzəli iş – kəramət göstərməyə" .٢ qadir olmalıdır; belə ki, ilahi rəhbər və imam bəşərin qüdrətindən xaric olan xariqülадə işləri bacarmalı və bu işə məhz başqaları onu qəbul etmədikdə, əl atmalıdır. Lakin bu məsələdə peyğəmbər peyğəmbərlik, imam da imamət iddiası ilə çıxış etməlidir. Başqa sözlə desək, imam olduğunu iddia edən şəxs xariqülадə bir işi peyğəmbərlik iddiası ilə deyil, imamət iddiası ilə həyata keçirməlidir. Şübhəsiz, belə bacarıq ona Allah tərəfindən əta olunur. Hikmətli və hər şeyi bilən Allah bu imkanı yalançı iddiaçıların .ixtiyarına əsla verməz

Nübüvvət" şərtlərində deyildiyi kimi, əlamətlərin müşahidəsi ilə imam müəyyən" .٣ olur; belə ki, bir sıra xüsusiyyətləri müşahidə

etməklə məsum imam və ilahi rəhbəri tanımaq olar. Həmin şəxsin elm və biliyi, əxlaqi səciyyələri, insani keyfiyyətləri, keçmişi, əməlləri, danışığı və fikirləri birlikdə məsum imam və Peyğəmbər (s)-in canişini aşkara çıxarır.(۱)



---

۱- [۱]. Əlavə məlumat əldə etmək istəyənlər “Peyami-Quran” kitabının ۷-ci cildinin, ۳۰۳-۳۰۹-cu səhifələrinə müraciət etsinlər.

## IV. PEYĞƏMBƏR VƏ İMAMLARIN "TƏKVİNİ" VİLAYƏTİ

### İşarə

:İşarə: Bildiyimiz kimi, vilayət iki qismə bölünür

;"Təşrii vilayət" .۱

."Təkvini vilayət" .۲

Təşrii vilayət" qanun çərçivəsində rəhbərlik və hakimiyyətdən ibarətdir. Bəzən o, ata" və babanın övladı üzərindəki vilayəti kimi məhdud olur, bəzən də İslamın hökumət və .ölkənin bütün işlərini əhatə edir

Təkvini vilayət" isə bir kəsin yaradılış aləmində Allahın izni ilə xilqəti təşkil edən" qanunlarda əli olması, eləcə də onları dəyişdirməyə qadir olmasından ibarətdir. O, Allahın izni ilə ixtiyarı çatdığı qədər əlacsız bir xəstəyə şəfa vermək və ölüləri diriltmək kimi qeyri-adi işləri yerinə yetirə bilər. İnsanların cismində və təbiətdə bir sıra qeyri-.adi dəyişikliklər yaratmaq da bura daxildir

Təkvini vilayət"i dörd yerə aid etmək olar ki, bəziləri onu qəbul, bəziləri isə inkar" :edirlər

Dünyanın yaradılışında vilayət: Belə ki, Allah-taala bir bəndəyə, yaxud mələyə . ۱ aləmdə bir varlıq yaratmağa, yaxud bir varlığın həyatını almağa icazə verir. Sözsüz ki, bu qeyri-mümkün deyildir. Çünki Allah-taala hər bir şeyə qadirdir və istədiyi qüdrəti istədiyi şəxsə əta edə bilər. Lakin Quran ayələri göstərir ki, varlıq aləminin, yer və göylərin, insan, cin və mələklərin, heyvan və bitkilərin, dağ, dərə və dənizlərin yaradılışı mələklərin, yaxud xüsusi

bəndələrinin ixtiyarında yox, məhz Allahın qüdrət əlindədir. Bu isə (geniş mənada) qeyrisinə əsla verilməmişdir. Buna əsasən, yer, göy və bütün canlıların xaliqi yalnız .aləmlərin rəbbi olan Allahdır

Təkvini feyz vasitəsi": Yəni Allah tərəfindən bəndələrə, yaxud varlıq aləminin digər " .٢ məxluqlarına çatan hər bir yardım, rəhmət, bərəkət və qüdrət ilahi övliyalar və Onun xas bəndələri vasitəsilədir. Məsələn, şəhərin evlərinə çəkilən boruların suyu mənbəsini böyük su hovuzlarından alır və hamıya paylanır. Burada mənbədən ayrılan ilk şaxəyə ."feyz vasitəsi" demək olar

Bu nəzər də əqli baxımdan qeyri-mümkün deyildir. Bunun nümunəsini kiçik formada insanın orqanizmində qanın ürəyin şah damarı vasitəsilə bütün orqanlara yayılmasında müşahidə edirik. Bu prosesin böyük aləmdə gerçəkləşməsinin də təsəvvürü qeyri-mümkün deyildir. Şübhəsiz, onu sübut etmək üçün kifayət qədər .dəlilə ehtiyac vardır. Əgər sübut olunsa belə, yenə Allahın izni şərtdir

Məhdud "təkvini vilayət": Bura ölüləri diriltmək, əlacsız xəstələrə şəfa vermək və s. .٣ .işləri misal göstərmək olar

Qurani-Kərimin ayələrində peyğəmbərlərin bu qism vilayətə malik olan nümunələri açıq-aydın görünür və biz bu ayələrə sonra işarə edəcəyik. Bu məsələ rəvayətlərdə də təsdiq olunur. Buna görə də "təkvini vilayət"in bu qismi həm əqli, həm də nəqli dəlillərə .əsasən, mümkün bir iş sayılır

Xeyirli işlərin gerçəkləşməsi üçün dua xarakterli vilayət: Bu da mütəal Allahın izninə (٤ bağlıdır. Belə ki, Peyğəmbər (s), yaxud məsum imam dua edir və Allahın iznilə xarici .aləmdə gerçəkləşir

Bu da əqli və şəri baxımdan məqbuldur, bu haqda ayə və rəvayətlər çoxdur. Bəlkə də ona "təkvini vilayət" adını vermək münasib deyil, çünki duanın qəbulu Allah .tərəfindəndir

Bir çox rəvayətlərdə peyğəmbər, imam və bəzi ilahi övliyaların "ismi-əzəm"i (Allahın böyük adını) bilməsindən söz açılmış və onun vasitəsilə aləmdə məsləhət üzrə olan

istəklərin həyata keçirilməsi göstərilmişdir. “İsmi-əzəm”in(۱) nə olduğunu nəzərə almadan, bu



---

۱- [۱] . Bu məsələ ilə əlaqədar “Peyami-Quran” kitabının “Allahın sifətləri” fəslində geniş bəhs etmişik.

qəbildən olan rəvayətlər onun “təkvini vilayət”in üçüncü qismi ilə uyğun olduğunu .açıqlamışdır

:Bu işarə ilə Qurani-Kərimdən “təkvini vilayət”i bildirən bəzi ayələri misal çəkirik

وَيُعَلِّمُهُ الْكِتَابَ وَالْحِكْمَةَ وَالتَّوْرَاةَ وَالإِنجِيلَ وَرَسُولاً إِلَى بَنِي إِسْرَائِيلَ أَنِّي قَدْ جِئْتُكُم بِآيَةٍ مِّن رَّبِّكُمْ أَنِّي أَخْلُقُ لَكُم مِّنَ الطِّينِ كَهَيْئَةِ الطَّيْرِ فَأَنفُخُ فِيهِ فَيَكُونُ طَيْرًا بِإِذْنِ اللّهِ وَأُبْرِئُ الأكْمَهَ والأَبْرَصَ وَأُحْيِـي الْمَوْتَى بِإِذْنِ اللّهِ وَأُنَبِّئُكُم بِمَا تَأْكُلُونَ وَمَا تَدَّخِرُونَ فِي بُيُوتِكُمْ إِنَّ فِي ذَلِكَ لآيَةً لَّكُمْ إِن كُنتُم مُّؤْمِنِينَ

Allah ona kitabı, hikməti, Tövratı, İncili öyrətdi və onu İsrail övladlarına peyğəmbər“ .١ göndərdi. (İsa onlara dedi:) “Mən həqiqətən, Rəbbiniz tərəfindən ayə (möcüzə) ilə sizə peyğəmbər olaraq gəlmişəm. Sizin üçün palçıqdan quşa bənzər bir surət düzəldib ona üfürərəm, o da Allahın izni ilə (diri) quş olar. Anadangəlmə korları, cüzam xəstəliyinə tutulanları sağaldar və Allahın iznilə ölüləri dirildərəm. Mən evlərinizdə yediyiniz və yığıb saxladığınız şeyləri də sizə xəbər verərəm. Əgər möminsinizsə, bunlarda həqiqi (nişanələr vardır!”(١

فَسَخَّرْنَا لَهُ الرِّيحَ تَجْرِي بِأَمْرِهِ رُخَاء حَيْثُ أَصَابَ

(Biz küləyi ona ram etdik. Külək onun əmri ilə istədiyi yerə rahatca gedirdi!”(٢“ .٢

قَالَ الَّذِي عِندَهُ عِلْمٌ مِّنَ الْكِتَابِ أَنَا آتِيكَ بِهِ قَبْلَ أَن يَرْتَدَّ إِلَيْكَ طَرْفُكَ فَلَمَّا رَآهُ مُسْتَقِرًّا عِندَهُ قَالَ هَذَا مِن فَضْلِ رَبِّي لِيَبْلُوَنِي أَأَشْكُرُ أَمْ أَكْفُرُ وَمَن شَكَرَ فَإِنَّمَا يَشْكُرُ لِنَفْسِهِ وَمَن كَفَرَ فَإِنَّ رَبِّي غَنِيٌّ كَرِيمٌ

Səmavi) kitabdan bir qədər bilən birisi dedi: “Mən onu sənə bir göz qırpımında)“ .٣ gətirərəm! (Süleyman) taxtı yanında hazır durmuş görüncə dedi: “Bu, Rəbbimin lütf və mərhəmətindəndir. Məni imtahana çəkmək üçündür ki, görək Ona şükür edəcəyəm, yoxsa nankor olacağam! Kim şükür etsə, yalnız öz xeyrinə şükür etmişdir; kim nankor (olsa, həqiqətən, mənim Rəbbim hər şeydən ehtiyacsızdır və kərəm sahibidir!”(٣

Birinci ayədə əvvəlcə Allahın həzrət İsaya (ə) xüsusi lütf və mərhəmətindən söz açılaraq buyurulur: “Allah ona kitabı, hikməti, Tövratı və İncili öyrətdi.” Sonra onu peyğəmbər kimi tanıtdıraraq buyurur: “Onu İsrail övladlarına peyğəmbər göndərdi.” Ayənin

davamında İsa (ə) özünün haqq olduğunu sübut etmək üçün dediyi sözləri və :möcüzələri şərh edərək beş qismə bölür

Əvvəl buyurur: “Mən həqiqətən, Rəbbiniz tərəfindən möcüzə ilə sizə peyğəmbər gəlmişəm. Sizin üçün palçıqdan quşa bənzər bir surət düzəldib ona üfürərəm, o da ”.Allahın iznilə quş olar

İkinci və üçüncü: “Anadangəlmə korlara və cüzam xəstəliyinə tutulanlara şəfa ”!verərəm

”!Dördüncü: “Allahın iznilə ölüləri diriltdərəm

Beşinci: “Mən evlərinizdə yediyiniz və zəxirə etdiyiniz şeyləri də sizə xəbər verərəm. ”!Əgər möminsinizsə, bunlarda həqiqi nişanələr vardır

Bu ayənin möhtəvasına və onun ibarələrindəki təfavütə diqqət yetirdikdə, məlum olur ki, həzrət İsa (ə) quşların yaradılışını Allah-taalaya, digər üç möcüzəni isə (ölüləri diriltmək, anadangəlmə korlara və cüzam xəstəliyinə tutulanlara şəfa vermək) Allahın əmri və izni ilə özünə nisbət verir. “Təkvini vilayət”də bəzən Allah-taala insana elə bir qüdrət verir ki, Onun əmrilə yaradılış aləmində təsir qoyaraq adi səbəbləri adlayır, .ölünü diriltmək və əlacsız xəstəyə şəfa vermək kimi işlərə qadir olur

Bu, Allah-taalanın İsa peyğəmbərə əta etdiyi “təkvini vilayət”in bir nümunəsi idi və buna oxşar vilayətin digər peyğəmbərlər və məsum imamlara da verməsində heç bir .mane görünmür

Amma bir kəs “məqsəd İsanın (ə) duası ilə Allah-taalanın şəfa verməsi, yaxud ölüləri diriltməsidir!” – demiş olsa, bu nəzər ayənin zahiri mənası ilə əksdir. Çünki ayədə açıq-aydın buyurulur ki: “Mən bu işi Allahın iznilə görürəm!” Yəni xariqüladə işləri Allahın iznilə özüm görürəm. Heç bir dəlil yoxdur ki, ayənin zahiri mənasını buraxıb, ona əks .olan bir fikir yürüdək

Hətta “quşların yaradılışı”nda da mümkündür ki, bu təsir Allah-taalanın iznilə İsa (ə)-ın üfürməsinə verilsin və o da Allahın iznilə belə bir iş görsün. Hərçənd, bir çox təfsirçilər bu mənanı qəbul edərək demişlər ki, quşların yaradılışı birbaşa Allaha mənsubdur.

Bəlkə də məqsəd budur ki, bəziləri həzrət İsanın (ə) Allah olmasını iddia etməsinlər. Çünki xaliqlik yalnız yeganə Allaha məxsusdur! Bu

mənanın oxşarını “Maidə” surəsinin ۱۱۰-cu ayəsində də görmək olar, lakin bu iş İsanın :(ə) dili ilə deyil, Allah-taalanın İsaya (ə) xitabı ilə görülür. Ayədə buyurulur

وَإِذْ تَخْلُقُ مِنَ الطِّينِ كَهَيْئَةِ الطَّيْرِ بِإِذْنِی فَتَنفُخُ فِيهَا فَتَكُونُ طَيْرًا بِإِذْنِی وَتُبْرِىءُ الأَكْمَهَ وَالأَبْرَصَ بِإِذْنِی وَإِذْ تُخْرِجُ الْمَوتَى بِإِذْنِی

Xatırla o zamanı ki, sən Mənim iznimlə palçıqdan quşa bənzər bir şey düzəldib ona“ üfürürdün, o da Mənim iznimlə quş olurdu. Sən Mənim iznimlə anadangəlmə kora və (cüzamlı xəstəyə şəfa verir və Mənim iznimlə ölüləri dirildirdin!”(۱)

Diqqəti cəlb edən məsələ budur ki, “Ali-İmran” surəsindəki ibarə fərqliyi eynilə burada da görünür, yəni xilqət və quşların yaradılışı İsa peyğəmbərə yox, yalnız ölüləri diriltmək, anadangəlmə korlara və əlacsız xəstələrə şəfa ona nisbət verilmiş, hərçənd, .onların hamısında Allahın izni qeyd edilmişdir

Bir sözlə, bu ayələr İsa peyğəmbərin xüsusi və məhdud çərçivədə “təkvini vilayət”ə malik olmasını açıq-aydın sübut edir və bu məsələnin yalnız o həzrətə həsr edilməsi üçün heç bir dəlil də yoxdur və bu, digər peyğəmbərlərə və məsum imamlara da .aiddir

İkinci ayədə küləklərin həzrət Süleymana (ə) tabe olmasından söz açılaraq buyurulur: ”!“Biz küləyi ona ram etdik. Külək onun əmri ilə istədiyi yerə rahatca gedirdi

Bu ayə və sonrakı ayələrdən açıq-aşkar başa düşülür ki, cinlər Süleyman peyğəmbərin əmrinə tabe olduqları və onun üçün quru və suda mühüm işlər yerinə yetirdikləri kimi, küləklər də onun əmrinə təslim idi və onun göstəriş verdiyi yerə hərəkət edirdilər. Bu da “təkvini vilayət”in xaricdəki nümunələrindəndir. Bu məna “Ənbiya” surəsinin ۸۱-ci :ayəsində də açıqlanmışdır

وَلِسُلَيْمَانَ الرِّيحَ عَاصِفَةً تَجْرِی بِأَمْرِهِ إِلَى الْأَرْضِ الَّتِی بَارَكْنَا فِيهَا

Allahın) əmrilə bərəkət verdiyimiz yerə tərəf şiddətlə əsən küləyi də Süleymana Biz)“ ”.ram etdik

Bu ayədə şiddətlə əsən küləyin Süleyman peyğəmbərin ixtiyarında olmasından söz .açılır

Çox ehtimal ki, həzrət Musanın (ə) əsasını daşa vuraraq Allahın iznilə on iki çeşmənin fəvvarə vurması(١), eləcə də əsasını dəryaya vurmaqla onu iki hissəyə bölməsi(٢) .“təkvini vilayət”in qismindəndir

Nəticə: Heç bir şübhə yoxdur ki, Allah-taala xas bəndələrinə “təkvini vilayət” verməklə .onlara yaradılışda və xarici aləmdə dəyişiklik qüdrəti əta edir

Üçüncü ayədə Süleyman peyğəmbərin xüsusi dostlarından olan bir kəsin “təkvini vilayəti”ndən söz açılır. Qurani-Kərimdə onun adı çəkilmir, yalnız “elmdən bir qədər :bilən kəs” ibarəsi ilə vəsf edilir. Qurani-Kərimdə buyurulur

قَالَ يَا أَيُّهَا المَلَأُ أَيُّكُمْ يَأْتِينِى بِعَرْشِهَا قَبْلَ أَن يَأْتُونِى مُسْلِمِينَ

Süleyman dedi: “Ey əyanlar! Onlar müti vəziyyətdə yanıma gəlməmiş hansınız“ ((Bilqeysin) taxtını mənə gətirə bilər.”(٣

قَالَ عِفْرِيتٌ مِّنَ الْجِنِّ أَنَا آتِيكَ بِهِ قَبْلَ أَن تَقُومَ مِن مَّقَامِكَ

(Cinlərdən olan bir ifrit dedi: “Sən yerindən qalxmamış, mən onu sənə gətirərəm!”(٤“

قَالَ الَّذِى عِندَهُ عِلْمٌ مِّنَ الْكِتَابِ أَنَا آتِيكَ بِهِ قَبْلَ أَن يَرْتَدَّ إِلَيْكَ طَرْفُكَ

Səmavi) kitabdan bir qədər bilən birisi isə dedi: “Mən onu sənə bir göz qırpımında)“ (gətirərəm!”(٥

Əlbəttə, bu bir iddia olmayıb, əməli olaraq həyata keçirildi. Ayənin davamında :buyurulur

فَلَمَّا رَآهُ مُسْتَقِرًّا عِندَهُ قَالَ هَذَا مِن فَضْلِ رَبِّى

Süleyman) taxtı yanında hazır durmuş görüncə dedi: “Bu, Rəbbimin lütf və) (mərhəmətindəndir (ki, dostlarımdan bəzisinə belə bir qüvvət və qüdrət verilmişdir)!”(٦

?Sual: Səmavi kitabı bilən şəxs kim idi

Məşhur nəzərə görə, bu şəxs Süleyman peyğəmbərin vəziri Asəf ibn Bərxiya olmuşdur. Deyilənlərə görə, o, Süleyman peyğəmbərin bacısı oğlu imiş. Əyyaşinin

təfsir kitabında qeyd olunan rəvayətdə



---

۱- [۱] . “۶۰ :Bəqərə” surəsi, ayə.

۲- [۲] . “۶۳ :Şüəra” surəsi, ayə.

۳- [۳] . “۳۸ :Nəml” surəsi, ayə.

۴- [۴] . “۳۹ :Nəml” surəsi, ayə.

۵- [۵] . “۴۰ :Nəml” surəsi, ayə.

۶- [۶] . “۴۰ :Nəml” surəsi, ayə.

deyilir: “Yəhya ibn Əksəm imam Əli ibn Mühəmməd ibn Nəqi (ə)-dan Asəf ibn Bərxiyanın kim olduğunu soruşduqda, o həzrət buyurdu: “Süleymanın (ə) canişini idi və nübüvvət məqamına çatmışdı.” Həzrət Süleyman (ə) bu işlə onun məqam və .mövqeyini hamıya bildirmək istəyirdi. Halbuki özü bu işi görməyə hamıdan qadir idi

Bəziləri ehtimal vermişlər ki, o, Süleyman peyğəmbərin özü olmuşdur. Bu isə ayənin .zahiri mənasına tam əksdir

Bəziləri də demişlər ki, o, Bəni-İsrail tayfasından bir nəfər olmuşdur. Məlumdur ki, bu təfsirin Asəf ibn Bərxiya ilə heç bir ziddiyyəti yoxdur. Çünki Asəf ibn Bərxiya da zahirən, Bəni-İsraildən imiş. Ümumiyyətlə, burada məqsəd ilahi övliyalardan birinin kitabdan, yaxud “ismi-əzəm”dən bir qədər biliyi ilə xarici aləmdə Səba padşahının taxtını ərəb ölkələrinin cənubundan şimalına bir göz qırpımında gətirməyindən söhbət gedir. Bu isə digər ilahi övliyalar, peyğəmbərlər və məsum imamlara aiddir. Xüsusilə, bəzi rəvayətlərdə imam Baqir (ə)-ın buyruğu bunu təsdiq edir: “İsmi-əzəm (Allahın böyük adı) yetmiş üç hərfdən ibarətdir. Asəf ibn Bərxiya onun yalnız bir hərfini bilirdi və onu dilə gətirərkən yer və Bilqeysin taxtı onun müqabilində diz çökdü... Və bu iş bir göz qırpımından da tez baş verdi. Biz isə onların yetmiş ikisini bilirik və (qalan) bir hərf isə yalnız Allah-taalanın qeybi elminə məxsusdur, hər bir qüvvət və qüdrət yalnız Onun (izni və əmrilədir!”(۱)

Bu məzmunda başqa rəvayətlər də imam Baqir (ə) və imam Sadiq (ə), eləcə də digər imamlardan da nəql olunmuşdur. Beləliklə, ötən ayələrdən açıq-aşkar məlum olur ki, Qurani-Kərim baxımından “təkvini vilayət”in bəndələrə verilməsində heç bir şübhə .yoxdur

## HƏDİSLƏRDƏ TƏKVİNİ VİLAYƏT

Bir çox rəvayətlərdə biz “təkvini vilayət”dən qaynaqlanan bir sıra möcüzələrlə rastlaşırıq ki, müxtəlif növlərə bölünür; bunlar bəzən Peyğəmbər (s), yaxud məsum imamın sırf duası, bəzən camaatın

onlardan tələbi, bəzən Allahın öz əmri, bəzən də onların öz feli ilə baş vermişdir ki, bu da onların mənəvi və ilahi məqamlarına arxalanaraq Allahın iznilə xariqüladə işlər görməsini, onların “təkvini vilayət”ə malik olduqlarını göstərir. Belə hallar çoxdur və biz :burada onların bir neçəsilə kifayətlənrik

İmam Əli (ə) “Nəhcül-bəlağə”nin “Qasiə” xütbəsində diqqəti cəlb edən bir möcüzəyə .١ işarə edərək buyurur: “Mən Peyğəmbər (s)-lə birgə idim. Bu zaman Qüreyş tayfasının böyükləri onun yanına gəlib dedilər: “Ya Mühəmməd! Sən çox böyük bir iddia edirsən, halbuki əsil-nəsəbin, ata-babaların belə bir iddia etməmişlər. Biz səndən bir möcüzə istəyirik! Əgər razı olub, möcüzə göstərə bilsən, peyğəmbərsən, yox, əgər göstərə ”!bilməsən, sənin yalançı və sehrkar olduğun bizə aydın olacaq

Peyğəmbər (s) “İstəyiniz nədir?” – deyə soruşduqda, onlar dedilər: “Bu ağacı çağır, ”!kökündən çıxıb irəli gəlsin və qarşında dursun

O həzrət buyurdu: “Allah-taala hər bir şeyə qadirdir. Əgər bu işi görsəm, mənə iman ?gətirib, haqq olduğuma şahid duracaqsınızmı

”!Dedilər: “Bəli

Həzrət buyurdu: “İndi istədiyinizi rəva edəcəyəm, lakin bilirəm ki, siz xeyir və yaxşılığa doğru qayıtmayacaqsınız. Sizin aranızda “Bədr” quyusuna atılan, eləcə də “Əhzab” ordusuna qoşulanlar vardır!” Sonra o həzrət ağacı belə səslədi: “Ey ağac! Əgər Allaha və qiyamət gününə iman gətirib, mənim peyğəmbər olduğumu bilirsənsə, kökündən ”!ayrılıb yanıma gəl və Allahın əmrilə mənim qarşımda dur

Onu haqq olaraq peyğəmbər göndərən Allaha and olsun! Ağac köklərilə yerdən ayrılıb irəli gəldi, sanki səmada qanadlarını çırpan quşlar kimi ucadan səs salırdı. Ağac Allahın Rəsulunun (s) qarşısında dayandı və quşların lələkləri kimi, budaqlarından bir neçəsi yerə töküldü, bir neçə uca budağını Peyğəmbər (s)-in, bir neçəsini də mənim çiynimə .sarı əydi. Mən o həzrətin sağ tərəfində durmuşdum

Qüreyş böyükləri isə bu vəziyyəti müşahidə etdikdə, qürur və təkəbbür üzündən dedilər: “Ağaca əmr et ki, yarısı irəli getsin, yarısı da

öz yerində qalsın." Peyğəmbər (s) əmr verdikdə, dəhşətli səslə ağacın yarısı !Peyğəmbər (s)-ə o qədər yaxınlaşdı ki, artıq o həzrətə toxundu

Onlar yenə küfr edib dedilər: "Göstəriş ver ki, ağacın bu hissəsi də qalan hissəsinə yapışıb, əvvəlki vəziyyətə düşsün!" Peyğəmbər (s)-in göstərişi ilə ağac əvvəlki vəziyyətə düşdü. Mən dedim: "La ilahə illəllah! (Allahdan başqa Allah yoxdur!) Ya Peyğəmbər! Mən sənə iman gətirən birinci şəxsəm və şəhadət verirəm ki, ağac Allahın ".əmrilə sənin peyğəmbərliyini və dəvətini təsdiq edərək istədiyini yerinə yetirdi

Onlar isə yenə dedilər: "Xeyr, o yalançı sehrkardır ki, qəribə bir sehr göstərdi və öz işində çox mahirdir. Sənin peyğəmbərliyini bunun kimilərindən başqa (məni deyirdilər) kim təsdiq edəcəkdir?!" Lakin mən Allah yolunda heç bir danlaqdan qorxmayanlardan, doğru danışanlardan və sözlərində xeyirdən başqa bir şeyi düşünməyənlərdənəm! Onlar gecələri (ibadət üçün) oyaq qalar, gündüzlərə aydınlıq verər, Qurana bağlanar, Allahın və Rəsulunun sünnəsini dirildər, nə təkəbbür edər, nə özlərini üstün bilər, nə də fitnə-fəsad törədərlər, qəlbləri behiştdə, bədənləri isə dünyadadır və həmişə öz "!vəzifələrinə əməl edərlər

Bu xütbənin ibarələrindən açıq-aydın görünür ki, bu xariqüladə iş Peyğəmbər (s)-in xarici aləmdə təsiri ilə baş vermişdir. Buna əsasən, xütbənin "ağac Allahın əmri və izni ilə hərəkətə gəldi!" – ibarəsində Allahın izni, əmri işlədilmiş və Allah-taala Peyğəmbər (s)-i belə işlərə qadir etmişdir. Burada əvvəldən axıra qədər "Allahın izni" ifadəsi işlədilmişdir. Beləliklə, "Ey ağac, kökündən ayrılıb yanıma gəl...!" – ibarəsi aşkar surətdə İslam Peyğəmbərinin (s) "təkvini vilayət" və xarici aləmdə təsirəmalik olduğunu .göstərir

Mərhum Əllamə Məclisi "Biharul-ənvar" kitabında Salman Farsidən belə nəql edir: .٢ "Peyğəmbər (s) Mədinəyə gəldikdə, camaat onun dəvəsinin yüyənindən yapışdı, hər kəs Həzrəti öz evinə aparmaq istəyirdi. Peyğəmbər (s) isə buyurdu: "Dəvəni azad buraxın və hər kəsin evinin qapısı qarşısında yatsa, mən onun evində qalacağam!" (Bu, (.ixtilaf və ayrıseçkiliyi aradan qaldırmaq üçün ən yaxşı yol idi

Onlar dəvəni buraxdılar və o gedib, Mədinə küçələrinə daxil oldu, nəhayət, Əbu Əyyub Ənsarinin evinin qapısının qarşısında yatdı. Mədinədə Əbu Əyyub Ənsaridən yoxsul bir kəs yox idi. Camaat Peyğəmbər (s)-lə birgə olma səadətindən məhrum olduqları üçün .təəssüfləndilər

Əbu Əyyub Ənsari qışqırdı: "Anacan, qapını aç! İnsanların sərvəri, "Rəbiə" və "Müzər" qəbilələrinin ən əziz şəxsi Mühəmməd Müstəfa (s) – Rəsuli-Müctəba təşrif gətirib!" Onun anası qapını açıb, çölə çıxdı. Onun gözləri görmürdü. Dedi: "Kaş, gözüm olaydı, mövlam və sərvərim Peyğəmbər (s)-in camalına baxaydım!" Bu vaxt Peyğəmbər (s) əlini Əbu Əyyubun anasının üzünə sürtdü və onun gözləri açıldı. Bu, Peyğəmbər (s)-in göstərdiyi ilk möcüzə idi. (Mümkündür "əlini üzünə sürtdü" – ibarəsindən məqsəd, əli (ilə işarə etmək, yaxud əlini paltar üstündən sürtmək və sair olsun.)(١)

Həm şiə, həm də əhli-sünnənin mötəbər kitablarında nəql olunmuşdur ki, "Xeybər" .٣ müharibəsində bəzi sərkərdələrin vasitəsilə qələbə əldə edilmədikdə, Peyğəmbər (s) buyurdu: "Sabah bayrağı Allah və Rəsulunun sevdiyi bir şəxsə tapşıracağam!" Səhər o həzrət Əlinin (ə) yanına getdi. O vaxt Əlinin (ə) gözü bərk ağrıyırdı. Peyğəmbər (s) ağız suyunu onun gözünə çəkdi və bundan sonra bir daha ağrı hiss etmədi. Sonra bayrağı (ona tapşırdı (və "Xeybər" qalası o həzrətin əlilə fəth edildi)!(٢

Bu hədisdə qeyd edilir ki, Peyğəmbər (s) Allahın izni və təkvini təsiri ilə Əlinin (ə) .gözünə şəfa vermişdir

Bir dəfə Əmirəlmöminin Əlinin (ə) dövründə "Fərat" çayı daşmışdı, hətta Kufə .٤ camaatı qorxuya düşmüşdü. Onlar Əlinin (ə) yanına gedib dedilər: "Qorxuruq ki, sel bizi aparsın, çünki Fəratın suyu o qədər çoxalıb ki, indiyə qədər belə olmamışdır. Bütün "!küçələri su tutub. Sənə Allahı and veririk ki, bizim dadımıza çat

Əmirəlmöminin Əli (ə) atına mindi və camaat da onunla birgə hərəkət etməyə başladılar... Fərat çayına çatdıqda, hələ çayın coşğun



---

.Biharul-ənvar", ١٩-cu cild, səh. ١٢١" . [١] -١

Kamilut-tarix”, İbn Əsir, ٢-ci cild, səh. ٢١٩; “Sireyi-Nəbəviyyə”, ٣-cü cild, səh. ٣۴٩“ . [٢] -٢
.və “Biharul-ənvar”, ٢١-ci cild, səh. ٢٩٨, hədis: ٣٠

dalğaları hər yerə yayılırdı. Əli (ə) dayandı və camaat da o həzrətə tamaşa edirdi. O həzrət ibrani dilində bir söz dedi ki, birdən Fəratın suyu bir “zira” (iki qarış) azaldı. Sonra ”?Həzrət üzünü camaata tutub buyurdu: “Bu qədər kifayət edərmi

”!Dedilər: “Bir az da azalsın

İmam Əli (ə) əlindəki çubuqla suya vurduqda, su tamamilə yatdı. (Camaat sevinc (!içərisində Fəratın ətrafından dağıldılar

!?Görəsən, Əlinin (ə) bu işi Allahın izni ilə təkvini aləmə təsirdən başqa bir şeymi idi

***

Yenə imam Əlinin (ə) həyatında oxuyuruq ki, o həzrət Kufənin yaxınlığından . ٥ keçərkən, bir qrup yəhudi o həzrətə yaxınlaşıb dedilər: “Sən imam Əli ibn Əbi ”?Talibsənmi

”!İmam buyurdu: “Bəli

Dedilər: “Bizim kitablarımızda peyğəmbərlərdən altı nəfərin adı yazılan böyük bir daşdan söz açılır və biz o daşı nə qədər axtarırıqsa, tapa bilmirik. Əgər sən ”!imamsansa, onu bizim üçün tap

Həzrət buyurdu: “Mənim ardımca gəlin!” Yəhudilər o həzrətin ardınca getdilər. Onlar gəlib bir səhralığa çatdılar ki, orada çınqıl daşlı böyük bir təpə var idi. İmam buyurdu: “Ey külək, Allahın böyük adlarına xatir, çınqıl daşları böyük daşın üzərindən apar!” Bu (zaman külək əsib, çınqıl daşları özü ilə apardı və həmin böyük daş göründü.(١

Həm şiə, həm də sünnülərin tarix, təfsir və hədis kitablarında, İslamın müxtəlif mənbələrində belə misallar olduqca çoxdur. Biz isə qeyd etdiyimiz bir neçə nümunə ilə kifayətlənirik. Qeyd edilən ayə və rəvayətlərdə açıq-aşkar göstərilir ki, ilahi övliyalar, peyğəmbərlər və imamlar Allahın əmri və izni ilə təkvini aləmə təsir və nüfuz etməklə xariqüladə işlər görməyə qadirdirlər. Bu da yalnız dua və Allahdan istəməklə deyil, həm də Allah tərəfindən verilən xüsusi qüdrətlədir ki, biz buna “təkvini vilayət” deyirik. Əlbəttə, “təkvini vilayət”in mənəvi yardımlarla haqqı qəbul etməyə hazır olan qəlblərə

təsir, mənəvi nüfuzla ləyaqətli şəxsləri hidayət və tərbiyə etmək kimi hallar barədə İslam tarixində çoxlu nümunəsi vardır. Məsələn, Peyğəmbər (s), yaxud məsum imamların hüzuruna elə şəxslər gəlirdilər ki, bəzən bir an içərisində qəribə və .görünməyən bir hala düşür, beləliklə, yaşayışlarını tamamilə dəyişirdilər

.Belə qəribə və ani dəyişikliklər də “təkvini vilayət”in təsirlərin-dəndir

## V. XÜSUSİ İMAMƏT VƏ VİLAYƏT

### İşarə

Ümumi imamət”dən sonra “xüsusi imamət” məsələsini, Peyğəmbər (s)-dən sonrakı“ məsum imam və ilahi canişinin kim olduğunu araşdırmağa başlayır, bu məsələdə İslamın müxtəlif mənbələrinə, ayə və rəvayətlərə, eləcə də ilahi rəhbərləri tanımada .ən gözəl üsullardan biri olan “şahidlər toplusu”na istinad edəcəyik

Allahdan düşüncəmiz, qələmimiz və bəyanımıza haqq və həqiqəti cari etməyi, hər bir !xilaf və inhirafdan uzaq olmağı diləyirik

Əvvəlcə, Quran ayələrinə üz tutaraq “xüsusi imamət”lə əlaqədar ayələri araşdırırıq. Bu :ayələri iki qismə bölmək olar

;İmamət haqda açıq-aşkar söz açan ayələr .١

.Bu haqda qeyri-müstəqim (və dolayısı yolla) söz açan ayələr .٢

Ümumiyyətlə, hər iki qismə aid olan ayələr çoxdur, lakin məqsədimiz imamətə dəlalət .edən daha aydın ayələri araşdırmaqdır

:Birinci qismə aid ayələr

;Təbliğ” ayəsi və “Qədir-Xum” əhvalatı”-١

;Vilayət” ayəsi”-٢

;Ulil-əmr” (əmr sahibləri) ayəsi”-٣

;Sadiqin” (sadiq olanlar) ayəsi”-۴

.Qurba” (ən yaxınlar) ayəsi”-۵

:İkinci qismə aid ayələr

Bu ayələr imamət və xilafət məsələsini birbaşa açıqlamasa da, Əmirəlmöminin Əlinin (ə) fəzilətlərini sübut edir, o həzrəti İslam ümmətinin ən fəzilətli, Peyğəmbər (s)-dən

sonra ən üstün şəxsiyyət olduğunu göstərir və belə nəticə alırıq ki, Peyğəmbəri-Əkrəm (s)-dən

səh:۱۳۲

.sonra ümmətin rəhbərliyini öhdəsinə götürməyə ən layiqli şəxs odur

:Bu ayələr daha çox olduğundan, yalnız iyirmi beş ayəni qeyd edəcəyik

;Mübahilə” ayəsi”-١

;Xeyrul-bəriyyə” (yaradılmışların ən yaxşısı) ayəsi”-٢

;Leylətül-məbit” ayəsi”-٣

;Hikmət” ayəsi”-۴

;Həl-əta” surəsinin ayələri”-۵

;Bəraət” surəsinin ilk ayələri”-۶

;Siqayətul-hacc” (hacılara su vermə) ayəsi”-٧

;Salihul-muminin” (möminlərin əməlisalehi) ayəsi”-٨

;Vəzarət” (vəzirlik) ayəsi”-٩

;və ١١-”Əhzab” surəsinin ayələri ١٠

;Bəyyinə” (şahid) ayəsi”-١٢

;Siddiqun” (sadiqlər) ayəsi”-١٣

;Nur” ayəsi”-١۴

;İnzar” (qorxudan) ayəsi”-١۵

;Mərəcəl-bəhreyn” (iki dənizin bir-birinə qovuşma) ayəsi”-١۶

;Nəcva” (pıçıltı, gizli söhbət) ayəsi”-١٧

;Sabiqun” (öndə olanlar) ayəsi”-١٨

;Uzunun-vaiyə” (eşidib yadda saxlayan qulaq) ayəsi”-١٩

;Məvəddət” (məhəbbət) ayəsi”-٢٠

;Münafiqun” (münafiqlər) ayəsi”-٢١

;İyza” (əziyyət) ayəsi”-٢٢

;İnfaq” ayəsi”-٢٣

;Məhəbbət” ayəsi”-٢٤

.Məsulun” (sorğu-suala tutulanlar) ayəsi”-٢٥

### TƏBLİĞ” AYƏSİ”–١

#### İşarə

يَا أَيُّهَا الرَّسُولُ بَلِّغْ مَا أُنزِلَ إِلَيْكَ مِن رَّبِّكَ وَإِن لَّمْ تَفْعَلْ فَمَا بَلَّغْتَ رِسَالَتَهُ وَاللّهُ يَعْصِمُكَ مِنَ النَّاسِ إِنَّ اللّهَ لاَ يَهْدِي الْقَوْمَ الْكَافِرِينَ

Ya Peyğəmbər! Allah tərəfindən sənə nazil olanı (camaata) çatdır. Əgər (bunu)“ etməsən, Onun risalətini yerinə yetirməmişsən. Allah səni insanlardan (onların ehtimal verilən təhlükələrindən) qoruyacaq. Allah kafir

səh:١٣٣

(camaatı hidayət etməz."(1)

### AYƏNİN NAZİL OLMA SƏBƏBİ

Bir çox əhli-sünnə alimlərinin təfsir, hədis və tarix kitablarında (və şiənin bütün məşhur kitablarında) yuxarıdakı ayənin imam Əli (ə) haqda nazil olduğu qeyd olunmuşdur. Bu rəvayəti çoxlu səhabə, o cümlədən, Əbu Səid Xudri, Zeyd ibn Ərqəm, Cabir ibn Abdullah Ənsari, İbn Abbas, Bərra ibn Azib, Hüzeyfə, Əbu Hüreyrə, İbn Məsud və Amir ibn Leyli nəql etmişlər. Onların rəvayətlərində bu ayənin imam Əli (ə) və "Qədir-Xum" .hadisəsi barəsində nazil olduğu göstərilmişdir

Diqqəti cəlb edən məsələ budur ki, bu rəvayətlərin bəzilərinin ravilər silsiləsi, o cümlədən, Əbu Səid Xudrinin və İbn Abbasın hədisinin on bir, Bərra ibn Azibin hədisinin isə üç qrupdan ibarət olduğu nəql olunmuşdur. Bu hədisləri öz əsərlərində (istər geniş, :istərsə də qısa şəkildə) qeydə alan məşhur alimlər aşağıdakılardan ibarətdir

Hafiz Əbu Nəim İsfahani: "Ma nuzzilə minəl-Quran fi Əliyyin" kitabı ("Əl-xəsais"– ;(kitabından nəqlən, səh. ٢٩

;Əbülhəsən Vahidi Nişapuri: "Əsbabun-nüzul" kitabı, səh. ١٥٠–

;(İbn Əsakir Şafei: ("Əd-durrul-mənsur" kitabından nəqlən, ٢-ci cild, səh. ٢٩٨–

;Fəxri-Razi: "Kəbir" təfsiri, ٣-cü cild, səh. ۶٣۶–

;Əbu İshaq Həməvini: "Fəraidus-səmteyn" kitabı–

;İbn Səbbağ Maliki: "Füsusul-muhimmə" kitabı, səh. ٢٧–

;Cəlaləddin Süyuti: "Əd-durrul-mənsur" kitabı, ٢-ci cild, səh. ٢٩٨–

;Qazi Şovkani: "Fəthul-qədir" kitabı, ٣-cü cild, səh. ۵٧–

;Şəhabuddin Alusi Şafei: "Ruhul-məani" kitabı, ۶-cı cild, səh. ١٧٢–

;Şeyx Süleyman Qunduzi Hənəfi: "Yənabiul-məvəddət" kitabı, səh. ١٢٠–

;Bədrəddin Hənəfi: “Umdətul-qari fi şərhi Səhihi-Buxari” kitabı, ۸-ci cild, səh. ۵۸۴–

;Şeyx Məhəmməd Əbduh Misri: “Əl-mənar” təfsiri, ۶-cı cild, səh. ۴۶۳–

səh:۱۳۴

---

.Maidə” surəsi, ayə: ۶۷“ . [۱] -۱

Hafiz ibn Mərdəveyh (vəfatı: ۴۱۸ h.q) (Süyutinin "Əd-durrul-mənsur" kitabından–.nəqlən) və s

Əlbəttə, unutmaq olmaz ki, bu alimlərin bəziləri ayənin nazil olma səbəbini və rəvayətləri nəql etməklə yanaşı, sonradan işarə edəcəyimiz dəlillərin üstündən asanlıqla keçmiş, yaxud məsələyə iradla yanaşmışlar ki, biz gələcək bəhslərdə Allahın .lütf və mərhəməti sayəsində onların nəzərlərini dəqiq araşdıracağıq

## QƏDİR–XUM HADİSƏSİ

Ötən bəhslərdəki bir dəlilə əsasən, "təbliğ" ayəsinin imam Əli (ə) barəsində nazil olduğu qısa şəkildə məlum oldu. Bu haqda (həm şiə, həm də) əhli-sünnənin məşhur kitablarında nəql olunan rəvayətlərin sayı o qədər çoxdur ki, heç kim onu inkar edə bilməz. Bu rəvayətlərdən əlavə, digər rəvayətlərdə də açıq-aşkar deyilir ki, bu ayə "Qədir-Xum" hadisəsinə və Peyğəmbəri-Əkrəm (s)-in Əlini (ə) öz canişini, vəsisi təyin etdiyi zamana aiddir. Bu rəvayətlərin sayı o qədər çoxdur ki, hətta Əllamə Əmini "Əl-qədir" kitabında "Qədir-Xum" hədisinin canlı şahidi olan Peyğəmbəri-Əkrəm (s)-in ۱۱۰ nəfər səhabəsindən, ۸۴ nəfər tabeindən və ۳۶۰ nəfər məşhur İslam alimlərindən nəql olunduğunu qeydə almışdır. Kim bu sənəd və mənbələrə nəzər salsa, əmin olar ki, "Qədir-Xum" hədisi ən mötəbər rəvayətlərdən, "təvatür" həddində çatmış hədislərin ən üstünüdür. Doğrusu, kim onun "təvatür" həddinə çatmasında şəkk etsə, "təvatür" həddində olan heç bir hədisi qəbul etməməlidir. Bu kimi bəhslər bizi təfsir üslubundan xaric etdiyindən, hədisin sənədləri və ayənin nazil olma səbəbləri barəsində deyilənlərlə kifayətlənib, onun möhtəvasını araşdırmağa başlayırıq. Hədislə bağlı geniş :izah istəyənlər aşağıdakı kitablara müraciət edə bilərlər

;Əl-qədir" (Əllamə Əmini), ۱-ci cild"–

Ehqaqul-həqq" (Əllamə Qazi Nurullah Şuştəri) Ayətullah Nəcəfinin şərhi ilə ۲-۴ və ۲۰-"–;ci cildlər

;(Əl-müraciat" (Seyid Şərəfuddin Amuli"–

Əbəqatul-ənvar" (Mirhamid Hüseyni Hindi – bu kitabın xülasəsinin ٧-٩-cu cildlərinə"– müraciət etmək daha münasibdir);

səh:١٣٥

.Dəlailus-sidq”, (Mərhum Müzəffər), ٢-ci cild”–

## QƏDİR–XUM” RƏVAYƏTLƏRİNƏ BİR BAXIŞ“

Qədir-Xum” hadisəsini qeydə alan rəvayətlərin məcmusundan (əlbəttə, bəzi“ rəvayətlərdə bu hadisə daha geniş, bəzilərində qısa, bəzilərində hadisənin bir qismi, bəzilərində isə digər bir qismi açıqlanmışdır) belə qənaətə gəlirik ki, İslam Peyğəmbəri (s) ömrünün sonuncu ilindəki həcci (“Həccətül-vida”nı) daha şövkət və əzəmətlə sona çatdırmış, bu mövsümdə hacıların qəlbləri mənəvi hislərlə dolmuş, bu böyük ibadətin ləzzətini bütün cisim və canları ilə duymuşdular. Peyğəmbər (s)-in səhabələri(١) bu böyük səadətə çatdıqları üçün sevinclərindən dərilərinə sığmırdılar. Bu səfərdə Peyğəmbər (s)-lə birgə yalnız Mədinə əhalisi deyil, həm də bu böyük tarixi iftixar və səadətə nail olmaq üçün Ərəbistan yarımadasının müxtəlif məntəqələrindən çoxlu .müsəlman var idi

Hicazın qızmar günəşi dağ və düzənlikləri yandırsa da, bu misilsiz mənəvi səfərin ləzzəti hər bir şeyi asanlaşdırmışdı. Günorta yaxınlaşır və yavaş-yavaş Cöhfə məntəqəsi, ondan sonra isə “Qədir-Xum”un quru və yandırıcı səhralıqları uzaqdan görünürdü. Burada Hicazı digər məntəqələrdən ayıran dörd yolayrıcı var idi ki, biri şimala (Mədinəyə), biri şərqə (İraqa), biri qərbə (Misirə), biri də cənuba (Yəmənə) doğru gedirdi. Camaat bura çatdıqda, artıq bir-birindən ayrılır və həcc səfərinin son xatirəsi burada sona yetirdi. Bu yerdə müsəlmanlar İslam Peyğəmbərindən (s) son .göstərişləri almaqla bir-birlərindən ayrılırdılar

Hicri qəməri tarixi ilə ١٠-cu ilin cümə axşamısı idi və “Qurban” bayramından səkkiz gün keçirdi. Bu vaxt Peyğəmbər (s) tərəfindən hacıların dayanması üçün göstəriş verildi. Müsəlmanlar uca səslə elan etdilər ki, karvanın önündə hərəkət edənlər geri qayıtsınlar, nəhayət, geridə qalanlar da gəlib çatdılar. Günorta vaxtı Peyğəmbər (s)-in azançısı “Allahu-Əkbər” səsi ilə camaatı namaza çağırdı. Camaat tez namaza hazırlaşdılar. Havanın qızmar istisindən hacılardan bəziləri əbalarının bir ucunu ayaqlarının altına, o biri

Bəzi alimlər Peyğəmbər (s)-lə birgə həcdə olanların sayını ۹۰ min, bəziləri ۱۱۲ . [۱] -۱
.min, bəziləri ۱۲۰ min, bəziləri isə ۱۲۴ min qeyd etmişdir

ucunu da başlarına atmışdılar; çünki səhranın yandırıcı çınqılları və günəşin şüası onların əl-ayaqlarını yandırırdı. Bu səhralıqda bir neçə çılpaq ağacdan başqa nə bir gölgəlik, nə də bir ot-ələf və çəmənlik gözə görünmürdü. Bəziləri də bu çılpaq ağaca .sığınmışdılar

Nəhayət, günorta namazı qurtardı. Ağacların birinin üstünə parça atılaraq Peyğəmbər (s) üçün kölgəlik düzəldildi. Bununla belə, yandırıcı hava onları kölgəlikdə də rahat qoymurdu. Müsəlmanlar özləri ilə gətirdikləri çadırlara girmək istədikdə, Peyğəmbər (s) xəbərdarlıq etdi ki, hamı Allah tərəfindən nazil olan yeni bir xəbəri eşitmək üçün hazır olsunlar. Peyğəmbər (s)-dən uzaq olanlar cəmiyyətin içərisindən o həzrətin nurani surətini görə bilmədikləri üçün dəvələrin kəcavəsindən hündür bir yer düzəltdilər. Peyğəmbər (s) onun üstünə qalxıb, əvvəlcə Allaha həmd-səna dedi və özünü Allaha tapşıraraq camaata belə buyurdu: "Mən tezliklə Allahın dəvətini qəbul edib, sizin aranızdan gedəcəyəm. (Allah qarşısında) həm mən məsuliyyət daşıyıram, "?həm də siz! Siz mənim haqda necə şəhadət verirsiniz

Camaat uca səslə dedi: "Biz şəhadət veririk ki, sən peyğəmbərlik borcunu kamil yerinə yetirdin, xeyirxahlıq etdin və bizim hidayətimiz yolunda çalışdın. Allah sənə yaxşı "!mükafat versin

Sonra Peyğəmbər (s) buyurdu: "Siz Allahın təkliyinə, mənim peyğəmbərliyimə, "?qiyamətin və ölülərin diriləcəyi günün haqq olmasına şəhadət verirsinizmi

.Hamı bir ağızdan "Bəli, şəhadət veririk!" – dedilər

Peyğəmbər (s) dedi: "İlahi şahid ol..." Əlavə edərək buyurdu: "Ey camaat, səsimi "?eşidirsinizmi

"!Dedilər: "Bəli

Bundan sonra səhra tamamilə sükuta büründü, isti küləyin züm-züməsindən başqa bir səs eşidilmirdi. Bu vaxt Peyğəmbər (s)-in səsi ucaldı: "İndi baxın görün, mənim "!?aranızda yadigar qoyduğum iki böyük və ağır əmanətlə necə davranacaqsınız

"?Cəmiyyətin içərisindən bir səs gəldi: "Ey Allahın Rəsulu! Bu iki ağır əmanət hansılardır

tərəfi isə sizin əlinizdə olan Allahın kitabıdır! Ondan əlinizi çəkməyin, yoxsa zəlalətə düşərsiniz. Mənim ikinci ağır yadigarım Əhli-beytimdir. Hər şeyi bilən Allah mənə xəbər verib ki, bu iki əmanət behiştdə mənə qovuşana qədər, heç vaxt bir-birindən ayrılmayacaqlar. Onlardan irəli keçməyin, yoxsa həlak olarsınız, geridə də qalmayın ki, yenə həlak olarsınız!”

Bu zaman hamı gördü ki, Peyğəmbər (s) öz ətrafına baxır və kimisə axtarırdı. Əlini (ə) görən kimi əyilib, onun əlindən tutdu və o qədər yuxarı qaldırdı ki, hətta onun qoltuğunun altı belə göründü. Hamı onu tanıyıb bildilər ki, o, İslamın yenilməz sərkərdəsidir. Bu zaman Peyğəmbər (s) səsini bir az da ucaldaraq buyurdu: “Ey camaat! Möminlərə onların özlərindən daha artıq ixtiyar sahibi kimdir?!”

Dedilər: “Allah və Peyğəmbəri daha yaxşı bilir!”

Peyğəmbər (s) buyurdu: “Allah mənim mövlam və rəhbərim, mən də möminlərin mövlası və rəhbəriyəm və onlara özlərindən daha artıq ixtiyar sahibiyəm (mənim əmrim onların hər bir istəyindən irəlidir)!” Sonra buyurdu: “Belə isə mən hər kəsin mövlası və rəhbəriyəmsə, Əli də onun mövlası və rəhbəridir.” O həzrət bunu üç dəfə (bəzi ravilərin dediyinə görə, dörd dəfə) təkrar etdi. Sonra başını səmaya qaldırıb belə dua etdi:

اَللّٰهُمَّ والِ مَنْ والاهُ وَعادَ مَنْ عاداهُ وَاَحِبْ مَنْ اَحَبَّهُ وَاَبْغِضْ مَنْ اَبْغَضَهُ وَانْصُرْ مَنْ نَصَرَهُ وَاخْذُلْ مَنْ خَذَلَه وَاَدْرِ الْحَقَّ مَعَهُ حَيْثُ دارَ:

“İlahi! Onun dostunu Sən də dost bil, onu düşmənini Sən də düşmən bil, onu sevəni Sən də sev, onu qəzəbləndirənə Sən də qəzəbli ol, dostlarına kömək et, onu tək qoyub xar edənləri Sən də xar və zəlil et, haqqı həmişə onunla birgə et və onu haqdan ayırma!”

Sonra buyurdu: “Hazır olanlar bu xəbəri burada olmayanlara çatdırsınlar!”

Peyğəmbər (s)-in xütbəsi sona yetdi. Həzrətin, Əlinin (ə) və camaatın üz-gözündən tər axırdı. Hələ camaat dağılmamışdı ki, vəhy mələyi nazil olub, Peyğəmbər (s)-ə bu ayəni çatdırdı:

الْيَوْمَ أَكْمَلْتُ لَكُمْ دِينَكُمْ وَأَتْمَمْتُ عَلَيْكُمْ نِعْمَتِى...

Peyğəmbər (s) buyurdu: “Allahu-Əkbər, Allahu-Əkbər! Allah Öz dinini kamil, nemətini bizə tamamladı, mənim risalət və peyğəmbərliyimdən, məndən sonra isə Əlinin vilayətindən razıdır!”

Bundan sonra hacılar Əliyə (ə) doğru gəlməyə başladılar və onu bu məqama nail olduğuna görə təbrik etdilər. Onu təbrik edən tanınmış şəxslərdən Əbu Bəkr və Ömər misal göstərmək olar ki, onlar cəmiyyətin qarşısında bu sözləri dillərinə gətirdilər:

بَخٍّ بَخٍّ لَکَ یَاابْنَ اَبِی طالِبٍ اَصْبَحْتَ وَاَمْسَیْتَ مَوْلایَ وَمَوْلا کُلِّ مُؤمِنٍ وَمُؤمِنَهٍ:

“Afərin sənə, afərin sənə, ey Əbu Talibin oğlu! Sən mənim, bütün mömin kişi və qadınların mövlası və rəhbəri oldun.” Bu zaman İbn Abbas dedi: “Allaha and olsun! Bu əhd-peyman hamının boynunda qalacaqdır.”

Məşhur şair Həssan ibn Sabit Peyğəmbər (s)-dən bu münasibətlə bir şer söyləmək üçün icazə istədi, sonra belə dedi:

Yunadihim yovməl-Ğədiri Nəbiyyuhum,

Bi-Xummin və-əsmi bir-Rəsuli munadiyən.

Fəqalə, fəmən movlakum və nəbiyyukum?

Fəqalu, və ləm yəbdu hunakət-təamiyən,

İlahukə movlana və əntə nəbiyyuna,

Və ləm təlqi minna fil-vəlayəti asiyən.

Fəqalə ləhu, qum ya Əliyyu, fə-innəni,

Rəziytukə min bədi imamən və hadiyən,

Fə-mən kuntu movlahu, fə-haza vəliyyəhu,

Fəkunu ləhu ətbaə sidqin muvaliyən!

Hunakə dəa, Əllahummə, vali vəliyyuhu,

!Və kun lilləzi ada Əliyyən muadiyən

***

,Qədir-Xumda Peyğəmbərin nidası“

.Yayıldı carçısıyla hər sədası

”?Dedi: “Kimdir sizin mövla, nəbiniz

!Bir ağızdan: “Allah bizim Rəbbimiz

!Ondan sonra sən də peyğəmbərimiz

”!Vilayətə asi olmaz birimiz

:Peyğəmbərin Əliyə buyruğuyla

.Qalx ayağa, həqiqət sorağıyla“

Məndən sonra imam, hidayətçisən,

Mövlası olduğumun rəhbərisən!

Bəs, itaət edin buyuruqlarıma,

Allahdan əmanət qoyduqlarıma!

“İlahi! Onu sevən hər kəsi, sev Sən də

Düşmən olan kəsə, düşmən ol Sən də!”

Bu, şiə və sünnü alimlərinin kitablarında nəql olunan “Qədir-Xum” hadisəsinin xülasəsi idi!

### “TƏBLİĞ” AYƏSİ ÜZƏRİNDƏ YENİ BİR TƏHLİL

Əgər biz “təbliğ” ayəsinin nazil olma səbəbi, eləcə də “Qədir-Xum” barəsində nəql olunan bütün rəvayətləri nəzərə almayıb, elə bu ayə və ondan sonrakı ayələrin möhtəvasına diqqətlə nəzər yetirsək belə, yenə İslam Peyğəmbərinin (s) canişinlik və xəlifəliyi ilə bağlı vəzifəmizi ayırd edə bilərik.

İzah: Bu ayə özü müxtəlif ifadələrlə üç mühüm məsələyə toxunur:

١. Ayədən məlum olur ki, bu məsələ İslam baxımından yüksək əhəmiyyətə malik olmuş, hətta Allah tərəfindən Peyğəmbəri-Əkrəm (s)-ə göstəriş verilmişdir ki, mütləq onu xalqa çatdırsın, əgər çatdırmasa, vəzifəsini yerinə yetirməmiş olacaqdır! Başqa sözlə desək, bu məsələ peyğəmbərliyi qədər ağır vəzifə imiş, əgər elan edilməsəydi, sanki Peyğəmbər (s)-in vəzifəsi yarımçıq qalacaqmış!

Məlum olduğu kimi, burada sadə bir əmr nəzərdə tutulmayıb ki, əgər o pozulsa, Peyğəmbər (s)-in risaləti şübhə altına düşsün. Bunun da izaha ehtiyacı yoxdur. Halbuki ayənin zahirindən göründüyü kimi, burada çox mühüm məsələnin qarşıya qoyulduğu və birbaşa peyğəmbərlik məqamı ilə əlaqələndiyi vurğulanmışdır.

٢. Bu ilahi əmr sözsüz ki, namaz, oruc, həcc, cihad, zəkat və digər əməli vəzifələrlə bağlı deyildir. Çünki bu ayə “Maidə” surəsində yerləşir və bildiyiniz kimi, bu surə İslam

Peyğəmbərinə (s) nazil olan sonuncu surədir (yaxud sonuncu surələrdən biridir). Yəni bu surə nazil olanda, artıq İslamın əməli vəzifələrilə əlaqədar bütün

(məsələləri bəyan edilmişdi.(١)

٣. Ayənin ibarələri göstərir ki, elan olunacağı xəbər bəzilərinin sərt mövqeyinə səbəb olacaq və bu işdə Peyğəmbər (s)-in canı təhlükəyə düşəcəkdir. Lakin Allah-taala o həzrətə qarşı xüsusi himayəsini bildirərək buyurur: “Allah səni xalqdan (onların ehtimal verilən təhlükələrindən) qoruyacaq!”

Ayənin sonunda daha təkidlə buyurur: “Allah kafir cəmiyyəti hidayət etməz!”

Bu ibarə qəti şəkildə bir qrup müxaliflərin əks mövqe tutacaqlarını göstərir.

Ayədən açıq-aşkar görünən bu üç məsələni nəzərə alsaq, o zaman Peyğəmbər (s)-ə xilafət və canişinliklə əlaqədar vəhyin nazil olduğunu başa düşərik. Bəli, Peyğəmbəri-Əkrəm (s)-in ömrünün axırlarında çatdıracağı son mühüm məsələ İslamın o vaxta qədər bəyan edilməyən əməli vəzifələri deyil, yalnız xəlifəliklə bağlı ola bilərdi. Çünki Peyğəmbər (s)-in risalət və peyğəmbərliyi qədər mühüm olan və müxaliflərin sərt mövqe tutacaqlarına və o həzrətin canının təhlükə altına düşəcəyi ehtimal verilən məsələ məhz budur! Əgər “təbliğ” ayəsini imamət, vilayət və xilafət məsələsindən başqa bir yönə təfsir etsək, ayənin möhtəvası ilə qətiyyən uyğunlaşmayacaq.

Əhli-sünnənin təfsir alimlərinin bu ayənin möhtəvasına aid etdikləri fikir və nəzərlərin heç biri deyilən təkidlərlə əsla uyğunlaşmır və həqiqətdə ayəni təfsir etməkdə “acizdirlər” (çünki imamət və vilayətə etiqadlı deyillər).

**ŞƏRHLƏR**

a) ”Qədir-Xum” hədisindəki “mövla” sözünün təfsiri:



---

١- [١] . Fəxri-Razi bu ayənin təfsirində yazır: “Hədis raviləri və “sirə” yazanların nəql etdiklərinə əsasən, yuxarıdakı ayə nazil olduqdan sonra Peyğəmbər (s) ٨١, yaxud ٨٢ gündən artıq həyat sürmədi. (“Kəbir” təfsiri, ١١-ci cild, səh. ١٣٩.) “Əl-mənar” və digər kitablarda da “Maidə” surəsinin bütövlükdə sonuncu həcc mərasimində nazil olduğu qeyd olunmuşdur. (“Əl-mənar”, ۶-cı cild, səh. ١١۶.) Əlbəttə, bəziləri “təbliğ” ayəsi nazil

olduqdan sonra Peyğəmbəri-Əkrəm (s)-in qeyd edilən gündən də az həyat sürdüyünu .nəql etmişlər

Biz “təvatür” həddində olan “Qədir-Xum” hədisini qısa şəkildə bəyan etdik ki, Peyğəmbər (s)-in onda buyurduğu “Mən hər kəsin mövlasıyamsa, Əli də onun .mövlasıdır!” – kəlamı çox həqiqətləri aydınlaşdırır

Əhli-sünnə alimlərinin çoxu “mövla” sözünü “dost” mənasına təfsir etməyə çalışsalar da(۱), müxtəlif şahidlər göstərir ki, hədisdə bəyan olunan “mövla” sözü “vəli”, “başçı” və :“rəhbər” mənasını ifadə edir və bu şahidlər qısa şəkildə aşağıdakılardan ibarətdir

O zaman imam Əlinin (ə) bütün möminlərlə dostluq məsələsi elə də gizli və . ۱ üstüörtülü bir məslə deyildi ki, bu qədər təkid və elana ehtiyac olsun. Əgər məqsəd Əlini sevməkdirsə, onda o böyük karvanın quru və yandırıcı bir səhrada dayandırılıb, Peyğəmbər (s)-in uzun bir xütbə oxumasına və camaatdan ardıcıl etiraf istəməsinə nə ehtiyac var idi?! Həm də Quranda açıq-aşkar buyurulur ki, möminlər bir-birlərilə qardaşdırlar.(۲) Həmçinin başqa bir ayədə buyurulur: “Mömin kişilər və mömin qadınlar (bir-birinin dostudurlar!”(۳

Bir sözlə, İslamda qardaşlıq və müsəlmanların bir-birilə dostluğu bu dinin açıq-aydın məsələlərindən biridir və bu, İslamın ilk çağlarından olmuş, Peyğəmbər (s) dəfələrlə bunu buyurmuş və təkid etmişdir. Bundan əlavə, dostluq və qardaşlıq elə .məsələlərdən deyil ki, Peyğəmbər (s)-in onu bəyan etməsilə canı təhlükəyə düşsün

Peyğəmbəri-Əkrəm (s)-in buyurduğu “Ələstu ovla bikum min ənfusikum!” (Mən sizə .۲ özünüzdən daha artıq ixtiyar sahibi deyiləmmi?) – sualı əksər rəvayətlərdə nəql olunmuşdur və bu sadə bir dostluğu bəyan etməklə əsla uyğunlaşmır. Əksinə o həzrət bununla demək istəyirdi ki, mənimlə Əlinin (ə) sizin üzərinizdə olan ləyaqət, ixtiyar və rəhbərliyimiz eynidir. Burada bundan başqa bir təfsir yürütmək insafsızlıq və .həqiqətdən uzaqdır

Bu tarixi hadisədə camaat, xüsusilə Əbu Bəkr və Ömər tərəfindən Əliyə (ə) deyilən .۳ təbriklər o həzrətin xilafət məqamına nail

səh:۱۴۲

---

.Çünki bu sözün mənalarından biri də budur və biz də bunu qəbul edirik . [۱] -۱

olmasını bir daha təsdiqləyir. Çünki ümumi şəkildə bütün müsəlmanlara dostluq məsəlsinin elan olunmasında təbrikə ehtiyac duyulmur. Əhmədin “Müsnəd” kitabında :yazılır: “Ömər, Peyğəmbər (s)-in bəyanatından sonra Əliyə dedi

هَنِيئاً يَابْنَ اَبِيطالِبٍ اَصْبَحْتَ وَاَمْسَيْتَ مَوْلى كُلِّ مُؤمِنٍ وَ مُؤمِنَهٍ:

(Afərin sənə, ey Əbu Talibin oğlu! Sən hər bir mömin kişi və qadının mövlası oldun.”(١“

:Fəxri-Razinin “təbliğ” ayəsinin təfsirində yazdığı ibarə də belədir: “Ömər dedi

هَنِيئاً لَكَ اَصْبَحْتَ مَوْلاىَ وَ مَوْلى كُلِّ مُؤمِنٍ وَ مُؤمِنَهٍ:

”!Afərin sənə! Sən mənim və bütün mömin kişi və qadınların mövlası oldun“

”.Beləliklə, Ömər onu özünün və bütün möminlərin mövlası hesab etdi

Tarixi-Bağdad” kitabında Ömərin belə dediyi nəql olunur: “Afərin, afərin olsun sənə,“ (ey Əbu Talibin oğlu! Sən mənim və bütün müsəlmanların mövlası oldun.”(٢

Feyzül-qədir” və “Əs-səvaiq” kitablarında da yazılır ki, bu təbriki Əliyə (ə) həm Əbu“ (Bəkr, həm də Ömər demişdir.(٣

Gün kimi aydındır ki, bütün möminlər arasındakı sadə dostluğun bəyan edilməsi üçün böyük bir mərasimin qurulmasına ehtiyac yoxdur. Deməli, hədisdəki “vilayət” sözü .xilafətdən başqa bir məna daşıya bilməz

Öncə qeyd etdiyimiz Həssan ibn Sabitin açıq-aşkar ibarələrlə dolu şeri bizim .۴ .müddəamıza canlı bir şahiddir

:b) ”Qədir-Xum” hədisini təsdiq edən digər ayələr

:Məaric” surəsinin başlanğıcında buyurulur“

سَأَلَ سَائِلٌ بِعَذَابٍ وَاقِعٍ لِّلْكَافِرينَ لَيْسَ لَهُ دَافِعٌ مِّنَ اللَّهِ ذِى الْمَعَارِجِ

Bir nəfər vaqe olacaq əzab barədə soruşdu. O əzab kafirlərə məxsusdur“

Müsnədi-Əhməd”, ۴-cü cild, səh. ۲۸۱. (“Fəzailul-xəmsə” kitabından nəqlən, ۱-ci“ . [۱] -۱
.cild, səh. ۴۳۲

.Tarixi-Bağdad”, ۷-ci cild, səh. ۲۹۰“ . [۲] -۲

.Feyzül-qədir”, ۶-cı cild, səh. ۲۱۷ və “Əs-səvaiq”, səh. ۱۰۷“ . [۳] -۳

və onu dəf edə biləcək bir kimsə yoxdur. O əzab yüksək dərəcələr sahibi olan (mələklərini göylərə qaldıran) Allah tərəfindəndir!”(۱)

:Bir çox təfsirçilər və hədis raviləri bu ayələrin nazil olma səbəbi barədə belə demişlər

İslam Peyğəmbəri (s) imam Əlini (ə) “Qədir-Xum”da xəlifəliyə seçib (مَنْ كُنْتُ مَوْلاهُ فَعَلِيٌّ مَوْلاهُ “Mən hər kəsin mövlasıyamsa, Əli də onun mövlasıdır!” – buyurandan sonra bu xəbər tez bir zamanda hər tərəfə yayıldı. Münafiqlərdən olan Nöman ibn Haris Fehri(۲) Peyğəmbəri-Əkrəm (s)-in hüzuruna gəlib dedi: “Sən bizə göstəriş verdin ki, Allahın yeganəliyinə, sənin peyğəmbərliyinə şəhadət verək, biz də şəhadət verdik. Sonra bizə cihad, namaz, həcc və zəkatı əmr etdin, onları da qəbul etdik. Yenə bunlarla razılaşmayıb, nəhayət, bu cavanı (Əliyə (ə) işarə etdi) öz yerinə canişin təyin edərək dedin: “Mən hər kəsin mövlasıyamsa, Əli də onun mövlasıdır!” Bu göstəriş özündəndir, ”?yoxsa Allah-taala tərəfindən

”!Peyğəmbər (s) buyurdu: “Yeganə məbud olan Allaha and olsun ki, Allah tərəfindəndir

Bu vaxt Nöman ibn Haris üzünü döndərib dedi: “İlahi! Əgər bu söz haqq və Sənin tərəfindəndirsə, onda bizim başımıza bir daş endir!” Elə bu zaman birdən səmadan bir .daş düşüb, onun başını yardı və qeyd etdiyimiz ayələr nazil oldu

Bu rəvayət “Məcməül-bəyan” kitabında Əbül-Qasim Həskanidən nəql olunmuşdur.(۳) Bu rəvayəti əhli-sünnə təfsirçiləri də öz kitablarında, o cümlədən, Qurtubi (öz təfsirində), Alusi (“Ruhul-məani” kitabında) və Əbu İshaq Sələbi (öz təfsirində) azacıq (fərqlə nəql etmişlər.(۴

Əllamə Əmini “Əl-qədir” kitabında bu rəvayəti otuz nəfər əhli-sünnə alimindən (mənbə ,və mətnləri ilə birlikdə), o cümlədən



---

۱- [۱] . “Məaric” surəsi, ayə: ۱-۳.

۲- [۲] . Bəzi rəvayətlərdə Haris ibn Nöman, bəzilərində isə Nəzr ibn Haris adı ilə nəql .olunmuşdur

٣- [٣] . “Məcməül-bəyan”, ٩-١٠-cu cild, səh. ٣٥٢.

٤- [٤] . “Təfsiri-Sələbi”, ١٠-cu cild, səh. ٦٧٥٧.

Hələbinin “Sirə”, Həməvininin “Fəraidus-səmteyn”, Şeyx Məhəmməd Zərəndinin “Durərus-səmteyn”, Şəmsəddin Şafeinin “Əs-siracul-munir”, Süyutinin “Şərhu-camiis-səğir”, Hafiz Əbu Übeyd Hərəvinin “Təfsiru-ğəribil-Quran” və Əbu Bəkr Nəqqaşın .“Təfsiru-şəfais-südur” kitablarından nəql etmişdir

İmam Əlinin (ə) fəzilətlərini çarəsizlikdən və ikrahla qəbul edən təfsir və hədis alimlərindən bəzisi yuxarıdakı ayələrin nazil olma səbəbinə müxtəlif iradlar tutmuşlar. “Əl-mənar” kitabının müəllifi və digər əhli-sünnə alimləri qeyd etdiyimiz rəvayəti nəql :etdikdən sonra belə iradlar irəli sürmüşlər

Birinci irad: “Məaric” surəsi Məkkədə nazil olmuşdur. Belə isə, “Qədir-Xum” hadisəsi ilə ?necə uyğun gələ bilər

Cavab: Bir surənin “məkki” adlanmasının (Məkkədə nazil olan) mənası onun bütün ayələrinin Məkkədə nazil olması demək deyildir. Qurani-Kərimin bir sıra surələri məkki adlansa da, onların bəzi ayələri Mədinədə nazil olmuş, eynilə bunun əksi olaraq, “mədəni” adlanan (Mədinədə nazil olan) surələrin də bəzi ayələri Məkkədə nazil olmuşdur. Buna “məkki” adlanan “Ənkəbut” surəsini misal göstərmək olar, halbuki Təbəri, Qurtubi və digər alimlərin yazdıqlarına əsasən, bu surənin ilk on ayəsi Mədinədə nazil olmuşdur.(١) Və yaxud “Kəhf” surəsi “məkki” adlansa da, Qurtubi və Süyutinin öz kitablarında yazdıqlarına görə, onun ilk yeddi ayəsi Mədinədə nazil omuşdur.(٢) Həmçinin bunun əksi olaraq, “mədəni” adlanan, lakin ayəsi Məkkədə nazil olan surələrdən də “Mücadilə” surəsini misal çəkmək olar. Bəzi təfsirçilərin yazdıqlarına əsasən, bu surənin ilk on ayəsi Məkkdə nazil olmuşdur.(٣) Bir sözlə, Qurani-Kərimdə bəzi surələr vardır ki, Məkkədə, yaxud Mədinədə nazil olsa da, onların .bir neçə ayəsi həmin şəhərdə nazil olmamışdır və “Məaric” surəsi də bu qəbildəndir

İkinci irad: “Məaric” surəsinin ilk ayələrinin nazil olma səbəbi nəql olunan rəvayətdə göstərilir ki, Haris ibn Nöman “Əbtəh” adlı yerdə Peyğəmbər (s)-lə görüşmüşdür və “Əbtəh” Məkkədə bir



---

.Təfsiri-Təbəri”, ٢٠-ci cüz, səh. ٨۶ və “Təfsiri-Qurtubi”, ١٣-cü cüz, səh. ٣٢٣“ . [١]-١

۲- [۲]. Əlavə məlumat əldə etmək istəyənlər “Əl-qədir” kitabının ۱-ci cildinin ۲۵۶-۲۵۷-ci səhifələrinə müraciət edə bilərlər.

۳- [۳]. “Təfsiri-Əbis-Süud” (Fəxri-Razinin “Kəbir” təfsirinin haşiyəsində), ۸-ci cüz, səh. ۱۴۸ və “Əs-siracul-munir”, ۴-cü cild, səh. ۳۱۰.

.dərənin adıdır. Bu isə “Qədir-Xum” hadisəsi ilə uyğunlaşmır

Cavab: Əvvəla, “əbtəh” sözü bütün rəvayətlərdə deyil, bəzi rəvayətlərdə nəql olunmuşdur. İkincisi də “əbtəh” və “bətha” sözləri ümumiyyətlə, içərisində çınqıl daşları olan arxlara və qumlaq yerlərə deyilir. Mədinədə və başqa məntəqələrdə belə yerlər az deyildir. Maraqlıdır ki, ərəb ədəbiyyatında dəfələrlə buna işarə edilmişdir. O cümlədən, Şəhabəddinin Əhli-beytin (ə) şəninə söylədiyi məşhur şerlərində onların :qatilləri ilə bağlı belə deyilir

„Mələkna fəkanəl-əfvu minna səciyyətən“

,Fələmma mələktum, salə bid-dəmi əbtəhu

,Və həlləltumu qətləl-usari və taləma

”.Ğədəvna ənil-əsra nəfu və nəsfuhu

!Qurduğumuz dövlətdə səciyyəmiz əfv idi“

!Sizsə hakim olandan, “əbtəh” qan ilə dolu

,Hətta əsirlərin siz ol qanından keçmədiz

”!Bizsə o vaxt bağışlardıq, kəsməzdik bir yolu

Aydındır ki, Peyğəmbər (s)-in Əhli-beytinin övlad və nəsillərinin əksəriyyəti İraq, Kərbəla, Kufə və Mədinədə qətlə yetirilmiş və Məkkədə yerləşən “Əbtəh” adlı məntəqədə qan tökülməmişdir. Bəli, Məkkədən təxminən, on fərsəx fasilədə yerləşən “Fəxx” məntəqəsində də şəhadətə yetənlər olmuşdur, lakin “Əbtəh” məntəqəsi (Məkkənin lap yaxınlığındadır.(۱

:Şairlərdən başqa birisi şəhidlərin sərvəri imam Hüseynin (ə) şəninə belə yazmışdır

,Və təinnu nəfsi lər-rübui və qəd ğəda

,Bəytun-nəbiyyi muqəttəul-ətnabi

,Bəytun li-alil-Mustəva fi Kərbəla

.Zərbuhu bəynə əbatihin və rəvabi

Mənim canım Peyğəmbər (s)-in viran edilmiş evlərinin əsər-əlamətindən nalə edir. O“ cümlədən, Kərbəlada Peyğəmbər (s)-in



---

.Əl-qədir”, ۱-ci cild, səh. ۲۵۵“ . [۱] -۱

Əhli-beytindən bir evi “əbtəh”lərin və hündür təpələrin arasında bərpa edilmişdi.” (.(Burada “əbtəh” qumluq yerlər mənasındadır

İçərisində “əbtəh”, yaxud “əbatih” ifadələri olan və Məkkədəki müəyyən məntəqəyə aid olmayan şerlər çoxdur. Bir sözlə, “əbtəh” Məkkədə bir məntəqənin adı olsa da, .onun ümumi mənası bir məntəqəyə məxsus deyildir

?v) Bu ayələrin özündən əvvəl və sonraki ayələrlə əlaqəsi necədir

Bəzi təfsirçilər “təbliğ” ayəsindəki həqiqətdən yayınmaq məqsədilə başqa bəhanəyə əl atmış və demişlər ki, bu ayənin əvvəlki və sonrakı ayələri “kitab əhli” barəsində söz açdığından, onun imamət, vilayət və xilafət məsələsilə heç bir uyğunluğu yoxdur. Belə (fərq qoymaq isə Qurani-Kərimin bəlağət və fəsahətinə əksdir.(١)

Quran ayələrinin toplanması ilə tanış olanlar yaxşı bilirlər ki, onlar tədricən və müxtəlif münasibətlərlə əlaqədar nazil olurdu. Buna görə də çox hallarda surələrdə müxtəlif məsələlərdən söz açılır. Məsələn, bir surədə həm müəyyən bir müharibəyə, həm İslamın hökmlərinə, həm münafiqlərə, həm də möminlərə aid hissələrə rast gəlirik. “Nur” surəsinə diqqət yetirsək, tövhid, məad, zinanın hökmü, “ifk” hadisəsi, münafiqlər, hicab və digər məsələlərə işarə edildiyinin şahidi olacağıq (Quranın digər böyük surələri də az-çox bu qəbildəndir). Hərçənd, bir surənin məcmusu arasında ümumi .bağlılıq həmişə qorunur

Bir surənin möhtəva müxtəlifliyi Qurani-Kərimin tədricən və zərurəti nəzərə almaqla müxtəlif münasibətlərdə nazil olmasındandır. Qurani-Kərim əvvəlcədən təyin olunan bir mövzu haqqında danışan klassik bir kitab deyildir. Buna əsasən, “Maidə” surəsinin bir hissəsinin “kitab əhli”, digər bir hissəsinin isə “Qədir-Xum” hadisəsi barəsində söz açmasında heç bir anlaşılmazlıq yoxdur. Əlbəttə, ümumi götürsək, bu mövzular arasında da müəyyən bağlılıq vardır. Peyğəmbər (s)-in yerinə canişin təyin edilməsinin də “kitab əhli”nə təsiri vardır, çünki onlar Peyğəmbər (s)-in vəfatından sonra İslamın .dağılacağına ümidvar idilər

?q) Nə üçün Əli (ə) “Qədir-Xum” hədisinə istinad etmədi

Bəziləri bəhanə axtarıb deyirlər ki, əgər əzəmətlə yad edilən “Qədir-Xum” hədisi həqiqətdirsə, bəs, nə üçün Əli (ə), onun Əhli-beyti və dostları zəruri hallarda ona istinad etmirdilər? Onların Əlinin (ə) xilafətini sübut etmək üçün bu mühüm sənədə ?əsaslanmaları daha yaxşı olmazdımı

Bu irad da digər iradlar kimi təfsir, tarix və hədis kitablarından kifayət qədər xəbərsizliyin ucbatından irəli gəlmişdir. Çünki əhli-sünnə alimlərinin bir çox kitablarında nəql olunmuşdur ki, Əli (ə) özü, Əhli-beyt imamları, eləcə də onların dostları “Qədir-?Xum” hədisinə istinad etmişlər. Maraqlıdır ki, irad tutanlar bunları necə görməmişlər

Xətib Xarəzmi Hənəfi “Mənaqib” kitabında Amir ibn Vasilədən nəql edir ki, (Ömərdən sonra xəlifə təyin etmək üçün altı nəfərdən ibarət olan) “şura” günü Əli (ə) ilə birlikdə idim. O, şura üzvlərinə belə deyirdi: “Sizə tutarlı bir dəlil göstərirəm ki, ərəb və əcəm onu dəyişməyə qadir deyillər... Sizə Allahı and verirəm! Sizin aranızda elə bir kəs varmı ki, Peyğəmbər (s) onun barəsində belə buyurmuş olsun: “Mən hər kəsin mövlasıyamsa, Əli də onun mövlasıdır. İlahi! Onun dostunu Sən də dost bil, onu sevəni ”!Sən də sev. Hazır olanlar bunu qaib olanlara çatdırsınlar

(Hamı dedi: “Xeyr!”(١

Bu rəvayəti Həməvini “Fəraidus-səmteyn” kitabının ٥٨-ci bölümündə, İbn Hatəm “Durrun-nəzim” kitabında və İbn Əbil-Hədid “Nəhcül-bəlağə”nin şərhində, eləcə də (İbn Həcər “Əs-səvaiq” kitabında Darü-Qutnidən nəql etmişlər.(٢

Əl-qədir” kitabında imam Əlinin (ə) müxtəlif yerlərdə, o cümlədən, Osmanın və öz“ xilafəti dövründə, Cəməl müharbəsində və yenidən Kufədə “Siffeyn” müharibəsi günü “Qədir-Xum” hədisinə əsaslanmasına və onların mənbələrilə birgə bu məsələyə geniş yer verilmişdir. Bundan əlavə, Fatimeyi-Zəhra (ə.s), imam Həsən (ə), imam Hüseyn (ə), bir qrup səhabə və qeyri-səhabələrin də on altı yerdə bu hədisə istinad etmələrini nəql etmişdir ki, bu da müəllifin

geniş məlumata malik və bu hədisin müxtəlif zamanlarda diqqət mərkəzində olduğunu göstərir. Hərçənd, hər dövrün xüsusi siyasətinə uyğun mümkün qədər bunu əhəmiyyətsiz qələmə verməyə çalışmışlar. Bu bəhsin əhatəsi geniş olduğundan, artıq bunlarla kifayətlənirik.(١)

## ٢–"VİLAYƏT" AYƏSİ

### İşarə

"Xüsusi imamət"ə dəlalət edən ayələrdən biri də "vilayət" ayəsidir. Bu ayədə buyurulur:

إِنَّمَا وَلِيُّكُمُ اللّهُ وَرَسُولُهُ وَالَّذِينَ آمَنُواْ الَّذِينَ يُقِيمُونَ الصَّلاَةَ وَيُؤْتُونَ الزَّكَاةَ وَهُمْ رَاكِعُونَ

"Həqiqətən, sizin vəliniz (rəhbəriniz) yalnız Allah, Onun Peyğəmbəri və iman gətirənlərdir. O kəslər ki, iman gətirib namaz qılır və rüku halında zəkat verirlər."(٢)

### AYƏNİN NAZİL OLMA SƏBƏBİ

Təfsir və hədis alimlərinin əksəriyyəti bu ayənin imam Əli (ə) haqda nazil olduğunu nəql etmişlər. Süyuti "Əd-durrul-mənsur" kitabında bu ayənin təfsiri ilə bağlı İbn Abbasdan belə nəql edir: "Əli (ə) namazda rüku halında olarkən, bir yoxsul ondan kömək istəyir. Əli (ə) də öz üzüyünü çıxarıb ona verir. Peyğəmbər (s) o yoxsuldan "Bu üzüyü sənə kim sədəqə verdi?" – deyə soruşduqda, o, imam Əliyə (ə) işarə edib deyir: "Rüku halında olan o kişi!" Bu zaman "Həqiqətən, sizin rəhbəriniz yalnız Allah, Onun Peyğəmbəri və iman gətirənlərdir..." – ayəsi nazil olur."(٣)

Bu kitabda elə həmin məzmunu yetirən İbn Abbasdan, Səlmət ibn Küheyldən və imam Əlinin (ə) özündən əlavə rəvayətlər nəql olunmuşdur.(٤)

Bunu Vahidi də "Əsbabun-nüzul" kitabında Cabir ibn Abdullah və İbn Abbasdan nəql etmişdir.(٥)



---

١- [١] . Əlavə məlumat əldə etmək istəyənlər "Əl-qədir" kitabının ١-ci cildinin ١۵٩-٢١٣-cu səhifələrinə müraciət edə bilərlər.

۲- [۲] . “Maidə” surəsi, ayə: ۵۵.

۳- [۳] . “Əd-durrul-mənsur”, ۲-ci cild, səh. ۲۹۳.

۴- [۴] . Yenə orada.

۵- [۵] . “Əsbabun-nüzul”, səh. ۱۴۸.

Məşhur təfsirçi Carullah Zəməxşəri “Kəşşaf” təfsirində yazır: “Bu ayə Əli (ə) haqqında nazil olmuşdur. Bir gün Əli (ə) məsciddə namaz qılarkən rüku halında bir yoxsul gəlib, ondan kömək istəyir və Əli (ə) öz üzüyünü çıxarıb ona verir.”(١)

Fəxri-Razi öz təfsirində Abdullah ibn Salamdan belə nəql edir: “Bu ayə nazil olduqda, Allahın Rəsuluna (s) dedim: “Mən öz gözlərimlə gördüm ki, Əli (ə) rüku halında öz üzüyünü yoxsula sədəqə verdi. Buna görə də biz onun vilayət və rəhbərliyini qəbul edirik.” Həmçinin Əbuzərdən də belə nəql edir: “Bir gün Peyğəmbər (s)-lə birgə günorta namazını qılırdım. Bu zaman bir yoxsul məscidə girib kömək istədi və heç kəs ona kömək etmədi. Yoxsul əlini göyə qaldırıb dedi: “İlahi, şahid ol! Mən Peyğəmbər (s)-in məscidində kömək istədim, lakin heç kim mənə kömək etmədi.” Əli (ə) namaz halında ikən o yoxsula sağ əli ilə kiçik barmağındakı üzüyü götürməsini işarə etdi. O, Peyğəmbər (s)-in gözü önündə gedib, Əlinin (ə) barmağından üzüyü çıxartdı. Peyğəmbər (s) dedi: “İlahi! Qardaşım Musa Səndən sinəsinin genişlənməsini, qardaşı Harunu peyğəmbərliyinə şərik olmasını istədikdə..., ona buyurdun: “Mən tezliklə səni qardaşın vasitəsilə gücləndirərək, sizə qüvvət və qələbə bəxş edəcəyəm.” İlahi! Mən Mühəmməd, Sənin peyğəmbərin və elçinəm. Mənim də sinəmi genişləndir, işləri mənə asanlaşdır, mənim üçün Əhli-beytimdən bir vəzir təyin et, məni onun vasitəsilə güclü və qüvvətli et!”

Əbuzər deyir: “Allaha and olsun! Allahın Rəsulu (s) hələ sözünü qurtarmamışdı ki, Cəbrail nazil olub dedi: “Ey Mühəmməd! Oxu: “İnnəma vəliyyukumullahu və Rəsuluhu...”(٢)

Əlbəttə, Fəxri-Razi bu rəvayəti nəql etdikdən sonra adəti üzrə bu ayənin imamətə dəlalət etməsinə irad tutmağa başlayır ki, biz onun iradını sonra qeyd edəcəyik.

Təbəri də öz təfsirində bu ayənin təfsiri və nazil olma səbəbi haqda müxtəlif rəvayətlər nəql edir ki, o rəvayətlərin çoxu bu ayənin



---

١- [١]. “Kəşşaf” təfsiri, ١-ci cild, səh. ۶۴۹.

٢- [٢]. “Kəbir” təfsiri, Fəxri-Razi, ١٢-ci cild, səh. ٢۶.

(Əli (ə) haqda nazil olduğunu açıqlayır.(۱

Alimlərin böyük bir dəstəsi bu ayənin nazil olma səbəbini açıqlayan rəvayəti müxtəlif ibarələrlə qeyd etmişlər ki, o cümlədən, “Kənzül-ümmal” kitabının ۶-cı cildinin ۳۱۹-cu səhifəsində bu rəvayət nəql olunmuşdur. Həmçinin ۵-ci əsrin məşhur alimlərindən olan Hakim Həskani Hənəfi onu “Şəvahidut-tənzil” kitabında altı müxtəlif silsilə sənədlə İbn Abbasdan, iki sənədlə Ənəs ibn Malikdən, iki sənədlə Məhəmməd ibn Hənəfiyyədən, bir sənədlə Əta ibn Saibdən, bir sənədlə Əbdül-Məlik ibn Cərih Məkkidən və onlar da Peyğəmbəri-Əkrəm (s)-dən nəql etmişlər ki, “innəma vəliyyukumullah...” – ayəsi (namazın rükusunda öz üzüyünü yoxsula verən Əli (ə) haqda nazil olmuşdur.(۲

Mərhum Əllamə Əmini bu rəvayəti və həmin ayənin imam Əli (ə) haqda nazil olduğunu əhli-sünnənin təqribən, iyirmi kitabından (sənəd və mənbələri ilə birgə) nəql etmişdir.(۳) “Ehqaqul-həqq” kitabında bu rəvayət müxtəlif kitablardan nəql (olunmuşdur.(۴

Diqqəti cəlb edən budur ki, Peyğəmbər (s)-in dövründə yaşayan məşhur şair Həssan ibn Sabit bunu şübhəsiz bir məsələ kimi öz şerlərində də nəzmə çəkmişdir. O, məşhur :bir şerində imam Əliyə (ə) xitab edərək deyir

,Və əntəlləzi ətəytu iz kuntə rakiən

!Zəkatən fədətkən-nəfsu, ya xəyrə rakiin

,Fə-ənzələ fikəllahu xəyrə vəlayətin

!Və bəyyənəha fi muhkəmatiş-şəraye

Rükusunda zəkat verən sən idin. Can sənə qurban olsun, ey rüku edənlərin ən yaxşısı!“ Bundan sonra Allah-taala sənin üçün ən gözəl vilayəti nazil edərək, onu Quranında (bəyan etdi.”(۵



---

.Təfsiri-Təbəri”, ۶-cı cild, səh. ۱۸۶“ .[۱] -۱

Rəvayətin sənədləri haqda əlavə məlumat əldə etmək istəyənlər “Şəvahidut- . [۲] -۲
.tənzil” kitabının ۱۶۱-۱۶۸-ci səhifələrinə (Beyrutun “Ələmi” çapına) müraciət edə bilərlər

.Əl-qədir”, ۲-ci cild, səh. ۵۲-۵۳“ . [۳] -۳

.Ehqaqul-həqq”, ۲-ci cild, səh. ۳۹۹-۴۰۷“ . [۴] -۴

Həssan ibn Sabitin şerləri azacıq fərqlə bir çox kitablarda, o cümlədən, “Ruhul- . [۵] -۵
.məani” və “Kifayətut-talib” (Gənci Şafei) kitablarında qələmə alınmışdır

:Onun başqa bir şerində belə deyilir

,Mən za bixatəmihi təsəddəqə rakiən

?Və əsərrəha fi nəfsihi israrən

(Rükuda sədəqə verən və bunu öz qəlbində gizlədən kim idi?”(١)“

Bir sözlə, “vilayət” ayəsinin imam Əli (ə) haqda nazil olmasında heç bir şəkk-şübhə yoxdur. Hətta “Minhacul-bəraə fi şərhi Nəhcül-bəlağə” kitabının müəllifi yazır: “Bu haqda Əhli-beyt məktəbinin ardıcılları və əhli-sünnə vasitəsilə “mütəzafir”, hətta ”.“mütəvatir” hədislər nəql olunmuşdur

Burada bizi maraqlandıran əsas məsələ bu ayənin Peyğəmbər (s)-in xilafət və vilayət .məsələsinə dəlalət etməsilə əlaqədardır

### VİLAYƏT” AYƏSİNİN XİLAFƏTƏ DƏLALƏTİ“

Bu ayədə gələn “vəli” sözü imam Əlinin (ə) müsəlmanların vəlisi və rəhbəri olmasını açıqlayır. Öncə işarə etdiyimiz kimi, “vəli” sözünün müxtəlif mənaları vardır ki, bəzən dost, bəzən hakim və rəhbər mənasında işlədilir. Rağib İsfahaninin yazdığına görə, bu sözün ilkin mənası bir-birinin kənarında yerləşən və aralarında heç bir fasilə olmayan iki şeyin sıx rabitəsini ifadə edir. Sonra əlavə edərək yazır: “Vilayət” dostluq və kömək, (“vəlayət” isə rəhbər və ixtiyar sahibi mənasını yetirir.”(٢

Ayədə mövcud olan şahidlər göstərir ki, burada “vəli” rəhbər və ixtiyar sahibi mənasındadır. Çünki burada “vəli” dost və yardımçı mənası kimi işlənsə, onda bütün :möminlərə aid olacaq. Necə ki, “Tövbə” surəsinin ٧١-ci ayəsində belə buyurulur

وَالْمُؤْمِنُونَ وَالْمُؤْمِنَاتُ بَعْضُهُمْ أَوْلِيَاء بَعْضٍ

”...Mömin kişilər və qadınlar bir-birlərinin dostlarıdır“

Lakin bəhs etdiyimiz ayədəki vilayət sözü xüsusi hala – rüku halında sədəqə verən şəxsə aid edilmiş və həsri bildirən “innəma” (yalnız və yalnız) sözü ilə birgə qeyd olunmuşdur. Bu ifadə isə

---

Təzkirətul-xəvass", (Sibt ibn Covzi), səh. ۱۰; "Kifayətut-talib", (Şafei Gənci), səh." . [۱] -۱
.۱۲۳

Müfrədati-Rağib", "vəli" sözü. Bəzi alimlər "mövla" sözünə iyirmi yeddi məna . [۲] -۲
qeyd etmişlər. ("Əl-qədir", ۱-ci cild, səh. ۳۶۲.) Lakin onun əsas mənaları qeyd etdiyimiz
.iki mənadır, qalan mənalar da bu iki mənaya qayıdır

vilayət sözünün dostluq və yardım kimi (eləcə də buna oxşar digər) mənalar daşımasına imkan verir. Beləliklə, yeganə yol odur ki, “vəli” sözünün ixtiyar sahibi və rəhbər mənasını, Allahın və Peyğəmbər (s)-in vilayəti ilə yanaşı tutulan cəhətini qəbul .edək

:(Sonrakı ayə (ayənin davamı

وَمَن يَتَوَلَّ اللّهَ وَرَسُولَهُ وَالَّذِينَ آمَنُواْ فَإِنَّ حِزْبَ اللّهِ هُمُ الْغَالِبُونَ

Hər kəs Allahı, Onun Peyğəmbərini və iman gətirənləri özünə vəli seçsə, (qələbə“ ”!çalar). Şübhəsiz ki, Allahın dəstəsi məhz qələbə çalanlardır

Həqiqətdə, bu ayə qabaqkı ayənin məzmununu tam dolğunlaşdırır və bizi ondakı vilayət sözünün ixtiyar sahibi və rəhbər mənasında olmasını göstərən daha bir şahidlə qarşılaşdırır. Belə ki, “hizbullah” (Allahın dəstəsi) və “düşmənlərə qələbə çalma” ifadələri sadə və adi dostluqla deyil, İslam hökumətinin təşkili ilə əlaqədardır. Bu da göstərir ki, əvvəlki ayədə qeyd olunan “vəli” sözünün mənası İslam və müsəlmanların hakim və rəhbəri ilə uyğundur. Hətta “hizb” (dəstə) sözünün müştərək hədəfləri təmin .edən ictimai quruluşa aid olması vilayət və rəhbərliklə daha münasibdir

### İRADLAR VƏ BƏHANƏLƏR

Gördüyünüz kimi, bu ayə çox aydın surətdə imamət və xilafətə dəlalət edir. Əgər bu ayə başqaları barədə nazil olsaydı, bəlkə də onun haqqında kiçik mübahisəyə belə yol verilməzdi! Lakin o, imam Əli (ə) haqda nazil olduğundan və digər firqələrin əqidələri ilə .uyğun gəlmədiyindən çoxları israrla hər cür irad və bəhanə fikrinə düşmüşlər

Bu iradları iki qismə bölmək olar ki, bir qismi zahirən elmi yönə malik olduğundan cavabı elmi olmalı, digər bir qismi isə bəhanəyönlü olduğundan qısaca :cavablandırılmalıdır

Birinci qismə aid ilk irad budur ki, ayədəki “iman gətirənlər”, “namaz qılanlar”, “zəkat .١ verənlər” və “rüku halında olanlar” – kimi şəxs əvəzlikləri cəm formasında işlədilmiş və buyurulmuşdur ki, bu xüsusiyyətlərə malik olanlar sizin rəhbərinizdir. Belə isə Əli (ə) bir ?nəfər olduğu halda, bu cəm əvəzlikləri ona necə aid ola bilər

Cavab: Həm şiə, həm də sünnülərin kitablarında “müstəfiz”, hətta “mütəvatir” şəkildə nəql olunan rəvayətlərə – ayənin nazil olma səbəbinə diqqət yetirdikdə, onun bir fərdə aid olduğuna heç bir şəkk-şübhə qalmır. Başqa sözlə desək, hədislər və İslam tarixi şahiddir ki, rüku halında yoxsula sədəqə və üzük verən bir qrup deyil, yalnız Əli (ə) olmuşdur. Buna əsasən, deyə bilərik ki, ayənin şəxs əvəzliklərinin cəm formasında işlədilməsindən məqsəd ehtiram və həmin şəxsin məqamını yüksəltməkdir. Çünki ərəb ədəbiyyatında cəm formasında işlədilən sözdən bir nəfər nəzərdə tutulduğuna çox rast gəlinir. Məsələn, “mübahilə” ayəsində “nisaəna” (qadınlar) sözü cəm formasında işlədilsə də, onun nazil olma səbəbini nəql edən rəvayətlərə əsasən, məqsəd, təkcə Fatimeyi-Zəhra (ə.s)-dır. Eləcə də həmin ayədə qeyd olunan “ənfusəna” (özlərimiz) sözünün cəm formasında işləndiyi halda, bütün alimlər qəbul edirlər ki, mübahilədə .İslam Peyğəmbərindən başqa camaatın arasından yalnız Əli (ə) iştirak etmişdir

:Həmraul-əsəd” müharibəsi ilə bağlı nazil olan ayədə də belə buyurulur“

الَّذِينَ قَالَ لَهُمُ النَّاسُ إِنَّ النَّاسَ قَدْ جَمَعُواْ لَكُمْ فَاخْشَوْهُمْ فَزَادَهُمْ إِيمَاناً

O kəslər ki, camaat onlara dedilər: “(Düşmən ordusundan) bir qrup sizə hücum...“ etmək üçün əlbir olmuşlar. Onlardan qorxun. Lakin onlar (nəinki qorxmadılar, həm də) (imanları daha da artdı.”(١)

Bu ayədə xəbər verən kəsin cəm mənasını daşıyan “nas” (camaat, insanlar) sözü ilə qeyd olunmasına baxmayaraq, tarixdə göstərildiyi kimi, o, yalnız Nəim ibn Məsud .olmuşdur

:Maidə” surəsinin ٥٢-ci ayəsində buyurulur“

فَتَرَى الَّذِينَ فِى قُلُوبِهِم مَّرَضٌ يُسَارِعُونَ فِيهِمْ يَقُولُونَ نَخْشَى أَن تُصِيبَنَا دَآئِرَةٌ

Ürəklərində xəstəlik (nifaq) olanları onlarla (yəhudi və məsihilərlə) dostluq etməkdə“ bir-birini ötənləri və “Bizə bir fəlakət üz verməsindən (və onların köməyinə möhtac olacağımızdan) qorxuruq!” – deyənləri görərsən.” Bu ayə də təkcə Abdullah ibn Übeyy haqqında nazil olsa da, onun əvəzlikləri cəm formasında

.işlədilmişdir

Mümtəhinə” surəsinin ۱-ci ayəsindəki xitab ümumi olsa da, Hatib ibn Übeyy Bəltəə“ haqqında nazil olmuş, “Münafiqun” surəsinin ۸-ci ayəsinin şəxs əvəzliyi cəm formasında işlənsə də, məqsəd Abdullah ibn Übeyydir. Bir çox hədislərə əsasən, “Bəqərə” surəsinin ۲۷۴-cü ayəsi imam Əlinin (ə) şəni haqda nazil olmuş, onun bütün şəxs əvəzlikləri isə cəm formasında gəlmişdir. “Bəqərə” surəsinin “(Ya Mühəmməd!) Səndən Allah yolunda nə verəcəkləri haqqında soruşanlara söylə...”(۱) – ayəsindəki (əvəzlik cəm formasında olsa da, soruşan şəxs yalnız Əmr ibn Cümuh olmuşdur.(۲

Görəsən, bu ayələrdə məqsəd bir nəfər olduğu halda, onun əvəzliklərinin cəm formada işlənməsinin səbəbi nə imiş? Ola bilsin ki, bəzən səbəbi nəzərdə tutulan şəxsə hörmət əlaməti, bəzən də başqalarının həmin şəxslə bir fikirdə olmaları ilə əlaqədardır. Ayələrə diqqət yetirdikdə, bunu (ehtiram və ya eyni fikirdə olma) bir-birindən ayırd etmək olar. Bunlardan da əlavə, Qurani-Kərimin əksər ayələrində Allah-taala Özü haqda söz açdıqda, əvəzlikləri cəm formasında işlədir. Halbuki Onun müqəddəs zatı tək və misilsiz, hər cəhətdən “əhəd” və “vahid”dir. Bunun cavabını belə vermək olar ki, böyük bir şəxsin idarəçiliyi və işlərini yerinə yetirməkdə ona tabe olan məmurları vardır. Bu da səbəb olur ki, o, fərd olduğu halda, əvəzlikləri cəm formasında işlətsin. Başqa sözlə desək, ayələrdəki bu cəm əvəzlikləri Onun uca məqamını və .böyüklüyünü göstərir

Şübhəsiz, Əli (ə) Peyğəmbər (s)-in dövründə müsəlmanların vilayət və rəhbərliyi .۲ ?məqamına malik deyildi. Belə isə, bu ayəni ona aid etmək olarmı

Bu iradın da cavabı aydındır. Gündəlik danışıq və ifadələrdə dəfələrlə müşahidə edirik ki, müəyyən bir şəxs vəzifə və məqama seçilsə, yaxud namizəd olsa da, hələ rəsmi olaraq həmin vəzifəni idarə etmir. Məsələn, bir kəs bir nəfəri öz yerinə canişin seçir və .özü hələ yaşasa da, “filankəs onun vəsisi və canişinidir!” – deyilir



---

.Bəqərə” surəsi, ayə: ۲۱۵“ .[۱]-۱

Bu rəvayətlərin sənəd və mənbələri haqda məlumat əldə etmək istəyənlər . [۲] -۲

Peyğəmbəri-Əkrəm (s)-in həyatında imam Əliyə (ə) xəlifə və canişin adını vermək elə də anlaşılmaz deyildir. O həzrət həyatda ikən imam Əlini (ə) Allahın əmrilə öz yerinə .təyin etmiş və onun xəlifəliyi Peyğəmbər (s)-in vəfatından sonra qüvvəyə minmişdir

Biz buna oxşar halı “Məryəm” surəsinin ٥-ci ayəsində də müşahidə edirik. Belə ki, :həzrət Zəkəriyya (ə) Allahdan belə bir hacət istəyir

فَهَبْ لِی مِن لَّدُنکَ وَلِیًّا

”!(İlahi! Mənə bir vəli və canişin bağışla (seç“

Allah-taala da onun duasını qəbul edərək, Yəhyanı ona əta edir. Şübhəsiz, Yəhya, Zəkəriyyanın həyatında canişin, vəli və varis olsa da, onun vəfatından sonra bu .məqamı əlinə almışdır

Bunun oxşarı “Yovmul-inzar” əhvalatında da (Peyğəmbər (s) öz yaxınlarını bir yerə yığaraq, ilk dəfə onları İslama dəvət etdiyi gün) baş vermişdir. Həm şiə, həm də əhli-sünnə tarixçilərinin və hədis alimlərinin yazdıqlarına görə, Peyğəmbər (s) həmin gün :Əliyə (ə) işarə edərək buyurdu

اِنَّ هذا اَخِی وَوَصِیِّ وَخَلِیفَتی فِیکُمْ فَاسْمَعُوا لَهُ وَاَطِیعُوهُ:

Bu, sizin aranızda mənim qardaşım, vəsim və xəlifəmdir. Onun sözünü eşidin və“ (əmrinə itaət edin!”(١

Peyğəmbəri-Əkrəm (s)-in həyatda belə buyuruqları heç bir iradla üzləşmədiyi halda, .Qurani-Kərimin də ayələri belə iradlardan uzaqdır

:İkinci qism iradlar (bəhanələr) çox olduğundan, onların bəzilərini qeyd edirik

Bəs, siz deyirsiniz ki, “Əli (ə) dünya malından heç bir şey yığmamışdır. Onda necə ola .١ bilər ki, boynunda vacib zəkat olsun? Əgər məqsəd müstəhəb sədəqədirsə, ona zəkat .deyilmir

Cavab: Qurani-Kərimin bir çox ayələrində müstəhəb sədəqəyə zəkat adı verilmişdir. Hətta “məkki” surələrinin çoxunda zəkatdan söz açılır ki, məqsəd müstəhəb sədəqədir.

Çünki zəkat Peyğəmbər (s)-in Mədinəyə hicrətindən sonra vacib edilmişdir. Bu məsələ
"“Nəml

səh:١٥۶

---

Bu hədisi əhli-sünnənin İ bn Əbi Cüreyr, İ bn Əbi Hatəm ibn Mərdəveyh, Əbu . [١] -١ Nəim, Beyhəqi, Sələbi və Təbəri kimi alimləri nəql etmişlər. Bu hədis İ bn Əsirin “Kamilut-tarix” kitabının ٢-ci cildində, eləcə də Əbül-Fidanın tarix kitabının ١-ci cildində (!vardır. (Bu hədisin barəsində söz açacağıq

surəsinin ٣-cü, “Hud” surəsinin ٣٩-cu, “Loğman” surəsinin ۴-cü, “Fussilət” surəsinin ٧-ci ayələrində açıqlanmış və bu surələr Məkkədə nazil olsalar da, onlarda müstəhəb zəkat nəzərdə tutulmuşdur. Bundan əlavə, imam Əli (ə) dünya malından özü üçün bir şey yığmasa da, müharibə qənimətlərindən pay alırdı. Şübhəsiz, öz zəhməti ilə də qazanc kəsb edirdi və yoxsula verdiyi çox da bahalı olmayan gümüş üzüyün bu yolla əldə edilməsi çətin bir iş deyildir. Bəziləri Həzrətin gümüş üzüyünün qiymətini şişirtsə də, bu .düz deyildir

Fikrin yoxsula doğru yayılması ilə namazda qəlbin hazırlığının və ilahi münacata qərq .٢ olmağın nə qədər reallığı vardır? Halbuki onlar (şiələr) deyirlər: “Namaz halında imam Əlinin (ə) ayağından oxu çıxartsalar da, o həzrət əsla bunu hiss etməmişdir! Belə isə ?namaz halında yoxsul bir şəxsin fikrində olmasını necə izah edirlər

Cavab: Bu iradın sahibi bilməlidir ki, yoxsulun səsini eşitmək, kiməsə yardım etmək Allahdan qeyrisinin, özünün və dünya malının fikrində olmaq deyil, əksinə bu özü də bir .növ ibadət və Allaha boyun əyməkdir

Yoxsulların istək və səsləri qarşısında imam Əli (ə) kimi böyük şəxsiyyətin pak qəlbi həmişə həssas idi və həmişə onların səsinə cavab verirdi. O, bu işlə ibadəti ibadətə .qoşur, namaz halında zəkat verməklə yalnız Allahın əmrlərini yerinə yetirirdi

Doğrusu, bu irad və bəhanə həqiqətdə Qurani-Kərimə irad sayılır. Çünki Allah-taala bu ayədə rükuda zəkat verməyi tərifləyir, onu böyük adla yad edir. Əgər bu əməl qəflət və Allahdan yayınmaq sayılsaydı, onda yüksək və bəyənilmiş bir sifət kimi yad edilməzdi? Biz isə tamamilə bunun əksini görürük. Bu iradı tutan təəssübkeşlər imam .Əlinin (ə) fəzilətini inkar etmək istəsələr də, həqiqətdə Allaha irad tutmuşlar

Fəxri-Razi yazır: “Əliyə (ə) yaraşan iş Allahın zikri ilə məşğul olmaqdır. Belə kəs isə başqasının sözünü eşidib başa düşə bilməz.” (Beləliklə, yoxsulun istəyini rəva etmək (namazın qaydaları ilə ziddir!)(١)

Fəxri-Razidən soruşmaq lazımdır ki, əgər bu iş namazın qaydaları

və qəlbin hazırlığı ilə uyğun gəlməsəydi, bəs, nə üçün Allah-taala bu işi tərifləmiş, möminlərin vilayətini belə bir kəsə layiq bilmişdir? Şübhəsiz, namaz halında yoxsulun səsini eşidib, istəyini yerinə yetirmək ani baş verən əlavə ibadətdir. (Bizi həqiqətdən uzaqlaşdıran təəssübkeşlikdən Allaha pənah aparırıq!)

۳. Burada irad şəkilli bəhanələrdən biri də budur ki, namaz halında yoxsula üzük vermək namazda artıq bir iş sayılır və bu da namazı batil edir.

(Doğrudan da, insan haqqı qəbul etməsə, necə bəhanələrə əl atır!)

Cavab: Müctehidlərin heç birinin fətvasında bir işarə ilə üzüyü çıxarmaq, xüsusilə, işarə ilə yoxsul özü onu çıxartsa, namazda artıq iş və hərəkətin sayılması və namazın batil olması haqda heç bir hökm yoxdur. Halbuki fəqihlərin açıq-aşkar fətvalarına görə, hətta namaz halında əqrəb kimi zərərli həşəratı öldürmək, yaxud körpə bir uşağı təhlükəli hadisədən xilas etmək, yaxud kiçik daşlarla namazın rəkətlərini saymaq, (namaz halında) nəcis libası təmizləmək və s. hərəkətlər belə, namazı batil etmədiyi halda, yoxsula üzük bağışlamaq, yaxud onu barmaqdan çıxartmaq isə daha asan və sadə bir işdir.

۴. Başqa bir bəhanədə deyilir: “Əli (ə) bu bahalı üzüyü haradan almışdı? Onu barmağa taxmaq israf deyildimi?”

Cavab: Bu üzüyün bahalı olduğunu deyənlər yanılırlar. Axı, nə üçün belə mənbəsiz uydurmalara inanmalı, nəticədə müqəddəs Quranın bir ayəsini inkar etməliyik?!

Həmin üzüyün qiymətinin Şamın xəracı qədər olması ilə bağlı yalnız bir rəvayət nəql olunmuşdur ki, bu da əfsanəyə daha çox bənzəyir. Çox güman ki, bu zəif hədisi(۱) imam Əlinin (ə) bu böyük fəzilətini dəyərsiz qələmə vermək üçün saxta hədis düzəldənlər nəql etmişlər. Halbuki belə hallarda əsas məsələ infaq olunan və xərclənən malın qiyməti deyil, yoxsula Allah yolunda yardım etmək, onun əlindən tutmaq və bu işin saf niyyətlə birgə olması nəzərdə tutulur. Əgər Qurani-Kərimin bir surəsi (“Həl-əta” surəsi) Allah yolunda

Zəif” – ravilərdən birinin fasiq, yaxud vəziyyətinin naməlum, yaxud da hədis“ . [١] -١
(.qondaran olması şübhəsi olan rəvayətə deyilir. (“Zühur əsri”, Əli Kurani, səh. ١ (Müt

yetim və fəqirə bir neçə ədəd çörək verməyə görə nazil olursa, namaz halında bir üzüyün yoxsula bağışlanması ilə bağlı bir ayənin nazil olması elə də qəribə deyildir. Belə iradları qeyd edib cavablandırmaq məqsəddən yayınmağa və vaxtın tələfinə .səbəb olduğundan, qeyd olunanlarla kifayətlənirik

## ULİL–ƏMR" AYƏSİ"–٣

:Nisa" surəsinin ٥٩-cu ayəsində buyurulur"

يَا أَيُّهَا الَّذِينَ آمَنُواْ أَطِيعُواْ اللّهَ وَأَطِيعُواْ الرَّسُولَ وَأُوْلِي الأَمْرِ مِنكُمْ

Ey iman gətirənlər! Allaha, Peyğəmbərə və özünüzdən olan əmr sahiblərinə itaət" ".edin

Ümumi imamət və vilayət" bəhsində bu ayənin mənası və "əmr sahibləri"nin kimlərə" aid olduğu haqda geniş söz açdıq. Orada dediyimiz kimi, "əmr sahibləri"nə mütləq şəkildə itaətin Allahın Rəsuluna (s) itaətlə bir qeyd edilməyin səbəbi budur ki, "əmr sahibləri" Allahın Rəsulu (s) ilə bir səviyyədə olan kəslər, yəni o həzrətin məsum .canişinləridir. Çünki məsumlardan başqalarına mütləq itaət düzgün deyildir

Əmr sahibləri" ilə əlaqədar deyilən bütün ehtimalları araşdırdıqda, görürük ki, onun" məsum imamlardan başqası haqda düzgün məfhumu yoxdur. Burada isə bizim məqsədimiz xüsusi vilayət və imam Əlinin (ə) xilafətilə bağlı bu ayənin o həzrətə tətbiqi və İslamın (xüsusilə, əhli-sünnənin) məşhur mənbələrində nəql olunan hədisləri araşdırmaqdır. Məşhur təfsir alimi Hakim Həskani bu ayənin təfsirində beş hədis nəql etmişdir ki, onların hamısında "əmr sahibləri" ünvanı imam Əliyə (ə) (xarici bir nümunə və fərd kimi) tətbiq olunmuşdur. Birinci hədis o həzrətin özündən nəql edilir: "Peyğəmbər (s) "Mənim (ümmətə rəhbərlikdə) şəriklərim o kəslərdir ki, Allah-taala onları Özünə və mənə yaxın etmişdir!" – deyə buyurduğu zaman, "Ey iman gətirənlər! Allaha, Peyğəmbərə və özünüzdən olan əmr sahiblərinə itaət edin!" – ayəsi nazil oldu. "?Mən o həzrətdən soruşdum: "Ya Peyğəmbər! Əmr sahibləri kimlərdir

(Həzrət buyurdu: “Sən onların birincisisən!”(١

İkinci hədisi məşhur təfsirçi Mücahiddən nəql edir: “Bu ayə Əmirəlmöminin Əli (ə) haqqında nazil olmuş və bu o zaman idi ki, Peyğəmbər (s) (“Təbuk” müharibəsinə gedərkən,) Mədinədə onu öz yerinə canişin seçmişdi.

Üçüncü hədisi imam Baqir (ə) və dördüncü hədisi Səd Vəqqasdan nəql edərək yazır: “Peyğəmbər (s) “Təbuk” müharibəsinə gedərkən (Mədinənin yaxınlığındakı) Curuf adlı məntəqəyə çatdı. Əli (ə) o həzrətin arxasınca gedirdi və əlində silah yox idi. O, Peyğəmbər (s)-ə dedi: “Ey Allahın Rəsulu! Məni öz yerinə qoydun (məni özündən ayırdın), halbuki mən heç bir müharibədə səndən ayrılmamışam! Münafiqlər şayiə yayıblar ki, məni Mədinədə ona görə saxlamısan ki, mənim sizinlə birgə olmağımdan narahatsan!”

Səd deyir: “Öz qulağımla eşitdim ki, Allahın Rəsulu (s) buyurdu:

يا عَلِىّ اَلا تَرْضى اَنْ تَكُونَ مِنِّى بِمَنْزِلَهِ هارُونَ مِنْ مُوسى اِلّا اَنَّهُ لا نَبِىَّ بَعْدِى فَارْجِع فَاخْلُفْنِى فِى اَهْلِى وَ اَهْلِكَ:

Ya Əli! “Razı olmazsanmı ki, səninlə mənim nisbətim Harunla Musanın nisbəti kimi“ olsun? Bu fərqlə ki, məndən sonra bir peyğəmbər yoxdur. (Yəni sən də Harun kimi peyğəmbərlikdən başqa bütün məqamlara sahibsən!) Buna görə də geri qayıt, mənim və öz əhli-əyalın arasında canişinim ol (və Mədinəni münafiqlərin şərindən qoru!)”

(Buna oxşar beşinci hədisi yenə imam Əlidən (ə) nəql etmişdir.(٢

Əbu Həyyan Əndəlusi Məğribi “Əl-bəhrul-muhit” təfsirində “əmr sahibləri” ilə bağlı (üç təfsir alimi) Müqatil, Məymun və Kəlbidən nəql edir ki, ondan məqsəd “səraya əmirləri”, yaxud Əhli-beyt imamlarıdır. Sonra isə ayənin imam Əli (ə) haqqında nazil olduğuna əks çıxaraq iki irad irəli sürür:

١. Əli (ə) bir nəfər olduğu halda, necə ola bilər ki, cəm formasında buyurulan “əmr sahibləri” ona aid olsun?

٢. Ayənin zahiri camaatın əmr sahiblərinə itaətinin Peyğəmbəri-Əkrəm (s)-in həyatına aid olduğunu göstərir. Halbuki Əli (ə) o həzrətin həyatında imam deyildi?

Bu kimi irad, yaxud bəhanələr eynilə “vilayət” ayəsinə də tutulmuşdu ki, biz onların cavablarını açıqladıq və dedik ki, tarixdə göstərildiyi kimi, insanlar həyatda öz yerlərinə vəsi və canişin təyin edir, bunu kəlamlarında deyir və yazırlar ki, filankəs mənim vəsim və canişinimdir, o, bu işləri görməkdə ixtiyar sahibidir və s. Bu sözlərin mənası odur ki, .onun vəfatından sonra vəsiyyətləri icra edilməlidir

Ayədə işlənən “cəm əvəzliyi”nə gəldikdə isə, onun da cavabı verildi. Belə ki, Qurani-Kərimdə, eləcə də ərəb ədəbiyyatında cəm əvəzliyinin bir nəfərə şamil olma halları çoxdur. Bu ayədə də “əmr sahibləri” hər dövrdə bir imama aid olsa da, həqiqətdə cəm şəklində bütün məsumlara şamil olur və hər bir dövrdə yalnız bir məsum yaşasa da, hamısı birlikdə bir qrupu təşkil edirlər. Bu iki iradın cavabını daha geniş şəkildə “vilayət” .ayəsinin təfsirində bəyan etdik

Diqqəti cəlb edən məsələ budur ki, Hakim Həskani “Şəvahidut-tənzil” kitabında, eləcə də digər alimlər bu ayənin nazil olma səbəbini açıqlayan müxtəlif rəvayətləri nəql edərkən demişlər ki, o, imam Əlinin (ə) xilafətinə aiddir. O cümlədən, məşhur alim Əbu Bəkr ibn Mömin Şirazi “Etiqad” risaləsində (Kaşinin “Mənaqib” kitabına istinadən) İbn Abbasdan nəql edir ki, “ulil-əmr” ayəsi Əli (ə) haqqında nazil olmuşdur. Peyğəmbər (s) “Təbuk” müharibəsinə gedərkən, onu Mədinədə öz yerinə qoydu. Əli (ə) dedi: “Ey Allahın Rəsulu! Məni Mədinədə qadın və uşaqlarla birgə qoyub gedirsən?” Peyğəmbər (s) buyurdu: “Razı olmazsanmı ki, səninlə mənim nisbətim Harunla Musanın nisbəti kimi olsun? O zaman ki, Musa ona dedi: “Tayfamın arasında qal və onları islah et!” (Sonra Allah-taala buyurdu: “Əmr sahibləri də sizdən olacaqlar!”(١

Yənabiul-məvəddət” kitabının müəllifi Şeyx Süleyman Hənəfi Qunduzi özünün“ “Mənaqib” kitabında Süleym ibn Qeysdən belə nəql edir: “Bir gün bir kişi Əlinin (ə) hüzuruna gəlib soruşdu: “İnsanı möminlərin, yaxud kafirlər və azğınların sırasına qatan ən kiçik əməl hansıdır?” İmam buyurdu: “İnsanı azğınların dəstəsinə qatan ən kiçik əməl odur ki, vilayəti vacib olan ilahi höccəti, nümayəndəni və şahidi



---

.Ehqaqul-həqq”, ٣-cü cild, səh. ۴٢۵“ . [١] -١

tanımasın." O kişi dedi: "Ya Əmirəlmöminin! Onları (ilahi höccətləri) mənə tanıtdır!" Əli (ə) buyurdu: "Allah-tala onları Özü və Peyğəmbər (s)-lə birgə qərar verərək buyurmuşdur: "Ey iman gətirənlər! Allaha, Peyğəmbərə və özünüzdən olan əmr sahiblərinə itaət edin!"(١)

Bu hədis çox aydın surətdə əmr sahiblərinin camaatın seçdiyi şəxslər deyil, ilahi höccət və nümayəndə olduqlarını göstərir.

"Burhan" təfsirində də bu ayə ilə bağlı Əhli-beytdən (ə) nəql olunan bir çox rəvayətlərdə deyilir ki, "ulil-əmr" ayəsi Əli (ə) və Əhli-beytdən olan digər imamlar haqqında nazil olmuş, hətta bu rəvayətlərin bir qismində Əhli-beyt imamların adları bir-bir qeyd edilmişdir.(٢)

## ۴–"SADİQİN" (SADİQ OLANLAR) AYƏSİ

"Tövbə" surəsinin ١١٩-cu ayəsində buyurulur:

يَا أَيُّهَا الَّذِينَ آمَنُواْ اتَّقُواْ اللّهَ وَكُونُواْ مَعَ الصَّادِقِينَ

"Ey iman gətirənlər! Allahdan qorxun (təqvalı olun) və sadiq olanlarla birgə olun!"

Bu ayənin təfsiri "ümumi vilayət" bəhsində geniş izah edildi. Burada isə ayənin imam Əliyə (ə), yaxud bütün Əhli-beyt imamlarına aid olması ilə bağlı rəvayətləri qeyd etməyi lazım bilirik:

١. Məşhur təfsir alimi Süyuti "Əd-durrul-mənsur" kitabında "Allahdan qorxun (təqvalı olun) və sadiq olanlarla birgə olun!" – ayəsinin təfsirində İbn Abbasın belə dediyini nəql edir: "Yəni Əli ibn Əbi Taliblə birgə olun!"

Bu məzmunun oxşarını Xarəzmi "Mənaqib", Zərəndi "Durərus-səmteyn", Abdullah Şafei "Mənaqib" və Hakim Həskani "Şəvahidut-tənzil" kitablarında nəql etmişlər; bu fərqlə ki, bəziləri "O, Əli ibn Əbi Talibdir!", bəziləri "Ayə Əli ibn Əbi Talib haqqında nazil olmuşdur!", bəziləri isə "Əli və səhabələri ilə birgə olun!" – ibarələrini qeyd etmişlər.(٣)

٢. Hafiz Süleyman Qunduzi Hənəfi "Yənabiul-məvəddət" kitabında Salman Farsidən belə nəql etmişdir: "Ey iman gətirənlər! Allahdan qorxun (təqvalı olun) və sadiq

olanlarla birgə olun!” – ayəsi

səh:۱۶۲

---

(.Yənabiul-məvəddət”, səh. ۱۱۶. (İraqın “Darul-kutub” çapı“ . [۱] -۱

.Burhan” təfsiri, ۱-ci cild, səh. ۳۸۱-۳۸۷“ . [۲] -۲

Mənaqib”, səh. ۱۸۹; “Durərus-səmteyn”, səh. ۹۱; “Mənaqib” (Abdullah Şafei),“ . [۳] -۳
.səh. ۱۵۴ və “Şəvahidut-tənzil”, ۱-ci cild, səh. ۲۵۹

nazil olduqda, Salman soruşdu: “Ey Allahın Rəsulu! Ayənin məfhumu ümumidir, yoxsa :xüsusi?” Peyğəmbər (s) buyurdu

اَمّا الْمَأمُورُونَ فَعامَّه الْمُؤمِنِينَ، وَاَمّا الصّادِقُونَ فَخاصَّه اَخِی عَلِیّ وَاَوْصِیائِهِ مِنْ بَعْدِهِ اِلی یَوْمِ الْقِیامَهِ:

Bu göstərişə əmr olunanlar bütün möminlərdir, sadiq olanlar isə məhz qardaşım Əli“ (və məndən sonra qiyamət gününə qədərki vəsilərimdir!”(١

Hakim Həskani “Şəvahidut-tənzil” kitabında “Sadiq olanlarla birgə olun!” – ayəsinin .٣ təfsirində Abdullah ibn Ömərin belə dediyini nəql edir: “Sadiq olanlardan məqsəd (Mühəmməd (s) və onun Əhli-beytidir!”(٢

Fəraidus-səmteyn” kitabının müəllifi Əllamə Həməvini, “Şərəfun-Nəbiyy” kitabının“ .۴ müəllifi Şeyx Əbülhəsən Kaziruni kimi bir qrup əhli-sünnə alimi bu ayənin təfsirində imam Baqirdən (ə) nəql etdikləri hədis də eyni mənanı daşıyır, yəni “Mühəmməd (s) və (onun Əhli-beyti ilə birgə olun!”(٣

Bu ayənin təfsirində yuxarıdakı hədisləri nəql edənlər yalnız adlarını çəkdiklərimiz .deyil, digər alimlər də onları öz kitablarında nəql etmişlər

Bunu da qeyd etməliyik ki, Allah-taalanın “möminlər həmişə sadiq olanlarla birgə olsunlar” – göstərişi mütləq və qeydsiz-şərtsizdir, yəni məsum imamlardan başqasına aid ola bilməz. Çünki məsum olmayanların xəta və səhvə yol vermə ehtimalı qətidir və insan mütləq həmin şəxsdən ayrılmalıdır. Hər bir halda itaəti vacib olan, xəta və səhvə əsla yol verməyən kəslər məhz məsum imamlardır. Buna əsasən, ayədəki “sadiq olanlar”dan məqsəd düz danışan hər bir kəs deyil, əksinə səhv üzündən və ya bilərəkdən haqqa qarşı çıxmayanlardır. Bununla belə, “Ruhul-məani” kitabının müəllifi (Alusi) kimi bəzi məşhur əhli-sünnə alimləri ayədəki “sadiq olanlar” ifadəsini imam Əliyə (ə) aid edən rəvayətləri qeyd etdikdən sonra demişlər: “Şiələr Əlinin (ə) canişinliyinin haqq olduğunu sübut emək üçün bu ayəyə istinad edirlər. Bu istinad batildir!” Lakin onlar bunu deyib, məsələnin üstündən asanlıqla keçmiş və öz

.Yənabiul-məvəddət”, səh. ١١٥“ . [١] -١

.Şəvahidut-tənzil”, ١-ci cild, səh. ٢۶٢“ . [٢] -٢

Bax: “Ehqaqul-həqq”, ١۴-cü cild, səh. ٢٧۴-٢٧۵; ٣-cü cild, səh. ٢٩۶-٢٩٧, ١۴-cü cild, . [٣] -٣
.səh. ١٧٠-٢٧٧ və “Əl-qədir”, ٢-ci cild, səh. ٢٧٧

müddəalarına bir dəlil gətirməmişlər. Onların belə mövqeləri göstərir ki, təəssübkeşlik hissi təfəkkür nurunun qarşısını alimlərdən belə alır! Amma Doktor Məhəmməd Ticani Səmavi kimi azad düşüncəli insanlar da vardır ki, bu ayə və onunla bağlı rəvayətlərin şüası sayəsində yolunu düzgün görür, Əli (ə) və digər Əhli-beyt (ə) imamlarına olan imanını şücaətlə açıqlayır, bu zəmində "Lə əkunə məəs-sadiqin" (Sadiq olanlarla birgə .olam) adlı dəyərli bir kitab yazır ki, bir çox müsəlmanlara böyük təsir bağışlayır

## QURBA" AYƏSİ"–۵

### İşarə

:Şura" surəsinin ۲۳-cü ayəsində Peyğəmbəri-Əkrəm (s)-ə xitab olunaraq buyurulur"

قُل لَّا أَسْأَلُكُمْ عَلَيْهِ أَجْرًا إِلَّا الْمَوَدَّةَ فِى الْقُرْبَى

Ya Peyğəmbər!) De ki, mən sizdən bunun (peyğəmbərlik və risalətimin) müqabilində )" ".ən yaxınlarımı sevməkdən başqa bir şey istəmirəm

Bütün şiələr və bir qrup əhli-sünnə təfsirçiləri bu ayədə qeyd olunan "zil-qurba" sözünün kimlərə aid olduğu barədə demişlər: "Zil-qurba"dan məqsəd Peyğəmbəri-Əkrəm (s)-in ən yaxınlarıdır!" Lakin bu təfsirin müqabilində digər ehtimallar verilsə də, nəzərə belə çarpır ki, onların əsas məqsədi Peyğəmbər (s)-in xilafət məsələsini və :Əhli-beytin (ə) məqamını gözdən salmaqdır. O cümlədən

Risalətin savab və mükafatı dedikdə, müsəlmanları Allaha yaxınlaşdıran məsələlər .۱ nəzərdə tutulur. Buna əsasən, "qurba" Allaha yaxınlaşmağa səbəb olan hər hansı bir .amildir

Əvvəla, məlumdur ki, bu təfsir ayənin zahiri ilə əsla uyğun deyil; çünki namaz, oruc, cihad və bu kimi insanı Allaha yaxınlaşdıran məsələlərdə ən əhəmiyyətli cəhət onlara məhəbbət bəsləmək deyil, əməl etməkdir. Görəsən, Peyğəmbər (s)-in səhabələri arasında bunları sevməyən bir kəs vardımı? Təbii ki, xeyr! Hətta əməldə səhlənkarlıq edənlər belə, Allaha və Qurana iman gətirdikləri üçün İslamın qanunlarını sevirdilər, ...hərçənd, onlara əməl etməsəydilər də

İkinci də “əl-qurba” yaxınlaşdıran deyil, ən yaxın mənasındadır. Buna görə də Qurani-(Kərimin hər bir ayəsində (başqa on beş ayədə

.işlədilən bu söz yaxın (xüsusilə, qohum) olan şəxslərə aid olmuşdur

Bəs, bu alimlər hansı səbəbə görə bu ayədəki “qurba” sözünü həm lüğət, həm də Quranın bütün ayələrində gələn mənanın əksinə təfsir etmişlər? Görəsən, bunun ?səbəbi yuxarıda dediyimiz qərəzli məqsədlər deyildir

Diqqəti cəlb edən məsələ budur ki, bir çox lüğət alimləri açıq-aşkar bildirmişlər ki, “qurba”, yaxud “zil-qurba” dedikdə, nəsəbi yaxınlıq və qohumluq nəzərdə tutulur. “Məqayisul-lüğət” kitabında yazılır: “Fulanun zu qərabətin – huvə mən yəqrubu minkə ”.rəhimən

Filankəs (qohum olan şəxs barəsində) mənə yaxındır deyildikdə, o şəxsin nəsəbi“ qohumluğu nəzərdə tutulur.” Və yaxud: “Əl-qurba və əl-qərabət – hər ikisi bir mənanı ”.ifadə edir, o da nəsəbi qohumluqdur

:Lisanul-ərəb” kitabında belə yazılır“

والقرابه والقربی؛ الدنو فی النسب

”!Qərabət və qurba nəsəbi yaxınlıq və qohumluğa deyilir“

Məqsəd budur ki, siz müsəlmanlar öz yaxın adamlarınız və qohumlarınızı risaləti“ .۲ ”!qiymətləndirdiyiniz kimi sevin

İnsanın öz qohumlarını sevməsi risalətin mükafatı ilə uyğunluğu olmadığı halda, maraqlıdır ki, ayənin daha münasib mənasını – Peyğəmbər (s)-in yaxın adamlarını sevməyi – nəzərə almayıb, onu öz qohum-əqrəbamızı sevmək kimi açıqlamaq nə !?qədər həqiqətlə uyğundur

Təfsir alimlərinin digər bir qrupu isə belə demişlər ki, Peyğəmbər (s)-in məqsədi .۳ budur: “Mənim risalətimin mükafatı olan qohum-əqrəbama hörmət qoyun. Çünki mənim bir çox qəbilələrlə nəsəbi və yaxud başqa vasitələrlə qohumluğum vardır, belə ”!isə mənə əzab-əziyyət verməyin

Bu nəzər isə ayəyə yüklənən və zorla qəbul etdirilən ən pis təfsirdir. Çünki Peyğəmbər (s) risalətinin əvəzi o kəslərdən istənilə bilər ki, bunu qəbul etmiş olsunlar. Belə isə

onların Peyğəmbər (s)-ə əzab-əziyyət verməyi mənasızdır. Amma burada Peyğəmbər (ə)-ə əzab-əziyyət verənlər düşmənlərdirsə, onlar heç o həzrətin risalət və peyğəmbərliyini qəbul etmirdilər. Necə ola bilər ki, o həzrət desin:

“Mənim risalət və peyğəmbərliyimin müqabilində sizdən yalnız bir xahişim vardır və o da budur ki, sizinlə qohumluğa xatir mənə əzab-əziyyət verməyin!”

Əvvəla, Qurani-Kərimdə peyğəmbərlərin dilindən nəql edilən ibarələrdə buyurulur: “Biz sizdən heç bir mükafat istəmirik, bizim mükafatımız aləmlərin Rəbbinin yanındadır!”

Bu ayədə buyurulanlar təkcə beş peyğəmbərin (Nuh, Hud, Saleh, Lut və Şüeybin) dilindən nəql edilmişdir.(١)

İkincisi, “qurba” ayəsində Peyğəmbər (s) buyurur ki, mən siz müsəlmanlardan yaxın adamlarımı və qohumlarımı sevməkdən başqa bir mükafat istməmirəm.

Üçüncüsü, “Fürqan” surəsinin ٥٧-ci ayəsində yenə Peyğəmbər (s) haqda belə buyurulur:

قُلْ مَا أَسْأَلُكُمْ عَلَيْهِ مِنْ أَجْرٍ إِلَّا مَن شَاء أَن يَتَّخِذَ إِلَى رَبِّهِ سَبِيلًا

“(Ya Peyğəmbər!) De ki, mən sizdən bunun (peyğəmbərliyimin) müqabilində yalnız Rəbbinə tərəf doğru yol tapmaq istəyən kimsələrdən başqa heç bir mükafat istəmirəm!”

Dördüncüsü, “Səba” surəsinin ٤٧-ci ayəsində yenə Peyğəmbər (s) haqda belə buyurulur:

قُلْ مَا سَأَلْتُكُم مِّنْ أَجْرٍ فَهُوَ لَكُمْ إِنْ أَجْرِيَ إِلَّا عَلَى اللَّهِ

“(Ya Peyğəmbər) De: “Sizdən (peyğəmbərliyimin müqabilində) istədiyim mükafat yalnız sizin xeyrinizədir, çünki mənim muzd və mükafatım yalnız Allaha aiddir!”

Bu dörd ayəni əlavə etməklə, belə bir nəticəyə gəlirik ki, İslam Peyğəmbəri (s) də digər ilahi peyğəmbərlər kimi camaatdan özünə heç bir muzd və mükafat istəməmişdir, əksinə o həzrətin yaxın adamlarını sevmək Allaha təfər doğru yol kimi göstərilmiş və bu, sözsüz ki, müsəlmanların öz xeyrinədir! Çünki bu məhəbbət imamət, xilafət, Peyğəmbər (s)-in canişinliyi, ümmətə rəhbərliyinin davamı və insanların hidayəti üçün açılan qapıdır.

Bəli, hər vaxt bu ayələri zəhiri ilə uyğun təfsir etsək, qaranlıq və anlaşılmaz bir nöqtə qalmayacaq, əks halda isə ya onlara zidd, ya da



---

۱-[۱]. “Şüəra” surəsi, ayə: ۱۰۹, ۱۲۷, ۱۴۵, ۱۶۴ və ۱۸۰.

naçar qalıb əsla uyğun gəlməyən uzun-uzadı təfsirlərə əl atacağıq. Düzgün təfsir isə bir qrup alimlərin əqidələrilə zidd olduğundan, ondan üz döndərmiş, bəzən də demişlər: “Camaatdan muzd və mükafat istəmək İslam Peyğəmbərinin (s) məqamı ilə münasib deyildir. Buna əsasən, “qurba” ayəsi burada müstəsna olunmalıdır.” Bəzən də belə demişlər: “Bu ayə, “Qul ma əsəlukum ələyhi min əcrin və ma ənə minəl-mutəkəllifin!” – ayəsi ilə ziddiyyət təşkil edir.” Bəzən də mənasız yozumlara əl atmışlar.

Həqiqət isə “qurba” ayəsinin təfsir və şərhi ilə bağlı Peyğəmbəri-Əkrəm (s)-dən nəql olunan rəvayətləri toplayıb bir-birinin kənarına düzdükdə, daha aydın olur. Bu ayənin təfsiri ilə əlaqədar rəvayətlərin məcmusundan belə nəticəyə gəlirik ki, risalət və peyğəmbərliyin muzd və mükafatı sayılan “zil-qurba” müsəlmanları Allaha yaxınlaşdıran və xeyir-mənfəəti onların özlərinə çatan imamət və xilafətdən ibarətdir. Bununla da həmişə əks mövqe tutan bəzi təfsir alimlərinin iradları aydınlaşır.

Alusi “Ruhul-məani” kitabında “qurba” ayəsinin təfsirində yazır: “Şiələr məntiq qaydalarına əsaslanaraq, bu ayəni Əlinin (ə) imamətinə dəlil gətirir və deyirlər: “(Ayənin tələbinə görə,) ona məhəbbət bəsləmək vacib, məhəbbət bəslənməsi vacib olan kəsə itaət etmək vacib və itaət olunması vacib olan kəs isə imamət məqamına malikdir. Deməli, Əli (ə) imamdır!” Sonra o, bu dəlilə irad tutmağa başlayır.[1]

Əvvəla, qeyd etdiyimiz mətləblərdən məlum olduğu kimi, biz ayədən belə bir əsassız nəticə almaq istəmirik. Heç ayədəki mühüm incəlik də bu deyildir. Burada əsas məsələ Peyğəmbər (s)-in risalət və peyğəmbərliyinin mükafatı sayılan yaxın adamlarına məhəbbət bəsləməkdir ki, başqa ayələrdə də qeyd olunduğu kimi, bu mükafat Allaha yaxınlaşmağa vəsilə və müsəlmanların öz xeyrinədir. Amma onların kimlər olduğuna gəldikdə, öncə şərh etdiyimiz kimi, bu, imamlardan başqasına aid ola bilməz. Peyğəmbər (s)-in buyurduğu rəvayətlər isə bu məsələnin sübutu üçün əlavə dəlillərdir ki, sonradan onlara işarə edəcəyik.



---

۱-[۱]. “Ruhul-məani”, ۲۵-ci cild, səh. ۳۰.

Həm şiə, həm də əhli-sünnə mənbələrində "(Ya Peyğəmbər!) De ki, mən sizdən bunun (risalət və peyğəmbərliyimin) müqabilində ən yaxınlarımı sevməkdən başqa bir şey istəmirəm!" – ayəsinin məna və təfsirini tamamilə açıqlayan çoxlu rəvayət nəql :olunmuşdur. O cümlədən

ci əsrin məşhur əhli-sünnə alimi Hakim Həskani "Şəvahidut-tənzil" kitabında Səid-۵ .۱ ibn Cübeyrdən, o da İbn Abbasdan belə nəql edir: "Qurba" ayəsi nazil olduqdan sonra Peyğəmbər (s)-ə dedilər: "Ey Allahın Peyğəmbəri! Allah tərəfindən bizə məhəbbət bəslənilməsi vacib olan kəslər kimlərdir?" O həzrət belə buyurdu: "Əli, Fatimə və iki (oğulları!"(۱

Həmin kitabda müxtəlif sənədlərlə İbn Abbasdan həmin məzmunda digər rəvayətlər (də nəql olunmuşdur.(۲

Yenə həmin kitabda Əbu Əmamə Bahilidən nəql olunur ki, Peyğəmbəri-Əkrəm (s) .۲ :belə buyurmuşdur

اِنَّ اللهَ خَلَقَ الْاَنْبِیاءَ مِنْ اَشْجارٍ شَتّی، وَخُلِقْتُ وَعَلِیّ مِنْ شَجَرَهٍ واحِدَه، فَاَنَا اَصْلُها وَعَلِیٌّ فَرْعُها، (وَفاطِمَهُ لُقاحُها) وَالْحَسَنُ وَالْحُسَیْنُ ثِمارُها، وَ اَشْیاعُنا اَوْراقُها، فَمَنْ تَعَلَّقَ بِغُصْنٍ مِنْ اَغْصانِها نَجی وَمَنْ زاغَ هَوی، وَلَوْ اَنَّ عَبْداً عَبَدَاللهَ بَیْنَ الصَّفا وَالْمَرْوَهِ اَلْفَ عامٍ، ثُمَّ اَلْفَ عامٍ، ثُمَّ اَلْفَ عامٍ، حَتّی یَصِیرَ کالشَّنِّ الْبالِس، ثُمَّ لَمْ یُدْرِکْ مَحَبَّتَنااَکَبَّهُ اللهُ عَلی مِنْخَرَیْهِ فِی النّارِ ثُمَّ قَرَءَ قُلْ لا اَسئَلُکُمْ عَلَیْهِ اَجْراً اِلَّا الْمَوَدَّهَ فِی الْقُرْبی:

Allah-taala peyğəmbərləri müxtəlif ağaclardan, mənimlə Əlini isə bir ağacdan yaratdı." Mən həmin ağacın kökü, Əli budaqları, (Fatimə o ağacın bar verməsi üçün bir vasitə,) Həsən və Hüseyn meyvələri, şiələrimiz isə yarpaqlarıdır. Belə isə onun hər bir budağından yapışan kəs nicat tapar, ayrı düşən kəs isə zəlalətə uğrayar. Allaha Səfa və Mərvə (dağları) arasında min il, sonra min il, yenə də min il ibadət edib, nəticədə tuluq kimi köhnələrək quruyan, lakin bizi sevməyən bəndəni Allah-taala üzü üstə oda (cəhənnəmə) atar." Sonra o həzrət bu ayəni (şahid və sübut olaraq) tilavət etdi: "(Ya Peyğəmbər!) De ki, mən sizdən bunun (peyğəmbərlik və risalətimin) müqabilində ən (yaxınlarımı sevməkdən başqa bir şey istəmirəm."(۳

Əhli-sünnənin məşhur təfsir alimi Süyuti "Əd-durrul-mənsur" kitabında bəhs . ۳

etdiyimiz ayənin təfsiri ilə bağlı Mücahiddən, o da İbn



---

.Şəvahidut-tənzil", ۲-ci cild, səh. ۱۳۰" . [۱] -۱

.Yenə orada, səh. ۱۳۱-۱۳۵ . [۲] -۲

.Yenə orada, səh. ۱۴۱ . [۳] -۳

Abbasdan nəql edir ki, Peyğəmbəri-Əkrəm (s) “(Ya Peyğəmbər!) De ki, mən sizdən bunun (peyğəmbərlik və risalətimin) müqabilində ən yaxınlarımı sevməkdən başqa bir şey istəmirəm!” – ayəsinin təfsirində buyurdu: “Məqsəd budur ki, Əhli-beytimə qarşı (haqqımı qoruyun və onları mənə xatir sevin!”(١)

Əhməd ibn Hənbəl “Fəzailul-xəmsə” kitabında Səid ibn Cübeyrdən, o da Amirdən .۴ belə nəql edir: “Qurba” ayəsi nazil olduqdan sonra Peyğəmbər (s)-ə dedilər: “Ey Allahın Rəsulu! Məhəbbət bəslənilməsi bizə vacib olan yaxın adamların kimlərdir?” O həzrət buyurdu: “Əli, Fatimə və onların iki oğulu!” Peyğəmbər (s) bu cümləni üç dəfə təkrar (etdi.”(٢)

Bu rəvayəti Qurtubi həmin ayənin təfsirində azacıq fərqlə Səid ibn Cübeyrdən, o da .İbn Abbasdan nəql etmişdir

Hafiz Əbu Nəim İsfahani “Hilyətül-övliya” kitabında Cabirdən belə nəql edir: “Bir ərəb .۵ kişi Peyğəmbəri-Əkrəm (s)-in hüzuruna gəlib dedi: “Ey Məhəmməd! İslamı mənə öyrət.” Peyğəmbər (s) buyurdu: “Şəhadət verirsən ki, Allahdan başqa bir məbud yoxdur, təkdir, şəriksizdir, Məhəmməd Onun bəndəsi və peyğəmbəridir?” Dedi: “Bunun müqabilində məndən bir muzd istəyəcəksənmi?” Peyğəmbər (s) buyurdu: “Xeyr, yalnız qohumları sevməyi istəyirəm!” Dedi: “Öz qohumlarımı, yoxsa sənin qohumlarını?” Peyğəmbər (s) buyurdu: “Mənim qohumlarımı!” Dedi: “Əlini uzat, səninlə beyət edim! Hər kəs səni və yaxınlarını sevməsə, Allah ona lənət etsin!” Peyğəmbər (ə) (buyurdu: “Amin!”(٣)

Məşhur təfsir alimi İbn Cərir Təbəri də “qurba” ayəsinin təfsirində İbn Cübeyrdən .۶ ”!belə nəql edir: “Məqsəd Peyğəmbəri-Əkrəm (s)-in yaxın adamlarıdır

Hakim “Müstədrəküs-səhiheyn” kitabında imam Zeynəlabidindən (ə) belə nəql edir: .٧ “Əlinin (ə) şəhadətindən sonra Həsən ibn Əli (ə) camaata xütbə söylədi və xütbəsində özünü tanıtdıraraq buyurdu: “Mən elə bir ailədənəm ki, Allah-taala onları sevməyi hər bir müsəlmana vacib

١- [١] . “Əd-durrul-mənsur”, ۶-cı cild, səh. ٧.

٢- [٢] . “Ehqaqul-həqq”, ٣-cü cild, səh. ٢.

٣- [٣] . “Hilyətül-övliya”, ٣-cü cild, səh. ٢٠١.

etmiş və Peyğəmbərinə (s) buyurmuşdur: “De ki, mən sizdən bunun (peyğəmbərlik və risalətimin) müqabilində yaxınlarımı sevməkdən başqa bir muzd istəmirəm.”

Əhli-sünnənin digər alimləri də bu hədisi nəql etmişlər. O cümlədən, Muhibbuddin Təbəri “Zəxair”də səh. ١٣٨; İbn Həcər “Əs-səvaiq”də səh. ١٠١; Süyuti “Əd-durrul-mənsur”da, “qurba” ayəsinin təfsirində.

٨. Əbu Cəfər Məhəmməd ibn Cərir Təbəri “Camiul-bəyan” kitabında Əbud-Deyləmdən belə nəql edir: “Zeynəlabidini (ə) Şama əsir aparıb Dəməşqin (darvazasının) pillələrində saxladılar. Şam əhalisindən bir nəfər ayağa qalxıb dedi: “Allaha şükür olsun ki, sizi öldürüb, kökünüzü kəsdi!” Zeynəlabidin (ə) ona buyurdu: “Heç Quran oxuyubsanmı?” Dedi: “Bəli!” Buyurdu: “Quranda “Ha-mim” övladlarını oxuyubsanmı?” Dedi: “Quranı oxumuşam, amma “Ha-mim” övladlarını görməmişəm!” Buyurdu: “Qul la əsluku ələyhi əcrən illəl-məvəddətə fil-qurba! (Ya Peyğəmbər) De ki, mən sizdən bunun (peyğəmbərlik və risalətimin) müqabilində yaxınlarımı sevməkdən başqa bir şey istəmirəm.)” Dedi: “Peyğəmbərin yaxınları sizmisiniz?” Buyurdu: “Bəli!”(١)

٩. İbn Həcər “Əs-səvaiqul-muhriqə” kitabında imam Əlinin (ə) belə buyurduğunu nəql edir: “Biz “Ha-mim” övladları haqda bir ayə nazil olmuşdur və o da budur ki, bizim dostluq və məhəbbətimizi möminlərdən başqa kimsə (qəlbində) saxlamaz.” Sonra bu ayəni tilavət etdi: “(Ya Peyğəmbər!) De ki, mən sizdən bunun (peyğəmbərlik və risalətimin) müqabilində yaxınlarımı sevməkdən başqa bir şey istəmirəm.”(٢)

Bu rəvayət azacıq fərqlə “Kənzül-ümmal” kitabında da nəql olunmuşdur.(٣) Bu rəvayətdən açıq-aşkar başa düşülür ki, bəhs etdiyimiz ayədə “qurba”dan məqsəd Peyğəmbər (s)-in yaxın adamlarıdır. “Ha-mim övladları”ndan məqsəd, əvvəli “Ha-mim”lə başlayan surələrdir. Bunlar yeddi surədir: “Mumin”, “Fussilət”, “Şura”, “Zuxruf”, “Duxan”, “Casiyə” və “Əhqaf”. Qeyd etdiyimiz



---

١- [١]. “Camiul-bəyan”, ٢٥-ci cild, səh. ١٦.

٢- [٢]. “Əs-səvaiqul-muhriqə”, səh. ١٠١.

٣- [٣]. “Kənzül-ümmal”, ١-ci cild, səh. ١١٨.

(ayə isə “Şura” surəsindədir.(1)

10. Zəməxşəri, Fəxri-Razi və Qurtubi təfsir kitablarında “qurba” ayəsinin təfsirində Peyğəmbəri-Əkrəm (s)-dən bir hədis nəql edirlər ki, Əhli-beyti (ə) sevməyi yüksək səviyyədə qiymətləndirir. Biz burada Zəməxşərinin “Kəşşaf” təfsirindəki hədisi olduğu kimi yazırıq. Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər kəs Mühəmməd (s)-in Əhli-beytinin məhəbbəti ilə ölsə, dünyadan şəhid olaraq getmişdir.

Agah olun! Hər kəs Mühəmməd (s)-in Əhli-beytinin məhəbbəti ilə dünyadan getsə, bağışlanmışdır.

Agah olun! Hər kəs Mühəmməd (s)-in Əhli-beytinin məhəbbəti ilə dünyadan getsə, tövbə ilə dünyadan getmişdir.

Agah olun! Hər kəs Mühəmməd (s)-in Əhli-beytinin məhəbbəti ilə dünyadan getsə, kamil imanlı halda dünyadan getmişdir.

Agah olun! Hər kəs Mühəmməd (s)-in Əhli-beytinin məhəbbəti ilə dünyadan getsə, ölüm mələyi ona behişt müjdəsi verər, sonra Nəkir və Münkər (adlı sorğu-sual mələkləri) onu müjdələyərlər.

Agah olun! Hər kəs Mühəmməd (s)-in Əhli-beytinin məhəbbəti ilə dünyadan getsə, gəlini bəy evinə apardıqları kimi, onu da ehtirmla behiştə aparlar.

Agah olun! Hər kəs Mühəmməd (s)-in Əhli-beytinin məhəbbəti ilə dünyadan getsə, onun qəbrindən behiştə doğru iki qapı açılar.

Agah olun! Hər kəs Mühəmməd (s)-in Əhli-beytinin məhəbbəti ilə dünyadan getsə, rəhmət mələkləri onun qəbrini ziyarətgah qərar verərlər.

Agah olun! Hər kəs Mühəmməd (s)-in Əhli-beytinin məhəbbəti ilə dünyadan getsə, sünnə ilə dünyadan getmişdir.

Agah olun! Hər kəs Mühəmməd (s)-in Əhli-beytinin ədavəti ilə dünyadan getsə, qiyamət günü alnına “Allahın rəhmətindən məyusdur!” – yazıldığı halda məhşərə çıxar!

Agah olun! Hər kəs Mühəmməd (s)-in Əhli-beytinin ədavət və kin-küdurəti ilə dünyadan getsə, kafir halda dünyadan getmişdir.

Agah olun! Hər kəs Mühəmməd (s)-in Əhli-beytinin ədavət və



---

۱- [۱] . ۷- Bax: "Məcməül-bəyan" təfsiri, "Mumin" surəsinin başlanğıcı, vərəqaltı haşiyə, ۸-ci cild, səh. ۵۱۲.

(kin-küdurəti ilə dünyadan getsə, behiştin iyini duymaz!"(١)

Maraqlıdır ki, bəzi təəssübkeş sünnü alimləri "Kəşşaf" təfsirinə yazdıqları vərəqaltı haşiyədə bu hədisi nəql etdikdən sonra belə yazmışlar: "Bu hədisin saxtalığı əsər-
"!əlamətindən bəllidir

Amma onlar hədisin saxta olmasına bir dəlil, yaxud saxtalığının necə bəlli olmasına aid bir söz açmamışlar. Səbəbi də budur ki, hədisdə Peyğəmbəri-Əkrəm (s)-in Əhli-beytinin məqam və dərəcəsi əzəmətlə bəyan olunmuş və bu da onların əqidəsi ilə uyğun deyil. Bəlkə də onlar ilk dəfə olaraq bu şərif hədislə Peyğəmbər (s)-in Əhli-beytinin əzəmətli məqamını müşahidə edirdilər. Bu hədisi eyni əqidəli üç böyük təfsir alimi nəql etsə də, onlara da irad tutmamışlar. Fəxri-Razi bu hədisi nəql etdikdən sonra belə yazır: "Hədisdəki "ali" sözü haqda fikir ayrılığı olsa da, mənim nəzərimə görə "ali-Mühəmməd" (Mühəmməd (s)-in Əhli-beyti) Peyğəmbər (s)-lə rabitə və əlaqələri daha sıx olan şəxslərdir. Bu rabitə nə qədər güclü və kamil olsa, yaxınlıq da bir o qədər artıq olar. Şübhəsiz, Əli, Fatimə, Həsən və Hüseynin (ə) həzrət Peyğəmbər (s)-lə rabitəsi hamıdan artıqdır. Bunun inkaredilməz bir həqiqət olduğu hamı tərəfindən eyni söylənilmiş və "mütəvatir" hədislər vasitəsilə sübuta yetirilmişdir. Buna əsasən, (hamının əqidəsinə görə) onlar Peyğəmbər (s)-in övladları, Əhli-beytidir. Amma onlardan başqalarının "ali-Mühəmməd"ə aid olmasında ixtilaf vardır. Həqiqətdə də ayrı şəxsləri "ali" sözünün mənasına daxil etmək ağıl, məntiq və nəql olunan rəvayətlərə qarşı çıxmaqdır." Fəxri-Razi əlavə dəlil və sübutlarla da göstərir ki, bu ayə Əli (ə), (Fatimə (ə.s), Həsən (ə) və Hüseynə (ə) aiddir.(٢)

Qeyd etdiklərimizdən məlum olur ki, "qurba" ayəsinin təfsirində "Ayədə Qüreyş kafirlərinə xitabdan məqsəd odur ki, mənim onlarla yaxınlığımı unutmayın, bu yaxınlıq və qohumluğa görə onlara əzab-əziyyət verməyin!" – kimi rəvayətlər düzgün deyildir. Çox ehtimal ki, bu saxta hədisləri düzəldənlər Əhli-beytin (ə) yüksək məqamını göstərən hədisləri əhəmiyyətsiz qələmə vermək istəmişlər. Çünki Qüreyş kafirlərinə belə bir xitab ayənin məfhumu ilə tam ziddir və

۱- [۱]. “Kəşşaf” təfsiri, ۴-cü cild, səh. ۲۲۰-۲۲۱; “Kəbir” təfsiri, ۲۷-ci cild, səh. ۱۶۵-۱۶۶ və “Təfsiri-Qurtubi” səh. ۵۸۴۳.

۲- [۲]. Bax: “Kəbir” təfsiri, ۲۷-ci cild, səh. ۱۶۶-۱۶۷.

Peyğəmbər (s)-in kafirlərə “Mən sizdən heç bir muzd istəmirəm, lakin mənimlə qohumluq əlaqələri olanları unutmayın və onlara əzab-əziyyət verməyin!” – deyə buyurması qeyri-mümkündür. Onlar Peyğəmbər (s)-in risalət və peyğəmbərliyini əsla .qəbul etmirdirlər, o ki qaldı risalətin mükafatına əməl edələr

Bu bəhsimizi də Fəxri-Razinin “Kəbir” və Alusinin “Ruhul-məani” kitablarında “qurba” ayəsinin təfsiri ilə bağlı qeyd etdikləri misralarla sona çatdırırıq. Bunlar sünnü :təriqətlərindən birinin banisi olan Şafeinindir. O, belə deyir

,Ya rakibən, qif bil-muhəssəbi min Məna

,Vəhtif bi-sakini xifiha vən-nahizi

,Səhərən, iza qazəl-həcicu ila Mina

.Fəyzən kə-multətəmil-furatil-faizi

,İn kanə rəfzən hubbu ali-Muhəmməd

!Fəl-yəşhidis-səqəlanu: inni rafiziyyun

Ey (Allah evinin ziyarəti üçün) süvar olan, “Mina”nın yaxınlığında şeytana daş atılan“ yerdə (Allah evinin zəvvarlarının toplaşdıqları böyük mərkəzdə) dayan. “Xif” məscidində (ibadətlə məşğul olan), yaxud Kəbəyə doğru hərəkət edən bütün kəsləri çağır; səhər vaxtı hacıların sel kimi “Mina” məntəqəsinə çatdığını gördükdə, fəryad edərək söylə: “Əgər Məhəmmədin Əhli-beytini sevmək tərk etmək hesab edilərsə, (onda bütün insanlar və cinlər şahid olsunlar ki, mən rafiziyəm!”(۱)

İlahi! Bizi namazda salam və salavat göndərdiyimiz Əhli-beyti (ə)sevənlərdən qərar !ver

İlahi! Bu sevgini “vilayət məqamı”nı tanımaq üçün vasitə, sonra isə bu tanışlığı Əhli-!beytin (ə) məktəbinə tabe olmağa çevir ki, bu, İslamın ən mühüm məqsədidir

**FƏZİLƏT AYƏLƏRİ**

**İşarə**

ki, imamət və xilafətə birbaşa dəlalət etmir, lakin imam Əli (ə) üçün böyük fəzilət sayılır və o həzrətin şəxsiyyətini başqalarından tamamilə ayırır.

İslam ümməti arasında onun kimi bir kəsin varlığı ilə imamət və xilafətin başqasına verilməsi əsla düzgün deyildir. Başqa sözlə desək, əqli dəlilə əsasən, imamət və xilafət kimi bir məqamın hikmətli Allah tərəfindən "əfzəl"i qoyub, "məfzul"a (fəzilətcə aşağı şəxsə) verilməsi mümkün deyil. Hətta dünyanın ağıllı insanları belə bir işi məzəmmət edər, danlayar və bunu tədbirsizliyin nişanəsi kimi hesab edərlər. Çünki burada üstün şəxs ondan aşağı səviyyədə olan şəxsə tabe edilmişdir.

Amma bu fəsildəki ayələr daha çox olduğundan, hətta bəzi alimlər bu haqda ayrıca kitab yazmışlar. Biz isə onların içərisindən daha barizlərini seçib nəzərdə tutduğumuz həcmə uyğun izah edəcəyik!

Yenə burada əhli-sünnənin məşhur mənbə və kitablarına istinad etməklə Əhli-beyt (ə) məktəbinin ardıcıllarının mənbələrinə də cüzi toxunacağıq ki, kimsə bu məktəbin ardıcıllarının təəssüb üzündən çıxış etdiyini təsəvvür etməsin. Ümumiyyətlə, bu ayələr çoxdur, biz isə ٢٥ ayəni seçib, onların təfsiri ilə sizi tanış edəcəyik:

### ١– "MÜBAHİLƏ" AYƏSİ"

#### İşarə

"Ali-İmran" surəsinin ٦١-ci ayəsində buyurulur:

فَمَنْ حَآجَّكَ فِيهِ مِن بَعْدِ مَا جَاءكَ مِنَ الْعِلْمِ فَقُلْ تَعَالَوْاْ نَدْعُ أَبْنَاءنَا وَأَبْنَاءكُمْ وَنِسَاءنَا وَنِسَاءكُمْ وَأَنفُسَنَا وأَنفُسَكُمْ ثُمَّ نَبْتَهِلْ فَنَجْعَل لَّعْنَةُ اللّهِ عَلَى الْكَاذِبِينَ

"(Ya Peyğəmbər!) Hər kəs sənə elm gəldikdən sonra səninlə mübahisə etsə, onlara de: "Gəlin biz də oğullarımızı, siz də oğullarınızı; biz də qadınlarımızı, siz də qadınlarınızı; biz də özümüzü, siz də özünüzü çağıraq! Sonra mübahilə edib (yalvarıb) yalançılara Allahın lənətini qərar verək."

Bu ayə ilə bağlı bir neçə məsələni aydınlaşdırmaq lazımdır:

١. Ayənin möhtəvası.

İslamın məşhur mənbələrində bu ayənin təfsirində nəql olunan rəvayətlər kimləri .۲
.tanıtdırır

(Ayənin Əli (ə), Fatimeyi-Zəhra (ə.s), Həsən (ə) və Hüseynin (ə .۳

.fəzilət və üstünlüyünə dəlaləti

.Bəzi irad və bəhanələrin cavabı .۴

**MÜBAHİLƏ” AYƏSİNİN MÖHTƏVASI“**

Bu ayə özündən əvvəlki və sonrakı ayələrlə birgə göstərir ki, xristianlar yanlış əqidələrindən əl çəkmədikləri, o cümlədən, heç bir məntiq və dəlilə əsaslanmadan həzrət İsanın (ə) allahlıq məqamında şərik olduğunu iddia etdikləri zaman İslam Peyğəmbəri (s) haqq tərəfin üzə çıxmağı üçün “mübahilə”yə əmr olunur. Belə ki, hər iki !qrup Allahdan yalvarıb qarşı tərəfin yalançı olduğunun aşkar etməsini diləməli idilər

Mübahilə” əslində “azad, özbaşına buraxmaq, bir şeyi qeydsiz-şərtsiz nəzərə almaq”“ mənasını daşıyan “bəhl” sözündən götürülmüşdür. Məsələn, balasının əmməməsi üçün özbaşına buraxılan heyvana “bahil” deyilir. Dualarda da “ibtihal”ın mənası işlərin Allaha .tapşırılmasından ibarətdir

Bəzən bu sözü “həlakət, lənət və Allahdan uzaqlaşmaq” kimi məna etmişlər ki, bəndənin Allahın lütf və mərhəmətindən kəsilib özbaşına buraxılmasını buna misal .göstərmək olar

Mübahilə”nin bu ayədəki məfhum və mənasına gəldikdə isə “mübahilə” iki nəfərin bir-“ birinə qarşı nifrin və qarğışı mənasını ifadə edir. Belə ki, hər şey şüur və məntiq baxımından əyan olduqdan sonra mübahisə kəsilmədiyi təqdirdə iki nəfər, yaxud iki qrup bir yerə toplaşıb, Allaha dua edir və Ondan yalançının rüsvay olmasını, cəzalanmasını diləyirlər. Ayədə qeyd olunduğu kimi, İslam Peyğəmbəri (s) bu qarşıdurmaya Nəcran xristianlarını dəvət etmişdi. Deyilənlərə əsasən, həmin ayənin :təfsirinə başlayırıq. Ayədə belə buyurulur

فَمَنْ حَآجَّكَ فِيهِ مِن بَعْدِ مَا جَاءكَ مِنَ الْعِلْمِ فَقُلْ تَعَالَوْاْ نَدْعُ أَبْنَاءنَا وَأَبْنَاءكُمْ وَنِسَاءنَا وَنِسَاءكُمْ وَأَنفُسَنَا وأَنفُسَكُمْ ثُمَّ

Ya Peyğəmbər!) Hər kəs sənə elm gəldikdən sonra səninlə mübahisə etsə, onlara de: )“ “Gəlin biz də oğullarımızı, siz də ouğllarınızı; biz də qadınlarımızı, siz də qadınlarınızı; biz ”!də özümüzü, siz də özünüzü çağıraq

ثُمَّ نَبْتَهِلْ فَنَجْعَل لَّعْنَةُ اللّهِ عَلَى الْكَاذِبِينَ

Sonra mübahilə edib (yalvarıb) yalançılara Allahın lənətini qərar“

səh:١٧٥

".verək

Şübhəsiz, bu hadisə tarixdə baş vermiş və Peyğəmbəri-Əkrəm (s) bir neçə nəfəri özü ilə "mübahilə"yə aparmışdır. Təfsir və hədis alimlərinin nəql etdikləri rəvayətlərdə buyurulur: "Mübahilə" ayəsi nazil olduqdan sonra Peyğəmbəri-Əkrəm (s) Nəcran xristianlarını mübahiləyə çağırdıqda, onlar o həzrətdən bu barədə bir qədər fikirləşmək üçün bir gün möhlət istədilər. Xristianların başçısı və elmi rəhbəri(١) dedi: "Əgər sabah Məhəmməd öz ailəsi və övladları ilə birgə mübahiləyə gəlsə, onunla mübahilə etmədən geri qayıdırıq; amma öz müridlərini gətirsə, onunla mübahilə ".edəcəyik

Ertəsi gün Peyğəmbər (s) Əli (ə), Fatimə (ə.s), Həsən (ə) və Hüseynlə (ə) birlikdə xristianların qarşısına çıxdı. Xristianların başçısı ətrafındakılardan soruşdu: "Bunlar kimlərdir?" (Bu hadisəni Peyğəmbər (s) özü müşahidə edirdi.) Ona dedilər: "Biri əmisi oğlu və kürəkəni, o iki oğlan uşağı qız nəvələri və o qadın da hamıdan əziz bildiyi qızıdır!" Xristianların başçısı onlara dedi: "Mənim gördüyüm kişi öz qərarında möhkəmdir, mübahiləyə şücaət və cürətlə gəlmişdir. Qorxuram ki, əgər o, haqq olsa, ağır bəlaya düçar olaq!" Sonra üzünü Peyğəmbərə tutub dedi: "Ey Məhəmməd! Biz qərara gəldik ki, səninlə mübahilə yox, sülh edək!" Bəzi rəvayətlərdə isə onun belə dediyi nəql olunmuşdur: "Ey xristianlar! Mən elə nurlu simalar görürəm ki, əgər onlar Allahdan istəsələr, dağ yerindən qopar! Onlarla mübahilə etməyin, yoxsa həlak (olarsınız!"(٢

Bu hadisə azacıq fərqlə bir çox təfsir kitablarında nəql olunmuşdur. O cümlədən, Fəxri-Razinin "Kəbir" təfsiri , ٨-ci cild, səh. ١٠; "Təfsiri-Qurtubi", ٢-ci cild, səh. ١٣۴۶; "Ruhul-bəyan", ٢-ci cild, səh. ۴۴; "Ruhul-məani", ٣-cü cild, səh. ١٨٨; "Bəhrul-muhit", ٢-ci cild, səh. ۴٧٢; "Təfsiri-Beyzavi", "mübahilə" ayəsinin təfsiri və digər təfsir



---

Nəcran xristianlarının heyəti üç nəfərdən ibarət idi. Bunlardan biri Əbdül-Məsih . [١] -١ adı ilə məşhur olan Aqib idi. Bu şəxs heyətin rəisi, elmi rəhbəri və fikir sahibi idi. İkincisi Eyhəm idi ki, onların yığıncaqlarının rəisi sayılırdı. Üçüncüsü isə Əbu Hatəm ibn Əlqəmə

idi ki, onların dini rəhbəri sayılırdı. (“Əl-füsulul-muhimmə”, İbn Səbbağ Maliki, kitabın (.müqəddiməsi.) (Müt

.(Məcməül-bəyan”, ١-٢-ci cild, səh. ۴۵٢ (ixtisarla“ . [٢] -٢

.kitablarında qeyd olunmuşdur

## MÜBAHİLƏ" HƏDİS ALİMLƏRİNİN KƏLAMLARINDA"

Əhli-sünnə və Əhli-beyt (ə) ardıcıllarının mötəbər və məşhur mənbələrində nəql olunan bir çox rəvayətlərə əsasən, "mübahilə" ayəsi Əli (ə), Fatimeyi-Zəhra (ə.s), :Həsən (ə) və Hüseyn (ə) haqqında nazil olmuşdur. O cümlədən

Səhihi-Müslüm"ün "səhabələrin fəzilətləri" kitabının "Əli ibn Əbi Talibin (ə) fəzilətləri" " .١ bölümündə Səd ibn Əbi Vəqqasdan nəql olunan rəvayətdə deyilir ki, Müaviyə ondan soruşdu: "Nə üçün sən Əbu Turabı (Əlini (ə)) söymürsən?" Səd cavabında dedi: "Peyğəmbəri-Əkrəm (s)-in üç buyruğu yadımdadır ki, onlara görə Əlini söyə bilmərəm. Əgər onlardan biri mənim haqqımda deyilsəydi, çoxlu qırmızı tüklü dəvəyə sahib olmağımdan daha yaxşı idi. (Bu ən bahalı dəvədir!)" Sonra o, "mənzilət" hədisini (Əlinin (ə) "Təbuk" müharibəsində Mədinədə Peyğəmbər (s)-in yerində canişin qalmasını), "Xeybər" müharibəsində Peyğəmbər (s)-in bayrağı Əliyə (ə) verməsini və mübahilə hadisəsini belə qeyd edir: "Mübahilə" ayəsi nazil olduqdan sonra Allahın Peyğəmbəri (s) Əli (ə), Fatimeyi-Zəhra (ə.s), Həsən (ə) və Hüseyni (ə) çağırıb dedi: "İlahi! Bunlar mənim (Əhli-beytimdir."(١

:Bu hədisi əhli-sünnənin digər alimləri də nəql etmişlər. O cümlədən

Termizi "Səhih" kitabında (٢) bu hədisi nəql etdikdən sonra yazır: "Əbu İsa deyir ki, bu hədis "həsən", "səhih", eyni zamanda "qərib"dir." (Hədisin "qərib" və nadirliyi fikri təəssübkeşlik ucbatındandır.) Həmçinin bunu Əhməd ibn Hənbəl "Müsnəd"(٣); Beyhəqi ."Əs-sünənül-kubra"(٤) və Süyuti "Əd-durrul-mənsur"(٥) kitablarında qeyd etmişlər



---

.Səhihi-Müslüm", ۴-cü cild, səh. ١٨٧١, ۴-cü bölüm, hədis: ٣٢" . [١] -١

Səhihi-Termizi", ۵-ci cild, səh. ۶٣٧, ٢١-ci bölüm ("Əlinin (ə) fəzilətləri" bölümü)," . [٢] -٢ .hədis: ٣٧٢۴

.Müsnədi-Əhməd", ١-ci cild, səh. ١٨۵" . [٣] -٣

.Əs-sünənül-kubra", "Fəzailul-xəmsə" kitabından nəqlən, ١-ci cild, səh. ٢٩١" . [۴] -۴

۲. Termizi “Səhih” kitabının başqa bir yerində Səd ibn Vəqqasdan nəql edir ki, “mübahilə” ayəsi nazil olduqda, Peyğəmbəri-Əkrəm (s) Əli, Fatimə, Həsən və Hüseyni (ə) çağırıb dedi: “İlahi! Bunlar mənim Əhli-beytimdir!”(۱)

Bu hədisi Hakim “Müstədrəküs-səhiheyn” kitabında nəql etdikdən sonra yazır: “Bu hədis səhih və doğrudur, Şeyxeynin (Buxari və Müslümün səhih və doğru bildikləri) şərtləri ilə tam uyğundur!”(۲)

Bunu Beyhəqi də “Əs-sünənül-kubra” kitabında nəql etmişdir.(۳)

۳. Süyuti “Əd-durrul-mənsur” kitabında Hakim və İbn Mərdəveyhdən, eləcə də Əbu Nəim “Dəlail” kitabında Cabir ibn Abdullah Ənsaridən belə nəql edirlər: “Peyğəmbəri-Əkrəm (s) xristianları mübahiləyə çağırdıqdan sonra səhəri gün Əli, Fatimə, Həsən və Hüseynin (ə) əlindən tutub təyin olunmuş yerə getdi, lakin onlar mübahiləyə razı olmadılar.” Cabir əlavə edərək deyir: “Mübahilə ayəsi onların haqqında nazil olmuşdur!”(۴)

Süyuti yazır: “Hakim bu hədisi səhih və doğru hesab etmişdir!”

۴. Yenə “Əd-durrul-mənsur” kitabında İbn Abbasdan belə nəql olunmuşdur: “Nəcran xristianları Peyğəmbər (s)-in hüzuruna gedib qərarlaşdılar ki, mübahilə etsinlər... Peyğəmbər (s) özü ilə mübahiləyə Əli, Fatimə, Həsən və Hüseyni (ə) gətirib, onlara buyurdu: “Mən dua edirəm, siz də “amin” deyin!” Bu vaxt Nəcran xristianları mübahilədən çəkilib, Peyğəmbər (s)-lə sülh etdilər və cizyə verməyə razı oldular.”(۵)

۵. Yenə həmin kitabda İbn Cərirdən, o da İlba ibn Əhmər Yəşkəridən belə nəql edilir: “Mübahilə ayəsi nazil olduqdan sonra Peyğəmbəri-Əkrəm (s) Əli, Fatimə, Həsən və Hüseynlə (ə) birgə müxalifləri mübahiləyə çağırdı və onlar isə buna razı olmadılar.(۶)

۶. Əllamə Təbəri “Təfsir” kitabında “mübahilə” ayəsinin təfsiri ilə

səh:۱۷۸

---

۱- [۱]. “Səhihi-Termizi”, ۵-ci cild, səh. ۲۲۵۶, ۴-cü bölüm, hədis: ۲۹۹۹, Beyrutun “Daru ehyait-turasil-ərəbi”, çapı.

٢- [٢]. “Müstədrəkus-səhiheyn”, ٣-cü cild, səh. ١٥٠.

٣- [٣]. “Əs-sünənül-kubra”, ٧-ci cild, səh. ٦٣.

٤- [٤]. “Əd-durrul-mənsur”, ٢-ci cild, səh. ٣٨, “mübahilə” ayəsinin təfsirində. Biz onu ixtisarla qeyd etdik.

٥- [٥]. Yenə orada, səh. ٣٩.

٦- [٦]. Yenə orada.

bağlı Zeyd ibn Əlidən belə nəql edir: “(Mübahilədə) Peyğəmbər (s)-lə Əli, Fatimə, Həsən və Hüseyn (ə) var idilər!”(۱)

۷. Yenə həmin kitabda bu ayənin təfsirində Sədiyyin vasitəsilə belə nəql olunur: “Peyğəmbər (s) Fatimə, Həsən və Hüseynin (ə) əlindən tutub, Əliyə (ə) buyurdu: “Bizim arxamızca gəl!”(۲)

۸. Hicri qəməri tarixi ilə ۴-cü əsrin alimlərindən olan Əllamə Əbu Bəkr Cəssas “Əhkamul-Quran” kitabında “mübahilə” barəsində açıq-aşkar belə yazır: “Tarix və sirə raviləri Peyğəmbəri-Əkrəm (s)-in Həsən, Hüseyn, Əli və Fatimənin əlindən tutub, xristianlarla mübahiləyə çıxmasında heç bir ixtilaf etməmişlər!”(۳) Cəssasın yazdığına görə, bütün tarix və hədis alimlərinin icması və yekdilliyi aydın bir məsələdir.

۹. Əllamə Əbu Bəkr Cəssas “Mərifətu-ülumil-hədis” adlı başqa bir kitabında “mübahilə” əhvalatını nəql etdikdən sonra yazır: “Hakim demişdir: Təfsir kitablarında İbn Abbas və başqalarından nəql olunan “mütəvatir” hədislərdə buyurulur: “Allahın Peyğəmbəri (s) mübahiləyə getdiyi gün Əli, Həsən və Hüseynin əlindən tutmuşdu və Fatimə də onların arxasınca gedirdi. Sonra o həzrət buyurdu: “Bunlar bizim oğullarımız, özümüz və qadınlarımızdır. Siz də özünüzü, övladlarınızı və qadınlarınızı gətirin (ki, dua edib, Allahdan yalançılara lənət diləyək)!”(۴)

Qeyd etdiklərimiz “mübahilə” ayəsinin nazil olma səbəbi ilə əlaqədar nəql olunan rəvayətlərin bir qismi idi. Gördüyünüz kimi, hədislərdəki fərq, yalnız Fatimə (ə.s)-ın, yaxud imam Əlinin (ə) Peyğəmbəri-Əkrəm (s)-lə yanaşı, yaxud o həzrətin arxasınca hərəkət etməsi idi. Bu da əslində elə də fərq sayılmır. Çünki “Bədr”, “Xeybər”, “Əhzab” müharibələri, hətta Məkkənin fəthi kimi qəti və şübhəsiz olan bir çox tarixi hadisələrdə fərq və ixtilaflar gözə dəyir.

səh:۱۷۹

---

۱- [۱]. “Təfsiri-Təbəri”, ۳-cü cild, səh. ۱۹۲. (“Ehqaqul-həqq” kitabından nəqlən, ۳-cü cild, səh. ۴۷.)

۲- [۲]. Yenə orada.

۳- [۳]. “Əhkamul-Quran”, ۳-cü cild, səh. ۱۴.

Tarixdə baş vermiş ən mühüm hadisələr içərisində belə görünməyib ki, müxtəlif .nəqllərə əsasən, onlarda azacıq fərq və ixtilaf olmasın

Ümumiyyətlə, qeyd etdiyimiz rəvayətlərin sayı olduqca çoxdur və bir qrup əhli-sünnə aliminin fikrinə görə, "təvatür" həddinə çatmışdır. Bununla belə, "Əl-mənar" kitabının müəllifinin "mübahilə" ayəsinin təfsirindəki qeydləri doğrudan da çox qəribədir! O yazır: "Müstəsnasız olaraq bütün rəvayətlərdə deyilir ki, Peyğəmbər (s) mübahiləyə Əli, Fatimə və iki övladlarını təyin etdi. (Ayədə qeyd olunan) "nisaəna" (qadınlarımız) sözü Fatiməyə, "ənfusəna" (özümüz) sözü isə yalnız Əliyə aid edilir. Bu rəvayətlərin (hamısı şiələrdəndir və onların da məqsədi bəllidir!"(١)

Doğrudan da, maraqlıdır! Firqə təəssübkeşlikləri baş qaldırdıqda, "Əl-mənar"ın müəllifi kimi məşhur bir alimin məntiqsiz mövqeyi hamıya bəlli olur. Görəsən, "Səhihi-Müslüm", "Səhihi-Termizi" və "Müsnədi-Əhməd" şiənin, yoxsa əhli-sünnənin məşhur mənbələridir?! Görəsən, "Əd-durrul-mənsur" (Süyuti), "Təfsiri-Təbəri", "Müstədrəki-Hakim" kitablarını şiə alimlərimi yazıblar?! Belə böyük yanlışlar yalnız təəssübkeşlik üzündəndir. "Əl-mənar"ın müəllifi bir tərəfdən "müstəsnasız bütün rəvayətlərdə belə deyilir..." – ifadəsini işlədir, digər tərəfdən isə məsələyə şübhə ilə yanaşır. Əgər "Səhihi-Müslüm", "Səhihi-Termizi", "Müsnədi-Əhməd" və s. kitablarda şiələrin saxta hədisləri "təvatür" həddində nəql olunubsa, onda belə kitabları "səhih" və "mötəbər" adlandırmaq, onun hətta bir hədisini belə qəbul etmək olarmı?! Həqiqətdə "Əl-mənar"ın müəllifi belə sözlərlə əhli-sünnənin bütün kitab və mənbələrini etibardan salır və onların dəyər-qiymətini şübhə altına aparır. Bəli, o, Əli (ə), Fatimeyi-Zəhra (ə.s) və onların övladlarının fəzilətini inkar etmək istəsə də, əksinə, əhli-sünnə məzhəbinə !zərbə endirmiş, onu kökündən vurmuşdur

Burada təkcə bir şübhə qalır ki, o da ayədəki cəm əvəzlikləri ilə bağlıdır. Biz bu haqda .sonra geniş söz açacağıq



---

.Əl-mənar", ٣-cü cild, səh. ٣٢٢" . [١] -١

Mübahilə" hadisəsi İslam Peyğəmbərinin (s) risalətinin doğru və haqq olduğunu" göstərən aydın bir nişanə və dəlildir. Çünki Allahla qəti və mənəvi əlaqəsi olmayan şəxsin belə təhlükəli işə razı olması mümkün deyildir. Peyğəmbəri-Əkrəm (s) çəkinmədən müxaliflərinə deyir ki, gəlin, birlikdə dua edib Allahdan yalançıları rüsvay etməsini diləyək. Bunun mənası odur ki, sözsüz, mənim nifrin və qarğışım sizi tutacaq !və siz bunun nəticəsini görəcəksiniz

Şübhəsiz, belə bir meydana girmək elə də asan bir iş deyildi; çünki, əgər qarğış Allah dərgahında qəbul olunmayıb qarşı tərəf cəzasına çatmasa, bu özü böyük rüsvayçılıq olacaqdır və heç bir ağıllı insan qarşı tərəfin məğlub olacağına inanmadan belə bir işə əl qoymaz. Məhz bu səbəbdən də rəvayətlərdə deyildiyi kimi, mübahilədən söz düşdükdə, Nəcran xristianları Peyğəmbəri-Əkrəm (s)-dən bu barədə bir qədər fikirləşmək üçün möhlət istədilər. Onlar Peyğəmbər (s)-in özü ilə gətirdiyi şəxslərin yalnız dörd nəfərdən ibarət olduğunu, səs-küy salmadan, qəti inam və xatircəmliklə vəd edilmiş yerə gəldiyini gördükdə, dəhşətə düşərək mübahilədən boyun qaçırdılar .və o həzrətin haqq və doğru olduğuna inanaraq ilahi əzabdan qorundular

Digər tərəfdən isə, bu ayə Peyğəmbər (s)-in Əhli-beytinin – Əli, Fatimə, Həsən və Hüseynin (ə) yüksək məqama malik olduğunu göstərən ən aydın və möhkəm sübutdur. Şübhəsiz, ayədə qeyd olunan "əbnaəna" (oğullarımız) sözündən məqsəd imam Həsən və imam Hüseyn (ə), "nisaəna" (qadınlarımız) sözündən məqsəd Fatimeyi-Zəhra (ə.s)-dır. "Ənfüsəna" (özümüz) sözünə gəldikdə isə, ondan məqsəd, şübhəsiz ki, təkcə Peyğəmbəri-Əkrəm (s)-in özü deyildir. Çünki ayədə "özümüzü dəvət edək" – ibarəsi vardır ki, əgər yalnız Peyğəmbər (s) nəzərdə tutulsaydı, onda insanın özü-özünü dəvət etməsinin heç bir mənası olmayacaqdır. Buna əsasən, yeganə yol "!budur ki, deyək: "Məqsəd yalnız Əli (ə)-dır

Fəxri-Razi özü bu ayənin təfsirində şiə alimlərindən olan Məhmud ibn Həsən Həmsidən bir mətləbi nəql edir ki, çox

maraqlıdır! O, bu ayəyə əsasən, Əlini (ə) Peyğəmbərdən (s) sonra bütün peyğəmbər və səhabələrdən fəzilətli olduğunu sübut edərək deyir: “İnsanın özü-özünü müəyyən bir işə dəvət etməsi qeyri-mümkündür. Buna əsasən, “ənfüsəna” (özümüzdən) məqsəd başqa bir şəxsdir. Alimlər də yekdil fikirdədirlər ki, həmin şəxs yalnız Əli (ə)-dır. Buna əsasən, Əli (ə) Peyğəmbər (s)-in özü kimidir. Şübhəsiz, onun eynilə özü olmasa da, o həzrətin peyğəmbərlik məqamını, eləcə də bütün insanlardan üstünlüyünü müstəsna etməklə, bütün xüsusiyyətlərdə onun kimidir. Əgər Peyğəmbəri-Əkrəm (s) bütün peyğəmbərlərdən üstün və fəzilətlidirsə, deməli, Əli (ə) də onların hamısından fəzilətli olmalıdır.” Sonra o, öz kəlamını sona yetirərək hamının qəbul etdiyi Peyğəmbər (s)-in :bu hədisinə istinad edir

مَـنْ اَرادَ اَنْ يَرَى آدَمَ فِى عِلْمِـهِ وَ نُوحـاً فِى طـاعَتِهِ وَ اِبْراهِيمَ فِى خُلَّتِهِ وَمُوسـى فِى هَيْبَتِهِ وَ عِيسـى فِى صَـفْوَتِهِ، فَلْيَنْظُر اِلى عَلِىِّ بْنِ اَبِيطالِبٍ (ع):

Hər kəs Adəmin elmini, Nuhun (Allaha) itaətini, İbrahimin dostluğunu, Musanın“ heybətini, İsanın pak və saflığını görmək istəyirsə, Əli ibn Əbi Talibə (ə) baxsın!” Bu hədisdə göstərilir ki, Əli (ə) müqəddəs insanların ayrı-ayrılıqda malik olduqları !xislətlərin hamısına sahib idi

Fəxri-Razi bundan sonra yazır: “Həm keçmişdə, həm də indinin özündə şiələr də bu ayəyə istinad edərək, Əlini (ə) Peyğəmbər (s)-in nəfsi və özü kimi bilirlər. Belə ki, bu ifadə onun Peyğəmbəri-Əkrəm (s)-in bütün xüsusiyyətlərinə malik olduğunu və beləcə bütün səhabələrdən üstünlüyünü göstərir. Buna əsasən, Əli (ə) hamıdan fəzilətli (sayılır.(١

Fəxri-Razi bu dəlili qeyd etdikdən sonra onun üstündən asanlıqla keçərək, yalnız belə bir cavabla kifayətlənir: “Bütün müsəlmanlar Mühəmməd (s)-i Əli ibn Əbi Talibdən fəzilətli bildikləri kimi, hər bir peyğəmbərin də peyğəmbər olmayanlardan üstün və fəzilətli olduğunu bilirlər. Şübhəsiz, Əli peyğəmbər deyildir, nəticə alırıq ki, digər ilahi (peyğəmbərlər də Əlidən üstün və fəzilətlidirlər.”(٢

Fəxri-Razinin sözlərindən məlumdur ki, həqiqətdə onun möhkəm və

tutarlı dəlili yoxdur, sanki o, səhifənin boş qalmaması üçün bir söz yazmaq istəmişdir. Halbuki “hər bir ilahi peyğəmbər qeyri-peyğəmbərdən üstün və fəzilətlidir!” – fikri elə də qəti söz deyildir. Çünki bu üstünlük yalnız vəhy məsələsində şübhəsizdir, lakin vəhydən başqa hallarda Peyğəmbəri (s) istisna etməklə, digər peyğəmbərlərdən üstün və fəzilətli bir ilahi insanın olması ehtimalı vardır. Bir də bizim söhbətimiz imam Əlinin (ə) İslam ümməti içərisindəki üstünlük və fəzilətindən gedir. Burada isə o .həzrətin digər peyğəmbərlərdən fəzilətli olmasını sübut etməyə ehtiyac yoxdur

Beləliklə, “mübahilə” ayəsinə və onunla bağlı “mütəvatir” hədislərə əsasən, fəzilətli şəxsin Peyğəmbər (s)-in xilafət və canişinliyinə layiqliyi daha da aydınlaşır. Çünki Allah-taala heç vaxt daha üstün və fəzilətli, eləcə də Peyğəmbər (s)-in canı kimi olan şəxsi !məmum və mürid, ondan aşağı olan şəxsi isə imam və rəhbər etməz

Bu məsələdə (bizim etiqadımıza görə) imamın Allah, yaxud (əhli-sünnənin etiqadına görə) camaat tərəfindən seçilməsində heç bir fərq yoxdur. Çünki birinci surətdə Allah-taala heç vaxt fəzilətli şəxsi ondan aşağı olan şəxsdən üstün bilməz, ikinci surətdə isə sağlam kütlə heç vaxt ağılın qəti hökmünə qarşı çıxmaz; əgər belə bir iş tutsa, .qətiyyən bəyənilmir və məqbul deyildir

### MÜBAHİLƏ” AYƏSİ VƏ İRADLAR“

Əl-mənar” kitabının müəllifi və digər alimlərin bu ayənin Əhli-beyt (ə) haqqında nazil“ olmasına tutduqları iradlardan biri budur ki, onda qeyd olunan “əbnaəna” (oğullarımız) sözü cəm formasında işlənmiş və onun iki nəfərə – Həsən və Hüseynə (ə) aid etmək düzgün deyildir. Eləcə də “nisaəna” (qadınlarımız) sözü cəm olduğu halda, necə ola bilər ki, yalnız Fatimeyi-Zəhraya (ə.s) aid olsun?! Hətta “ənfüsəna” (özümüz) sözü də !?cəm formasında işləndiyi halda, onu yalnız Əliyə (ə) necə şamil etmək olar

:Cavab: Burada diqqətinizi bir neçə məsələyə yönəldirik

Əvvəlcə geniş izah verildiyi kimi, həm şiə, həm də sünnülərin məşhur və mötəbər .١ mənbələrindəki rəvayətlər “mübahilə” ayəsinin Əhli-beyt (ə) barəsində nazil olduğunu, eləcə də Peyğəmbər (s)-in Əli

ə), Fatimeyi-Zəhra (ə.s), Həsən (ə) və Hüseyndən (ə) başqa bir kəsin mübahiləyə) aparmadığını açıq-aşkar qeyd etmişlər. Bunlar ayənin təfsiri üçün aydın sübutdur. Çünki Quran ayələrini təfsir edən, onların nazil olma səbəbini açıqlayan şahid və sübutlardan biri də qəti sünnədir! Buna əsasən, yuxarıdakı irada yalnız şiələr deyil, .həm də bütün İslam alimləri cavab verməlidirlər

Cəm formasının bir, yaxud neçə nəfərə şamil olması yeni bir məsələ deyildir. Qurani- .٢ .Kərimdə, ərəb və qeyri-ərəb ədəbiyyatında belə hallara çox rast gəlmək olar

İzah: Adətən, hər hansı bir qanun qoyularkən, yaxud bir əhdnamə yazılarkən, hökm ümumi şəkildə və cəm formasında qeyd edilir. Məsələn, əhdnamədə belə yazırlar: "İcrası üzərinə düşən məsul şəxslər – əhdnaməni imzalayanlar və onların övladlarıdır!" Burada ola bilər ki, birinin ya bir uşağı, ya da iki uşağı olsun. Bu isə qanunun, yaxud əhdnamənin "cəm formasında" nəzərə alınması ilə heç bir ziddiyyət təşkil etmir. Bir .sözlə, burada iki mərhələ vardır: ١. Müqavilə zamanı; ٢. İcra zamanı

Müqavilə zamanı ifadə və ibarələrin hamıya aid olması üçün buyuruqlar cəm formasında qeyd olunur. İcra zamanı isə mümkündür bu iş bir nəfərin üzərinə düşsün. .Bu da məsələnin ümumiliyinə heç bir xələl gətirmir

Başqa sözlə desək, Peyğəmbəri-Əkrəm (s) Nəcran xristianları ilə bağladığı müqaviləyə əsasən, bütün övladlarını, qadınlarını və onun canı sayılan kəsləri mübahiləyə aparmalı idi, lakin onlar bir neçə nəfərdən artıq deyildilər. Öncə deyildiyi kimi, Qurani-Kərimin bir çox ayələrində bəzi ibarələr bir nəfərə aid olduğu halda, cəm formasında işlədilmişdir. :Məsələn, "Ali-İmran" surəsinin ١٧٣-cü ayəsində buyurulur

الَّذِينَ قَالَ لَهُمُ النَّاسُ إِنَّ النَّاسَ قَدْ جَمَعُواْ لَكُمْ فَاخْشَوْهُمْ

O kəslər ki, xalq onlara dedi: "Düşmənlər (hücum etmək üçün) sizə qarşı toplaşmışlar," "!onlardan qorxun

Bu ayədəki "ən-nas" (xalq) sözündən məqsəd bir qrup təfsir aliminin yazdığına əsasən, Nəim ibn Məsuddur. O, müsəlmanları müşriklərin qüdrəti ilə qorxutmaq üçün Əbu .Süfyandan bir qədər mal (rüşvət) almışdı

:Həmçinin “Ali-İmran” surəinin ١٨١-ci ayəsində buyurulur

لَّقَدْ سَمِعَ اللّهُ قَوْلَ الَّذِينَ قَالُواْ إِنَّ اللّهَ فَقِيرٌ وَنَحْنُ أَغْنِيَاء

Allah kasıbdır, biz isə dövlətliyik! (Buna görə də Allah bizdən zəkat istəyir)” –“ ”!deyənlərin sözünü Allah, əlbəttə, eşitdi

Bir qrup təfsirçilərin nəzərinə görə, bu ayədə “qovləlləzinə” (deyənlərin sözünü) .kəlməsindən məqsəd Həyy ibn Xətib və ya Fənhas adlı şəxs olmuşdur

Bəzən də cəm formasında işlədilən söz nəzərdə tutulan şəxsə hörmət məqsədilədir. :Necə ki, “Nəhl” surəsinin ١٢٠-ci ayəsində həzrət İbrahim (ə) haqqında belə buyurulur

إِنَّ إِبْرَاهِيمَ كَانَ أُمَّةً قَانِتًا لِلّهِ حَنِيفًا

”.Həqiqətən, İbrahim Allaha müti və baş əyən bir ümmət idi“

.Bu ayədə cəm mənasını daşıyan “ümmət” sözü bir nəfərə – İbrahimə (ə) deyilmişdir

Mübahilə” ayəsindən başa düşülür ki, (oğlan olan) qız nəvələrə də “ibn” (oğul) deyilir.“ .٣ Cahillik dövründə isə ərəblər yalnız oğul tərəfindən olan nəvələri övlad hesab edib :deyirdilər

,Bənuna bənu əbnauna və bənatina

.Bənuhunnə əbnaur-ricali əbaidi

Bizim övladlarımız, yalnız oğullarımızın övladlarıdır, qızlarımızın övladları isə bizim“ ”.deyil, yadların övladları sayılırlar

Belə təfəkkür tərzi cahillik dövrünün yanlış adət-ənənələrindən qaynaqlanırdı; onlar qızları və qadınları bəşərin qismindən saymır və onlara oğullarını saxlamaq üçün bir :əşya kimi baxırdılar. Necə ki, o dövrün şairi deyir

,Və innəma ummuhatun-nasi əviyətun

.Mustəvdəatun və lil-ənsabi abaun

Analar onların böyüməsi üçün bir qabdır (əşyadır), nəsil isə yalnız ataların“ ”.hesabınadır

İslam dini isə belə təfəkkürü şiddətlə məhkum edərək, oğlanla qız övladları arasındakı fərqi götürdü. Qurani-Kərimin “Ənam” surəsinin ٨٥-ci ayəsində İbrahimin övladları :haqqında buyurulur

وَمِن ذُرِّيَّتِهِ دَاوُودَ وَسُلَيْمَانَ وَأَيُّوبَ وَيُوسُفَ وَمُوسَى وَهَارُونَ وَكَذَلِكَ نَجْزِي الْمُحْسِنِينَ وَزَكَرِيَّا وَيَحْيَى وَعِيسَى وَإِلْيَاسَ كُلٌّ مِّنَ الصَّالِحِينَ

səh:١٨٥

Davud, Süleyman, Əyyub, Yusif, Musa və Harun da onun (İbrahimin) övladlarından“ idilər. Biz yaxşı iş görənləri belə mükafatlandırırıq. Zəkəriyya, İsa və İlyas da ”.əməlisalehlərdən idi

Bu ayədə həzrət İsa (ə) İbrahim peyğəmbərin övladlarından sayılmışdır, halbuki o, .(Məryəmin oğlu idi (yəni İbrahim (ə)-ın qız nəvəsi idi

Şiə və sünnülərin vasitəsilə nəql olunan rəvayətlərdə “ibn Rəsulillah” (Peyğəmbərin .övladı) sözünün imam Həsən və imam Hüseynə (ə) deyilməsi müşahidə olunur

Evlənməyi haram olan qadınlar barəsindəki ayədə buyurulur: “Sizin oğullarınızın zövcələri.” İslam fəqihləri və alimlərinin nəzərinə görə, oğulların və nəvələrin (istər qız, .istərsə də oğlan) zövcələri insana məhrəmdir və bu ayə onlara şamil olur

Mübahilə” ayəsinin təfsirində nəql olunan məşhur bir hədis insanın diqqəti özünə“ daha çox cəlb edir. Hədisdə deyilir: “Bir gün xəlifə Məmun imam Riza (ə)-dan “Baban Əli ibn Əbi Talibin (ə) Peyğəmbər (s)-in xəlifəsi olmasına dəlilin varmı?” – deyə ”.(soruşduqda, o həzrət buyurdu: “Ənfüsəna” ayəsi (buna dəlildir

”(!Məmun dedi: “Əgər “nisaəna” olmasaydı, (sözün düz olardı

”(!İmam Riza (ə) buyurdu: “Əgər “əbnaəna” olmasaydı, (sən deyən olardı

Əllamə Təbatəbai bu qısa və eyni zamanda mənalı sözləri şərh edərək yazır: “İmam Rizanın (ə) “ənfüsəna” ayəsinə istinad etməsinin səbəbi odur ki, Allah-taala Əlini (ə) Peyğəmbərin (s) canı və nəfsi kimi tanıtdırmışdır. (Buna əsasən, Əli (ə) xilafət və imamət məqamına hamıdan layiqdir, risalət və peyğəmbərlikdən başqa hər bir (.məqamında Peyğəmbər (s)-lə eynidir

Məmunun cavabı isə buna bir növ irad idi. Belə ki, ayədə qeyd olunan “nisaəna” (qadınlarımız) sözü göstərir ki, “ənfüsəna” sözü Peyğəmbər (s)-in canı və nəfsi kimi .şəxsi deyil, ümumi olaraq “ricalənə” (kişilərimiz) mənasını yetirir

İmam Riza (ə) da yeni cavabı ilə bildirir ki, əgər “ənfüsəna” “kişilərimiz” mənasını daşısaydı, artıq “əbnaəna” (oğullarımız) sözünə ehtiyac olmazdı. Çünki oğullar ifadəsi

(əsasən, ayədəki “ənfüsəna” sözü “kişilərimiz” mənasında deyildir.(١)

Biharul-ənvar” kitabında Məmunla imam Rizanın (ə) arasındakı söhbət belə nəql“ olunmuşdur: “Bir gün Məmun imam Rizaya (ə) dedi: “Qurani-Kərimdə Əli ibn Əbi Talibin ”?(ə) ən böyük fəzilətinə dəlalət edən ayə hansıdır

İmam (ə) buyurdu: “Mübahilə ayəsi! Bu ayə nazil olduqda, Peyğəmbəri-Əkrəm (s) Həsən və Hüseyni (ə) çağırdı (onları özü ilə mübahiləyə apardı). Buna əsasən, ayədəki “əbnaəna” (oğullarımız) sözündən məqsəd onlardır. Sonra Fatimeyi-Zəhranı (ə.s) çağırdı. Ayədəki “nisaəna” (qadınlarımız) sözü də ona aiddir. Daha sonra Əmirəlmöminin Əlini (ə) çağırdı. Allahın hökmünə əsasən, o, Peyğəmbər (s)-in canı və nəfsi kimidir. Heç kim Peyğəmbər (s)-dən üstün və fəzilətli olmadığı kimi, o həzrətin ”.canı və nəfsindən, yəni Əli ibn Əbi Talibdən (ə) də üstün və fəzilətli deyildir

Məmun dedi: “Ola bilər ki, “ənfüsəna” (özümüz) sözü başqasına deyil, yalnız ”.Peyğəmbər (s)-in özünə aid olsun

İmam (s) buyurdu: “Məgər insan özünü bir işə çağıra bilərmi? Peyğəmbər (s) Fatimə (ə.s), Həsən və Hüseyndən (ə) əlavə, Əlini (ə) da çağırdı. Buradan məlum olur ki, Əli (ə) (Peyğəmbər (s)-in canı və nəfsi kimidir!”(٢)

### XEYRUL-BƏRİYYƏ” (YARADILMIŞLARIN ƏN YAXŞISI) AYƏSİ”-٢

:Bəyyinə” surəsinin ٧-٨-ci ayələrində buyurulur“

إِنَّ الَّذِينَ آمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ أُوْلَئِكَ هُمْ خَيْرُ الْبَرِيَّةِ جَزَاؤُهُمْ عِندَ رَبِّهِمْ جَنَّاتُ عَدْنٍ تَجْرِى مِن تَحْتِهَا الْأَنْهَارُ خَالِدِينَ فِيهَا أَبَدًا رَّضِىَ اللَّهُ عَنْهُمْ وَرَضُوا عَنْهُ ذَلِكَ لِمَنْ خَشِىَ رَبَّهُ

Həqiqətən, iman gətirib saleh əməllər edənlər yaradılmışların ən yaxşılarıdır. Onların“ öz Rəbbi yanındakı mükafatı (ağacları) altından çaylar axan behişt bağlarıdır. Onlar orada əbədi qalacaqlar. Allah onlardan razıdır, onlar da Allahdan. Bu (yüksək məqam) ”!Rəbbindən qorxanlar üçündür

Allah-taala bu iki və ondan qabaqkı ayələrdə ən pis və ən yaxşı məxluqatın kimlər olduğunu açıqlayır. Haqq nurunu söndürmək

---

۱- [۱] . “Əl-mizan”, ۳-cü cild, səh. ۲۳۰, “mübahilə” ayəsinin təfsiri.

۲- [۲] . “Biharul-ənvar”, ۱۰-cu cild, səh. ۳۵۰ (ixtisarla).

istəyən, müxtəlif hiylələrə əl atan, həm özlərini, həm də başqalarını azğınlığa çəkən kafirləri və kitab əhlindən olan müşrikləri “şərrul-bəriyyə” (yaradılmışların ən pisi), bunun müqabilində isə iman nuru sayəsində haqq yolunu seçən, yaxşı əməllər edən, həm özlərini, həm də başqalarını doğru yola çəkənləri “xeyrul-bəriyyə” (yaradılmışların .ən yaxşısı) kimi adlandırır

Göründüyü kimi, ayənin məfhumu daha geniş olub müəyyən bir nəfər, yaxud dəstəyə məxsus olmasa da, şiə və əhli-sünnənin hədis mənbələrində nəql olunan bir çox rəvayətlərə görə, Allahın bəndələri sırasında ən üstün və qabaqda duran şəxs yalnız bir nəfərdir. Bu hədislərin möhtəvasına diqqət yetirdikdə, indiyə qədər bəzilərinə qaranlıq qalan bir çox həqiqətlər aydınlaşır və xəbərsizlərin ittihamlarına tutarlı :cavablar vermək olur. Burada oxucuların diqqətini bu hədislərin bir qisminə yönəldirik

Məşhur təfsir alimi Süyuti “Əd-durrul-mənsur” kitabında bu ayənin təfsirində İbn .۱ Əsakirdən, o da Cabir ibn Abdullahdan belə nəql edir: “Biz Peyğəmbəri-Əkrəm (s)-lə bir yerdə idik. Bu vaxt Əli (ə) bizə tərəf gəlirdi. Peyğəmbər (s)-in gözü ona düşən kimi buyurdu: “Canım əlində olan Allaha and olsun ki, bu kişi və onun şiələri qiyamət günü nicat tapanlardandır!” Bundan sonra “İman gətirib saleh əməllər edənlər yaradılmışların ən yaxşılarıdır!” – ayəsi nazil oldu. Beləliklə, Əli (ə) gələrkən Peyğəmbər ((s)-in səhabələri ona “Yaradılmışların ən yaxşısı gəlir!” – dedilər.”(۱)

(Bu rəvayəti eynilə Hakim Həskani də “Şəvahidut-tənzil” kitabında nəql etmişdir.(۲)

İbn Abbasdan nəql olunan başqa bir rəvayətdə belə buyurulur: “İman gətirib saleh .۲ əməllər edənlər yaradılmışların ən yaxşılarıdır!” – ayəsi nazil olduqdan sonra :Peyğəmbəri-Əkrəm (s) Əliyə (ə) buyurdu

هُوَ اَنْتَ وَشِيعَتُکَ تَأتِی اَنْتَ وَشِيعَتُکَ يَوْمَ الْقِيامَهِ راضِينَ مَرْضِيينَ وَتَأتِی عَدُوُّکَ غَضْباناً مُقْمِحِينَ:

Sən və şiələrin qiyamət günü yaradılmışların ən yaxşılarısınız. Həm Allah sizdən“ (razıdır, həm də siz Allahdan. Sənin düşmənin isə (qiyamətdə

(əzab içərisində olar və boynuna zəncir bağlanar!"(1)

Əbu Bərzədən də belə nəql olunur: "Peyğəmbəri-Əkrəm (s) bu ayəni tilavət edərkən, .3 üzünü Əliyə (ə) tutub buyurdu: "Ya Əli! Yaradılmışların ən yaxşısı sən və şiələrindir. (Mənim və sənin vədən "Kövsər" hovuzunun kənarındadır."(2)

Əd-durrul-mənsur" təfsirində yazılır: "İbn Mərdəveyh, Əlidən (ə) nəql edir ki," .4 Peyğəmbəri-Əkrəm (s) mənə belə buyurdu: "Məgər Allahın "İman gətirib saleh əməllər edənlər yaradılmışların ən yaxşılarıdır!" – kəlamını eşitməmisən? Bunlar sən və şiələrindir. Mənim sizinlə vədə yerimiz (görüşəcək yerimiz) "Kövsər" hovuzunun kənarıdır! Mən ümmətlərdən hesab çəkməyə gəldiyim zaman siz seçilərək alnıaçıq (halda çağırılacaqsınız!"(3)

Yenə "Şəvahidut-tənzil" kitabında Ətiyyə Ovfinin belə dediyi nəql olunur: "Bir dəfə biz .5 Cabir ibn Abdullah Ənsarinin yanına getmişdik. Artıq o vaxt qocalığından qaşları "!gözünün üstünə tökülürdü. Ona dedik: "Bizə Əlidən danış

(O, əli ilə qaşlarını qaldırıb dedi: "O, yaradılmışların ən yaxşısıdır!"(4)

Gənci Şafei "Kifayətut-talib" kitabında Ətadan belə nəql edir: "Ayişədən Əli (ə) haqda .6 (soruşdum. Mənə dedi: "O, bəşərin ən yaxşısıdır və buna yalnız kafirlər şəkk edərlər!"(5)

Yenə həmin kitabda Hüzeyfin belə dediyi nəql olunur: "Peyğəmbəri-Əkrəm (s)-in belə buyurduğunu eşitdim: "Əli insanların ən yaxşısıdır, hər kəs bunu qəbul etməsə, (kafirdir!"(6)

Məlum olduğu üzrə, bütün bu ibarələr İslam Peyğəmbərindən (s) sonra imam Əliyə (ə) .aid olur, yəni o, Peyğəmbər (ə)-dən sonra insanların ən yaxşısıdır

Diqqəti cəlb edən məsələ budur ki, Əlinin (ə) fəzilətləri nəql



---

Yenə orada, hədis: 1126; "Əs-səvaiq", İbn Həcər, səh. 96 və "Nurul-əbsar", . [1] -1 .Şəblənci, səh. 70 və 101

۲- [۲]. “Şəvahidut-tənzil”, ۲-ci cild, səh. ۳۵۹, hədis: ۱۱۳۰.

۳- [۳]. “Əd-durrul-mənsur”, ۶-cı cild, səh. ۳۷۹.

۴- [۴]. “Şəvahidut-tənzil”, ۲-ci cild, səh. ۳۶۴, hədis: ۱۱۴۲.

۵- [۵]. “Kifayətut-talib”, səh. ۱۱۸, “Ehqaqul-həqq” kitabından nəqlən, ۳-cü cild, səh. ۲۸۸.

۶- [۶]. Yenə orada.

olunan hədislərə həmişə şübhə ilə yanaşan əhli-sünnənin məşhur təfsir alimi Alusi bu ayənin təfsiri ilə bağlı Peyğəmbəri-Əkrəm (s)-in buyurduğu hədislərin bir çoxunu nəql etdikdən sonra yazır: “Bu rəvayətlərin məfhum və mənası o deyil ki, bu ayə məhz Əli (ə), onun şiələri və ardıcıllarına aiddir, hərçənd, onlar şəkk-şübhəsiz bu ayəyə daxildir və yaradılmışların ən yaxşılarının önündə dururlar.” Sonra yazır: “İmamiyyə şiələri Əlini (ə) peyğəmbərlər və mələklərdən üstün bilsələr də, Peyğəmbər (s)-i ondan üstün ”!hesab edirlər

Bir sözlə, alimlərin böyük bir qrupu İslamın məşhur mənbələrində “xeyrul-bəriyyə” ayəsi ilə bağlı hədisləri nəql etmişlər ki, bu da Peyğəmbəri-Əkrəm (s)-dən sonra imam Əlinin (ə) bütün müsəlmanlardan və səhabələrdən üstün, fəzilətli olduğuna aydın bir dəlildir. Lakin əməvilərin zülmkar hakimiyyətindən bəri həmişə düşmənlər o həzrətin fəzilətlərini gizlətməyə çalışmış, dostları belə o canilərin qorxusundan heç bir söz deməmişlər. Bununla belə, bu böyük fəzilətlər bütün o qaranlıq, irticaçı dövrləri arxada qoyaraq bizim əlimizə gəlib çatmışdır. Bunu isə ilahi yardım və qeybi imdaddan başqa bir şey adlandırmaq olmaz! Bundan əlavə, bu ayə və hədislərdən iki mühüm məsələ :başa düşülür

Dərəcəsi aşağı olan bir kəsi fəzilətli bir insandan üstün bilmək bəyənilməz bir iş . ١ sayıldığından, imam Əli (ə) fəzilət və üstünlüyünə görə, Peyğəmbəri-Əkrəm (s)-in xəlifəsi və canişinidir; istər xəlifənin (bizim etiqadımıza görə) Allah, istərsə də .(sünnülərin etiqadına görə) xalq tərəfindən seçilməyini qəbul edək

Əksər hədislərdə qeyd olunduğu kimi, imam Əlinin (ə) ardıcıllarının “şiə” . ٢ adlandırılması Peyğəmbəri-Əkrəm (s)-in dilindən götürülmüşdür. Bu ada belə düşmən olanlar, ona nifrət bəsləyənlər və onun “ş” hərfini “şər” sözü kimi tərcümə edənlər həqiqətdə İslam Peyğəmbəri (s) ilə müxalifdirlər və o həzrətin kəlamlarına nifrət bəsləyirlər. Əgər doğrudan da onlar belə ittihamları agahlıq üzündən və bilə-bilə dillərinə gətirirsə, onların işləri çətin olacaqdır! Elə yaxşı olar ki, biz deyək, onların bu .hədislərdən xəbərləri yoxdur

Bəli, “şiə” ləqəbi nifrət doğurmur, əksinə çoxlu mötəbər rəvayətdə qeyd olunduğu (kimi, İslam Peyğəmbərinin (s) Əlinin (ə

ardıcıllarına qoyduğu iftixar tacıdır. Allahdan arzumuz budur ki, hamımız bu iftixara !layiq olaq

### LEYLƏTÜL–MƏBİT” AYƏSİ”–۳

:Bəqərə” surəsinin ۲۰۷-ci ayəsində buyurulur“

وَمِنَ النَّاسِ مَن يَشْرِى نَفْسَهُ ابْتِغَاء مَرْضَاتِ اللّهِ وَاللّهُ رَؤُوفٌ بِالْعِبَادِ

İnsanlardan bəzisi Allahın razılığını qazanmaq yolunda öz canını fəda edər. Allah Öz“ ”!bəndələrinə qarşı çox mehribandır

Bu ayənin nazil olması haqda İslamın məşhur mənbələrində çoxlu rəvayət nəql :olunmuşdur. O cümlədən

Əhli-sünnənin məşhur təfsir alimlərindən olanSələbi öz təfsir kitabında bu ayənin .۱ nazil olma səbəbini belə nəql edir: “Peyğəmbəri-Əkrəm (s) Mədinəyə hicrəti zamanı Əli ibn Əbi Talibi (ə) camaata olan əmanətlərini qaytarmaq üçün Məkkədə qoymalı oldu. Özü isə gecə yola düşmək istəyərkən, müşriklər tərəfindən evin mühasirəyə alındığını gördü, Əliyə (ə) onun öz yerində yatmağını göstəriş verib buyurdu: “Mənim yaşıl rəngli örtüyümü üstünə atıb, mənim yerimdə yatarsan. Allahın köməyi ilə sənə heç bir zərər .dəyməyəcəkdir!” Əli (ə) də o həzrətin göstərişinə əməl etdi

Bu zaman Allah-taala Cəbrail və Mikailə vəhy etdi ki, mən sizin aranızda qardaşlıq peymanı bağladım və ikinizdən birinizin ömrünü uzatdım. İndi sizin hansı biriniz digərin uzun ömürlü olmasını istəyir? Onların hər biri bunu özü üçün istədikdə, Allah-taala buyurdu: “Nə üçün siz Əli ibn Əbi Talib kimi deyilsiniz? Mən onunla Mühəmməd arasında qardaşlıq peymanı bağladım. O, Peyğəmbərin yatağında yatdı və onun canını öz canından üstün bildi. Yerə enin və onu düşmənlərdən qoruyun!” Onlar yerə endilər və Cəbrail, Əlinin başı üstə, Mikail isə ayaq tərəfində durdu. Cəbrail dedi: “Afərin, afərin! Ya Əli, kim sənin kimi ola bilər?! Allah-taala mələklərin yanında səninlə fəxr ”!edir

Peyğəmbər (s) Mədinəyə tərəf yola düşdüyü zaman bu ayə nazil oldu: “İnsanlardan bəzisi Allahın razılığını qazanmaq yolunda öz canını fəda edər. Allah öz bəndələrinə

cü cild, səh. ۲۳۷), Gənci “Kifayətut-talib” (səh. ۱۱۴), İbn Səbbağ Maliki “Əl-füsulul--۳) muhimmə” (səh. ۳۳), Sibt ibn Covzi Hənəfi “Təzkirətul-xəvass” (səh. ۲۱), Şəblənci (“Nurul-əbsar” (səh. ۸۲) kitablarında nəql etmişlər.(۱

Bu rəvayəti Həskani “Şəvahidut-tənzil” kitabında azacıq fərqlə Hakim Əbu Səid . ۲ (Xudridən nəql etmişdir.(۲

Yenə həmin kitabda İbn Abbasdan belə nəql olunur: “Əli (ə) Xədicədən (ə.s) sonra .۳ Peyğəmbər (s)-ə iman gətirən, onun libasını geyinən və yatağında yatan birinci (şəxsdir...” (Burada həmin ayəyə işarə edilmişdir!)(۳

Yenə həmin kitabda Abdullah ibn Süleymandan (başqa bir nüsxədə Abdullah ibn . ۴ Abbasdan) belə nəql olunur: Peyğəmbər (s) mağaraya doğru getdiyi zaman gecə Əlini (ə) öz yatağında yatırtdı, özü isə Əbu Bəkrin ardınca getdi. Qüreyşlilər Əliyə (ə) baxır və elə güman edirdilər ki, Peyğəmbərdir. Sübh açıldıqda, birdən gördülər ki, o Əlidir. Ondan “Mühəmməd haradadır?” – deyə soruşduqda, dedi: “Mənim xəbərim yoxdur!” Dedilər: “Nahaq təəccüblənmədik ki, sənə tərəf daş atdıqda, o tərəf–bu tərəfə çevrildin, halbuki Mühəmmədə tərəf daş atdıqda, o yerindən tərpənməzdi. “İnsanlardan bəzisi Allahın razılığını qazanmaq yolunda öz canını fəda edər. Allah öz (bəndələrinə qarşı çox mehribandır!” – ayəsi bu hadisə ilə bağlı nazil olmuşdur.”(۴

Hakim Nişapuri “Müstədrəküs-səhiheyn” adlı məşhur kitabında İbn Abbasdan belə .۵ nəql edir: “Əli (ə) Allah yolunda öz canını qurban etdi – Peyğəmbər (s)-in libasını geyinib, onun yerində yatdı...” Hədisin sonunda isə belə yazır: “Bu hədis mötəbərdir, (hərçənd, onu Buxari və Müslüm öz kitablarında nəql etməmişlər!”(۵

Yenə həmin kitabda Həkim ibn Cübeyr, o da imam Zeyənlabidin (ə)-dan belə nəql .۶ edir: “Allahın razılığı yolunda canını



---

.Əl-qədir”, ۲-ci cild, səh. ۴۸“ . [۱] -۱

.Şəvahidut-tənzil”, ۱-ci cild, səh. ۱۹۶, hədis: ۱۳۳“ . [۲] -۲

.Yenə orada, səh. ۹۸ . [۳] -۳

Allah yolunda fəda edən birinci şəxs Əli ibn Əbi Talibdir.”[1]

Sonra yazır: “Əli (ə) Peyğəmbəri-Əkrəm (s)-in yerində yatanda, bu şeri zümzümə edirdi:

Vəqəytu binəfsi xəyrə mən vətəəl-həsa,

Və mən tafə bil-bəytil-ətiqi və bil-hicri

Rəsulillahi xafə ən yəmkuru bihi,

Fənəccahu zut-təvlil-ilahi minəl-məkri,

Və batə Rəsulullahi fil-ğari aminən,

Muvəqqəən və fi hifzil-ilahi və fi sətri,

Və bittu iraihim və ləm yəthəmunəni,

Və qəd vətəntu nəfsi ələl-qətli vəl-əsri.

“Mən canımla Yer üzünə qədəm qoyan ən əfzəl insanı – Kəbə evini və Həcərül-əsvədi təvaf edən kəsi qorudum.

O, Allahın Rəsulu idi ki, düşmənlərin məkr və hiyləsindən qorxsa da, qüdrətli Allah onların məkrindən onu xilas etdi.

Allahın Rəsulu (s) mağarada əmin-amanlıqda – Allahın sayəsinə bürünmüşkən, mən isə onları (düşmənləri) gözləyirdim.

Onlar mənim Peyğəmbər (s)-in yerində yatmağımı güman etmirdilər, bir halda ki, ölüm və əsirliyə hazır idim.”[2]

İmam Əlinin (ə) iman və fədakarlığını göstərən bu şer digər kitablarda da nəql olunmuşdur.

٧. Məşhur tarixçi Təbəri Peyğəmbəri-Əkrəm (s)-in hicrəti ilə əlaqədar belə yazır: “Əli (ə) Peyğəmbər (s)-in yerində yatmışdı, düşmənlər isə pusquda durub Peyğəmbər (s)-ə

hücum çəkməyi gözləyir və onu öz yatağında uzandığını görüb deyirdilər: “And olsun ki, o, Mühəmməddir!” Nəhayət, sübh açıldı və Əli (ə) Peyğəmbər (s)-in yatağından qalxdı.” (Təbəri bu rəvayəti Peyğəmbər (s)-in hicrəti ilə bağlı “Ənfal” surəsinin “(Ya Mühəmməd!) Yadına sal ki, bir zaman kafirlər səni həbs etmək və ya öldürmək, yaxud da (Məkkədən) çıxarıb qovmaq üçün sənə qarşı hiylə qurmuşdular. Allah



---

.Yenə orada . [١] -١

.Müstədrəküs-səhiheyn”, ٣-cü cild, səh. ۴“ . [٢] -٢

(.da tədbir tökdü...”(۱) – ayəsinin təfsirində yazmışdır

۸. İbn Əsir “Usdul-ğabə” kitabında imam Əlinin (ə) fəziləti haqda yazır: “Peyğəmbəri-Əkrəm (s) hicrət etmək istədikdə, əmanətlərini camaata qaytarmaq üçün Əlini (ə) Məkkədə qoydu və elə həmin gecə Məkkədən mağaraya doğru yola düşdü, halbuki müşriklər onun evini mühasirəyə almışdılar. O, Əliyə (ə) göstəriş verdi ki, onun yerində yatıb, yorğanını üstünə atsın.” Sonra o, “Leylətül-məbit” əhvalatını və Allah-taalanın Cəbrail və Mikailə vəhyini nəql edərək yazır: “Peyğəmbər (s) Mədinəyə hərəkət etdiyi zaman Allah-taala bu ayəni ona nazil etdi: “İnsanlardan bəzisi Allahın razılığını qazanmaq üçün öz canını fəda edər. Allah Öz bəndələrinə qarşı çox mehribandır!”

۹. Əhli-sünnənin dörd imamından biri olan Əhməd ibn Hənbəl məşhur “Müsnəd” kitabında İbn Abbasdan “(Ya Mühəmməd!) Yadına sal ki, bir zaman kafirlər səni həbs etmək və ya öldürmək, yaxud da (Məkkədən) çıxarıb qovmaq (sürgün etmək) üçün sənə qarşı hiylə qurmuşdular. Allah da tədbir gördü və Allah tədbirlilərin ən yaxşısıdır!”(۲) – ayəsinin təfsirində belə nəql edir: “Qüreyşlilər Məkkədə bir-birlərilə məsləhətləşib, bəziləri “Onu öldürün!”, bəziləri isə “Onu sürgün edin!” – dedikləri zaman Allah-taala Peyğəmbəri bu hadisədən xəbərdar etdi. Bu zaman Əli (ə) Peyğəmbər (s)-in yatağında yatdı... (və Peyğəmbər (s) Məkkədən çıxdı.)”(۳)

Əhməd ibn Hənbəl bu rəvayəti “İnsanlardan bəzisi Allahın razılığını qazanmaq üçün öz canını fəda edər. Allah öz bəndələrinə qarşı çox mehribandır!” – ayəsinin təfsirində deyil, “Leylətül-məbit” ayəsi ilə əlaqədar nazil olan “Ənfal” surəsinin ۳۰-cu ayəsinin təfsirində nəql etmişdir.

“Leylətül-məbit” hadisəsi ilə bağlı rəvayətlər bunlarla bitmir, hətta digər məşhur mənbələrdə də çoxlu rəvayət nəql olunmuşdur ki, əlavə məlumat əldə etmək istəyənlər “Ehqaqul-həqq”(۴), “Şəvahidut-



---

۱- [۱]. “Ənfal” surəsi, ayə: ۳۰.

۲- [۲]. “Ənfal” surəsi, ayə: ۳۰.

۳- [۳]. “Müsnədi-Əhməd”, ۱-ci cild, səh. ۳۴۷. (Beyrutun “Darus-sadiq” çapı.)

Ehqaqul-həqq”, ۳-cü cild, səh. ۲۳-۴۵, ۶-cı cild, səh. ۴۷۹-۴۸۱, ۸-ci cild, səh. ۳۳۵-۳۴۸“ . [۴] -۴
.və ۱۴-cü cild, səh. ۱۱۶-۱۳۰

.tənzil”,(۱) “Fəzailul-xəmsə”,(۲) “Əl-qədir”(۳) və “Burhan”(۴) kitablarına müraciət etsinlər

## HİKMƏT” AYƏSİ”-۴

:Bəqərə” surəsinin ۲۶۹-cu ayəsində buyurulur“

يُؤتِى الْحِكْمَةَ مَن يَشَاء وَمَن يُؤْتَ الْحِكْمَةَ فَقَدْ أُوتِىَ خَيْرًا كَثِيرًا

Allah hikməti (elmi) istədiyi (və layiq gördüyü) şəxsə bəxş edər. Hər kimə də hikmət“ ”.bəxş edilmişsə, ona çoxlu xeyir verilmişdir

Hakim Həskani “Şəvahidut-tənzil” kitabında Rəbi ibn Xeysəmdən belə nəql edir: “Elə bir kəs görmədim ki, Əlinin hökm və qəzavətinə irad tuta bilsin. Həqiqətən, Allah-taala buyurur: “Allah hikməti (elmi) istədiyi (və layiq gördüyü) şəxsə bəxş edər. Hər kimə (hikmət bəxş edilmişsə, ona çoxlu xeyir verilmişdir.”(۵

Həmin kitabda bu məzmunda əlavə rəvayətlər nəql olunmuşdur ki, o cümlədən, İbn :Abbas Peyğəmbəri-Əkrəm (s)-in belə buyurduğunu demişdir

مَنْ اَرادَ اَنْ يَنْظُرَ اِلى اِبْراهِيمَ فِى حُكْمِهِ وَالى نُوحٍ فِى حِكْمَتِهِ وَالى يُوسُفَ فِى اِجْتِماعِهِ فَلْيَنْظُر اِلى عَلِيِّ بْنِ اَبِى طالِبٍ:

Hər kəs İbrahimin helmini, Nuhun hikmətini və Yusifin insanpərvərliyini görmək“ (istəyirsə, Əli ibn Əbi Talibə baxsın!”(۶

Başqa bir yerdə isə Əbil-Həmradan belə nəql edir: “Biz Peyğəmbər (s)-in yanında idik :və Əli (ə) bizə tərəf gəlirdi. Bu vaxt Peyğəmbər (s) buyurdu

مَنْ سَرَّهُ اَنْ يَنْظُرَ اِلى آدَمَ فِى عِلْمِهِ وَ نُوحٍ فِى فَهْمِهِ وَ اِبْراهِيمَ فِى خُلَّتِهِ فَلْيَنْظُرْ اِلى عَلِيِّ بْنِ اَبِى طالِبٍ:

Hər kəs Adəmin elmini, Nuhun düşüncəsini və İbrahimiin Allahla dostluğunu müşahidə“ (edib sevinmək istəyirsə, Əli ibn Əbi Talibə baxsın!”(۷

Yenə orada Abdullah ibn Abbadan belə nəql olunur: “Biz Peyğəmbər (s)-in yanında idik :və o həzrətdən Əlinin (ə) haqqında soruşulduqda, buyurdu

۱- [۱] . “Şəvahidut-tənzil”, ۱-ci cild, səh. ۹۶-۹۷.

۲- [۲] . “Fəzailul-xəmsə”, ۲-ci cild, səh. ۳۴۵-۳۴۶.

۳- [۳] . “Əl-qədir”, ۲-ci cild, səh. ۴۹-۵۰.

۴- [۴] . “Burhan” təfsiri, ۱-ci cild, səh. ۲۰۶-۲۰۷.

۵- [۵] . “Şəvahidut-tənzil”, ۱-ci cild, səh. ۱۰۷, hədis: ۱۵۰.

۶- [۶] . Yenə orada, ۱-ci cild, səh. ۱۰۶, hədis: ۱۴۷.

۷- [۷] . “Şəvahidut-tənzil”, ۱-ci cild, səh. ۷۹, hədis: ۱۱۶.

قُسِّمَتِ الْحِكْمَهُ عَشَرَه اَجزاءَ فَاُعْطِی عَلی تِسْعَهُ اَجْزاءَ وَ اُعْطِی النّاسُ جُزءً واحِداً:

(Elm və hikmət on qismdir ki, onun doqquzu Əliyə, biri isə camaata verilmişdir!”(١“

Bu rəvayətlər açıq-aydın göstərir ki, Peyğəmbəri-Əkrəm (s)-dən sonra İslam ümməti arasında elm, bilik və hikmətdə Əliyə (ə) çatan bir kəs yoxdur. İmamətin əsas və mühüm şərti elm və hikmət olduğundan, İslam Peyğəmbərindən (s) sonra imamət və .(xilafət məqamına ən layiq şəxs yalnız Əlidir (ə

:Termizinin “Səhih” kitabında Peyğəmbəri-Əkrəm (s)-in belə buyurduğu nəql olunur

اَنَا دارُ الْحِكْمَهِ وَ عَلِیٌّ بابُها:

(Mən hikmət eviyəm, Əli isə onun qapısıdır!”(٢“

Şübhəsiz, kim bir evə girmək istəsə, mütləq onun qapısından daxil olmalıdır; necə ki, Qurani-Kərimdə buyurulur: “Evlərə qapılarından daxil olun!” Beləliklə, hər kim İslam Peyğəmbərinin (s) elm və hikmət xəzinəsinə yol tapmaq istəyirsə, mütləq imam Əlidən .(ə) başlamalı və bu xəzinənin açarını ondan almalıdır

### HƏL-ƏTA” (İNSAN) SURƏSİ”-٥

#### İşarə

İmam Əli (ə) və Əhli-beytin fəzilətlərini sübut edən mühüm sənədlərdən biri də “Həl-əta” surəsidir. Bu surənin möhtəvasına, ibarələrinə, eləcə də nazil olma səbəbinə diqqət yetirdikdə, bir çox həqiqətlər üzə çıxacaq. Əlbəttə, bu surənin ayələri ümumilik kəsb etsə də, onun “İnnəl-əbrarə yəşrəbunə min kəsin...” (Şübhəsiz, yaxşı əməl və itaət sahibləri kafur qatılmış şərbət içəcəklər...) – ayəsindən başlayaraq ٢٢-ci ayəsinə qədər (on yeddi ayə) “əbrar” (yaxşılar) adlı qrup haqda söz açır. İslamın məşhur mənbələrində nəql olunan çoxlu rəvayətə və bu ayənin nazil olma səbəbinə əsasən, “əbrar”ın tam mənadakı nümunələri Əli (ə), Fatimeyi-Zəhra (ə.s), Həsən (ə) və Hüseyndir (ə). Diqqət yetirmək lazımdır ki, bu on yeddi ayədə behiştin ən üstün maddi ,və mənəvi nemətlərinin – cənnət bağları

١- [١]. Yenə orada, səh. ١٠٥, hədis: ١۴۶.

٢- [٢]. "Səhihi-Termizi", ۵-ci cild, səh. ۶٣٧ ("Mənaqib" kitabı, "Əli ibn Əbi Talibin (ə) fəzilətləri" bölümü, hədis: ٣٧٢٣).

pak şərbət çeşmələri, geyimlər, zinətlər, yeməklər, taxtlar, xidmətçilər və sairənin adı çəkilsə də, digər nemətlərdən sayılan behiştin qadın və hurilərindən söz açılmamışdır. Quranın sirlərindən agah olan bəzilərinin nəzərinə görə, bunun səbəbi aləmlərin ən üstün qadını Fatimeyi-Zəhranın (ə.s) ehtiramına xatir olmuşdur. Qurani-Kərimin çox az surəsində behiştin bu yüksək nemətləri birgə qeyd olunmuşdur. Bu da onu göstərir ki, ayədə qeyd olunan "əbrar" (yaxşı əməl sahibləri) sözündən məqsəd adi şəxslər deyil, .Allaha yaxın olan pak, yaxşı və alicənab kəslərdir

Bunu da qeyd edək ki, yaxşı əməl sahiblərinin nişanələrini göstərən bu surənin ۵-۱۰-cu :ayələrində belə buyurulur

إِنَّ الْأَبْرَارَ يَشْرَبُونَ مِن كَأْسٍ كَانَ مِزَاجُهَا كَافُورًا عَيْنًا يَشْرَبُ بِهَا عِبَادُ اللَّهِ يُفَجِّرُونَهَا تَفْجِيرًا يُوفُونَ بِالنَّذْرِ وَيَخَافُونَ يَوْمًا كَانَ شَرُّهُ مُسْتَطِيرًا وَيُطْعِمُونَ الطَّعَامَ عَلَى حُبِّهِ مِسْكِينًا وَيَتِيمًا وَأَسِيرًا إِنَّمَا نُطْعِمُكُمْ لِوَجْهِ اللَّهِ لَا نُرِيدُ مِنكُمْ جَزَاء وَلَا شُكُورًا إِنَّا نَخَافُ مِن رَّبِّنَا يَوْمًا عَبُوسًا قَمْطَرِيرًا

Şübhəsiz, ki, yaxşı əməl və itaət sahibləri kafur qatılmış şərab içəcəklər. O (kafur) elə" bir çeşmədir ki, Allahın bəndələri ondan içəcək və onu istədikləri yerə asanlıqla axıdacaqlar. Onlar elə kəslərdir ki, etdikləri nəzrə vafa edər və əzabı bürüyəcək gündən qorxarlar. Onlar öz iştahaları çəkdiyi, özləri yemək istədikləri (yeməyə möhtac olduqları) halda (və ya Allahın razılığını qazanmaq uğrunda) yeməyi yoxsula, yetimə və əsirə yedirərlər. (Və sonra da yedirtdikləri kimsələrə belə deyərlər:) "Biz sizi yalnız Allah razılığından ötrü yedirdir və sizdən nə bir mükafat, nə də təşəkkür istəyirik. "!Həqiqətən, biz çox sərt və çətin bir gündə Rəbbimizdən qorxuruq

Bu ayələrin nazil olma səbəbi haqda Zəməxşəri məşhur "Kəşşaf" təfsirində İbn Abbasdan belə nəql edir: "Bir gün Həsən və Hüseyn (ə) xəstələnmişdi. Peyğəmbər (s) bir qrup səhabə ilə onlara baş çəkməyə gəldi. Səhabələr Əliyə (ə) müracət edərək dedilər: "Ya Əbəl-Həsən! Nə yaxşı olardı ki, uşaqlarının şəfa tapması üçün nəzir edəsən." Əli (ə) bu təklifi məmuniyyətlə qəbul edib, üstəlik Fatimeyi-Zəhra (ə.s), xidmətçisi Fizzə də uşaqların sağalacağı təqdirdə üç gün oruc tutmağı nəzir etdilər. (Bəzi rəvayətlərə əsasən, Həsən və Hüseyn (ə) də nəzir etdilər.(۱)) Nəhayət, uşaqlar şəfa tapıb sağaldılar. Lakin o

ərəfələrdə Əlinin (ə) evində iftar üçün ərzaq yox idi. Odur ki, gedib bir nəfərdən üç "sa" (təxminən ١٠ kq) arpa borc aldı. Fatimə (ə.s) onun üçdə bir hissəsini üyüdüb un etdi və ailə üzvlərinin sayı qədər – beş ədəd çörək bişirdi. İftar vaxtı çörəkləri süfrəyə qoyub yeməyə hazırlaşdıqda, bir yoxsul qapını döyərək evdəkiləri belə səslədi: "Salam olsun sizə, ey Mühəmmədin Əhli-beyti! Mən bir müsəlman yoxsulam, mənə də yeməyə bir şey verin. Allah sizə cənnət süfrələrini qismət etsin!" Bu sözləri eşidən Əhli-beyt (ə) heç nəyi fikirləşmədən süfrədə olan çörəklərin hamısını ona verdilər, özləri isə su ilə iftar edib gecəni belə keçirdilər. Sabah yenə ac halda oruc tutdular. Ötən gün kimi, Fatimeyi-Zəhra (ə.s) yenə çörək bişirdi. Onlar axşam iftar üçün süfrə başına əyləşərkən, yenə bir yetim qapıya gəlib yemək istədi. Onlar bu dəfə süfrədəkiləri o yetimə verib, özləri ac qaldılar. Üçüncü axşam da qapıya bir əsir gəlib yemək istədikdə, bu müqəddəs şəxslər iftara hazırladıqlarını ona verdilər. Ertəsi gün Əli (ə) oğulları Həsən və Hüseyn (ə) ilə birlikdə Peyğəmbər (s)-in hüzuruna getmişdi. Peyğəmbər (s) onların aclıqdan titrədiklərini görüb buyurdu: "Sizi bu halda görmək mənə çox ağırdır!" Sonra onlarla birlikdə Fatimənin (ə.s) evinə getdi. Peyğəmbər (s) gördü ki, qazı Fatimə (ə.s) acından zəifləmiş və gözləri çuxura düşdüyü halda, mehrabda ibadət edir. Bu mənzərə Peyğəmbərə (s) çox təsir etdi. Bu zaman Cəbrail nazil olub dedi: "Ey Mühəmməd! Allah səni belə bir Əhli-beytin olduğuna görə təbrik edir." Sonra "Həl-əta" surəsi nazil oldu."(١)

Bu rəvayəti Qurtubi öz təfsir kitabında azacıq fərqlə nəql etmiş və bu haqda bir şer də qeyd etmişdir.(٢)

Fəxri-Razi də bu rəvayəti "Əl-vəsit" kitabında Vahididən nəql etmişdir. Həm o, həm də Zəməxşəri bu rəvayəti qeyd etdikdən sonra belə yazmışlar: "Şübhəsiz, yaxşı əməl və itaət sahibləri kafur qatılmış şərab içəcəklər..." – ayəsindəki əvəzliklər cəm formasında işləndiyi üçün bir nəfərə (Əliyə (ə)) deyil, bütün yaxşı əməl və itaət sahiblərinə



---

١-[١]. "Kəşşaf" təfsiri, ٤-cü cild, səh. ٦٧٠.

٢-[٢]. "Təfsiri-Qurtubi", ١٠-cu cild, səh. ٦٩٢٢.

aiddir. Əlbəttə, Əlini (ə) bu ayələrdən ayrı bilmək olmaz, lakin bunlar təkcə ona aid deyildir... (Ayələrin nazil olma səbəbini açıqlayan rəvayətlərə gəldikdə isə) deməliyik ki, bu surə Əlinin (ə) itaəti haqda nazil olsa da, "üsuli-fiqh" elminin qaydalarına əsasən, (ayələrdəki meyar xüsusi deyil, ümumilik daşıyır."(١)

Fəxri-Razi guya, cəm formasında deyilən ayələrin təkcə imam Əliyə (ə) yox, həm də .Fatimeyi-Zəhra, Həsən, Hüseyn (ə) və Fizzəyə aid olduğunu unutmuşdur

Axı, ayələrin məfhumunu ümumiləşdirməklə onların nazil olma səbəbini aradan aparmaq olmaz, əksinə belə yerlərdə ayələr birbaşa Əhli-beyt (ə) (və yaxud hər kim) tərəfindən yerinə yetirilən itaət və fədakarlıqla əlaqədar nazil olur və bu da onların Allah tərəfindən qiymətləndirilməsi deməkdir. Başqa sözlə desək, imam Əli (ə) və onun ailəsi bu ayələrin xaricdəki ən kamil nümunələridir. Çünki bu ayələr onların xalis əməli ilə bağlı nazil olmuşdur. Əgər kimsə bu böyük fəziləti inkar etmək istəyirsə, sözsüz, .özünü aldadır

Alusi "Ruhul-məani" kitabında bu rəvayəti əvvəldən axıra qədər olduğu kimi İbn Abbasdan nəql etdikdən sonra belə yazır: "Bu rəvayət camaat arasında məşhurdur." Sonra adəti üzrə onu əhəmiyyətsiz qələmə verməyə çalışır və bu məqsədlə onun sənədləri haqda söz açaraq yazır: "Bu ayələrin Əli, Fatimə, Həsən və Hüseyn (ə) haqda nazil olma ehtimalı olsa da, onun isbat, yaxud inkarı qəti deyildir. Çünki bu zəmində olan rəvayətlər çox və ziddiyyətlidir. Hətta bu ayələrin onların barəsində nazil olmadığını desək belə, yenə onların yüksək məqamından bir şey azalmır. Çünki onların "əbrar"ın (yaxşı əməl və itaət sahiblərinin) üzvləri olmaları çox aydındır, bəlkə də bu cərgədə başqalarından öndədirlər. Onların şəni ilə bağlı bunu demək olar ki, Əli (ə) möminlərin vəlisi və Peyğəmbər (s)-in canişini, Fatimeyi-Zəhra (ə.s) Peyğəmbər (s)-in canının bir parası, Həsən və Hüseyn (ə) isə Peyğəmbər (s)-in ruhu və reyhanı, behişt cavanlarının rəhbəridirlər. Bunun mənası isə başqalarını bütünlüklə tərk etmək (deyildir!"(٢)



---

.Əl-vəsit", ٣-cü cild, səh. ٢۴۴" . [١] -١

Deməli, belə misilsiz fəziləti görməməzliyə vurmaq, digər fəzilətlərin də yavaş-yavaş belə bir taleyə düçar olacağı və bir gün Əli, Fatimeyi-Zəhra, Həsən və Hüseynin (ə) bütün fəzilətlərinin, onların başqalarından üstünlüyünün unudulacağı şübhəsizdir. Axı, nə üçün təfsir və hədis alimlərinin nəql etdiyi bu məşhur rəvayətə etinasız yanaşmalı, !?o ilahi şəxsiyyətlərin irsini üzümüzə bağlamalıyıq

Məşhur sünnü alimi Süyuti də “Əd-durrul-mənsur” kitabında İbn Mərdəveyhdən, o da İbn Abbasdan belə nəql edir: “Onlar öz iştahaları çəkdiyi (və möhtac olduğu), özləri yemək istədikləri halda, onu yoxsula, yetimə və əsirə yedirirlər!” – ayəsi Əli, Fatimə, .Həsən və Hüseyn (ə) barəsində nazil olmuşdur

Eləcə də Şəblənci “Nurul-əbsar” kitabında bəhs etdiyimiz ayələrin nazil olma səbəbilə (əlaqədar bu rəvayəti olduğu kimi qeyd etmişdir.(۱

### HƏL–ƏTA” SURƏSİ ŞER ƏDƏBİYYATINDA“

Həl-əta” surəsinin Əhli-beyt (ə) barəsində nazil olması o qədər aydın imiş ki, bir çox“ məşhur şairlər öz şerlərində ona toxunmuşlar. O cümlədən, müxtəlif kitablarda nəql olunan “şafei məzhəbi”nin imam və rəhbəri Məhəmməd ibn İdris Şafenin bu misraları :məşhurdur

?İla mə, ila mə, və hətta məta

!Uatəbu fi hubbi hazəl-fəta

?Və həl zuvvicət Fatimu ğəyrəhu

?Və fi ğəyrihi “Həl-əta”, həl-əta

***

?Haçana qədər, haçana qədər, haçana qədər“

!Danlanmağım o mərdi sevdiyim üçün bəsdi, yetər

!?Məgər ondan başqasını Fatimə heç seçdimi ər

(Allah Özü ondan ötrü "Həl-əta"nı endirər!"(٢

Hicri qəməri tarixi ilə ٦-cı əsrin alimlərindən olan İbn Bitriq "Umdətu-üyuni sihahil-əxbar" kitabında Əbu İshaq Sələbinin təfsir kitabından bir şer nəql edir ki, onun bir :misrası belədir

,Ənə movla li-fəta



---

.Nurul-əbsar", səh. ٦٢" . [١] -١

Ehqaqul-həqq", ٣-cü cild, səh. ١٥٨ və "Əliyyun fil-kitabı vəs-sünnə", ١-ci cild, səh." . [٢] -٢ .٤٤٧

!"Unzilə fihi "Həl-əta

(Mən o comərd şəxsin quluyam ki, "Həl-əta" surəsi onun haqqında nazil olmuşdur!"(١"

Məhəmməd ibn Təlhə Şafei (٧-ci əsrin alimi) "Mətalibus-sual" kitabında Peyğəmbər :(s)-in Əhli-beyti (ə) barəsində belə bir şer söyləmişdir

,Humul-urvətul-vusqa li-motəsimin biha

,Mənaqibuhum caət bi-vəhiyin və inzali

"Mənaqibu fiş-Şura və surətu "Həl-əta

.Və fi surətil-"Əhzab"i yərifuhət-tali

Onlar yapışmaq və sarılmaq istəyənlər üçün "ürvətül-vüsqa"dırlar (möhkəm" dayaqlardırlar). Onların fəzilətləri Quran və vəhydə – "Şura" və "Həl-əta" surələrində deyilmiş, "Əhzab" surəsində gəlmişdir ki, (Quranı) tilavət edən hər kəs bunu yaxşı (bilir."(٢

Əhli-beytin "Şura" surəsindəki fəzilətləri dedikdə, "qurba" ayəsi nəzərdə tutulur. "(Ya Peyğəmbər!) De ki, mən sizdən risalətim və peyğəmbərliyim müqabilində ən yaxın (adamlarımı sevməkdən başqa bir mükafat istəmirəm!"(٣

Əhzab" surəsindəki fəziləti isə "Təthir" ayəsi ilə bağlıdır: "Həqiqətən, Allah siz Əhli-" (beytdən hər bir çirkinliyi uzaqlaşdırıb, sizi pak-pakizə etmək istəyir!"(٤

Bu zəmində Əbul-Qarat ibn Rəzikin "Təlaye" kitabında daha çox şerlər nəql (olunmuşdur.(٥

### HƏL-ƏTA" SURƏSİ VƏ İRADLAR"

Əhli-sünnənin tarix, hədis və təfsir kitabları ilə tanış olanlar yaxşı bilirlər ki, hər vaxt Əli ibn Əbi Talibin (ə) və Peyğəmbər (s)-in Əhli-beytinin (s) fəzilətlərindən söz açıldıqda, bəzi təəssübkeş alimlər müxtəlif bəhanələrlə hər bir hədisin məzmunu və sənədinə irad tutmağa başlamış, onu qiymətdən salmağa çalışmışlar. Bu yersiz

---

۱- [۱] . “Umdətu-üyuni sihahis-sittə”, səh. ۳۴۴, “Camiətul-mudərrisin” çapı.

۲- [۲] . “Mətalibus-sual”, səh. ۸. (“Əl-qədir” kitabından nəqlən, ۳-cü cild, səh. ۱۰۹.)

۳- [۳] . “Şura” surəsi, ayə: ۲۳.

۴- [۴] . “Əhzab” surəsi, ayə: ۳۳.

۵- [۵] . Bax: “Əliyyun fil-kitabi vəs-sünnə”, ۱-ci cild, səh. ۴۴۷.

iradlar göstərir ki, sanki onlar bu fəzilətləri inkar etmək üçün möhkəm əhd-peyman .bağlamışlar

Ruhul-məani", "Əl-mənar" və "Kəbir" (Fəxri-Razi) kitablarını mütaliə etdikdə, görürük" ki, Əhli-beytin (ə) fəzilətlərini göstərən hədislər ya tam mənada qəbul edilməmiş, ya da çoxlu iradlara məruz qalmışdır. Bunlar isə doğrudan da adamı heyrətə gətirir! Çünki buna əks olaraq çox zəif hədislərdə bəzilərinin "fəzilətləri" gözübağlı qəbul edilir. Bununla belə, Əhli-beytin fəzilətləri bir çox rəvayətlərdə onların irad və tənqid .qılınclarından amanda qalmışdır. Bunu başa düşmək isə elə də çətin deyildir

Burada "Həl-əta" surəsinin nazil olmasına tutulan iradların mühüm bir hissəsini :cavablandırmağı lazım görürük

Həl-əta" surəsi Mədinədə Həsən və Hüseynin (ə) təvəllüdündən sonra nazil olduğu" .١ təqdirdə, bu fəzilətin Əhli-beytə aid olduğunu doğru hesab edə bilərik. (Məşhur nəzərə görə, imam Həsən (ə) hicrətin ٣-cü, imam Hüseyn (ə) isə hicrətin ۴-cü ilində dünyaya gəlmişdir.) Halbuki bir çox alimlərin nəzərinə görə, bu surə Məkkədə nazil olmuşdur. !Buna əsasən, onun Əhli-beytin (ə) barəsində nazil olması şübhəlidir

Cavab: Əhli-sünnə alimi Qurtubinin yazdığı kimi, məşhur alimlərin nəzərinə əsasən, bu surə Mədinədə nazil olmuşdur.(١) Hakim Həskani isə bu surənin "Ər-rəhman" və ."Təlaq" surələrindən sonra Məkkədə nazil olduğunu söyləmişdir

Diqqət yetirmək lazımdır ki, adları çəkilən alimlər bu zəmində səkkiz rəvayət nəql etmişlər ki, onların hamısı "Həl-əta" surəsinin Mədinədə nazil olduğunu demişlər. Bu rəvayətlərin bəzisi İbn Abbasdan, bəzisi Əkrəmədən, bəzisi də başqalarından nəql .olunmuşdur

Hakim Həskani qeydlərinin əsnasında belə yazır: "Əhli-beytin düşmənlərindən bəziləri ("Həl-əta" surəsinin nazil olma səbəbinə) etiraz edərək demişlər ki, bütün təfsir alimlərinin yekdil nəzərinə görə, bu surə Məkkədə nazil olmuşdur, halbuki Əhli-beyt (ə) ".barəsində nəql olunan əhvalat isə Mədinədə baş vermişdir

Sonra ardınca yazır: "Bu şəxs bütün alimlərin yekdil fikirdə olduğunu necə iddia edə

(Həl-əta” surəsinin Mədinədə nazil olduğunu söyləmişlər.”(١“

Əbu Abdullah Zəncani “Tarixul-Quran” kitabında “Nəzmud-durər və tənasuxul-ayati vəs-suvər” kitabına istinadən nəql edir ki, bir qrup əhli-sünnə aliminin fikrinə görə, bu (surə Mədinədə nazil olmuşdur.(٢

Süyuti isə bunu “Əd-durrul-mənsur” kitabında İbn Abbasdan müxtəlif sənədlərlə nəql etmişdir. Həmçinin onun “Əl-itqan” və Beyhəqinin “Dəlailun-nubuvvət” kitablarında (Əkrəmənin nəqlinə görə, “Həl-əta” surəsi Mədinədə nazil olmuşdur.(٣

Bu surənin Əli, Fatimə, Həsən və Hüseyn (ə) barəsində nazil olduğunu deyən alimlər böyük bir qrupu təşkil edirlər ki, onların adları qabaqda çəkildi və onların hamısı bu .surənin Mədinədə nazil olduğunu demişlər

Bütün bunlardan əlavə, bu surənin bir qisminin Məkkədə nazil olduğunu fərz etsək belə, Əli (ə) və ailəsinin nəzri ilə bağlı hadisəni açıqlayan ayələr Mədinədə nazil olmuşdur. Qurani-Kərimdə bir çox surələrin ayələrinin bir hissəsi Məkkədə, digər bir hissəsi isə Mədinədə nazil olmuşdur. Belə olan təqdirdə “Həl-əta” surəsi də bu .qəbildən olacaqdır

Məhz bu səbəbdən də “Ruhul-bəyan” əsərinin müəllifi (Bursui Hənəfi) “Həl-əta” surəsinin Mədinədə nazil olduğunu söyləyərək, bir qrup böyük alimin uyğun fikrini bəyan etdikdən sonra onun ayələrinin bir hissəsinin Məkkədə, digər bir hissəsinin isə Mədinədə nazil olduğunu deyən alimlərə də toxunaraq yazır: “Buna əsasən, deyə bilərik ki, bu surə həm Məkkə, həm də Mədinədə nazil olmuşdur. Bununla belə, onun Mədinədə nazil olan ayələrinin sayı çoxdur. Deməli, bu surəninin Mədinədə nazil olduğunu deməyimiz daha uyğundur. Ümumiyyətlə, biz bu surənin nazil olma səbəbini açıqlayan əhvalatın (Əlinin (ə) və ailəsinin nəzrinin) doğruluğunda şəkk-şübhə (etmirik!”(٤

Bu təfsir alimi və digərlərinin “Həl-əta” surəsinin Mədinədə nazil

۱- [۱]. “Şəvahidut-tənzil”, ۲-ci cild, səh. ۳۱۰-۳۱۵.

۲- [۲]. “Tarixul-Quran”, səh. ۵۵.

۳- [۳]. “Əl-mizan”, ۲۰-ci cild, səh. ۲۲۱.

۴- [۴]. “Ruhul-bəyan”, ۱۰-cu cild, səh. ۲۶۹.

olmasına əsasları onda qeyd edilən “əsir” sözü ilə bağlıdır. Bildiyimiz kimi, Peyğəmbər (s) Məkkədə olduğu zaman kimsə əsir olmamışdır və əsirlik Mədinədə cihad hökmü .nazil olduqdan sonraya aiddir

Həmin alim yazır: “Bu ayələrin Mədinədə nazil olduğunu göstərən dəlil onda qeyd olunan “əsir” sözü ilə əlaqədardır. Çünki əsirlik cihad ayəsi və onun hökmü nazil (olduqdan sonra Mədinədə müşahidə olunmuşdur.”(١

Maraqlıdır ki, imam Əlinin (ə) vilayət və xilafətinə qarşı çıxan bəzi təəssübkeş alimlər bu ayədə qeyd olunan “əsir” sözünə də müəyyən yozumlar tapmışlar ki, bu, insanı lap təəccübləndirir! Onların bəziləri burada arvadının əsarəti altında olan kəslərin, bəziləri (də borc içərisində əsir olanların nəzərdə tutulduğunu qeyd etmişlər!...(٢

Bu alimlərdən soruşmaq lazımdır ki, əsir sözünün həqiqi mənası nə üçün məcazi !?mənalar daşımalıdır?! Axı nə üçün

?Ayənin ibarəsi ümumi olduğu halda, onu müəyyən fərdlərə necə aid etmək olar .٢

Dəfələrlə işarə edildiyi kimi, ayələrin məfhumunun ümumiliyi ilə onun xüsusi bir məsələ ilə bağlı nazil olmasında heç bir ziddiyyət yoxdur. Bunu Qurani-Kərimin bir çox ayəsində də müşahidə etmək olar. Qəribədir ki, Qurani-Kərimdə məfhum və mənası ümumi olub, xüsusi bir məsələ ilə əlaqədar nazil olan digər ayələrə bu iradlar !tutulmadığı halda, imam Əlidən (ə) söz açıldıqda, bu məsələ tamamilə dəyişilir

?Bir insanın üç gün ac qalıb, yalnız su ilə iftar etməsi mümkündürmü .٣

Bu bəhanə isə doğrudan insanı heyrətə gətirir! Axı, dəfələrlə görmüşük ki, bir çoxları bir sıra tibbi müalicələr üzündən nəinki üç gün, hətta on gün, bəlkə də qırx gün belə ac qalaraq, yalnız xalis su ilə dolanmışlar. Bəzi həkimlər hətta bu yolla xəstələri müalicə edirlər. Qeyri-müsəlman olan doktor Aleksey Sufurin dəqiq proqramlara



---

.Yenə orada . [١] -١

Bəhrul-muhit”, ٨-ci cild, səh. ٣٩۵. Bu kitabın müəllifinin nəzərinə görə, burada“ . [٢] -٢

əsasən, bəzi xəstəliklərin qırx gün ac qalmaqla müalicəsi haqda ayrıca bir əsər (yazmışdır.(۱)

Bir növ “su orucu” sayılan “aclıq etirazı” da müasir dövrdə yayılmış və bəzən də bu üsul .qırx günü ötüb keçmişdir

Bəs, nə üçün bəhanə axtaranlar üç gün oruc tutaraq, yalnız su ilə iftar etməyə təəccüblənirlər?! Görəsən, məqsəd mümkün olan hər yolla yalnız Əhli-beytin (ə) bu !?böyük fəzilətini inkar etmək deyilmi

### BƏRAƏT” AYƏLƏRİ”–۶

Tövbə” surəsində də bir neçə ayə vardır ki, onların nazil olma səbəbilə əlaqədar təfsir,“ hədis və tarix kitablarında nəql olunan rəvayətlərə diqqət yetirdikdə, bir daha .Əmirəlmöminin Əlinin (ə) fəzilətləri aşkar olur

Bu surənin ilk ayələri əhd-peymanı pozan müşriklərlə müharibənin elanı ilə əlaqədardır. Demək olar, bütün tarixçi və təfsirçilərin nəzərinə görə, hicrətin ۹-cu ili bu ayələr nazil olduqda, İslam Peyğəmbəri (s) ondakı bu əmri Məkkədə – həcc mərasimində hamıya çatdırmağı Əbu Bəkrə tapşırdı. Lakin o, yolun bir miqdarını getdikdən sonra bu işi Əliyə (ə) həvalə edib, Əbu Bəkri geri çağırtdı. Əli (ə) də Peyğəmbər (s)-in əmrini olduğu kimi icra etdi. Hərçənd, tarix, təfsir və hədis alimləri arasında bu hadisə azacıq fərqlə qeyd edilsə də, burada onu açıqlayan rəvayətlərin bir :qismini qeyd edirik

Əhli-sünnənin “hənbəli” məzhəbinin rəhbəri Əhməd ibn Hənbəl “Müsnəd” kitabında .۱ yazır: “Peyğəmbəri-Əkrəm (s) “Bəraət” ayələrini Əbu Bəkrə verib, Məkkəyə göndərdi ki, onun əhalisinə çatdırıb desin: “Bu ildən sonra heç bir müşrik Allahın evini – Kəbəni ziyarət etmək hüququna malik deyildir. Heç kəs çılpaq halda Kəbəni təvaf edə bilməz...” Sonra Peyğəmbəri-Əkrəm (s) Əliyə (ə) buyurdu ki, özünü (Məkkə ilə Mədinə yolu arasında) Əbu Bəkrə çatdırıb, onu geri qaytarsın və “Bəraət” ayələrini ondan alıb, özü onları elan etsin. Əli də belə etdi. Hədisin axırında belə deyilir: “Əbu Bəkr

Onun bu əsəri “Ət-təbibu bis-sovm” (Oruc vasitəsilə təbabət) adı ilə ərəb dilinə, . [١] -١ “Ruze – rəvişi novin bəraye-dərmane-bimariha” adı ilə fars dilinə tərcümə .olunmuşdur

Peyğəmbəri-Əkrəm (s)-dən “Mənim geri qayıtmağımla əlaqədar bir ayəmi nazil olubdur?” – deyə soruşduqda, Həzrət buyurdu:

اُمِرْتُ اَنْ لا يُبَلِّغَهُ اِلّا اَنا اَوْ رَجُلٌ مِنّى:

“Mənə əmr gəlib ki, bu surəni camaata ya özüm çatdırım, ya da məndən olan bir kəs!”(1)

Əhli-sünnənin mötəbər mənbələrindən sayılan “Sünəni-Termizi”də bu rəvayət başqa ibarələrlə Ənəs ibn Malikdən nəql olunur ki, Peyğəmbəri-Əkrəm (s) “Bəraət” ayələrini Əbu Bəkrə verəndən sonra onu geri çağırtdırıb buyurdu:

لا يَنْبَغِى لِاَحَدٍ اَنْ يُبَلِّغَ اِلّا رَجُلٌ مِنْ اَهْلِى فَدَعا عَلِيّاً فَاَعْطاهُ اِيّاهُ:

“Bu surəni mənim Əhli-beytimdən olan kişidən başqa heç kəs camaata çatdırmağa layiq deyildir.” Sonra Əlini çağırıb, bu surəni ona verdi!”(2)

Termizi daha başqa bir hədisi İbn Abbasdan təfsilatı ilə nəql edir.(3) Diqqəti cəlb edən məsələ budur ki, o, hər iki hədisi qeyd etdikdən sonra bu barədə həm öz, həm də başqalarının nəzərini belə açıqlayır: “Bu hədis “həsən” (yaxşı) və “qərib”dir!” Lakin o, bu sözü nə ondan qabaqkı, nə də sonrakı hədislər barəsində demir və bu da öz növbəsində çox qəribədir. Guya, imam Əlinin (ə) məqamı və fəziləti haqda nəql olunan hər bir hədis onların nəzərinə qəribə gəlmişdir!

2. Süyuti “Əd-durrul-mənsur” kitabında Abdullah ibn Əhməd Hənbəldən və İbn Mərdəveyhdən, onlar da imam Əlidən (ə) belə nəql edirlər: “Bəraət” surəsinin ilk on ayəsi nazil olduqda, Peyğəmbər (s) Əbu Bəkri çağırıb, bunları ona verdi ki, Məkkə əhalisinə yetirsin. Sonra isə məni çağırıb buyurdu: “Əbu Bəkrə çatıb, məktubu (ayələri) ondan al (və özün elan et)! Əbu Bəkr geri qayıdıb dedi: “Ya Peyğəmbər (s)! Mənim haqda (bu işə layiq olmadığımı göstərən) bir şeymi nazil olubdur?!”

Peyğəmbər (s) buyurdu: “Xeyr, lakin Cəbrail gəlib mənə dedi: “Bu xəbəri başqası oxuya bilməz, ya özün, ya da sənin Əhli-beytindən bir kişi oxumalıdır!”(4)

3. Yenə həmin kitabda Əhməddən, Termizidən, eləcə də İbn

---

۱- [۱] . “Müsnədi-Əhməd”, ۱-ci cild, səh. ۳, “Darus-sadiq” çapı.

۲- [۲] . “Sünəni-Termizi”, ۵-ci cild, səh. ۲۷۵, hədis: ۳۰۹۰.

۳- [۳] . Yenə orada, hədis: ۳۰۹۱.

۴- [۴] . “Əd-durrul-mənsur”, ۳-cü cild, səh. ۲۰۹.

Mərdəveyhdən, onlar da Ənəs ibn Malikdən belə nəql edirlər: "Peyğəmbər (s) "Bəraət" :ayələrini Əbu Bəkrə verib Məkkəyə göndərdi. Sonra onu geri çağırtdırıb buyurdu

لا يَنْبَغِى لِاَحدٍ اَنْ يُبَلِّغَ هذا اِلاّ رَجُلٌ مِنْ اَهْلِى، فَدَعا عَلِيّاً فَاَعْطاهُ اِيّاهُ:

Bu surəni camaata çatdırmağa mənim Əhli-beytimdən olan kişidən başqa bir kəs" (layiq deyildir." Sonra Əlini çağırıb, "Bəraət" ayələrini ona verdi!"(١

Yenə orada Səd ibn Əbi Vəqqasdan belə nəql edilir: "Peyğəmbər (s) "Bəraət" .۴ ayələrini Əbu Bəkrə verib Məkkəyə göndərdi. Sonra Əlini (ə) onun ardınca yollayıb tapşırdı ki, ayələri ondan alsın. Əbu Bəkr narahat olub, bunu Peyğəmbər (s)-ə dedikdə, :Həzrət buyurdu

اِنَّهُ لا يُؤَدّى عَنِّى اِلّا اَنا اَوْ رَجُلٌ مِنِّى

Şübhəsiz, məndən, yaxud mənim Əhli-beytimndən olan kəsdən başqa bir kimsə onu" (mənim tərəfimdən camaata çatdıra bilməz!"(٢

Yenə orada məşhur səhabə Əbu Səid Xudridən belə nəql edilir: "Peyğəmbəri-Əkrəm .۵ (s) "Bəraət" ayələrini Məkkə camaatına elan etmək üçün əvvəlcə Əbu Bəkri göndərdi. Sonra Əlini çağırıb dedi: "Ya Əli! (Bu ayələri) mənim özümdən, yaxud səndən başqa kimsə camaata çatdıra bilməz." Sonra onu öz dəvəsinə mindirib Əbu Bəkrin ardınca göndərdi. Əli (ə) yola düşüb, Əbu Bəkrə çatdı və "Bəraət" ayələrini ondan aldı. Əbu Bəkr qorxa-qorxa Peyğəmbər (s)-in hüzuruna gəlib "Ya Peyğəmbər (s)! Mənim haqqımda bir şeymi nazil olub?!" – deyə soruşduqda, o həzrət Əliyə (ə) dediyi sözləri (buyurdu."(٣

Yenə həmin kitabda Peyğəmbər (s)-in məşhur səhabəsi Əbu Rafedən belə nəql .۶ edilir: "Peyğəmbəri-Əkrəm (s) Əbu Bəkri "Bəraət" ayələri ilə birlikdə həccə göndərdi. Cəbrail nazil olub dedi: "Şübhəsiz, onu səndən, yaxud sənin Əhli-beytindən başqa kimsə camaata çatdıra bilməz!" Bundan sonra Peyğəmbər (s) Əlini (ə) Əbu Bəkrin ardınca göndərdi. Əli (ə) Məkkə ilə Mədinə arasında ona çatıb, ayələri ondan aldı və (həcc mövsümündə camaata elan etdi."(۴

,Hakim Həskani "Şəvahidut-tənzil" kitabında Ənəs ibn Malik .٧

.Yenə orada . [۱] -۱

.Yenə orada . [۲] -۲

.(Əd-durrul-mənsur", səh. ۲۳۰ (azacıq ixtisarla" . [۳] -۳

.Yenə orada . [۴] -۴

İbn Abbas, Səd, Əbu Səid Xudri, Əbu Hüreyrə və başqalarından bu haqda on iki rəvayət nəql etmişdir. (Əlavə məlumat əldə etmək istəyənlər o kitaba müraciət etsinlər.)(١)

Digər alimlər də bu rəvayəti müxtəlif sənədlərlə nəql etmişlər ki, onun ravilərinin sayı olduqca çoxdur. Əllamə Əmini bu barədə yazır: "Bu hədis "təvatür" həddinə çatmış, hətta bəzilərinin nəzərinə görə, "təvatür" həddini də keçmişdir." Sonra bu hədisi öz kitablarında nəql edən əhli-sünnənin ٧٣ aliminin qeydlərini təfsilatı – mənbə və sənədləri ilə birlikdə qeyd etmiş(٢), sonra yazmışdır: "Bu hədisin raviləri aşağıda adları çəkilən səhabələrdir: Əli (ə), Əbu Bəkr, İbn Abbas, Cabir ibn Abdullah Ənsari, Ənəs ibn Malik, Əbu Səid Xudri, Səd ibn Əbi Vəqqas, Əbu Hüreyrə, Abdullah ibn Ömər, Həbəş ibn Cünadə, İmran ibn Həsin və Əbuzər Qifari."(٣)

Bu mövzunu da ٨-ci (h.q) əsrin məşhur şairlərindən olan Şəmsəddin Malikinin şerilə sona çatdırırıq:

Və ərsələhu ənhur-Rəsulu mubəlliğən,

Və xəssə bihazəl-əmri təxsisə mufrədi,

Və qalə: "həlit-təbliğu ənni yənbəği

Li-mən ləysə min bəyti minəl-qovmi fəqtəda."

"Peyğəmbər (ə) onu (Əlini) onun (Əbu Bəkrin) əvəzində öz təbliğatçısı kimi göndərdi və bu əmri yalnız ona tapşırıb buyurdu: "Görəsən, heç layiqdirmi ki, Əhli-beytimdən kənar bir şəxs bunu mənim tərəfimdən yetirsin?! Əli də ona tabe oldu!"(٤)

## Nəticə

Bu hədis mənbə və sənədləri ilə birgə imam Əlinin (ə) Allah dərgahında Peyğəmbəri-Əkrəm (s)-dən sonra bütün insanlardan üstün və fəzilətli olduğunu göstərən aydın və möhkəm dəlildir. Çünki bu hədisdə açıq-aydın buyurulur: "Cəbrail Allah tərəfindən nazil olub Peyğəmbər (s)-ə dedi ki, "Bəraət" ayələrini ya özün, ya da Əli (ə) elan etsin!" Peyğəmbər

---

Şəvahidut-tənzil", ۱-ci cild, səh. ۲۳۲-۲۴۳, hədis: ۳۰۹, ۳۱۰, ۳۱۱, ۳۱۲, ۳۱۴, ۳۱۵, ۳۱۶, ۳۱۷," . [۱] -۱
.۳۱۸, ۳۲۳, ۳۲۴ və ۳۲۵

Bu alimlərin adlarını bilmək istəyənlər "Əl-qədir" kitabının, ۷-ci cildinin ۳۴۱-۳۸۸-ci . [۲] -۲
.səhifələrinə müraciət etsinlər

.Əl-qədir", ۶-cı cild, səh. ۳۴۱-۳۴۸" . [۳] -۳

.Yenə orada, səh. ۳۳۸ . [۴] -۴

s) də buyurdu: “Bu, ya mənim, ya da mənim Əhli-beytimdən olan bir kişinin işidir. Bu) ”!işə yalnız Əli layiqdir

Müşriklərin əhd-peymanlarını pozması o zaman ən həssas və mühüm hadisələrdən olduğu üçün İslamın göstərişlərinin şücaət və yüksək tədrbilə həyata keçirilməsi tələb olunurdu. Çünki həcc mərasimində müxaliflərin sərt rəftarı ehtimalı çox idi. İmam Əlinin (ə) bu işə seçilməsi ümmətin içərisində ən şücaətli və tədbirli bir şəxs olduğunu da göstərir. Belə bir mühüm işə seçilən şəxs sözsüz ki, İslam Peyğəmbərinin (s) .canişini olmağa hamıdan layiqdir

Diqqət yetirmək lazımdır ki, Əbu Bəkrin özü də bunu hiss edərək Peyğəmbər (s)-in hüzuruna gəldikdə, tam nigarançılıqla “Mənim haqqımda bir şeymi nazil olub?” – deyə soruşur. Peyğəmbər (ə) buyurur: “Bu iş mənim yaxınlarımdan olan bir şəxsin vasitəsilə ”.yerinə yetirilməlidir

Burada yenə bəzi bəhanə axtaranlar bu işin imam Əli (ə) üçün heç bir fəzilət daşımadığını göstərmək məqsədilə buna məntiqsiz təhlillərlə yanaşmışlar. Misal üçün, Alusi “Ruhul-məani” kitabında bu hədisi nəql etdikdən sonra yazır: “Bu rəvayət qısa şəkildə Əlinin (ə) və qüreyşin fəzilətinə dəlalət edir və bunu heç bir mömin inkar etmir. Lakin bu, xilafət məsələsində Əlinin (ə) Əbu Bəkrlə müqayisədə üstün və layiqli olmasına əsla dəlil ola bilməz!” Sonra belə əlavə edir: “Bəzi sünnülər burada Əbu Bəkri hacıların başçısı, Əlini (ə) isə müşriklərin əhd-peymanlarını pozmağı barəsində “Bəraət” ayələrinin elanı üçün təbliğatçı kimi seçilməsi ilə bağlı bir incəliyi qeyd etmişlər. O da budur ki, Əbu Bəkr camal və rəhmət sifətinin cilvəsi olduğu üçün Peyğəmbəri-Əkrəm (s) də müsəlmanların rəhmətlə bağlı işlərini ona tapşırmışdı, lakin Əli (ə) Allahın aslanı və cəlal sifətinin məzhəri olduğundan, (Allahın qəzəbinə səbəb olan kafirlərin əhd-peymanlarını pozduqlarına görə,) həmin ayələrin elanını onun öhdəsinə qoymuşdur. Onlar hər ikisi qaynar bulağa bənzəyirlər ki, biri camal, digəri isə cəlal sifətlərin nümunəsidir.” O, daha sonra yazır: “Amma Peyğəmbər (s)-in

(söylədiyi səbəb olmasaydı, bu təhlil daha münasib sayılardı."(١)

O, sözünün sonunda yazır: "Bu təhlil özü Peyğəmbər (s)-in buyruğu ilə uyğun gəlmir. Çünki Peyğəmbər (s) açıq-aydın buyurur: "Cabrail Allah tərəfindən mənə göstəriş verdi ki, bu işi ya özüm, ya da mənim Əhli-beytimdən olan bir şəxs yerinə yetirsin." Yəni o şəxs Peyğəmbər (s)-ə bənzəməli, onun xüsusiyyətlərinə malik olmalıdır. Bildiyimiz ".kimi, Peyğəmbər (s) isə bütün camal və cəlal sifətlərə malik idi

Görəsən, nə üçün bizim bu qardaşlarımız imam Əlinin (ə) bu misilsiz fəzilətini inkar etməyə, yaxud müxtəlif yozumlarla ört-basdır etməyə çalışırlar?! Şübhəsiz, qorxurlar .ki, şiələr ona istinad etməklə öz məzhəblərinin doğru olduğunu sübut etsinlər

Bu bəhsi də "Mətalibus-sual" kitabında Əbuzər Qifaridən nəql olunan bir hədislə sona yetiririk. O deyir ki, Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur

عَلِيٌّ مِنِّى وَاَنَا مِنْ عَلِيّ وَلا يُؤَدِّى اِلاّ اَنَا اَوْ عَلِيٌّ:

Əli məndəndir, mən də Əlidənəm. Bu risaləti ("Bəraət" ayələrinin elanını) ya mən, ya" (da Əlidən başqa heç kim yerinə yetirə bilməz!"(٢)

### SİQAYƏTÜL-HACC" (HACILARA SU VERMƏ) AYƏSİ"-٧

:Bəraət" surəsinin ١٩-cu ayəsində buyurulur"

أَجَعَلْتُمْ سِقَايَةَ الْحَاجِّ وَعِمَارَةَ الْمَسْجِدِ الْحَرَامِ كَمَنْ آمَنَ بِاللّهِ وَالْيَوْمِ الآخِرِ وَجَاهَدَ فِى سَبِيلِ اللّهِ لاَ يَسْتَوُونَ عِندَ اللّهِ وَاللّهُ لاَ يَهْدِى الْقَوْمَ الظَّالِمِينَ

Yoxsa siz hacılara su verməyi və Məscidül-Həramı təmir etməyi Allaha və qiyamət" gününə iman gətirib Allah yolunda cihad edənlərlə eyni bilirsiniz?! Onlar Allah yanında ".eyni deyillər. Allah zalım tayfanı hidayət etməz

Hakim Həskani Hənəfi "Şəvahidut-tənzil" kitabında müxtəlif sənədlərlə bu ayənin imam Əli (ə) haqda nazil olduğunu göstərən ondan çox rəvayət nəql etmişdir. Rəvayətlərin birində Ənəs ibn Malikdən belə nəql edir: "Abbas ibn Əbdül-Müttəliblə Şeybə (Allah evinin qarovulçusu) hər biri özünün üstün və fəzilətli olduğunu deyərkən, Əli onların yanına gəldi. Abbas dedi: "Qardaş oğlu, dayan, sənə sözüm vardır!" Əli

,dayandı. Abbas dedi: “Şeybə mənə deyir ki

səh:۲۱۰

---

.Ruhul-məani”, ۱۰-cu cild, səh. ۴۷“ . [۱] -۱

.(Mətalibus-sual”, səh. ۱۸ (“Əl-qədir” kitabından nəqlən, ۶-cı cild, səh. ۳۴۸“ . [۲] -۲

mən səndən üstün və şərafətliyəm!” Əli (ə) buyurdu: “Əmi can! Sən ona nə cavab verdin?” Abbas dedi: “Dedim ki, mən Peyğəmbər (s)-in əmisi, onun atasının vəsisi və hacıları su ilə təmin edənəm! Buna görə də mən səndən üstünəm.” Əli (ə) üzünü Şeybəyə tutub buyurdu: “Bəs, sən ona nə dedin?” Şeybə dedi: “Dedim ki, mən səndən şərafətliyəm; çünki mən Kəbəni qorumaqla Allaha əmanətdarlıq edirəm, Onun evinin qapısını açıb-bağlamaq mənim öhdəmdədir. Əgər Abbas şərafətli olsaydı, o, bu işə seçilər və onu əmanətdar bilərdilər!”

Əli (ə) buyurdu: “Mən isə fəxr edirəm ki, bu ümmətin içərisində Peyğəmbər (s)-ə iman gətirən, hicrət edən və cihad edən birinci şəxsəm!”

Nəhayət, onların hər üçü Peyğəmbər (s)-in yanına gedib, hər biri öz sözünü o həzrətə ərz etdi. Peyğəmbər (s) isə onlara heç bir cavab vermədi. Onlar geri qayıtdılar. Bir neçə gündən sonra bu haqda vəhy nazil oldu. Bu zaman Peyğəmbər (s) onların yanına gedib, yuxarıdakı ayəni onlara tilavət etdi.”(١)

Bu hadisə azacıq fərqlə digər rəvayətlərdə də bəyan edilmişdir. Onların bəzisində belə nəql olunur: “Abbas həmin ayənin nazil olduğunu eşitdikdə, üç dəfə “Biz təslimik!” – dedi.”

Hakim Həskanidən başqa alimlər də bunu öz kitablarında bəziləri geniş, bəziləri isə qısa şəkildə nəql etmişlər. Aşağıda adı çəkilən alimləri buna misal göstərmək olar:

– Təbəri: “Təfsir” kitabında, Ənəs ibn Malikdən(٢);

– Vahidi: “Əsbabun-nüzul” kitabında(٣);

– Qurtubi: “Təfsir” kitabında(۴);

– Fəxri-Razi: “Kəbir” təfsirində(۵);

– Xazin: “Xazin” təfsirində(۶);

– Əbul-Bərəkat Nəsəfi: “Təfsir” kitabında(٧);

– İbn Səbbağ Maliki: “Füsulul-muhimmə” kitabında(٨);

---

.Şəvahidut-tənzil", ۱-ci cild, səh. ۲۴۹" . [۱] -۱

.Təfsiri-Təbəri", ۱۰-cu cild, səh. ۵۹" . [۲] -۲

.Əsbabun-nüzul", səh. ۱۸۲" . [۳] -۳

.Təfsiri-Qurtubi", ۸-ci cild, səh. ۹۱" . [۴] -۴

.Kəbir" təfsiri, ۴-cü cild, səh. ۴۲۲" . [۵] -۵

.Xazin" təfsiri, ۲-ci cild, səh. ۲۲۱" . [۶] -۶

.Təfsiri Əbul-Bərəkat", ۲-ci cild, səh. ۲۲۱" . [۷] -۷

.Əl-füsulul-muhimmə", səh. ۱۲۳" . [۸] -۸

Əhli-sünənin öz hədisləri əsasında yazılan “Əd-durrul-mənsur” kitabında bəhs etdiyimiz bu ayənin imam Əli (ə) barəsində nazil olması ilə bağlı həm yuxarıdakı (rəvayət, həm də başqa rəvayətlər nəql edilmişdir.(١)

Burada bir sual qarşıya çıxır: Məgər, müsəlmanların öz üstünlüklərini bir-birlərinə deyib, onunla qürrələnməsi İslamda məzzəmət olunmayıbmı? Əgər bu iş pis və ?bəyənilməzdirsə, bəs, nə üçün Əli (ə) bu işi görübmüş

Burada bir incəliyə diqqət yetirməklə onun cavabı aydın olacaqdır. O da budur ki, bəzən insanlar dəyərləri tanımaqda səhvə düçar olur, həqiqi dəyəri buraxıb, qiymətsiz işlərin ardınca düşürlər. Belə bir şəraitdə, insanın öz üstünlüyünü əyan etməsi nəinki eyib deyil, bəzən bu iş onun üzərinə düşən bir vəzifə sayılır. Məsələn, bir məclisdə bir nəfərin fəxrlə böyük imarət tikdirdiyini, başqa birisi isə bir idarənin rəisi olduğunu dediyi zaman, məclisin küncündə əyləşən bir nəfərin həqiqi dəyərləri göstərmək üçün “Mən sərvət, mal-dövlət və vəzifə sahibi olmasam da, Quranı əzbər bilirəm!” – deməsi .nəinki pis bir iş deyil, üstəlik dəyərli bir dərsdir

### SALİHUL-MUMİNİN” (MÖMİNLƏRİN ƏMƏLİSALEHİ) AYƏSİ”-٨

Təhrim” surəsinin ٤-cü ayəsində Allah-taala Peyğəmbəri-Əkrəm (s)-in bəzi“ :zövcələrinə xitab edərək buyurur

إِن تَتُوبَا إِلَى اللَّهِ فَقَدْ صَغَتْ قُلُوبُكُمَا وَإِن تَظَاهَرَا عَلَيْهِ فَإِنَّ اللَّهَ هُوَ مَوْلَاهُ وَجِبْرِيلُ وَصَالِحُ الْمُؤْمِنِينَ وَالْمَلَائِكَةُ بَعْدَ ذَلِكَ ظَهِيرٌ

Əgər (siz iki nəfər qadın) ona qarşı bir-birinizə kömək etsəniz də (əlinizdən bir iş“ gəlməyəcəkdir), çünki Allah onun mövlası (hamisi), Cəbrail və möminlərin əməlisalehi, ”.bunlardan sonra mələklər onun köməkçiləridir

Möminlərin əməlisalehi” ifadəsi ümumi məna daşıyaraq Peyğəmbər (s)-ə kömək“ edən bütün imanlı, yaxşı əməl sahibi olan kəslərə, yalnız o həzrətin dövründə yaşayan əməlisaleh səhabələr və möminlərə deyil, həm də hər bir dövr və əsrdə yaşayan möminlərə

aiddir və onların hər hansı biri öz növbəsində bir növ İslamın, Peyğəmbəri-Əkrəm (s)-
.in və onun məktəbinin köməkçiləridir

Burada mühüm məsələ budur ki, bir çox rəvayətlərə əsasən, bu ayədə qeyd olunan “möminlərin əməlisalehi” ifadəsi birbaşa Əliyə (ə) aid edilmişdir. Bu da onu göstərir ki, o həzrət bu ayənin xaricdəki ən kamil fərdidir. Bu sözün Cəbrail sözünün kənarında yerləşməsinə diqqət yetirdikdə, imam Əlinin (ə) məqamının böyüklüyü və bu fəzilətin
.əhəmiyyəti çox gözəl aydın olur

Bəli, Allah-taala və Cəbrail-Əmindən sonra İslam Peyğəmbərinin (s) ömrü boyunca ən yaxın köməkçisi və hamisi imam Əli (ə) olmuşdur. Buna əsasən, xilafətə və Peyğəmbəri-Əkrəm (s)-in canişinliyinə ondan başqa heç kim layiq deyil. Məgər, bu rəvayətlər imam Əlinin (ə) Peyğəmbəri-Əkrəm (s)-dən sonra ümmətin ən fəzilətli və
?ən üstün olduğunu göstərən tutarlı dəlillər deyilmi

İndi isə, əhli-sünnə mənbələrində nəql olunan bəzi rəvayətlərin sənədlərini araşdıraq: Hakim Həskani Hənəfi “Şəvahidut-tənzil” kitabında bu ayədə qeyd olunan “möminlərin əməlisalehi”ndən məqsədin imam Əli (ə) olması ilə bağlı müxtəlif sənədlərlə on səkkiz hədis nəql etmişdir. O cümlədən, Əsma binti Ümeys belə nəql edir: “Mən İslam
:Peyğəmbərindən eşitdim ki, buyururdu

صالِحُ الْمُؤمِنِينَ عَلِيُّ بْنُ اَبِيطالِب:

(Möminlərin əməlisalehi Əli ibn Əbi Talibdir.”(١“

Yenə həmin kitabda İbn Abbasın nəqlinə görə, Peyğəmbəri-Əkrəm (s) Əli ibn Əbi Talib
((ə) haqda buyurmuşdur: “Möminlərin əməlisalehi odur!”(٢

Həmçinin Əmmar Yasirdən belə nəql olunur: “Əli (ə) deyirdi ki, Peyğəmbər (s) məni çağırıb buyurdu: “Sənə bir müjdə verimmi?” Dedim: “Bəli, ya Rəsuləllah! Sən həmişə xeyirli müjdə verənsən!” Buyurdu: “Allah-taala sənin haqqında bir ayə nazil etmişdir.” Dedim: “Hansı ayədir?” Buyurdu: “Sən Cəbraillə birgə eyni səviyyədə

١- [١]. “Şəvahidut-tənzil”, ٢-ci cild, səh. ٢٥۶, hədis: ٩٨٢.

٢- [٢]. Yenə orada, səh. ٢٥٨, hədis: ٩٨٧.

(nəzərdə tutulmusan!” Sonru bu ayəni söylədi.”(١)

Bu məzmun eynilə başqa hədislərdə də Hüzeyfədən, İbn Sirindən və imam Əlidən (ə) (nəql edilir ki, Peyğəmbər (s) buyurdu: “Möminlərin əməlisalehi Əli ibn Əbi Talibdir!”(٢)

Bir çox təfsir alimi də bu hədisi təfsir kitablarında, o cümlədən, Süyuti “Əddurrul-mənsur”da həmin ayənin təfsirində İbn Abbas və Əsma binti Ümeysdən nəql etmişdir.

Bursui “Ruhul-bəyan” kitabında bu ayənin təfsiri ilə bağlı alimlərin nəzərini qeyd etdikdən sonra Mücahidin bu barədəki fikrini belə açıqlayır: “Möminlərin əməlisalehi”ndən məqsəd Əli ibn Əbi Talibdir (ə).” O yazır: “Mücahidin bu sözünə dəlil Peyğəmbər (s)-in buyurduğu başqa bir hədisdir: “Ya Əli! Sənin mənimlə nisbətin Harunun Musa ilə nisbəti kimidir!”

Sonra o, bir sıra ayələri misal çəkir ki, onlarda Allah-taala “əməlisalehlər” sözünü İslam Peyğəmbərinə (s) aid etmişdir. Bundan da belə bir nəticə alınır ki, əgər Əli (ə) Allahın peyğəmbəri Harun (ə) kimidirsə, deməli, “əməlisaleh” adına layiqdir.(٣)

Bu hədisi Əsqəlani, (“Fəthül-Bari”də), İbn Həcər (“Əs-səvaiq”də), Əlaəddin Müttəqi (“Kənzül-ümmal”da) kimi alimlər də nəql etmişlər.

Bir sözlə, “əməlisaleh möminlər”dən olmaq böyük bir fəzilətdir ki, Cəbrail-Əminlə eyni səviyyədə durur və qeyd etdiyimiz rəvayətlərə əsasən, onun ən kamil nümunəsi imam Əli (ə)-dır. Bəli, Peyğəmbəri-Əkrəm (s)-lə birlikdə bütün hadisələrdə çiyin-çiyinə çalışan, həmişə o həzrətin köməkçisi olan Əmirəlmöminin Əli (ə) imamət və canişinlik məqamına hamıdan layiqdir.

## ٩– “VƏZİRLİK” AYƏSİ

### İşarə

“Ta-ha” surəsinin ٢٩-٣٢-ci ayələrində (Musa peyğəmbərin dili ilə) buyurulur:

وَاجْعَل لِّي وَزِيرًا مِّنْ أَهْلِي هَارُونَ أَخِي اشْدُدْ بِهِ أَزْرِي وَأَشْرِكْهُ فِي أَمْرِي

“(İlahi!) Mənə öz ailəmdən bir vəzir qərar ver – qardaşım Harunu!

Onunla arxamı möhkəmləndir. Onu işimə şərik et.”

Bu ayələrin təfsirində əhli-sünnə mənbələrində çoxlu rəvayət nəql olunmuşdur. İslam Peyğəmbəri (s) risalətin vəzifələrini həyata keçirmək üçün həzrət Musanın (ə) Allahdan istədiyi duanı istəyir; bu fərqlə ki, Peyğəmbər (s) Harunun (ə) yerinə imam Əlinin (ə) adını çəkir. Biz həmin rəvayətlərin bir qismini aşağıda qeyd edirik:

١. “Şəvahidut-tənzil” kitabında Hüzeyfə ibn Üseyddən belə nəql olunur: “Peyğəmbəri-Əkrəm (s) Əmirəlmöminin Əli ibn Əbi Talibin (ə) əlindən tutub buyurdu:

اَبْشِر، وَاَبْشِر، اِنَّ مُوسی دَعا رَبَّهُ اَنْ یَجْعَلَ لَهُ وَزیراً مِنْ اَهْلِهِ هارُونَ، وَاِنّی اَدْعُوا رَبّی اَنْ یَجْعَلَ لِی وَزِیراً مِنْ اَهْلِی عَلِیّ اَخی، اُشْدُدْ بِهِ ظَهْرِی وَاَشْرِکْهُ فِی اَمْرِی:

“(Ya Əli!) Müjdə verirəm, müjdə verirəm! Həqiqətən, Musa (ə) Allahdan qardaşı Harunun onun xəlifəsi və işlərində şərik olmasını istədiyi kimi, mən də Allahdan istədim ki, öz əhlimdən olan bir nəfəri – Əlini mənim üçün vəzir və xəlifə seçsin. İlahi! Onunla arxamı möhkəmləndir və onu işimə ortaq et!”(١)

٢. Başqa bir rəvayətdə Əsma binti Ümeysdən belə nəql olunur: “Allahın Peyğəmbəri (s) buyurmuşdur:

اَللّهُمَّ اِنّی اَقُولُ کَما قالَ اَخِی مُوسی اَللّهُمَّ اجْعَلْ لِی وَزیراً مِنْ اَهْلِی عَلِیّاً اَخی، اُشْدُدْ بِهِ اَزْرِی وَاَشْرِکْهُ فِی اَمْرِی، کَیْ نُسَبِّحَکَ کَثِیراً، وَنَذْکُرَکَ کَثِیراً، اِنَّکَ کُنْتَ بِنا بَصِیراً:

“İlahi! Mən Səndən qardaşım Musanın (ə) istədiyini istəyirəm: İlahi! Mənim Əhli-beytimdən bir nəfəri – qardaşım Əlini mənə vəzir qərar ver! Onunla arxamı möhkəmləndir, onu işimə şərik et ki, Sənə çoxlu həmd-səna deyim, Səni çoxlu yad edim. Həqiqətən, Sən bizi görürsən (və bizim vəziyyətimizdən xəbərdarsan)!”(٢)

Məlum olduğu kimi, İslam Peyğəmbərinin (s) işlərinə şərik olmaq nübüvvət və peyğəmbərliyə aid deyil, yalnız xalqın rəhbərliyi ilə bağlı işlər nəzərdə tutulur.

٣. Ənəs ibn Malikdən nəql olunan hədisdə yalnız xəlifəlik və vəzirlik məsələsi açıqlanır: “Allahın Peyğəmbəri (s) buyurur:

اِنَّ خَلِیلِی وَ وَزِیری وَ خَلِیفَتِی فِی اَهْلِی، وَخَیْرَ مَنْ اَتْرُکَ بَعْدِی، یُنْجِزُ مَوْعُودِی وَیَقْضِی دِینِی، عَلِیُّ بْنُ اَبِیطالِبٍ:

Həqiqətən, Əhli-beytimdən olan dostum, vəzirim, xəlifəm və özümdən“



---

.Şəvahidut-tənzil”, ۱-ci cild, səh. ۳۶۸, hədis: ۵۱۰“ . [۱] -۱

.Yenə orada, səh. ۳۷۰, hədis: ۵۱۱ . [۲] -۲

sonra vədlərimə sadiq qalaraq borclarımı ödəməyə ən layiqli insan Əli ibn Əbi (Talibdir!"(١

(Bu hədis azacıq fərqlə Salman ibn Farsidən də nəql olunmuşdur.(٢ .۴

ci (h.q) əsrin alimlərindən olan Hafiz Əbu Nəim İsfahani "Ma nəzələ minəl-Qurani fi-۵ .۵ Əliyyin" (Qurani-Kərimdə Əli (ə) haqda nazil olan ayələr) adlı kitabında Əsma binti Ümeysin nəql etdiyi hədisi İbn Abbasdan nəql edir ki, onun sonunda İbn Abbas deyir: "Peyğəmbər (s)-in duasından sonra qeybdən belə bir səs eşitdim: "Ya Əhməd! (Allahdan istədiyin şey sənə verildi."(٣

Fəxri-Razi "Kəbir" təfsirində bu hədisi daha geniş şəkildə Əbuzər Qifaridən nəql edir: .۶ "Peyğəmbəri-Əkrəm (s) Əlinin (ə) namaz üstə üzüyünü yoxsula verdiyini gördükdə, dedi: "İlahi! Qardaşım Musa səndən istədi ki, onun sinəsini genişləndirəsən..., əhli-beytindən bir nəfəri vəzir seçib işilərinə ortaq edəsən (və Sən də qəbul etdin). İlahi! Sən onun duasının qəbul olduğunu bildirən Qurani-natiq (danışan Quran) nazil etmisən. İlahi! Mən Mühəmməd də Sənin peyğəmbərin və elçinəm. Mənim də sinəmi genişləndir, işlərimi mənə asan et və Əhli-beytimdən olan Əlini vəzirim seç və onunla "!arxamı möhkəmləndir

Hələ Peyğəmbər (s)-in duası qurtarmamışdı ki, Cəbrail "Sizin vəliniz, rəhbəriniz Allah, (Onun Rəsulu və sizlərdən olan əmr sahibləridir!" – ayəsini nazil etdi."(۴

Bu rəvayətin sənədlərini nəql edən kitabların sayı olduqca çoxdur, biz isə kitabın .həcmini nəzərə alaraq bunlarla kifayətlənirik

### VƏZİRLİK" AYƏSİ VƏ HƏDİSLƏRİNİN MÖHTƏVASI"

Bu hədislərdə açıq-aşkar belə deyilir: "Peyğəmbəri-Əkrəm (s)-in duasından sonra Allah-taala Musanın (ə) duası kimi o həzrətin duasını da



---

.Yenə orada, səh. ۳۷۴, hədis: ۵۱۶ . [۱] -۱

.Yenə orada, səh. ۷۷, hədis: ۱۱۵ . [۲] -۲

۳- [۳]. “Mülhəqati Ehqaqul-həqq”, ۲۰-ci cild, səh. ۱۲۸.

۴- [۴]. “Maidə” surəsinin ۵۵-ci ayəsinin “Kəbir” təfsiri, Fəxri-Razi, ۱۲-ci cild, səh. ۲۶. (təfsirində.)

qəbul etdi. Peyğəmbər (s)-in duası belə idi: “İlahi! (Harun (ə) Musanın (ə) vəziri, xəlifəsi olduğu kimi,) Əhli-beytimdən bir nəfəri vəzirim seç, onunla arxamı möhkəmləndir və ”.onu işlərimə şərik et

Deyildiyi kimi, burada imam Əlinin (ə) Peyğəmbər (s)-in işlərinə şərik olması peyğəmbərlik məqamına aid deyildir. Çünki İslam Peyğəmbəri (s) peyğəmbərlərin sonuncusudur. Bu da bəllidir ki, burada məqsəd, əmr be məruf (yaxşı işlərə dəvət), nəhy əz münkər (pis işlərdən çəkindirmək) və dinin təbliği ilə bağlı digər məsələlər də deyildir. Çünki bu, bütün müsəlmanların vəzifəsi olub, hamı gücü çatdığı qədər əmr be .məruf və nəhy əz münkər etməli, İslamı yaymalıdır

Beləliklə, Peyğəmbər (s)-in duasından məqsəd, peyğəmbərlik və ümumi vəzifələrdən başqa xüsusi bir məqamdır. O da Peyğəmbər (s)-dən sonra xilafət və imamət məqamı ola bilər. Bu isə Peyğəmbər (s)-dən sonra müsəlmanların rəhbəriliyi və o həzrətin canişinliyi deməkdir. Başqa sözlə desək, elə vəzifələr də vardır ki, hamı onun öhdəsindən gələ bilməz. O da dini hər bir təhrif və azğınlıqdan qorumaq, Peyğəmbər (s)-dən sonra ümmətə rəhbərlik etmək və o həzrətin hədəflərini həyata keçirməkdir (ki, bunların hamısı “vəzir” sözündə cəmlənmişdir.(١

Deməli, Peyğəmbəri-Əkrəm (s) Allahdan imam Əlinin (ə) müsəlmanların xəlifəsi və .imamı olmasını istədikdə, Allah da o həzrətin duasını qəbul etmişdir

Amma imam Əlinin (ə) belə fəzilətlərini qəbul etməyən bəzi əhli-sünnə alimləri “Peyğəmbər (s)-in işlərində şərikliyi” məsələsini əmr be məruf və nəhy əz münkər işlərinə yozmuşlar. Lakin bildiyiniz kimi, bu vəzifə bütün müsəlmanlara aid olduğundan, ondan ötrü Allah tərəfindən bir nəfərin vəzir təyin olunmasına ehtiyac .yoxdur

### ƏHZAB” SURƏSİNİN AYƏLƏRİ”–١٠–١١

Bir qrup təfsir aliminin fikrinə əsasən, “Əhzab” surəsinin bir neçə



---

Vizr” sözündən götürülən “vəzir” sözü ağır iş mənasını daşıyır. Vəzirlik məqamını“ . [١] -١

tutan şəxs öhdəsinə müxtəlif ağır məsuliyyətlər götürüdüyündən, bu söz ona aid .edilmişdir

ayəsi imam Əli (ə) və onun misilsiz fədakarlığı haqda nazil olmuşdur. Bu surənin ٢٣-cü :ayəsində buyurulur

مِنَ الْمُؤْمِنِينَ رِجَالٌ صَدَقُوا مَا عَاهَدُوا اللَّهَ عَلَيْهِ فَمِنْهُم مَّن قَضَى نَحْبَهُ وَمِنْهُم مَّن يَنتَظِرُ وَمَا بَدَّلُوا تَبْدِيلًا

Möminlərdən bəziləri Allahla etdikləri əhdə sadiqdirlər. Onların kimisi öz əhdini sona“ çatdırmış (və bu yolda şəhid olmuş), bəzisi də intizardadır. Onlar (əhd-peymanlarını, ”.verdikləri sözü) əsla dəyişməzlər

:Bu surənin ٢٥-ci ayəsində isə buyurulur

وَرَدَّ اللَّهُ الَّذِينَ كَفَرُوا بِغَيْظِهِمْ لَمْ يَنَالُوا خَيْرًا وَكَفَى اللَّهُ الْمُؤْمِنِينَ الْقِتَالَ وَكَانَ اللَّهُ قَوِيًّا عَزِيزًا

Allah kafirləri qəzəbli olduqları halda geri döndərdi. Onlar heç bir xeyir əldə edə“ bilmədilər. Döyüşdə Allah möminləri ehtiyacsız (və onlara qələbəni nəsib) etdi. Allah ”!qüvvət və qüdrət sahibidir

Bildiyimiz kimi, İslamın ən mühüm müharibələrindən biri də “Əhzab” (ordular) müharibəsidir. Çünki adından bəlli olduğu kimi, bu, bütün İslam düşmənləri tərəfindən müsəlmanların əleyhinə hərtərəfli mübarizə tədbiri idi. İslam dininin tərəqqisi ilə mənafelərinin təhlükəyə düşdüyünü görən bütün əks qruplar əl-ələ verib, İslama və İslam Peyğəmbərinin (s) işinə son qoymaq, bununla da həmişəlik rahat olmaq istəyirdilər.”Əhzab” surəsinin ١٧ ayəsi bu müharibədən söz açır və bu ayələrdə dəqiq incəliklər, o cümlədən, müharibə zamanı müsəlmanların parçalanmalarından danışılır. Bu müharibədə müsəlmanlar çox ağır və təhlükəli hadisələrlə üzləşdilər, düşmənin sayının çox, İslam qoşununun isə azlığı, eləcə də düşmənin hərtərəfli hazırlığı onları .daha da çətinliklərə məruz qoydu

Qeyd etdiyimiz iki ayə də bu on yeddi ayələrdəndir. “Şəvahidut-tənzil” kitabında qeyd etdiyimiz birinci ayənin təfsirində silsilə sənədlə imam Əlinin (ə) belə buyurduğu nəql olunur: “Möminlərdən bəzisiləri Allahla etdikləri əhdə sadiqdirlər...” – ayəsi bizim (haqqımızda nazil omuşdur. And olsun Allaha, şəhadət intizarında olan şəxs mənəm!”(١

Yenə həmin kitabda Abdullah ibn Abbasdan belə nəql olunur: “Möminlərdən bəziləri Allahla etdikləri əhdə sadiqdirlər!” – ayəsi Əli (ə), Həmzə və Cəfər haqqında nazil

olmuşdur. (Ayədə qeyd olunan) “Bəzisi də intizardadır!” – cümləsi Allah yolunda şəhadət intizarını çəkən Əliyə

səh:۲۱۸

---

.Şəvahidut-tənzil”, ۲-ci cild, səh. ۱-۲, hədis: ۶۲۷“ .[۱]-۱

(ə) işarədir. Allaha and olsun ki, şəhadət ona nəsib oldu!”(١)

Bu rəvayət İbn Həcərin “Əs-səvaiq”, İbn Səbbağ Malikinin “Füsulul-muhimmə” və Nişapurinin “Əl-kəşfu vəl-bəyan” kitablarında da nəql olunmuşdur.(٢)

İkinci ayədə bu haqda söhbət daha genişdir. Çünki bir çox hədis və təfsir alimlərinin yazdıqlarına görə, “Kəfəllahul-mumininəl-qital!” (Döyüşdə Allah möminlərə qurtuluş verdi!) – ayəsi Əmr ibn Əbdəvudu məğlub etməklə kafirlərin kələyini kəsən imam Əliyə (ə) işarədir. Bunu nəql edən kəslərdən biri də Abdullah ibn Məsuddur. Belə ki, o, bu ayəni oxuyarkən, onun təfsirində deyirdi: “Möminləri döyüş zamanı qoruyan şəxs Əli ibn Əbi Talib olmuşdur!” (٣)

Hakim Həskani bu məzmunda Abdullah ibn Məsuddan bir neçə hədis(۴) və başqa bir hədisi də İbn Abbasdan nəql etmişdir: “Döyüşdə Allah möminlərə qurtuluş verdi (və onlara qələbəni nəsib etdi)!” – ayəsini oxuyarkən, buyurdu: “Allah-taala “Xəndək” günü Əli ibn Əbi Talibin (ə) vasitəsilə Əmr ibn Əbdəvudu öldürdüyü zaman möminləri (döyüşdən) xilas etdi.”(۵)

Yenə də məşhur səhabə Hüzeyfədən imam Əlinin (ə) Əmr ibn Əbdəvudlə döyüşü və onu qətlə yetirməsi ilə bağlı uzun bir hədisi nəql etdikdən sonra Peyğəmbər (s)-in belə buyurduğunu yazır:

بَشِّرْ يا عَلِيُّ! فَلَوْ وُزِنَ الْيَوْمُ عَمَلُكَ بِعَمَلِ اُمَّهِ مُحَمَّدٍ (ص) لَرَجَحَ عَمَلُكَ بِعَمَلِهِمْ وَذالِكَ اَنَّهُ لَمْ يَبْقَ بَيْتٌ مِنْ بُيُوتِ الْمُسْلِمينَ اِلاّ وَ قَدْ دَخَلَهُ عِزٌّ بِقَتْلِ عَمْرو:

“Ya Əli, sənə müjdə olsun! Əgər bu gün sənin bu işin Mühəmmədin (s) bütün ümmətinin əməlləri ilə müqayisə edilsə, sözsüz ki, sənin əməlin onların əməllərindən üstün olacaqdır. Çünki Əmr ibn Əbdəvudun ölümü ilə bütün müsəlman evlərinə izzət verildi.”(۶)

Həmçinin o, bu rəvayəti İbn Həkimdən də nəql edir.

Süyuti “Əd-durrul-mənsur” kitabında İbn Əbi Hatəm, İbn Mərdəveyh, İbn Əsakir və İbn Məsuddan nəql edir ki, Peyğəmbəri-

---

۱- [۱] . Yenə orada, hədis: ۶۲۸.

۲- [۲] . “Əliyyun fil-kitabi vəs-sünnə”, səh. ۲۱۸.

۳- [۳] . “Şəvahidut-tənzil”, ۲-ci cild, səh. ۳, hədis: ۶۲۹.

۴- [۴] . Yenə orada, hədis: ۶۳۰, ۶۳۱ və ۶۳۲.

۵- [۵] . Yenə orada, səh. ۵, hədis: ۶۳۳.

۶- [۶] . Yenə orada, səh. ۷, hədis: ۶۳۴.

Əkrəm (s) həmin ayəni oxuyarkən (onun şərhində) belə buyururdu: “Allah-taala (möminləri Əli ibn Əbi Talibin vasitəsilə döyüşdən xilas etdi.”(١)

Bunu Əllamə Şeyx Süleyman Qunduzi də “Yənabiul-məvəddət” kitabında nəql etmişdir.(٢) Bu ayə ilə bağlı başqa rəvayətlər də nəql olunmuşdur ki, kitabın həcmini nəzərə alaraq qeyd etdiklərimizlə kifayətlərinik. Diqqəti cəlb edən məsələ budur ki, “Əhzab” müharibəsində İslamın düşmənləri və müşriklərin atdıqları “sonuncu oxu” Əli (ə) Allahın əmrilə sındırır və döyüş müsəlmanların qələbəsilə sona yetir. Bəli, bu fəzilət Peyğəmbər (s)-in ümməti içərisində imam Əlidən (ə) savayı kimsəyə aid deyildir. İndi görək, Peyğəmbər (s)-in canişinliyi bir əməli ilə bütün İslam ümmətinin əməllərindən !?üstün olan kəsə layiqdir, yoxsa başqalarına

Sual: Burada sual verilə bilər ki, elə “Əhzab” surəsinin ٩-cu ayəsində bu müharibəyə işarə edilərək buyurulur: “Ey iman gətirənlər! Ordular sizin üstünüzə gəldiyi zaman Allahın sizə olan nemətini yadınıza salın. O vaxt Biz onların üstünə külək və sizin görmədiyiniz qoşun göndərmişdik (ki, bununla da onları məhv etdik). Allah sizin nə ”!etdiyinizi görürdü

Bu ayəyə əsasən, bu müharibədə düşmən ordusunun məğlubiyyət amillərindən biri onların üstünə əsən şiddətli külək və gözə görünməyən mələklərdən ibarət ilahi ordu olmuşdur. Belə isə necə deyə bilərik ki, müsəlmanların qələbə çalmasının səbəbi Əli ?(ə)-dır

Cavab: Bir müharibədə qələbənin müxtəlif amilləri ola bilər; təbii amil, hərbi amil, mənəvi amil və s. “Əhzab” müharibəsində də şübhəsiz, üç amil əl-ələ verərək, düşmənləri məğlub etdi və onların ayrıca öz təsirini əsla inkar etmək olmaz. Düşmən ordusunun böyük döyüşçüsü Əmr ibn Əbdəvud həm imam Əlinin (ə), həm əsən küləyin, həm də mələklərin vasitəsi ilə öldürüldü. Bu amillər burada əlbir olub, nəhayət, .müsəlmanların qələbəsinə şərait yaratdılar

### BƏYYİNƏ" (ŞAHİD) AYƏSİ"–١٢

:Hud” surəsinin ١٧-ci ayəsində buyurulur“

أَفَمَن كَانَ عَلَى بَيِّنَةٍ مِّن رَّبِّهِ وَيَتْلُوهُ شَاهِدٌ مِّنْهُ وَمِن قَبْلِهِ كِتَابُ مُوسَى إَمَامًا وَرَحْمَةً أُوْلَـئِكَ يُؤْمِنُونَ بِهِ

tərəfindən bir şahid gələn, ondan da əvvəl Musanın bir rəhbər və mərhəmət olan kitabını təsdiq etdiyi kimsə (başqaları kimi ola bilərmi?!) Bunlar (haqq-ədalət istəyənlər) ona iman gətirmişlər!”

Hakim Həskani “Şəvahidut-tənzil” kitabında bu ayənin təfsiri ilə bağlı on altıya yaxın rəvayət nəql edir ki, ondakı “şahid” sözündən məqsədin imam Əli (ə) olduğu qeyd olunur. Məsələn, Ənəs ibn Malikdən belə nəql olunur: “Məgər Allahdan açıq-aydın bir dəlilə istinad edən...” – ibarəsindən məqsəd Mühəmməd (s), “Ardınca Allah tərəfindən bir şahid gələn...” – ibarəsindən məqsəd isə Əli ibn Əbi Talib (ə)-dır. Müşriklər əhd-peymanlarını pozduqları zaman Məkkədə Peyğəmbəri-Əkrəm (s) tərəfindən həmin ayələri tilavət edən şəxs Əli (ə) idi.”(١)

Başqa bir hədisdə İbn Abbasın belə dediyi nəql olunur: “Ardınca Allah tərəfindən bir şahid gələn...” – ibarəsindən məqsəd, yalnız Əli ibn Əbi Talibdir!”(٢)

Həmçinin imam Əlinin (ə) xüsusi səhabələrindən olan Zazan o həzrətdən belə nəql edir: “Əgər mənim üçün qəzavət kürsüsü hazırlansa və mən onun üstündə əyləşsəm, Tövrat əhli ilə öz kitabları – Tövrat, İncil əhli ilə öz kitabları – İncil, Zəbur əhli ilə öz kitabları – Zəbur və Quran əhli ilə öz kitabları – Quran əsasında qəzavət və hökm edərəm... Allaha and olsun! Gecə, yaxud gündüz, çöldə, yaxud dağda, səhralıqda, yaxud suda elə bir ayə nazil olmayıb ki, hansı saatda, yaxud kimin haqqında nazil olduğundan mən xəbərdar olmayım!”

Bir nəfər “Ya Əmirəlmöminin! Quranda sənin haqqında bir ayə nazil olubmu?” – deyə soruşduqda, o həzrət buyurdu: “Məgər Allahdan açıq-aydın bir dəlilə istinad edən, ardınca Allah tərəfindən bir şahid gələn... kimsə (başqaları kimi ola bilərmi?!) – ayəsinə görə, Allah tərəfindən açıq-aydın dəlilə istinad edən Mühəmməd (s), ona şahid və onun ardınca qədəm götürən şəxs isə mənəm!”(٣)

Süyuti də “Əd-durrul-mənsur” kitabında bu haqda çoxlu rəvayət nəql etmişdir ki, o cümlədən, İbn Əbi Hatəm, İbn Mərdəveyh və Əbu

١- [١] . “Şəvahidut-tənzil”, ١-ci cild, səh. ٢٨٠, hədis: ٣٨٣.

٢- [٢] . Yenə orada, səh. ٢٨٢, hədis: ٣٨٧.

٣- [٣] . “Şəvahidut-tənzil”, ١-ci cild, səh. ٢٨٠, hədis: ٣٨٤.

Nəimin Əli ibn Əbi Talibdən (ə) nəql etdikləri hədisdə belə buyurulur: “Qüreyşdən elə bir kişi yoxdur ki, Quranda onun barəsində ayə nazil olmasın!”

Bir nəfər o həzrətdən soruşdu: “Quranda sənin də haqqında ayə varmı?”

Buyurdu: “Məgər “Hud” surəsini oxumayıbsınızmı ki, Allah-taala buyurur: “Məgər Allahdan açıq-aydın bir dəlilə istinad edən, ardınca Allah tərəfindən bir şahid gələn... kimsə (başqaları kimi ola bilərmi?!)”(١)

Həmin kitabda bu məzmunda əlavə hədislər də nəql edilmişdir.

“Ruhul-məani” təfsirində də İbn Əbi Hatəmin və İbn Mərdəveyhin Əlidən (ə) nəql etdikləri hədisdən sonra Peyğəmbəri-Əkrəm (s)-in belə buyurduğunu nəql edir: “Allahdan açıq-aydın bir dəlilə istinad edən...” şəxs mənəm, “Ardınca Allah tərəfindən bir şahid gələn...” şəxs isə Əlidir.”

Həmin kitabda yazılır: “Bəzi şiələr bu hədisləri Peyğəmbəri-Əkrəm (s)-dən sonra Əlinin (ə) xəlifəliyi ilə əlaqələndirirlər. Çünki bu ayədə Əli “şahid” sayılmış və “İnna ərsəlnakə şahidən və mübəşşirən və nəzirən!” (Həqiqətən, Biz səni şahid, müjdə verən və qorxudan göndərdik!) – ayəsində isə Peyğəmbəri-Əkrəm (s) şahid kimi göndərilmişdir. Bu da onu göstərir ki, İslam ümməti arasında Əlinin (ə) məqamı Peyğəmbəri-Əkrəm (s)-in məqamı ilə eynidir. Çünki Allah-taala Qurani-Kərmdə buyurduğu kimi, Əli (ə) də Allah tərəfindən bir şahid olaraq gəlmişdir. Bunun da mənası budur ki, Əli (ə) İslam Peyğəmbərindən (s) sonra xəlifədir!”

Sonra o, belə yazır: “Bu düzgün deyildir!” Bundan sonra bir rəvayəti nəql edərək “şahid” sözünü Peyğəmbər (s)-in zamanına aid edir.(٢)

Həmişə şiələrə və imam Əlinin (ə) imaməti ilə bağlı məsələlərə qarşı çıxan “Əl-mənar” kitabının təəssübkeş müəllifi “Ruhul-məani”nin müəllifi Alusidən geri qalmır. O da bu ayənin təfsirində əl-ayağa düşmüş və özünü ağır zəhmətlərə salaraq yazmışdır: “Ayənin zahiri mənası budur ki, “bəyyinə” (dəlil) Peyğəmbər (s)-in

١- [١]. “Əd-durrul-mənsur”, ٣-cü cild, səh. ٣٢٤.

٢- [٢]. “Ruhul-məani”, ١٢-ci cild, səh. ٢٨.

öz nübüvvətinə olan qəti elmi, “şahid” isə Qurandır.” Bu barədə Səid ibn Cübeyrdən bir hədis nəql edir ki, orada “bəyyinə” Quran, “şahid” isə Cəbrail qeyd edilmiş və ayədəki “yətluhu” sözü isə Qurani-Kərimin Peyğəmbər (s)-ə tilavət edilməsi mənasını daşıdığı göstərilmişdir. Sonra əlavə edərək yazır: “Əlbəttə, zəif bir hədisdə deyilir ki, “şahid” Peyğəmbər (s)-in Quranı camaata tilavət etdiyi dilildir. Şiələrin nəql etdikləri başqa bir (hədisə görə isə “şahid”in Əli (ə) olduğu göstərilir.”(١)

Təəssüflər olsun ki, belə yozum və təəssübkeşliklər Quranın ayələrinin və rəvayətlərin başa düşülməsi üçün ən böyük maneədir. Burada bir neçə məsələni qeyd etməyi lazım :görürük

Şiə və sünnülərin məşhur kitablarında müxtəlif sənədlərlə nəql olunan o qədər .١ hədislərin müqabilində “Əl-mənar”ın müəllifinin “Şiələrin nəql etdikləri zəif bir hədisdə “şahid”in Əli (ə) olduğu göstərilir!” – deməsi insanı lap təəccübləndirir! Görəsən, o, əhli-sünnənin “Əd-durrul-mənsur”, “Şəvahidut-tənzil”, hətta “Ruhul-məani” kitablarında “şahid” sözünün imam Əliyə (ə) aid edilməsi ilə bağlı nəql olunan hədisləri görməyibmi?! Məgər bu rəvayətləri təkcə şiələrmi nəql edib? Yaxud şiənin xeyrinə tamamlanan hər hansı rəvayəti, əksər əhli-sünnə alimləri nəql etsə belə, yenə şiələrin !?rəvayəti kimimi hesab edilməlidir

Bir qurp əhli-sünnə aliminin bu ayədə qeyd olunan “şahid” sözünün Peyğəmbəri- .٢ Əkrəm (s)-in “dili”nə (Quranın heç bir yerində görünməyən məfhuma) təfsiri fikri daha maraqlıdır. Çünki “Əl-mənar”ın müəllifi bu haqda yalnız bir zəif rəvayətin nəql olunduğu bildirmişdir. Bəlkə də o, “şahid” sözünün Peyğəmbəri-Əkrəm (s)-in dilinə, eləcə də “yətluhu” sözünün Quranın tilavətinə təfsir etməyin həqiqətdən daha uzaq olduğuna diqqət yetirmişdir. Çünki bu təfsirə əsasən, ayənin mənası belə olacaqdır: “Məgər Allahdan açıq-aydın bir dəlilə, yəni Qurani-Kərimə istinad edən, ardınca onu tilavət edən... kimsə (başqaları kimi ola bilərmi?!)” Bunun mənası budur ki, Peyğəmbər (s) özü-özünə şahiddir. Görəsən, nəyisə iddia edən bir kəs özü-özünə şahid ola bilərmi?! Üoxsa başqa bir kəsin şahidliyi

lazımdır? Məgər Quran Peyğəmbər (s)-in dilindən çıxmayıbmı? Bəs, necə ola bilər ki, Peyğəmbər (s)-in dili Qurana şahid olsun? Məgər Peyğəmbər (s)-in dili özündən ayrıdırmı? Bəli, həqiqəti etiraf etmək istəməyənlər onu o tərəf–bu təfərə yozur, .müxtəlif yollara əl atırlar

Şahid" sözünün Cəbrailə də təfsiri düzgün deyildir; çünki camaatın heç biri bu şahidi" .٣ .görmür. Belə isə, onun şahidliyi bihudə olacaq

!?Görəsən, onları belə əsassız yozumlara nə vadar edir

Ən maraqlısı isə Alusinin "Ruhul-məani"də yazdıqlarıdır: "Ayədə qeyd olunan . ۴ "bəyyinə" (dəlil) Quran, "şahid" isə Quranın ecazkarlığıdır. Quranın "dəlil" olmasını yalnız onun ecazkarlığı ilə başa düşməliyik və ecazkarlığı nəzərə almadan onu dəlil ".hesab etmək olmaz

.Burada da "bəyyinə" ilə "şahid" bir olacaqdır ki, bu da ayənin təfsiri ilə uyğun gəlmir

Bəyyinə" (dəlil) sözünün Peyğəmbəri-Əkrəm (s)-in öz peyğəmbərliyinə olan batini" .۵ və qəti elminə, "şahid" sözünün isə Qurani-Kərimə təfsiri də qəribədir. Çünki "bəyyinə" sözünün mənasını hər şeydən öncə Quranın özündən öyrənməliyik. Qurani-Kərimdə bu söz ١٩ dəfə, onun cəm forması olan "bəyyinat" sözü ۵٢ dəfə deyildiyi halda, batini və qəti elm mənasında deyil, adətən, "möcüzə", yaxud "səmavi kitablar və Qurani-Kərim" mənalarında işlənmişdir. Beləliklə, özümüzü zəhmətə salmadan deyirik ki, burada "bəyyinə" sözü İslam Peyğəmbərinin (s) əbədi möcüzəsi olan Qurani-Kərim, "şahid" isə .Peyğəmbəri-Əkrəm (s)-in haqq olduğuna şəhadət verən başqa bir şəxsdir

Haqq olan bu təfsirdən vəhşət edənlər isə onu hansı mənaya yozurlarsa-yozsunlar, yenə də əsassız iradlardan başqa bir nəticə almayacaqlar. Halbuki həqiqəti qəbul !etmək çox da çətin deyildir

### SİDDİQUN" (SADİQLƏR) AYƏSİ"–١٣

:Hədid" surəsinin ١٩-cu ayəsində buyurulur"

وَالَّذِينَ آمَنُوا بِاللَّهِ وَرُسُلِهِ أُوْلَئِكَ هُمُ الصِّدِّيقُونَ وَالشُّهَدَاء عِندَ رَبِّهِمْ لَهُمْ أَجْرُهُمْ وَنُورُهُمْ

Allaha və Peyğəmbərinə iman gətirənlər – məhz onlar Allah dərgahında olan siddiqlər“
.(sözündə və əməlində doğru olanlar) və şəhadət verənlərdir

"!Onların öz mükafatları və nurları vardır

Şəvahidut-tənzil" kitabında İbn Əbi Leylinin öz atasından belə nəql etdiyi qeyd" olunmuşdur: "Peyğəmbəri-Əkrəm (s) buyurub:

اَلصِّدّيقُونَ ثَلاثَةٌ: حَبيبُ النَّجّارِ مُؤمِنُ آلِ ياسينَ، حِزْبيلُ (حِزْقيلُ) مُؤمِنُ آلِ فِرْعَوْنَ، وَ عَلِيُّ بْنُ اَبى طالِبٍ الثّالِثُ وَهُوَ اَفْضَلُهُمْ:

Sadiqlər (düzdanışanlar) üç nəfərdir: Ali-Yasinin mömini Həbib Nəccar, ali-Fironun" mömini Hizbil (Hizqil) və üçüncüsü isə onların fəzilətlisi olan Əli ibn Əbi Talibdir."(١)

Bu hədis Əhməd ibn Hənbəlin "Fəzailul-xəmsə", Əbu Nəimin "Mərifətus-səhabə" və İbn Məğazilinin "Mənaqib" kitablarında da nəql olunmuşdur.(٢)

Şəvahidut-tənzil" kitabında bu məzmunda müxtəlif sənədlərlə qırx hədis nəql" olunmuşdur.(٣)

Şeyx Süleyman Qunduzi "Yənabiul-məvəddət" kitabında bu hədisi Əbu Nəimə, İbn Məğaziliyə, Müvvəffəq Xarəzmiyə və Əhməd ibn Hənbəlin "Müsnəd" kitabına istinad edərək, Əbu Leyli və Əbu Əyyub Ənsaridən nəql etmişdir.

Kənzül-ümmal" kitabında da İbn Abbasdan,(٤) eləcə də "Ehqaqul-həqq" kitabında" silsilə sənədlərlə müxtəlif kitablardan çoxlu rəvayət nəql olunmuşdur.(٥)

Bu hədislər birbaşa olaraq xilafət haqda söz açmasa da, İslam ümməti arasında "siddiq" məqamını imam Əliyə (ə) həsr edir. Bu bir fəzilətdir ki, başqaları ilə müqayisədə o həzrətin aşkar üstünlüyünün, bununla da Peyğəmbər (s)-in xəlifəlik məqamına daha layiq olduğunun şahidi oluruq.

Bir çox rəvayətlərdə imam Əli (ə) İslam ümmətinin siddiqi kimi tanıtdırılsa da, qəribədir ki, bəzi alimlər bu ləqəbi başqalarına vermişlər. Bu ayənin təfsirində nəql olunan bir sıra rəvayətlərdə siddiqlərin səkkiz nəfərdən ibarət, eləcə də imam Əli (ə) və Əbu Bəkrin də bu səkkiz nəfərin üzvü olduğu göstərilsə də, bu rəvayətlər



---

١-[١]. "Şəvahidut-tənzil", ٢-ci cild, səh. ٢٢٣, hədis: ٩٣٧.

۲- [۲] . “Şəvahidut-tənzil” kitabının haşiyəsi, Məhmudi, ۲-ci cild, səh. ۲۲۴.

۳- [۳] . “Şəvahidut-tənzil”, hədis: ۹۳۹-۹۴۲.

۴- [۴] . “Kənzül-ümmal”, ۱۱-ci cild, səh. ۶۰۱, hədis: ۳۲۸۹۷.

۵- [۵] . “Ehqaqul-həqq”, ۳-cü cild, səh. ۲۴۳.

Peyğəmbər (s)-dən nəql olunmamışdır. Peyğəmbər (s)-dən nəql olunan hədisdə isə buyurulur ki, Əli (ə) bu ümmətin siddiqidir. Bu da ayənin məfhumunun ümumiliyi ilə ziddiyyət təşkil etmir. Çünki dəfələrlə dediyimiz kimi, belə rəvayətlər ən kamil fərdə aid olub, İslam ümməti içərisində "siddiq"in ən kamil nümunəsini, sözündə və əməlində doğru olanı, Peyğəmbər (s)-ə hamıdan öncə iman gətirəni, o həzrəti birinci təsdiq edən .şəxsi (imam Əlini (ə)) göstərir

### NUR" AYƏSİ"-١۴

:Hədid" surəsinin ٢٨-ci ayəsində buyurulur"

يَا أَيُّهَا الَّذِينَ آمَنُوا اتَّقُوا اللَّهَ وَآمِنُوا بِرَسُولِهِ يُؤْتِكُمْ كِفْلَيْنِ مِن رَّحْمَتِهِ وَيَجْعَل لَّكُمْ نُورًا تَمْشُونَ بِهِ وَيَغْفِرْ لَكُمْ وَاللَّهُ غَفُورٌ رَّحِيمٌ

Ey iman gətirənlər! Təqvalı olun və Peyğəmbərinə iman gətirin ki, Allah sizə Öz" mərhəmətindən iki pay versin, sizə yol getməyiniz üçün nur bəxş etsin və sizi ".bağışlasın. Allah bağışlayan, rəhm edəndir

Şəvahidut-tənzil" kitabında bu ayənin təfsirində İbn Abbasdan belə nəql edilir: "Ayədə" qeyd olunan "Allah sizə Öz mərhəmətindən iki pay versin!" – ibarəsindən məqsəd (Allah-taalanın Əliyə (ə) mərhəmət etdiyi) Həsən və Hüseyn (ə), "Sizə yol getməyiniz üçün nur bəxş etsin!" – ibarəsindən isə məqsəd (İslam ümmətinin nuru və hidayət (nişanəsi) Əli ibn Əbi Talibdir (ə)."(١)

İbn Abbas bu sözü özündən deməmişdir; çünki elə həmin kitabda müəllif başqa bir hədisi Cabir ibn Abdullah Ənsaridən nəql edir ki, orada Peyğəmbəri-Əkrəm (s) belə buyurmuşdur: "...Allah sizə Öz mərhəmətindən iki pay versin!" – ibarəsindən məqsəd Həsən və Hüseyn (ə), "Sizə yol getməyiniz üçün nur bəxş etsin!" –ibarəsindən məqsəd (isə Əli ibn Əbi Talibdir (ə)!"(٢)

:Yenə həmin kitabda imam Baqirin (ə) belə buyurduğu nəql olunmuşdur

:مَنْ تَمَسَّکَ بِوَلايَهِ عَلِیٍّ فَلَهُ نُورٌ

(Əlinin (ə) vilayətindən yapışan şəxs üçün nur və aydınlıq vardır!"(٣"

۱- [۱] . “Şəvahidut-tənzil”, ۲-ci cild, səh. ۲۲۷, hədis: ۹۴۳.

۲- [۲] . Yenə orada, səh. ۲۲۸, hədis: ۹۴۴.

۳- [۳] . Yenə orada, hədis: ۹۴۶.

O, bunu da əsaslandırmaq məqsədilə Əbu Səid Xudridən bir hədis nəql edir ki, orada :Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur

اَما وَاللهُ لا يُحِبُّ اَهْلَ بَيْتِى عَبْدٌ اِلاّ اَعْطاهُ اللهُ عَزَّوَجَلَّ نُوراً حَتّى يَرِدَ عَلَىَّ الْحَوْضَ!:

Allaha and olsun! Allah-taala Əhli-beytimi sevən hər bir kəsə (qiyamətdə) Kövsər" (hovuzunun kənarına, mənim yanıma gəlmək üçün bir nur verəcəkdir!"(١)

:Kənzül-ümmal" kitabında imam Əlinin (ə) belə buyurduğu nəql olunmuşdur"

اَنَا عَبْدُ اللهِ وَاَخُو رَسُولِهِ وَاَنَا الصِّدِّيقُ الاَكْبَرُ لا يَقُولُها بَعْدِى اِلاّ كَذّابٌ مُفْتَرٍ وَلَقَدْ صَلَّيْتُ قَبْلَ النّاسِ سَبْعَ سِنِينَ:

Allahın bəndəsi, Peyğəmbərinin qardaşı və böyük siddiq mənəm! Bu sözü məndən" sonra iftira deyən yalançılardan başqa kimsə iddia etməz. Mən camaatdan yeddi il (qabaq (Peyğəmbər (s)-lə birlikdə) namaz qılırdım!"(٢)

Yenə həmin kitabda Məaz Ədviyyədən belə nəql edilmişdir: "Bəsrənin minbərində :Əlinin (ə) belə buyurduğunu eşitdim

اَنَا الصِّدِّيقُ الاَكْبَرُ آمَنْتُ قَبْلَ اَنْ يُؤمِنَ اَبُوبَكْرٍ وَاَسْلَمْتُ قَبْلَ اَنْ يُسْلِمَ:

Böyük siddiq mənəm! (Çünki) mən Əbu Bəkr iman gətirməzdən qabaq iman" (gətirmişəm, o, İslamı qəbul etməzdən qabaq İslamı qəbul etmişəm!"(٣)

Ümumiyyətlə, əhli-sünnə kitablarından qeyd etdiyimiz hədislərə əsasən, imam Əli (ə) fəzilətcə, Peyğəmbəri-Əkrəm (s)-dən sonra imamət və xilafət məqamına hamıdan .artıq layiq olan şəxsdir

Əllamə Əmini "Əl-qədir" adlı dəyərli əsərinin ٣-cü cildində imam Əlinin (ə) kişilər içərisində Peyğəmbəri-Əkrəm (s)-ə iman gətirən birinci şəxs olduğu ilə bağlı geniş söz açmış, məşhur əhli-sünnə alimlərinin kitablarından çoxlu rəvayət nəql etmiş, hətta bir çox İslam şairlərinin də şerlərini şahid kimi qeyd etmişdir(٤) ki, sonradan bu məsələ ilə .əlaqədar "Birinci müsəlman" adı ilə ayrıca bir fəsildə bəhs edəcəyik

### İNZAR" AYƏSİ"-١٥

:Şüəra" surəsinin ٢١٤-٢١٥-ci ayələrində buyurulur"

وَأَنذِرْ عَشِيرَتَكَ الْأَقْرَبِينَ وَاخْفِضْ جَنَاحَكَ لِمَنِ اتَّبَعَكَ مِنَ الْمُؤْمِنِينَ

səh:۲۲۷

---

۱- [۱] . Yenə orada, hədis: ۹۴۷.

۲- [۲] . "Kənzül-ümmal", ۱۳-cü cild, səh. ۱۲۲, hədis: ۳۶۳۸۹. (Beyrutun "Müəssisətur-risalə" çapı).

۳- [۳] . Yenə orada, səh. ۱۶۴, hədis: ۳۶۴۹۷.

۴- [۴] . "Əl-qədir", ۳-cü cild, səh. ۲۲۱-۲۴۱.

”!Ən yaxın qohumlarını qorxut. Sənə tabe olan möminləri qanadın altına al“

Bu ayələr bütün İslam tarixçilərinin yazdıqları bir hadisədən söz açır ki, Təbərsinin “Məcməül-bəyan” kitabında yazdığına əsasən, bu məsələ şiə və sünnülərin nəzərində məşhurdur. Hakim Həskani “Şəvahidut-tənzil” kitabında Bərra ibn Azibdən belə nəql edir: “Ən yaxın qohumlarını qorxut!” – ayəsi nazil olduqdan sonra Peyğəmbəri-Əkrəm (s) qırx nəfərdən ibarət olan Əbdülmüttəlib övladlarını bir yerə yığdı və onlara qonaqlıq süfrəsi açıb buyurdu: “Allahın adı ilə (süfrəyə) yaxınlaşın və yeyin!” Sonra südlə dolu bir qab gətirib buyurdu: “Allahın adı ilə için!” Ertəsi gün yenə onları bir yerə yığıb, süfrə başına dəvət etdi. Bu vaxt onları həm qorxudub, həm də müjdələyərək buyurdu: “Mən sizə dünya və axirətin xeyrini gətirmişəm. İslamı qəbul edin və doğru yola yönəlmək üçün mənə itaət edin!” Sonra əlavə edərək buyurdu: “Sizlərdən mənimlə (bu yolda) qardaş olmağa, mənə kömək etməyə, məndən sonra da əhli-əyalım içərisində vəsim ”?və canişinim olmağa, dinimi yaymağa kim hazırdır

Məclisə sükut çökdü. Həzrət bu sözü üç dəfə təkrar etdikdən sonra heç kim cavab verməmdiyi zaman Əli (ə) ayağa durub dedi: “Mən bu işə hazıram!” Peyğəmbər (s) ”!buyurdu: “Belə isə, mənim vəsim və canişinim sən olacaqsan

Məclisdə iştirak edənlər durub gedərkən, istehza ilə Əbu Talibə deyirdilər: “Get, oğluna ((Əliyə) itaət et ki, Mühəmməd (s) onu sənin əmirin seçdi!”(١

Şəvahidut-tənzil” kitabının haşiyəsində bu hədis Abdullah ibn Abbasdan və Əbu“ .Rafedən də nəql olunmuşdur

Nisai “Xəsais” kitabında Rəbiə ibn Nacizdən belə nəql edir: “Bir nəfər Əliyə (ə) “Sənin, əmin oğlu Mühəmməd (s)-ə varis olmağına səbəb nə idi? Halbuki səndən öndə duran əmin isə buna layiq olmadı?” – deyə soruşduqda, Əli (ə) onun cavabında “Yovmul-inzar”ı (Peyğəmbər (s)-in qırx nəfər qohumlarından ibarət təşkil etdiyi məclisi) danışdı və nəhayət, Peyğəmbər (s)-in belə buyurduğunu nəql etdi: “Sizdən hansı biriniz mənə beyət etməklə

[۱] -۱. “Şəvahidut-tənzil”, ۱-ci cild, səh. ۴۲۰ (ixtisarla) və “Məcməül-bəyan”, ۷-۸-ci cild, səh. ۲۰۶.

mənim qardaşım, dostum və varisim olmaq istəyir?” Heç kim cavab vermədikdə, mən ayağa qalxdım, halbuki hamıdan kiçik idim. Peyğəmbər (s) buyurdu: “Sən otur!” Peyğəmbər (s) sözünü üç dəfə təkrar etsə də, məndən başqa heç kim ona cavab vermədi. Axırda əlini mənim əlimə vurub buyurdu: “Buna görə də əmimi deyil, əmim (oğlumu özümə varis edirəm!”(١

Məşhur tarixçi Təbəri də bu hədisi geniş şəkildə nəql etdikdən sonra yazır: :“Peyğəmbəri-Əkrəm (s) Əliyə (ə) işarə edərək buyurdu

اِنَّ هذا اَخِی وَوَصِیِّ وَخَلِیفَتِی فِیکُمْ فَاسْمَعُوا لَهُ وَاَطِیعُوهُ:

Bu sizin aranızda mənim qardaşım, vəsim və xəlifəmdir. Ona qulaq asın və itaət edin!”“ Camaat gülə-gülə (istehza ilə) ayağa qalxıb gedərkən, Əbu Talibə (Əlinin (ə) atasına) dedilər: “Mühəmməd (s) əmr etdi ki, sən öz oğlunun sözünə qulaq asasan və itaət (edəsən!”(٢

.Təbəri bu hədisi başqa ravilərdən də nəql etmişdir

Diqqəti cəlb edən məsələ budur ki, Təbəri kimi əhli-sünnənin böyük tarixçi və müfəssiri “Tarix” kitabında (٣) bu hadisəni yuxarıdakı kimi gətirsə də, “Camiul-bəyan” təfsirində isə bu ayənin təfsirinə çatanda, Peyğəmbər (s)-in belə buyurduğunu nəql edir: “Sizdən hansı biriniz bu işdə mənə kömək edə bilər ki, sonra mənim qardaşım... sair və sair olsun!” Əli (ə) dedi: “Ey Allahın Peyğəmbəri (s)! Mən sənə kömək edə Həqiqətən, bu mənim“ :اَنَّ هـــذا اَخِی وَ کَـذا وَکَـذا :bilərəm!” Peyğəmbər (s) də buyurdu (qardaşımdır... sair və sair”(۴

Gördüyünüz kimi, Təbəri Peyğəmbər (s)-in buyurduğu “vəsiyyi və xəlifəti fikum” (Əli sizin aranızda mənim vəsim və xəlifəmdir!) – ibarələrin yerinə “kəza və kəza” (sair və sair) sözlərilə kifayətlənir ki, məbada “vəsi və xəlifə” sözləri Əhli-beyt məktəbinin .ardıcıllarının əlinə düşsün. Bunlar isə imam Əlinin (ə) xəlifəliyi üçün ən böyük dəlillərdir

Bəli, bu da əhli-sünnənin Təbəri kimi aliminin təəssübkeşliyi və həqiqəti gizlətməsi idi! Görəsən, kitab yazmaq və Peyğəmbəri-Əkrəm (s)-in hədislərinə qarşı əmanətdarlıq budurmu? Görəsən, o fikirləşmirdimi ki, bir gün gələcək, onun “Tarix” kitabındakı

---

.Təliqati Şəvahidut-tənzil”, ۱-ci cild, səh. ۴۲۳“ . [۱] -۱

.Tarixi-Təbəri”, ۲-ci cild, səh. ۶۳. Beyrut çapı“ . [۲] -۲

.Təbərinin “Tarix” kitabından əlavə, ۳۰ cilddən ibarət təfsir kitabı da vardır . [۳] -۳

Təfsiru camiul-bəyan”, Təbəri, ۱۹-cu cild, səh. ۷۵, “Şüəara” surəsinin ۲۱۴-cü“ . [۴] -۴ .ayəsi

ibarələrini “Təfsir” kitabındakı ibarələrlə müqayisə edəcəklər? Doğrusu, bu işdə heç Təbəri də tək deyildir, onunla eyni əqidədə olanların da belə hərəkətlərinə çox-çox .rast gəlinir

Alusi “Ruhul-məani” kitabında bu rəvayəti naqis və natamam şəkildə nəql etdikdən sonra yazır: “Şiələr xilafətlə bağlı məqsədlərinə çatmaq üçün bu rəvayətə istinad edirlərsə, biz də onu təvil etməli, yozmalı, yaxud da onun saxta və zəif olduğunu (deməliyik!”(١

Bu məşhur təfsir aliminin sözləri adamı dəhşətə gətirir! O deyir ki, bu rəvayət şiələrin xeyrinə qurtarmamaq üçün onu təvil etmək, yozmaq, yaxud da saxta və zəif hesab etmək lazımdır. Bu sözün mənası budur ki, Quran, hədis və tarixi həqiqətləri təhrif etmək olar, hər hansı bir məsələ onların əqidələrilə uyuşmadıqda, onu gözüyumlu saxta və zəif hesab etməliyik. Aydındır ki, bütün peyğəmbər və səmavi kitablar belə .toplaşıb, bu təfəkkür tərzinə malik olan şəxsin fikir və əqidəsini dəyişdirə bilməzlər

Əhli-sünnənin hənbəli məzhəbinin rəhbəri Əhməd ibn Hənbəl isə “Müsnəd” adlı məşhur kitabında “Yovmul-inzar” hadisəsini, hətta Peyğəmbər (s)-in belə buyurduğunu nəql edir: “Kim mənim borclarımı ödəmək, vədlərimə vəfa etmək, mənimlə behiştdə və əhli-beytimin içərisində canişinim olmaq istəyir?” Əli (ə) (Peyğəmbər (s)-ə müsbət cavab verib deyir: “Mən bu işi görərəm!”(٢

İbn Əbil-Hədid Mötəzili yazır: “Təbəri “vəzirlik” hədisini (Əlinin (ə) vəzirliyini isbat edən yuxarıdakı hadisəni) “Tarix” kitabında Abdullah ibn Abbasdan, o da Əli ibn Əbi Talibdən (ə) belə nəql etmişdir: “İnzar” ayəsi nazil olduqdan sonra Peyğəmbər (s) məni (Əli (ə)) çağırdı...” Sonra hadisəni geniş şəkildə yazır və nəhayət, Peyğəmbər (s)-in bu kəlamını nəql edir: “Allah mənə sizi Onun dininə dəvət etməyi göstəriş vermişdir. Sizdən hansı ”...biriniz bu işdə mənə yardımçı olsa, o, sizin aranızda qardaşım, vəsim və canişinimdir

Əli (ə) ayağa durub dedi: “Ya Rəsuləllah! Mən bu işdə sənə vəzir və yardımçın olmağa ”!hazıram

.Ruhul-məani”, ۱۹-cu cild, səh. ۱۳۵, bəhs etdiyimiz ayənin təfsirində“ . [۱] -۱

.(Müsnədi-Əhməd”, ۱-ci cild, səh. ۱۱۱ (azacıq ixtisarla“ . [۲] -۲

(Peyğəmbər (s) buyurdu: “Bu sizin aranızda mənim qardaşım, vəsim və xəlifəmdir.”(١

Diqqət yetirmək lazımdır ki, bu rəvayətdə və öncə qeyd etdiyimiz rəvayətlərin bir qismində işlənən “xəlifəti fikum” (sizin aranızda mənim xəlifəm) – ibarəsindən məlum olur ki, digər rəvayətlərdə qeyd olunan “əhl” sözündən də məqsəd yenə həmin .mənadır

İbn Əsir(٢) “Kamil” kitabında da bu hadisəni hətta bir çox tarix və hədis alimlərindən daha geniş şəkildə nəql edərək yazır ki, Peyğəmbər (s) buyurmuşdur: “Sizdən hansı biriniz bu işdə mənə kömək etsə, o, sizin aranızda mənim qardaşım, vəsim və xəlifəmdir!” Heç kim cavab verməyib sakit durduğu zaman Əli dedi: “Ey Allahın :Peyğəmbəri! Mən bu işdə sənə kömək edərəm!” Peyğəmbər (s) buyurdu

اِنَّ هذا اَخِی وَوَصِیِّ وَخَلِیفَتِی فِیکُمْ فَاسْمَعُوا لَهُ وَاَطِیعُوهُ:

Bu sizin aranızda mənim qardaşım, vəsim və xəlifəmdir. Ona qulaq asın və tabe“ (olun!”(٣

Bəli, İbn Əsirin nəql etdiyi bu hədisdə də “xəlifəti fikum” (sizin aranızda mənim xəlifəm) ibarəsi görünür. Həqiqətdə, Peyğəmbər (s)-in möcüzələrindən biri də budur ki, Əlinin (ə) on üç yaşı olduğu halda, onun özündən sonra xəlifə olacağını qəti şəkildə bildirir. Kim deyə bilərdi ki, on üç yaşlı bir uşaq gələcəkdə varlıq aləminin ən böyük şəxsiyyəti olan Peyğəmbər (s)-in canişini olacaq?! Peyğəmbəri-Əkrəm (s) isə bunu həm dəvətinin ilk çağlarında, həm də ömrünün sonunda “Qədir-Xum”da bəyan etmişdir. Məgər ?bunlar imam Əlinin (ə) imamətini sübut edən aydın dəlillər deyilmi

### MƏRƏCƏL-BƏHREYN” AYƏSİ”-١۶

:Ər-rəhman” surəsinin ١٩-٢٢-ci ayələrində buyurulur“

مَرَجَ الْبَحْرَيْنِ يَلْتَقِيَانِ بَيْنَهُمَا بَرْزَخٌ لَّا يَبْغِيَانِ فَبِأَيِّ آلَاء رَبِّكُمَا تُكَذِّبَانِ يَخْرُجُ مِنْهُمَا اللُّؤْلُؤُ وَالْمَرْجَانُ

O, iki dənizi bir-birinə qovuşdurdu. Halbuki onların arasında maneə vardır və bir-“ birinə qatışmırlar. Belə olduqda, Rəbbinizin hansı nemətlərini

.Nəhcül-bəlağə”nin şərhi, İ bn Əbil-Hədid, ۱۳-cü cild, səh. ۲۱۰“ . [۱] -۱

İ bn Əsir hicri qəməri tarixi ilə ۷-ci əsrin ən məşhur tarixçisi olmuş və onun . [۲] -۲
.yazdığı “Tarix” kitabı ۱۳ cilddən ibarətdir

.Kamil”, ۲-ci cild, səh. ۶۳, Beyrutun “Darus-sadir” çapı“ . [۳] -۳

"!danırsınız? O iki dənizdən inci və mərcan çıxır

Alimlərin bu ayələrin təfsirində çoxlu mübahisəli fikirləri vardır. Biz bu barədə "Təfsiri-nümunə" kitabında geniş söz açmışıq.

Bəziləri demişlər: "Ayədə qeyd olunan iki dənizdən məqsəd suları şirin və şor olan, eyni zamanda bir-birlərinə qarışmayan iki dənizdir ki, dünyanın bir çox məntəqələrində ona rast gəlmək olar.

Diqqəti cəlb edən digər bir təfsirə görə, burada məqsəd dünya okeanının ekvator boyu isti sularını hər iki qütbə doğru yönəldən (Qolfstrm cərəyanı kimi) böyük axın və cərəyanlardır ki, bəzən onların rəngi də ətraf suların rəngindən fərqlənir. Hətta bəzən onların eni ١٥٠ km, dərinliyi isə ١٠٠-٢٠٠ metr olub, gün ərzində saatda ١٦٠ km sürətlə hərəkət edir və ətraf sularla da onun istiliyi fərqlənərək, ١٠-١٥ dərəcəyə çatır. Belə isti su cərəyanları isti küləklər yaratmaqla istiliyini ətrafa yayır, şimal istiqamətindəki məntəqə və ölkələrin havasını dəyişir, mülayimləşdirir. Əgər bu cərəyanlar baş verməsə, həmin ölkələrdə həyat tərzi çətin və dözülməz olar.

Əlbəttə, bu iqlim hadisəsi dünyanın beş qitəsinin sularında müşahidə olunur. Bu prosesin əsas amili Yerin ekvator xətti boyunca, suyun tempraturunun hər iki qütblə fərqliliyidir. (Bu barədə əlavə izahat istəyənlər "Təfsiri-nümunə" kitabının ٢٣-cü cildinin ١٣١-ci səhifəsinə müraciət etsinlər.)

Quran ayələrinin zahiri və batini mənaları olduğundan, bəzən ayələr həm zahiri, həm də batini baxımdan təfsir edilir. İslam rəvayətlərində bu "iki dəniz"in batini təfsiri Əli (ə) və Fatimeyi-Zəhra (ə.s), ayədə qeyd olunan inci və mərcan sözlərinin təfsiri isə Həsən və Hüseyndir (ə).

"Şəvahidut-tənzil" kitabında "O, iki dənizi bir-birinə qovuşdurdu!" – ayəsinin təfsirində Salman Farsidən nəql olunan rəvayətdə deyilir ki, məqsəd Əli (ə) və Fatimeyi-Zəhra (ə.s)-dır. Sonra əlavə edərək Peyğəmbəri-Əkrəm (s)-in belə buyurduğunu yazır: "O iki dənizdən inci və mərcan çıxır!" – ayəsindən məqsəd Həsən və Hüseyndir (ə).(١) Bu məzmuna oxşar digər bir rəvayət İbn Abbas və Zəhhakdan da nəql olunmuşdur.(٢) Yenə həmin kitabda Səid ibn Cübeyrdən, o da İbn

Abbasdan belə nəql edilir ki, “O, iki dənizi bir-birinə qovuşdurdu!” – ibarəsindən məqsəd Əli (ə) və Fatimeyi-Zəhra (ə.s), “Onların arasında maneə vardır və bir-birinə qatışmırlar!” – ibarəsindən məqsəd sonsuz və kəsilməyən əbədi məhəbbət, “O iki dənizdən inci və mərcan çıxır!” – ibarəsindən məqsəd isə Həsən və Hüseyndir (ə).(۱)

Başqa bir hədisdə “Onların arasında maneə vardır və bir-birinə qarışmırlar!” – ayəsinin təfsirində İbn Abbasdan nəql olunan açıq-aydın bir rəvayətdə belə deyilir: “Əli (ə) ilə Fatimeyi-Zəhranın (ə.s) arasında elə sevgi və məhəbbət vardır ki, kin-küdurəti tamamilə uzaqlaşdırır.”(۲)

Ayədə qeyd olunan “bərzəx” sözü lüğətdə iki şey arasındakı maneə mənasını daşıyır. Burada da məqsəd kin-küdurəti qovan dostluq və məhəbbətdir.

Süyuti “Əd-durrul-mənsur” kitabında bu ayənin zahiri mənası ilə bağlı rəvayətləri qeyd etdikdən sonra, öncə qeyd etdiyimiz hədislərin batini mənası ilə bağlı İbn Abbasdan, o da Peyğəmbəri-Əkrəm (s)-dən nəql edərək yazır: “İbn Mərdəveyh “O, iki dənizi bir-birinə qovuşdurdu!” – ibarəsinin təfsirində İbn Abbasdan nəql edir ki, məqsəd Əli (ə) və Fatimeyi-Zəhra (ə.s), “O iki dənizdən inci və mərcan çıxır!” – ibarəsindən məqsəd isə Həsən və Hüseyndir (ə).”(۳)

O, bu rəvayəti Ənəs ibn Malikdən də nəql etmişdir.(۴)

Məşhur təfsir alimi Alusi “Ruhul-məani” kitabında yuxarıdakı rəvayəti İbn Abbas və Əyas ibn Malikdən, eləcə də Təbərsinin vasitsilə Salman Farsi, Səid ibn Cübeyr və Süfyan Suridən nəql etdikdən sonra belə yazır: “Mənim nəzərimcə, bu rəvayətlər səhih və düzgün olsa da, bu ayənin təfsiri ilə heç bir əlaqəsi yoxdur, üstəlik sufilərin bir çox ayələrlə bağlı yozumlarına bənzəyir. Əlbəttə, bizim nəzərimizcə, Əli və Fatimə elm və fəzilət baxımından dəryalardan da böyükdür. Həmçinin Həsən və Hüseyn inci və mərcandan daha gözəl, daha cəlbedicidir.”(۵)

Həqiqətdə, onun Peyğəmbər (s)-in Əhli-beytinə qarşı bu etirafı

۱- [۱]. Yenə orada, səh. ۲۱۰.

۲- [۲]. Yenə orada, səh. ۲۳۰.

۳- [۳]. “Əd-durrul-mənsur”, ۶-cı cild, səh. ۱۴۳.

۴- [۴]. Yenə orada.

۵- [۵]. “Ruhul-məani”, ۳۷-ci cild, səh. ۹۳ (bəhs etdiyimiz ayənin təfsirində).

tərifəlayiqdir; bu şərtlə ki, qeyd etdiyimiz rəvayətləri dəyərdən salmaq əzmində olmasın. Alusi guya unutmuşdur ki, bu hədis müxtəlif sənədlərlə Peyğəmbəri-Əkrəm (s)-dən nəql olunmuş və o həzrətin də ayələri təvil etməyə və yozmağa ixtiyarı vardır. Amma bunun sufilərin azğın fikirləri və sənədsiz yozumları ilə müqayisəsi isə zülm, .haqsızlıq deməkdir və belə bir alimin şən və məqamından uzaqdır

Ümumiyyətlə, bu ayə də imam Əli (ə), Fatimeyi-Zəhra (ə.s), Həsən (ə) və Hüseynin (ə) böyük fəzilətinə dəlalət edən ayələrdən biridir. Çünki Əli (ə) və Fatimeyi-Zəhra (ə.s) – Alusinin yazdığı kimi – iki böyük dəryaya bənzəyirlər. Belə ki, onlar Allahın əzəmətli nişanələri, xeyir-bərəkət mənbəyi, elm və biliklərin başlanğıcı, ismət, paklıq, səxavət, əxlaq və səciyyəvi xüsusiyyətlərin əlamətləridir. Alusi onların övladlarını da dəryanın daxilindəki zahiri və batini gözəllikdə, elm və təqvada, fəzilət və paklıqda tayı-bərabəri olmayan qiymətli, misilsiz ləl-cavahirə bənzədir. Axı, İslamda kimin haqqında bu qədər fəzilətlər deyilmişdir?! Peyğəmbər (s)-in canişinliyinə Əli (ə) və onun övladlarından başqa kim layiq ola bilər?! Doğrusu, bəzən alimlər belə, bu qədər fəzilətlərin üstündən !?necə rahat keçirlər

### NƏCVA" (PIÇILTI) AYƏSİ"–١٧

:Mücadilə" surəsinin ١٢-١٣-cü ayələrində buyurulur"

يَا أَيُّهَا الَّذِينَ آمَنُوا إِذَا نَاجَيْتُمُ الرَّسُولَ فَقَدِّمُوا بَيْنَ يَدَىْ نَجْوَاكُمْ صَدَقَةً ذَلِكَ خَيْرٌ لَّكُمْ وَأَطْهَرُ فَإِن لَّمْ تَجِدُوا فَإِنَّ اللَّهَ غَفُورٌ رَّحِيمٌ أَأَشْفَقْتُمْ أَن تُقَدِّمُوا بَيْنَ يَدَىْ نَجْوَاكُمْ صَدَقَاتٍ فَإِذْ لَمْ تَفْعَلُوا وَتَابَ اللَّهُ عَلَيْكُمْ فَأَقِيمُوا الصَّلَاةَ وَآتُوا الزَّكَاةَ وَأَطِيعُوا اللَّهَ وَرَسُولَهُ وَاللَّهُ خَبِيرٌ بِمَا تَعْمَلُونَ

Ey iman gətirənlər! Peyğəmbərlə məxfi danışığa getməzdən əvvəl (Allah yolunda)" sədəqə verin. Bu sizin üçün daha xeyirli, daha pakdır. Əgər bir şey tapmasanız, (bilin ki,) Allah bağışlayan və rəhm edəndir. Yoxsa siz məxfi danışmazdan əvvəl sədəqə verməkdən qorxdunuz?! İndi ki, siz bu işi etmədiniz və Allah da tövbənizi qəbul etdi, onda namaz qılın, zəkat verin, Allaha, Onun Peyğəmbərinə itaət edin (və bilin ki,) Allah "!nə etdiklərinizdən xəbərdardır

Bu iki ayədə mövcud olan şahidlərdən, eləcə də bir çox alimlərin, o cümlədən, Təbərsinin "Məcməül-bəyan", Fəxri-Razinin "Kəbir", Qurtubinin "Əl-camiu li-əhkamil-

Quran", Alusinin "Ruhul-məani" və digər təfsir kitablarında onun nazil olma səbəbilə əlaqədar qeydlərindən belə başa düşülür ki, bəzən müsəlmanlar (bəzi

təfsirçilərin yazdıqları kimi, sərvətli müsəlmanlar) Peyğəmbər (s)-in yanında mövqe qazanmaq üçün hər bir kiçik və əhəmiyyətsiz məsələni ona pıçıltı ilə və məxfi şəkildə bildirirdilər. Amma belə bixəbərlər anlamırdılar ki, Peyğəmbər (s) vaxtını bir fərdin əhəmiyyətsiz sözlərinə sərf etməklə mühüm işlərdən yayınır. Bu iş həm də zəif və yoxsul təbəqəni narahat edirdi. Bu zaman qeyd etdiyimiz birinci ayə nazil oldu və müsəlmanlara belə bir göstəriş verdi: “Əgər Peyğəmbərlə məxfi şəkildə danışmaq istəyirsinizsə, bu işdən öncə Allah yolunda sədəqə verin.” Bu göstəriş maraqlı bir sınaqla yanaşı, Peyğəmbər (s)-lə səmimi əlaqədə olduğunu iddia edənlərə tutarlı bir cavab oldu. Bir nəfərdən – yalnız imam Əmirəlmöminin Əlidən (ə) başqa heç kim .Peyğəmbər (ə)-lə məxfi danışmaqdan əvvəl sədəqə verməyə cürət etmədi

Bununla da müsəlmanlar imam Əlinin (ə) Allahın və Onun Peyğəmbərinin (s) yanında yüksək məqama malik olduğunun yaxından şahidi oldular. Az bir müddətdən sonra ikinci ayə nazil olub, birinci ayədə qeyd olunan hökmü ləğv etdi. Bununla da məlum oldu ki, bəzilərinin ürəklərində sərvət, mal-dövlət sevgisi Peyğəmbər (s)-lə məxfi danışmaqdan artıqdır. Həm də aydın oldu ki, məxfi danışmaq istəyənlərin sözləri .əhəmiyyətsiz və bu işdə məqsədləri yalnız ictimai mövqe qazanmaq idi

Bu ayənin təfsiri ilə əlaqədar çoxlu rəvayət nəql olunmuşdur ki, onun hökmünə əməl edən şəxs yalnız imam Əli (ə) olmuşdur. “Şəvahidut-tənzil” kitabında nəql olunur ki, :Mücahid imam Əlinin (ə) belə buyurduğunu deyir

اِنَّ فِی الْقُرْآنِ لآیَه ما عَمِلَ بِها اَحِدٌ قَبْلِی وَلا بَعْدِی وَهِیَ آیَهُ النَّجْوی، قالَ کانَ لِی دِینارٌ فَبِعْتُهُ بِعَشَرَهِ دَراهِمَ، فَکُلَّما اَرَدْتُ اَنْ اُناجِیَ النَّبِیَّ (ص) تَصَدَّقْتُ بِدِرْهَمٍ مِنْهُ ثُمَّ نُسِخَتْ:

Quranda bir ayə vardır ki, məndən qabaq və məndən sonra ona əməl edən bir kəs“ olmayıb və olmayacaq da; bu “nəcva” ayəsidir. Mənim bir dinar pulum var idi, onu on dirhəmə satdım. Bununla da hər vaxt Peyğəmbər (s)-lə məxfi danışmaq istəsəydim, bir dirhəm sədəqə verərdim. Lakin bir müddətdən sonra o ayənin hökmü (sonrakı (ayənin vasitəsilə) ləğv oldu.”(۱)



---

.Şəvahidut-tənzil”, ۲-ci cild, səh. ۲۳۱, hədis: ۹۵۱“ . [۱] -۱

Başqa bir rəvayətdə Əbu Əyyub Ənsaridən belə nəql olunur: “Bu ayə Əli (ə) haqda nazil olmuşdur. Əli (ə) Peyğəmbər (s)-lə on dəfə məxfi danışdı və hər danışığından əvvəl bir dirhəm sədəqə verdi.”(۱)

Yenə başqa bir rəvayətdə Mücahiddən belə nəql olunur: “Qurani-Kərimdə bir ayə vardır ki, hökmü ləğv olana qədər Əli ibn Əbi Talibdən (ə) başqa heç kim ona əməl etmədi. Həmin ayə “nəcva” ayəsidir. O, Allahın Peyğəmbəri ilə məxfi danışdı və bir dinar pul sədəqə verdi.”(۲)

Həmin kitabda bu barədə təxminən, on rəvayət nəql olunmuşdur.

Süyuti “Əd-durrul-mənsur” təfsirində də bu rəvayəti müxtəlif sənədlərlə (yeddi sənədlə), xüsusilə hədisin səhih və düzgünlüyü ilə bağlı Hakim Nişapurinin etirafını və imam Əlinin (ə) belə buyurduğunu nəql edir: “Qurani-Kərimdə bir ayə vardır ki, məndən qabaq və sonra ona əməl edən olmayıb və olmayacaq da.” Sonra hədisin davamını “Şəvahidut-tənzil” kitabında nəql olunduğu kimi qeyd etmişdir.(۳)

Yenə həmin kitabda bir çox ravidən belə nəql olunmuşdur: “Peyğəmbər (s) (şəxsi danışığa gəlmək istəyənlərin nə qədər sədəqə verəcəkləri barədə Əli (ə) ilə məsləhət edib) buyurdu: (Ya Əli!) Bir dinar necədir? Əli (ə) dedi: (Ya Peyğəmbər (s)!) Camaatın ona gücü çatmaz. Peyğəmbər (s) buyurdu: Bir dinarın yarısı necə? Əli (ə) dedi: Yenə də camaatın ona gücü çatmaz. Buyurdu: Bəs, nə qədər olsa, yaxşıdır? Dedi: Bir ədəd arpanın ağırlığı qədər qızıl pul! Peyğəmbər (s) buyurdu: (Ya Əli!) Onun miqdarını çox az dedin.

Onların söhbətindən bir az keçməmişdi ki, “Yoxsa siz məxfi danışmazdan əvvəl sədəqə verməkdən qorxdunuz?! İndi ki, siz bu işi etmədiniz və Allah da tövbənizi qəbul etdi, onda namaz qılın, zəkat verin...” – ayəsi nazil olub, ötən hökmü ləğv etdi.

Əli (ə) buyurur: “Allah-taala mənim vasitəmlə bu ümmətin yükünü yüngülləşdirdi.”(۴)



---

۱- [۱]. Yenə orada, səh. ۲۴۰, hədis: ۹۴۶.

.Yenə orada . [٢] -٢

.Əd-durrul-mənsur”, ٦-cı cild, səh. ١٨٥“ . [٣] -٣

.Yenə orada, ٦-cı cild, səh. ١٨٥ . [٤] -٤

Bu məsələ ilə əlaqədar Bursuinin “Ruhul-bəyan” təfsirində Abdullah ibn Ömər ibn Xəttabdan nəql etdiyi bir hədis diqqəti daha da cəlb edir. O deyir: “Əgər Əlinin (ə) malik olduğu üç fəzilətdən biri məndə olsaydı, bir dəstə qırmızı dəvəyə(۱) (ən qiymətli mala) sahib olmağımdan daha yaxşı olardı. Birincisi, Əlinin (ə) Fatimeyi-Zəhra (ə.s) ilə evlənməsi, ikincisi, “Xeybər” müharibəsində qələbə bayrağını əlinə götürməsi, (üçüncüsü, “nəcva” ayəsidir.”(۲

Bu hədisi Zəməxşəri “Kəşşaf”, Qurtubi “Əl-camiu li-əhkamil-Quran” və Təbərsi (“Məcməül-bəyan” kitablarında nəql etmişlər.(۳

Həqiqətdə, Abdullah ibn Ömər üç həssas və mühüm məsələyə işarə etmişdir. Çünki Peyğəmbər (s)-in buyurduğu kimi, bütün dünya qadınlarının ən fəzilətlisi Fatimeyi-Zəhraya (ə.s) layiq, yalnız Əlidir (ə) və Peyğəmbər (s)-dən sonra bəşəriyyətin qəhrəmanı odur! “Xeybər” döyüşündə İslam sərkərdələri məğlub olduqdan sonra Peyğəmbər (s)-in bayrağı imam Əliyə (ə) verməsi və bununla da müsəlmanların bu döyüşdə qələbəsi başqalarının arzuladığı misilsiz bir fəzilətdir. “Nəcva” ayəsinə .gəldikdə isə, bu ayəyə əməl edən yeganə şəxs imam Əli (ə) olmuşdur

Qəribədir ki, bəziləri bu məsələni əhəmiyyətsiz göstərməyə, hətta Əlinin (ə) bu fəzilətini ört-basdır etməyə cəhd etmişlər! Onlar adəti üzrə, həmişə bəhanələr, məntiqsiz və əsassız dəlillər girdabındadırlar. Bəzən deyirlər ki, səhabələrin böyükləri (sədəqə verməyi) ehtiyac bilmədikləri üçün bu işi görməmişlər; bəzən deyirlər ki, səhabələrin bu işi görməyə (sədəqə verməyə) kifayət qədər vaxtı yox idi, çünki bu hökm tez bir zamanda ləğv olundu; bəziləri də deyirlər ki, başqaları elə fikirləşərdilər ki, əgər sədəqə verib, Peyğəmbər (s)-lə məxfi danışığa getsəydilər, yoxsulları narahat, sərvətliləri isə vəhşətə salardılar. Çünki yoxsulların sədəqə verməyə gücləri çatmırdı ,və sərvətlilər də gücləri çatdıqları halda



---

Bu söz ərəblər arasında daha qiymətli əşyalar barəsində işlədilir. Onlar nəfis, . [۱] -۱ qiymətli və inci əşyaları bəyan edərkən, bu sözü işlədirlər. Bu söz atalar sözü .formasına düşmüşdür

۲- [۲]. “Ruhul-bəyan”, ۹-cu cild, səh. ۴۰۶.

۳- [۳]. “Kəşşaf”, ۴-cü cild, səh. ۴۹۴; “Əl-camiu li-əhkamil-Quran”, ۹-cu cild, səh. ۶۴۷۲ və “Məcməül-bəyan”, ۹-۱۰-cu cild, səh. ۲۵۲, bəhs etdiyimiz ayənin təfsirində.

əgər bu işi tərk etsəydilər, danlanacaqdılar. Buna görə də digər səhabələrin bu ayənin (hökmünə əməl etməməsi, onları fəzilətdən salmır."(۱)

Amma bu böyük təfsir alimləri sanki ikinci ayəni bəhanə gətirdikləri zaman tamamilə unutmuşlar ki, Allah-taala elə həmin ayədə əvvəlcə Peyğəmbər (s)-lə məxfi danışanları hökm nazil olduqdan sonra sədəqəni tərk etdikləri üçün danlayır və məzəmmət edir. Ayədə buyurulur: "Yoxsa siz məxfi danışmazdan əvvəl sədəqə verməkdən qorxdunuz?" Allah-taala bu işi tərk etməyi bir növ günah hesab edərək buyurur: "Allah tövbənizi qəbul etdi!" Bu ayədə sədəqə verməyi tərk edənlərin bağışlanmaları açıqlanır və onun əvəzində namaz qılmağa, zəkat verməyə, Allaha və Peyğəmbər (s)-ə itaət etməyə əmr olunurlar. Əgər digər səhabələrin vaxtı yox idisə, onların məqsədi yoxsulların qəlbini ələ almaq, sərvətlilərin isə vəhşətini aradan qaldırmaq idisə, onda nə üçün Allah-taala onları məzəmmət edir və tövbə məsələsini ortalığa atır?! Deməli, ayəyə diqqət yetirməklə məlum olur ki, onların tutduğu iş düzgün deyilmiş. Həqiqətdə, belə mövqedən çıxış edən alimlər əqidələri ilə uyğun gəlməyən məsələlərdə Quran ayələrini gözlərinin qabağında olduğu halda, görə .bilmirlər

Yenə bəziləri imam Əlinin (ə) fəzilətinin əhəmiyyətsiz olduğunu göstərmək üçün demişlər: "Nəcva" ayəsi ilə, onun hökmünü ləğv edən sonrakı ayə arasındakı fasilə yalnız bir saat olmuşdur. Buna əsasən, digər səhabələr onun hökmünə əməl etməyə müvəffəq olmamışlar." Bunlar da yaddaşları zəif olan qrupdan sayılır. Çünki onlar hökmü ləğv edən ayənin tonuna diqqət yetirməmişlər. Həmin ayədə bir qrup səhabə məzəmmət olunur ki, nə üçün yoxsulluğun qorxusundan sədəqə verməyi və Peyğəmbər (s)-lə məxfi danışmağı tərk etmişlər! Düzdür, onlar bu işi tərk etsələr də, Allah bağışlayan, rəhm edəndir və onların tövbəsini qəbul etmişdir. Əgər bu iki ayənin arasındakı fasilə bir saat olsaydı, Allah-taala onları məzəmmət



---

۱-[۱]. "Kəbir" təfsiri, Fəxri-Razi, ۲۹-cu cild, səh. ۲۷۲ və "Ruhul-məani", ۲۸-ci cild, səh. ۲۸.

etməzdi. Buna əsasən, bir sıra rəvayətlərin “bu iki ayənin arasındakı fasilə on gün (olmuşdur!” – deməsi daha münasibdir.(١)

Sual: Bu məsələ ilə əlaqədar yeganə bir sual qalır və o da budur ki, bu işi necə fəzilət hesab etmək olar? Bəzi təəssübkeş təfsirçilərinin dedikləri kimi, nə ona əməl etmək bir .fəzilətdir, nə də onu tərk etmək bir nöqsan və xəta

Cavab: Bu sualın da cavabı keçən bəhslərdə aydın oldu. Əlavə olaraq deyirik ki, bu sualın cavabını tapmaq üçün ən yaxşı yol Qurani-Kərimə müraciət edib, hökmü ləğv edən (ikinci) ayəyə diqqət yetirməkdir. Bu ayədən göründüyü kimi, Allah-taalanın bu əmrilə müsəlmanlar sınağa çəkilirlər. Belə ki, Peyğəmbər (s)-lə şəxsi danışmaq istəyənlər müsəlmanları nəzərə alaraq yenidən danışıq üçün pul xərcləməli, Allah yolunda sədəqə verməli idilər. Burada yalnız bir nəfər bu ilahi sınaqdan layiqincə keçdi və o da Əli ibn Əbi Talib (ə) oldu. Məgər bu böyük bir iftixar və fəzilət deyilmi?! Başqa sözlə desək, bütün səhabələr ayədə məzəmmət olunduğu və onların tövbəsindən söz .açıldığı halda, burada müstəsna olunan şəxs yalnız imam Əli (ə)-dır

Doğrusu, bəs, nə üçün bəzi alimlər belə açıq-aydın həqiqəti inkar etmək istəyirlər? !Bunun səbəbi haqda özünüz fikirləşin

### SABİQUN” (ÖNDƏ OLANLAR) AYƏSİ”–١٨

:Vaqiə” surəsinin ١٠-١٤-cü ayələrində buyurulur“

وَالسَّابِقُونَ السَّابِقُونَ أُوْلَئِكَ الْمُقَرَّبُونَ فِى جَنَّاتِ النَّعِيمِ ثُلَّةٌ مِّنَ الْأَوَّلِينَ وَقَلِيلٌ مِّنَ الْآخِرِينَ

Öndə olanlar, öndə olanlar! Onlar yaxın olanlardır. Onlar behiştin nemətlə dolu“ ”!bağlarında olacaqlar. Bir qrupu əvvəlki ümmətlərdən, az bir qismi də sonrakılardandır

Hakim Həskani “Şəvahidut-tənzil” kitabında İbn Abbasdan belə nəql edir: “(İmanda) öndə olanlar üç nəfərdir: Musaya iman gətirən Yuşə ibn Nun, İsaya iman gətirən Sahibi-Yasin (Həbib Nəccar) və

Ruhul-məani” təfsirində bu nəzər xəlifə Mənsur Dəvaniqinin dövründə yaşayan “ . [۱] -۱
.və “tabein” şagirdlərindən olan Müqatildən nəql olunmuşdur

(Peyğəmbəri-Əkrəm (s)-ə ilk iman gətirən Əli!”(١)

Yenə həmin kitabda İbn Abbasın belə dediyi nəql olunur: “Peyğəmbəri-Əkrəm (s)-dən :bu ayənin təfsirini soruşdum. Həzrət buyurdu

حَدَّثَنِی جَبْرَئِیلُ بِتَفْسِیرِها، قالَ ذاکَ عَلِیٌّ وَشِیعَتُهُ اِلَی الْجَنَّهِ:

Mən onun təfsirini Cəbraildən soruşdum. O dedi: “Ayə Əli və onun şiələrinə aiddir ki,“ (hamıdan öncə behiştə girəcəklər!”(٢)

Bu iki hədis və təfsir bir-birilə ziddiyyət təşkil etmir; çünki Əli (ə) həm Peyğəmbər (s)-ə iman gətirməkdə, həm də behiştə daxil olmaqda hamıdan öndədir. Həqiqətdə, bu iki təfsirin bir-birilə sıx bağlılığı vardır. (Yəni hamıdan əvvəl Peyğəmbər (s)-ə iman gətirən (!şəxs hamıdan əvvəl də behiştə daxil olacaqdır

.Həmin kitabda bu barədə bundan əlavə neçə hədis də nəql olunmuşdur

Əd-durrul-mənsur” kitabında da İbn Əbi Hatəm və İbn Mərdəveyh həmin ayənin“ təfsiri ilə bağlı İbn Abbasdan iki rəvayət nəql edirlər ki, birində belə deyilir: “Musaya (ə) iman gətirən birinci şəxs Yuşə ibn Nun, İsaya (ə) iman gətirən birinci şəxs Həbib Nəccar və İslam Peyğəmbərinə (s) iman gətirən birinci şəxs isə Əli ibn Əbi Talibdir ((ə)!”(٣)

Həmin kitabda bu məzmunda daha bir neçə hədis də nəql olunmuşdur.(۴)Bu hədisi :nəql edən alimlər aşağıdakılardır

;(İbn Məğazili, “Əl-ümdə” kitabı (İbn Bitriqdən nəqlən–

;Sibt ibn Cövzi, “Təzkirə” kitabı–

;İbn Kəsir, “Təfsir” kitabı–

;İbn Həcər, “Əs-səvaiq” kitabı–

;Əllamə Şövkani, “Fəthul-qədir” kitabı–

.Şeyx Süleyman Qunduzi, “Yənabiul-məvəddət” kitabı–

Diqqəti cəlb edən məsələ budur ki, imamət və xilafətə qarşı qatı təəssübkeşliyi olan Qazı Ruzbehan "İbtalu-nəhcil-həqq" kitabında



---

۱- [۱] . "Şəvahidut-tənzil", ۲-ci cild, səh. ۲۱۳, hədis: ۹۲۴.

۲- [۲] . Yenə orada, səh. ۲۱۵-۲۱۶, hədis: ۹۲۷.

۳- [۳] . "Əd-durrul-mənsur", ۶-cı cild, səh. ۱۵۴.

۴- [۴] . Yenə orada.

qeyd etdiyimiz ayələrin təfsiri ilə əlaqədar sünnü mənbələrində İbn Abbasdan nəql olunan “İmanda bu ümmətin qabaqcılı (bu ümmətin birinci iman gətirəni) Əli ibn Əbi Talibdir (ə)!” – hədisinə istinad edən Əllamə Hillinin cavabında yazır: “Bu hədisin əhli-sünnə mənbələrindəki ibarəsi belədir: “Ümmətin öndə gedənləri üç nəfərdir: Ali-Fironun mömini (Asiya), Həbib Nəccar və Əli ibn Əbi Talib.” Sonra əlavə edərək yazır: “Şübhəsiz, Əli (ə) İslamda hamıdan öndə idi, saysız-hesabsız fəzilətləri vardır, lakin (bunlar onun imamətinə dəlil deyildir!”(١)

Diqqət yetirmək lazımdır ki, hələlik biz bu hədislərin Əli ibn Əbi Talibin (ə) imamətinə dəlalət etməsini demək əzmində deyil, lakin ayə və rəvayətləri bir-birinin kənarına düzdükdə, Əlini (ə) İslam ümmətinin ən fəzilətli və bu məqama daha layiq şəxs olduğunu və bu məsələdə heç kəsin onun fəzilətinə çata bilmədiyini görürük. Görəsən, bu qədər inkaredilməz fəzilətlərlə yanaşı, başqalarını o həzrətdən üstün tutmağımız !düzgün bir işdirmi?! Əlbəttə, xeyr

:Burada bir neçə mühüm məsələni qeyd etməklə bəhsimizi tamamlayırıq

Ayədə qeyd olunan “qəlilun minəl-axirin” (az bir qismi də sonrakılardır) – ibarəsindən (١ ?məqsəd kimlərdir

Ötən ayələrdə öndə gedənlərin yüksək məqamından, Allahın dərgahına yaxın olmalarından və onların behiştin nemətlə dolu bağlarında yaşayacaqlarından söz :açıldı. Həmin ayələrin davamında isə belə buyurulur

ثُلَّةٌ مِّنَ الْأَوَّلِينَ وَقَلِيلٌ مِّنَ الْآخِرِينَ

(Bir qrupu əvvəlki ümmətlərdən, az bir qismi də sonrakılardandır!”(٢“

Hakim Həskani “Şəvahidut-tənzil” kitabında Məhəmməd ibn Fərat, Məhəmməd ibn Səhl və Əli ibn Abbasdan bir neçə rəvayət nəql etmişdir ki, Cəfər ibn Mühəmməd (s) “az bir qismi də sonrakılardır!” – ayəsinin təfsirində buyurmuşdur: “O, Əli ibn Əbi



---

Onun ibarəsi olduğu kimi “Ehqaqul-həqq” kitabının ٣-cü cildinin ١٢١-ci səhifəsində . [١] -١

(Talibdir!”(١)

Məlum olduğu üzrə, ayənin mənası bu deyil ki, İslam ümməti içərisində behiştə yalnız Əli (ə) gedəcək; əksinə imanda hamıdan öndə olmaq behiştdə yüksək məqamı tələb edir. Bu da Peyğəmbəri-Əkrəm (s)-dən sonra imam Əli ibn Əbi Talibə (ə) məxsusdur. Buna görə də behiştə öndə gedənlərin (“Əshabul-Yəmin”in – sağ tərəf sahiblərinin) məqamlarından söz açan “Vaqiə” surəsinin sonrakı ayələrində buyurulur ki, bir qrup əvvəlki ümmətlərdən, bir qrup da sonrakı ümmətdən, yəni Mühəmməd (s)-in ümmətindən behiştə daxil olacaq. Aydındır ki, əməl dəftəri sağ əllərinə verilən kəslər behişt əhlidirlər, lakin onların məqamı öndə gedən və Allah dərgahına yaxın olanların .məqamına çata bilməz

?Birinci müsəlman kimdir (٢

Bu məsələ ilə əlaqədar ən mühüm bəhslərdən biri də İslam Peyğəmbərinə (s) iman gətirən və beyət edən birinci şəxsin kim olmasıdır. Bütün İslam ümmətinin yekdil fikrinə görə, qadınlar içərisində Peyğəmbər (s)-ə iman gətirən birinci şəxs Xədicə (ə.s), kişilər içərisində isə Əli (ə)-dır. O, Peyğəmbər (s)-ə iman gətirən, onunla beyət edib namaz qılan, rüku və səcdə edən birinci şəxsdir və bu, bütün İslam mənbələrində açıq-:aydın göstərilmişdir. Biz burada həmin mənbələrin bir qisminə işarə edirik

Səhabədən on səkkiz nəfəri müxtəlif silsilə sənədlərlə Peyğəmbəri-Əkrəm (s)-dən nəql etmişlər ki, İslamı qəbul edən və Peyğəmbəri-Əkrəm (s)-lə namaz qılan birinci kişi :imam Əli (ə) olmuşdur

:Əbu Səid Xudri deyir: Peyğəmbəri-Əkrəm (s) əlini Əlinin (ə) kürəyinə vurub buyurdu .١

يا عَلِيّ لَکَ سَبْعَ خِصالٍ لا يُحاجُّوکَ فِيهِنَّ اَحَدٌ يَوْمَ الْقِيامَهِ اَنْتَ اَوَّلُ الْمُؤْمِنِينَ اِيماناً بِاللهِ...

Ya Əli! Sən yeddi xislətə maliksən ki, qiyamət günü heç kəs sənə tay ola bilməz“ (səninlə mübahisə edə bilməz): “Birincisi budur ki, Allaha iman gətirən (və İslamı qəbul (edən) ilk şəxs sənsən...”(٢)

.Şəvahidut-tənzil”, ٢-ci cild, səh. ٢١٨, hədis: ٩٣٢-٩٣٥“ . [١] -١

.Hilyətül-övliya”, Əbu Nəim İsfahani, ١-ci cild, səh. ۶۶“ . [٢] -٢

Ayişə deyir: Mühəmməd (s)-in qızı Fatimə mənə o həzrətin belə buyurduğunu dedi: .٢ “Səni elmi bütün möminlərin elmindən çox, İslamı hamıdan əvvəl qəbul edən və helmi hamının helmindən çox olan bir nəfərlə evləndirəcəyəm!”(١)

İbn Abbas deyir ki, Ömər ibn Xəttabın belə dediyini eşitdim: “Əlinimpis adla .٣ çağırmayın. Mən onun haqqında Peyğəmbərdən bəzi fəzilətlər eşitmişəm ki, əgər onların biri Xəttabın övladlarında olsaydı, mənim üçün günəşin saçdığı hər bir şeydən sevimli olardı. Mən, Əbu Bəkr, Əbu Übeydə və bir qrup səhabə Ümmü Sələmənin evinə getdik. Əlini onun evinin qapısının arxasında durduğunu görüb dedik: “Peyğəmbəri (s) görmək istəyirik!” Əli buyurdu: “İndi gələcək.” Peyğəmbər gələrkən, biz də o həzrətə tərəf getdik. Həzrət, Əliyə söykəndi və əli ilə onun çiyininə vurub buyurdu:

اِنَّکَ مُخاصِمٌ، اَنْتَ اَوَّلُ الْمُؤمِنِینَ اِیماناً وَ اَعْلَمُهُمْ بِاَیّامِ اللهِ وَ اَوْفاهُمْ بِعَهْدِهِ وَاَقْسَمُهُمْ بِالسَّوِیَّهِ وَاَرْاَفَهُمْ بالرَّعِیَّهِ وَ اَعْظَمُهُمْ الرَّزِیَّهَ:

Səninlə müxalifətə qalxacaqlar, halbuki sən iman gətirən ilk möminsən, ruzigardan" hamıdan çox xəbərdarsan, ilahi əhd-peymana ən vəfalısan, ədalətlə bölgüdə hamıdan dəqiqsən, rəiyyətə qarşı hamıdan mehribansan və sənin müsibətin də hamının müsibətindən böyükdür!”(٢)

Məaz ibn Cəbəl Peyğəmbəri-Əkrəm (s)-in imam Əliyə (ə) belə buyurduğunu nəql .٤ edir: “Səni camaatdan ayıran yeddi xislətin vardır ki, Qüreyş tayfasından heç kim səninlə həmin yeddi məsələdə mübahisə (və bərabərlik iddiası) edə bilməz; sən Allaha iman gətirən birinci şəxssən...”(٣)

Cəfər ibn Əbi Talibin zövcəsi Əsma binti Ümeys nəql edir ki, Peyğəmbəri-Əkrəm (s) .٥ qızı Fatimeyi-Zəhraya (ə.s) buyurdu: “Səni İslamda hamıdan öndə, helmi hamının helmindən böyük, elmi hamının elmindən çox olan bir şəxslə evləndirəcəyəm!”(۴)

Salman Farsi Peyğəmbəri-Əkrəm (s)-in belə buyurduğunu deyir: “Kövsər hovuzunda .۶ mənə qovuşan birinci şəxs İslam dinini



---

١-[١] . “Tarixi-Dəməşq”, İbn Əsakir, ١-ci cild, səh. ٢۴۴, Beyrut çapı.

.Kənzül-ümmal”, ۱۳-cü cild, səh. ۱۱۷, Beyrutun “Müəssisətur-risalət” çapı“ . [۲] -۲

Tovzihud-dəlail”, Şəhabəddin Hüseyni Şafei, səh. ۱۷۱, “Ehqaqul-həqq” “ . [۳] -۳
.kitabından nəqlən, ۲۰-ci cild, səh. ۴۵۵

.Tarixi - İbn Əsakir”, ۱-ci cild, səh. ۲۴۵, Beyrut çapı“ . [۴] -۴

(qəbul edən birinci şəxsdir: O, Əli ibn Əbi Talibdir!”(١)

Əbu Süxeylə deyir: “Mən və Salman həcc əməllərini yerinə yetirdikdən sonra . ٧ Əbuzərin yanına getdik və bir az onun yanında oturduq. Ayağa qalxıb qayıtmaq istədikdə, dedim: “Ey Əbuzər! Mən bir sıra işlərin baş verdiyini görür və camaatın arasında ixtilaf düşəcəyindən qorxuram. Əgər belə bir hadisə baş versə, mənə nə göstəriş verəcəksən?” Əbuzər dedi: “Allah-taalanın kitabı və Əli ibn Əbi Talibdən ayrılma! Şəhadət verirəm ki, Peyğəmbəri-Əkrəm (s)-in belə buyurduğunu özüm eşitmişəm: “Əli mənə iman gətirən və qiyamət günü mənimlə görüşəcək birinci şəxsdir. O, “böyük siddiq” (sözündə və əməlində doğru) və “faruq”dur, yəni haqqı (batildin ayırandır!”(٢)

Əbdür-Rəhman ibn Ovf bir hədisdə “əs-sabiqunəl-əvvəlun” (öndə gedən birincilər) – .٨ ayəsinin təfsirində deyir: “Onlar Qüreyşdən olan on nəfərdir. Onların da içərisində (birinci şəxs İslamı ilk qəbul edən Əli ibn Əbi Talibdir (ə).”(٣)

Cəmaləddin Əbül-Həccac “Təhzibul-kəmal” kitabında Peyğəmbəri-Əkrəm (s)-in . ٩ :səhabəsi Əbu Rafedən belə nəql etmişdir

اَوَّلُ مَنْ اَسْلَمَ مِنَ الرِّجالِ عَلِيٌّ:

(Kişilərdən İslamı qəbul edən birinci şəxs Əli (ə) idi!”(٤“

Peyğəmbəri-Əkrəm (s)-in xidmətçisi Ənəs ibn Malik o həzrətin belə buyurduğunu .١٠ :nəql edir

اَوَّلُ هذِهِ الْاُمَّهِ وُرُوداً عَلَیَّ الْحَوْضَ اَوَّلُها اِسْلاماً عَلِیُّ بْنُ اَبِی طالِبٍ (ع):

Bu ümmətdən Kövsər hovuzunda mənə qovuşan ilk şəxs İslam dinini qəbul edən ilk“ (şəxsdir. O, Əli ibn Əbi Talibdir!”(٥

İbn Abbas deyir: “Əli (ə) heç kimdə olmayan dörd xislətə .١١



---

Əl-cövhərə”, Məhəmməd ibn Əbi Bəkr, səh. ٨, Dəməşq çapı; “Kənzül-ümmal”“ . [١] -١

(kitabın müəllifi bu hədisi sənədsiz nəql etmişdir), ١١-ci cild, səh. ٦١٦, Beyrutun .“Müəssisətur-risalət” çapı

Təlxisu tarixid-Dəməşq”, müəllif: “ İ bn Mənzur” adı ilə məşhur olan İ mam“ . [٢] -٢ Məhəmməd ibn Mükərrəm, ١٧-ci cild, səh. ٣٠٦, Dəməşqin “Darul-fikr” çapı, “Ehqaqul-həqq” kitabından nəqlən, ٢٠-ci cild, səh. ۴٧٢ və “Kənzül-ümmal”, ١١-ci cild, səh. ٦١٦, .hədis: ٣٢٩٩٠

.Təlxisu tarixid-Dəməşq”, ١٧-ci cild, səh. ٣٠٧“ . [٣] -٣

Təhzibul-kəmal”, ٣-cü cild, səh. ٨۵, “Ehqaqul-həqq” kitabından nəqlən, ٢٠-ci cild,“ . [۴] -۴ .səh. ٣٦٧

.Tarixi-Hələbi”, İ bn Ədim Hələbi, səh. ٢٩۵“ . [۵] -۵

malik idi. “...O, ərəb-əcəm içərisində Peyğəmbəri-Əkrəm (s)-lə namaz qılan birinci şəxsdir!”(۱)

Başqa bir hədisdə isə belə deyir: “Xədicədən sonra iman gətirən birinci şəxs Əli ibn Əbi Talibdir.”(۲)

۱۲. Məşhur hədis alimi Nisai “Sünən” kitabında Zeyd ibn Ərqəmdən belə nəql edir: “Peyğəmbər (s)-ə iman gətirən birinci şəxs Əli ibn Əbi Talibdir (ə)!”(۳)

۱۳. Əbu Əhməd Cürcani Şafei “Əl-kamilu fir-rical” kitabında Malik ibn Hurisdən belə nəql edir: “Kişilərdən İslam dinini qəbul edən birinci şəxs Əli, qadınlardan isə Xədicə olmuşdur!”(۴)

۱۴. Peyğəmbəri-Əkrəm (s)-in dövründə müharibədə yaralananlara yardım edən Leyla Qifariyyə adlı bir qadın deyir: “Mən Əlinin (ə) qoşununda müharibə məqsədilə Bəsrəyə getdim. Ayişənin o həzrətə qarşı çıxdığını görüb, şübhəyə düşdüm. Onun yanına gedib soruşdum: “Peyğəmbəri-Əkrəm (s)-dən Əli (ə) haqqında bir fəzilət eşitmisənmi?” Dedi: “Bəli!” Sonra bir əhvalat danışdı və nəhayət, Peyğəmbəri-Əkrəm (s)-in belə buyurduğunu dedi: “Əli mənə iman gətirən birinci şəxsdir!”(۵)

۱۵. Əhməd ibn Hənbəl “Müsnəd” kitabında məşhur səhabə Məqil ibn Yəsardan belə nəql edir: “Bir gün Peyğəmbər (s)-in hüzuruna getmişdim. Peyğəmbər (s) mənə buyurdu: “Fatimə xəstədir, onu görməyə gedirəm!” Biz Fatimənin (ə.s) evinə getdik. Peyğəmbər (s) onun vəziyyətini soruşduqda, Fatimə (ə.s) dedi: “Qəm-qüssəm çox, yoxsulluğum şiddətli, xəstəliyim uzundur...” Peyğəmbər (s) (bu çətinliklərin müqabilində ona təsəlli verərək buyurdu: “Məgər buna razı deyilsənmi ki, mən səni İslam ümməti içrə hamısından öndə, elmi hamının elmindən çox, helmi hamının helmindən böyük olan şəxslə evləndirmişəm?”(۶)

səh:۲۴۵

---

۱- [۱]. “Əl-muxtar fi mənaqibil-əbrar”, səh. ۱۶, “Ehqaqul-həqq” kitabından nəqlən, ۲۰-ci cild, səh. ۴۵۷.

۲- [۲]. “Ali-Mühəmməd (s)”, Hüsaməddin Hənəfi, səh. ۱۷۴.

۳- [۳] . “Ehqaqul-həqq”, ۲۰-ci cild, səh. ۴۷۵.

۴- [۴] . “Əl-kamilu fir-rical”, ۶-cı cild, səh. ۲۳۷۸, Beyrutun “Darul-fikr” çapı.

۵- [۵] . “Təlxisu tarixid-Dəməşq”, ۱۷-ci cild, səh. ۱۱۹.

۶- [۶] . “Müsnədi-Əhməd”, ۵-ci cild, səh. ۲۶, “Darus-sadir” çapı.

Diqqət yetirmək lazımdır ki, bu hədis İbn Əbil-Hədidin “Nəhcül-bəlağə”nin şərhi (٣-cü cild, səh. ٢٥٧), İbn Əsakirin “Dəməşqin tarixi” (١-ci cild, səh. ٢٣٢), Əl-Heysəminin “Məcməüz-zəvaid” (٩-cu cild, səh. ١٠١), Müttəqi Hindinin “Kənzül-ümmal” (١٢-ci cild, səh. ٢٠٥) və digər əhli-sünnə alimlərinin kitablarında da nəql olunmuşdur.

١٦. Peyğəmbəri-Əkrəm (s)-in səhabəsi Abdullah ibn Sabit deyir: “Bir gün Peyğəmbəri-Əkrəm (s)-in hüzuruna gedib dedim: “(Ya Peyğəmbər!” Sənin elə bir sevimli səhabən varmı ki, bir hadisə baş verdikdə, ona qoşulaq və bir təhlükə zamanı onun yolunda fədakarlıq göstərək?”

Peyğəmbər (s) buyurdu: “O, hamıdan əvvəl müsəlman olan və İslamı qəbul edən Əlidir!”(١)

Bu hədisdə açıq-aydın göstərilir ki, Abdullah ibn Sabit kimiləri Peyğəmbəri-Əkrəm (s)-dən sonra imamət və vilayət məqamına hamıdan layiq kim olduğunu bilmək istədikdə, Peyğəmbər (s) imam Əlini (ə) göstərmişdir.

١٧. Peyğəmbəri-Əkrəm (s)-in Büreydə adlı başqa bir səhabəsi də Məqil ibn Yəsarın nəql etdiyi hədisə bənzər bir hədis nəql etmişdir ki, onun sonunda belə deyilir: “Peyğəmbəri-Əkrəm (s) Fatimeyi-Zəhraya (ə.s) təsəlli verərək buyurdu: “Allah-taala sənə İslamı hamıdan öncə qəbul edən, elmi hamının elmindən çox, helmi hamının helmindən böyük olan bir ər vermişdir.” Sonra Peyğəmbər (s) buyurdu: “Allaha and olsun! Sənin iki övladın (Həsən və Hüseyn) behişt cavanlarının sərvəridirlər!”(٢)

١٨. Məhəmməd ibn Əbi Bəkr Ənsarinin “Əl-cövhərə” kitabında nəql etdiyi hədisdə deyilir ki, Əli (ə) Bəsrənin minbərində buyurdu: “Böyük siddiq mənəm. Mən Əbu Bəkrdən qabaq iman gətirdim və İslamı qəbul etdim.”(٣)



---

١- [١]. “Mənaqib”, Əhməd ibn Mərdəveyh, “Ehqaqul-həqq” kitabından nəqlən, ١٥-ci cild, səh. ٣٣٦.

٢- [٢]. “Tarixud-Dəməşq”, İ bn Əsakir, ١-ci cild, səh. ٢٤٢, Beyrut çapı və “Ərcəhül-mətalib”, Əllamə Olmert Sirri, səh. ١٠٧ və ٣٩٦.

Əl-cövhərə", səh. ٨, Dəməşq çapı. Başqa alimlər də bu hədisi nəql etmişlər: "Əl-" . [٣] -٣
kamilu fir-rical", Əbu Əhməd Cürcani, ٣-cü cild, səh. ١١٢٣; "Tovzihud-dəlail", səh. ١٧١ və
."Təlxisu tarixid-Dəməşq" və s

Şeyx Məhəmməd ibn Mükərrəm Ənsari “Təlxisu tarixid-Dəməşq” adlı kitabında imam Əlinin (ə) belə buyurduğunu nəql edir: “İslamı qəbul edən birinci şəxs mənəm!”(۱)

“Nəhcül-bəlağə”də də dəfələrlə bu məsələ qeydə alınmış və imam Əli (ə) ۱۳۱-ci xütbədə belə buyurumuşdur:

اَللّهُمَّ اِنِّی اَوَّلُ مَنْ اَنابَ وَ سَمِعَ وَ اَجابَ لَمْ یَسْبِقْنِی اِلاّ رَسُولُ اللهِ (ص) بالصَّلاه:

“İlahi! Sənə üz tutub, əmrini eşidən və qəbul edən birinci şəxs mənəm. Peyğəmbəri-Əkrəm (s)-dən başqa heç kim məndən qabaq namaz qılmamışdır!”(۲)

Burada biz nəzərə çarpacaq dərəcədə söhbəti uzatdıq və təfsir üslubundan xaric olduq. Lakin məsələ bundan da artıq bəhsi tələb edir.

Bu məsələni də İbn Hişamın “Əs-sirətun-nəbəviyyə” adlı məşhur kitabında nəql etdiyi bir rəvayətlə sona çatdırırıq. Əlbəttə, etiraf etməliyik ki, bu haqda nəql olunan rəvayətlər olduqca çoxdur. O yazır: “İslamın ilk çağlarında Peyğəmbəri-Əkrəm (s) namazı məxfi şəkildə – Məkkənin dərələrində qılardı. Onunla bu yolda bir addım atan və namaz qılan şəxs yalnız Əli ibn Əbi Talib (ə) idi... Günlərin birində atası Əbu Talib ondan “Oğlum! Sənin qəbul etdiyin bu din nədir?” – deyə soruşduqda, Əli (ə) buyurdu: “Ata can! Mən Allaha, Peyğəmbərinə (s) və Allah tərəfindən göndərilənə iman gətirmişəm və onunla birgə namaz qılıram...” Əbu Talib dedi: “Agah ol ki, o, səni yalnız xeyir və yaxşılığa dəvət edir. Ondan heç vaxt ayrılma!”(۳)

İmam Əlinin (ə) ilk müsəlman olaraq iman gətirməsi o qədər aydın bir məsələdir ki, məşhur şairlər də şerlərində bunu o həzrətin iftixar və fəziləti kimi qeyd etmişlər. Şairlərdən biri demişdir:

“Ələysə əvvələ mən səlla li-qiblətikum,

Vəələmənnasə bil-Qurani vəs-sunəni?”

“Məgər o, sizin qiblənizə tərəf namaz qılan, Quranı və sünnəni hamıdan yaxşı bilən birinci şəxs deyilmi?!”

.Təlxisu tarixid-Dəməşq", ١٧-ci cild, səh. ١١٨" . [١] -١

.Bu ibarə "Nəhcül-bəlağə"nin ٧١-١٩٢-ci xütbələrində də gəlmişdir . [٢] -٢

.Sireyi- İ bn Hişam", ١-ci cild, səh. ٢۶٣, "Daru ehyait-turasil-ərəbi" çapı" . [٣] -٣

:Başqa bir şair isə belə demişdir

„Fə-haza və fil-İslami əvvəlu muslimin“

”.Və əvvəlu mən səlla və samə və həllən

O, İslam aləmində birinci müsəlman, namaz qılan, oruc tutan və “La ilahə illəllah”“ ”!deyən birinci şəxsdir

Mərhum Əllamə Əmini “Əl-qədir” kimi dəyərli əsərində buna toxunan on nəfərdən çox şairin adını və şerlərini qeyd etmişdir.(١) O, həmin kitabda Peyğəmbəri-Əkrəm (s), Əmirəlmöminin Əli (ə), səhabə və tabeindən (tarix və hədis alimlərinin kitablarından) yüzdən artıq hədis nəql etmişdir ki, onların hamısında imam Əlinin (ə) kişilər içərisində .İslam Peyğəmbərinə (s) iman gətirən birinci şəxs olduğu göstərilir

Sual: Burada elə İslamın əvvəllərindən bəzi bəhanə axtaranlar tərəfindən belə bir məşhur sual irəli sürülmüşdür: “Düzdür, Əli (ə) İslamı qəbul edən birinci şəxsdir, lakin yetkinlik həddinə çatmayan ١٠ yaşlı bir uşağın İslamı qəbul etməsi nə qədər mühüm ola bilər?! Halbuki onun yetkinlik dövrünü meyar və əsas götürsək, başqaları ondan ”.qabaq İslamı qəbul etmişlər

Cavab: Burada xəlifə Məmunla onun müasiri İshaq adlı məşhur əhli-sünnə alimi arasında baş verən danışıqları qeyd etməyi münasib görürük (bu əhvalatı İbn Əbdu :(Rəbbih “İqdul-fərid” kitabında qeyd etmişdir

Məmun, İshaqa deyir: “İslam Peyğəmbərinin (s) peyğəmbərliyə seçildiyi gün ən“ ?fəzilətli əməl nə ola bilərdi

İshaq: “Allahın yeganəliyinə və Peyğəmbər (s)-in risalətinə səmimi qəlbdən şəhadət ”.vermək

”?Məmun: “Əlidən öncə İslamı qəbul edən bir şəxsi tanıyırsanmı

”.İshaq: “Əli İslamı qəbul edəndə, yaşı çox az idi və ilahi hökmlər ona aid deyildi

Məmun: “Məgər Əlinin İslam dinini qəbul etməsi Peyğəmbəri-Əkrəm (s)-in dəvəti ilə

olmayıbmı? Məgər Peyğəmbər (s) onun İslamını qəbul etmədimi? Belə isə, necə ola bilər ki, Peyğəmbər (s) bir kəsi İslama dəvət etsin, amma onun İslamı qəbul ”?olunmasın



---

.Əl-qədir”, ۳-cü cild, səh. ۲۳۱-۲۳۳“ . [۱] -۱

(İshaq, Məmunun bu sualına daha cavab verə bilməyib susdu.(١)

Mərhum Əllamə Əmini bu əhvalatı “İqdül-fərid” kitabından nəql etdikdən sonra yazır: “Əbu Cəfər İskafi Mötəzili (vəfatı: ٢٤٠-cı h.q ili) öz risaləsində yazmışdır ki, hamının bildiyi kimi, imam Əli (ə) çərşənbə axşamı Peyğəmbər (s)-ə iman gətirmiş və özü buyurmuşdur ki, mən başqalarından yeddi il qabaq namaz qılmağa başlamışam! O, həmişə deyərdi: “Mən İslamı qəbul edən birinci şəxsəm.” Bu isə hər məşhur məsələdən də məşhurdur. Biz keçmişdəkilər arasında elə bir şəxs tapa bilmədik ki, Əlinin (ə) İslamı qəbul etməsini yüngül saysın, yaxud “İslamı uşaq ikən qəbul etdi!” – desin. Maraqlıdır ki, Abbas və Həmzə kimi şəxsiyyətlər İslamı qəbul etmək üçün Əbu Talibin rəftarını gözləyirdilər. Lakin Əbu Talibin oğlu isə heç vaxt atasını gözləməyərək, (Peyğəmbər (s)-ə iman gətirdi.”(٢)

Bir sözlə, İslam Peyğəmbəri (s) imam Əlinin (ə) imanını qəbul etdiyi halda, bunu mötəbər saymayanlar həqiqətdə Peyğəmbəri-Əkrəm (s)-ə irad tuturlar. Bir də “Yovmud-dar” hədisində dedik ki, Peyğəmbər (s) Qüreyşin mühüm adamlarını bir yerə yığıb, onları İslam dininə dəvət edərkən belə buyurmuşdur: “İslamın müdafiəsinə qalxaraq dəvətimi qəbul edən şəxs mənim qardaşım, (məndən sonra) vəsim və xəlifəm olacaqdır.” O zaman Əli ibn Əbi Talibdən (ə) başqa heç kim bu işi qəbul etmədi və Peyğəmbər (s)-ə cavab verərək dedi: “Mən səninlə beyət edirəm və sənin köməkçinəm.” Peyğəmbər (s) də buyurdu: “Sən mənim qardaşım, (məndən sonra) (vəsim və xəlifəmsən!”(٣)

Beləliklə, Peyğəmbəri-Əkrəm (s) o gün yetkinlik həddinə çatmayan, bəhanə axtaranların dediyimi kimi, imanı etibarsız olan bir kəsi özünün qardaşı, vəsisi və canişini kimi tanıtdırıb, başqalarına da ona tabe olmağı əmr etdi? Hətta müşriklərin !böyükləri istehza ilə Əbu Talibə dedilər ki, get, oğluna tabe ol

Şübhəsiz, həddi-buluğ İslamı qəbul etməyin şərtlərindən deyildir. Kifayət qədər ağlı kəsən, yaxşı-pisi ayırd edən hər bir yeniyetmə uşaq



---

١- [١] . “İqdul-fərid”, ٣-cü cild, səh. ٤٣ (ixtisarla).

۲- [۲]. “Əl-qədir”, ۳-cü cild, səh. ۲۳۷.

۳- [۳]. Bu hədisin sənədlərini geniş şəkildə “Yovmud-dar” hədisində qeyd etdik.

İslamı qəbul etsə, atası müsəlman olmasa belə, ondan ayrılır və müsəlmanların zümrəsinə daxil olur. Qurani-Kərimin ayələrindən də başa düşülür ki, yetkinlik həddi hətta nübüvvət və peyğəmbərliyin şərtlərindən də sayılmır. Peyğəmbərlərdən bəzisi elə uşaq ikən bu məqama çatmışlar. Belə ki, Qurani-Kərimdə Yəhya (ə) haqqında buyurulur: "Biz ona uşaq ikən peyğəmbərlik verdik!"(۱) Həzrət İsanın (ə) əhvalatında onun uşaq ikən "Mənə kitab verən, peyğəmbərliyə seçən Allahın bəndəsiyəm!"(۲) – .dedikləri qeyd olunmuşdur

Bunların içində ən aydın dəlil budur ki, Peyğəmbər (s) özü imam Əlinin (ə) imanını qəbul etmiş, hətta dəvətinin ilkin çağlarında Qüreyş böyüklərinin qarşısında onu öz qardaşı, (özündən sonra) vəsi və xəlifəsi elan etmişdir. Beləliklə, "Əli (ə) Peyğəmbər (ə)-in dəvətini qəbul edən birinci şəxsdir!" – deyən rəvayətlər imam Əlinin (ə) misilsiz fəzilətini açıqlayır ki, heç kim bu işdə onunla qarşı-qarşıya dura bilməz və o, İslam .ümməti içərisində Peyğəmbər (s)-in canişinliyinə hamıdan layiq şəxsdir

### UZUNUN–VAİYƏ" (EŞİDİB YADDA SAXLAYAN QULAQ) AYƏSİ"–۱۹

:Haqqə" surəsinin ۱۲-ci ayəsində buyurulur"

لِنَجْعَلَهَا لَكُمْ تَذْكِرَةً وَتَعِيَهَا أُذُنٌ وَاعِيَةٌ

Məqsəd bu idi ki, bunu (möminlərə Nuhun gəmisi ilə nicat verib, tufan vasitəsilə" kafirləri məhv etməyimizi) sizə bir ibrət dərsi edək və dərk edən qulaq bunu (və bu "!(kimi hadisələri) eşidib yadda saxlayacaq (ki, başqaları da ibrət götürsünlər

Süyuti "Əd-durrul-mənsur" kitabında altı sənədlə məşhur səhabə Büreydədən nəql :edir ki, Peyğəmbəri-Əkrəm (s) Əliyə (ə) buyurdu

إنَّ اللهَ اَمَرَنِی اَنْ اُدْنِیَکَ وَلا اُقْصِیَکَ، وَاَنْ اُعَلِّمَکَ وَاَنْ تَعِیَ، وَحَقٌّ لَکَ اَنْ تَعِیَ، فَنَزَلَتْ هذِهِ الآیَهُ وَتَعِیَها اُذُنٌ واعِیَهٌ:

Allah-taala mənə əmr etdi ki, səni özümə yaxın bilim və özümdən uzaqlaşdırmayım," sənə təlim verim və səni saxlayım. Sən buna layiqsən!" Elə bu zaman bu ayə nazil oldu: "Dərk edən qulaq bunu eşidib yadda

(saxlayacaq!”(۱)

Yenə həmin kitabda (Əbu Nəim İsfahaninin “Hilyətül-övliya” kitabından) imam Əlidən (ə) bunu nəql edir və Peyğəmbəri-Əkrəm (s)-in yuxarıda qeyd etdiyimiz sözlərdən (Büreydənin nəql etdiyi hədisdən) sonra belə buyurduğunu yazır: “Ya Əli! Sən mənim (elmimi qoruyub-saxlayacaqsan!”(۲)

Yenə həmin kitabda beş sənədlə Peyğəmbər (s)-in Məkhul adlı xidmətçisindən belə nəql edir: “Dərk edən qulaq bunu eşidib yadda saxlayacaq!” – ayəsi nazil olduqdan sonra Peyğəmbər (s) buyurdu: “Rəbbimdən istəyirəm ki, eşidib yadda saxlayan qulaq Əlinin olsun!” Əli (ə) deyir: “Bundan sonra Allahın Peyğəmbərindən (s) elə bir söz (eşitmədim ki, onu yaddan çıxarım!”(۳)

Eləcə də Zəməxşəri “Kəşşaf” kitabında qeyd etdiyimiz axırıncı hədisi iradsız nəql (etmişdir.(۴)

Digər təfsir alimləri də, o cümlədən, Fəxri-Razi “Kəbir”(۵), Alusi “Ruhul-məani”(۶), Borsui “Ruhul-bəyan”(۷) və Qurtubi “Təfsiri-came”də(۸) həmin ayənin təfsirində bu hədisi nəql etmişlər. Təbəri də “Təfsir” kitabında bu haqda bir sıra hədisləri nəql (etmişdir.(۹)

Hakim Həskani “Şəvahidut-tənzil” kitabında bu ayənin təfsirində müxtəlif ravilərdən sonu Peyğəmbəri-Əkrəm (s)-ə çatan on üç hədis nəql etmişdir. Bu hədislərdən bəzisini Peyğəmbəri-Əkrəm (s)-in xidmətçisi Məkhuldan, bəzisini Büreydədən, bəzisini imam Əli ibn Əbi Talibdən (ə) və bəzisini Cabir ibn Abdullah Ənsaridən nəql etmişdir ki, :onların bir qisminə işarə edirik

Əbud-Dünyanın imam Əlidən (ə) nəql etdiyi bir hədisdə belə deyilir: “Dərk edən qulaq bunu eşidib yadda saxlayacaq!” – ayəsi



---

.Əd-durrul-mənsur”, ۶-cı cild, səh. ۲۶۰“ . [۱] -۱

.Yenə orada . [۲] -۲

۳- [۳]. Yenə orada.

۴- [۴]. “Kəşşaf”, ۴-cü cild, səh. ۶۰۰.

۵- [۵]. “Kəbir”, ۳۰-cu cild, səh. ۱۰۷.

۶- [۶]. “Ruhul-məani”, ۲۹-cu cild, səh. ۴۳.

۷- [۷]. “Ruhul-bəyan”, ۱۰-cu cild, səh. ۱۳۶.

۸- [۸]. “Təfsiri-came”, ۱۰-cu cild.

۹- [۹]. “Təfsiri-Təbəri”, ۲۹-cu cild, səh. ۳۵.

nazil olduqdan sonra Peyğəmbəri-Əkrəm (s) mənə buyurdu: “Ya Əli! Mən Allahdan istəmişəm ki, o qulaq sənin qulağın olsun.” (Eşitdiklərini yadda saxlayıb, başqalarına (çatdırasan.)(۱)

Məkhuldan nəql olunan başqa bir hədisdə buyurulur: “Peyğəmbəri-Əkrəm (s) “və təiyəha uzunun-vaiyəh” (Dərk edən qulaq bunu eşidib yadda saxlayacaq!) – ayəsini tilavət etdikdən sonra üzünü Əliyə (ə) tutub buyurdu: “Allahdan istəmişəm ki, eşidib yadda saxlayan qulaqlar sənin qulaqların olsun!” Əli (ə) deyir: “Ondan sonra (Peyğəmbər (s)-dən hər nə eşidirdimsə, yadımdan çıxmırdı!”(۲)

Həmin kitabda Büreydə Əsləminin hədisi olduğu kimi nəql edilir və nəhayət, Cabir ibn Abdullah Ənsarinin belə dediyi yazılır: “Bu ayə nazil olduqdan sonra Peyğəmbəri-Əkrəm (s) Allahdan istədi ki, bu fəzilət Əliyə (ə) nəsib olsun və Peyğəmbər (s)-in də bu (istəyi qəbul oldu.”(۳)

Fəzailul-xəmsə”nin müəllifi bu hədisi qeyd edilən kitablardan əlavə, “Kənzül-ümmal”,“ “Nurul-əbsar”, “Məcməüz-zəvaid” (Heysəmi) və “Əsbabun-nüzul” (Vahidi) (kitablarından da nəql etmişdir.(۴)

Nəticə: Ötən bəhslərdə imamət, vilayət və Peyğəmbər (s)-in canişinliyinin şərtləri mövzusunda qeyd etdiklərimizə, ilahi rəhbərlərin İslam ümmətini din və dünya işlərində hidayət etmək üçün elm və bilikdən kifayət qədər bəhrələnməsinə, İslam təlimlərini, ilahi qanunları, Quran və sünnəni qoruyub-saxlamağa, eləcə də bəhs etdiyimiz ayənin təfsirində nəql olunan rəvayətlərə əsasən, imam Əlinin (ə) belə bir mövqeyə malik olması açıq-aydın göstərir ki, imamət və vilayət məqamına hamıdan !daha layiqdir

### MƏVƏDDƏT” (MƏHƏBBƏT) AYƏSİ”–۲۰

:Məryəm” surəsinin ۹۶-cı ayəsində buyurulur“

səh:۲۵۲

---

.Şəvahidut-tənzil”, ۲-ci cild, səh. ۲۷۱“ .[۱]-۱

.Yenə orada, səh. ۲۷۷, hədis: ۱۰۱۵ .[۲]-۲

إِنَّ الَّذِينَ آمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ سَيَجْعَلُ لَهُمُ الرَّحْمَنُ وُدًّا

Həqiqətən, iman gətirən və yaxşı işlər görənlər üçün Allah (möminlərin ürəklərində)“ ”!bir məhəbbət yaradacaqdır

Bu ayədə açıq-aydın göstərilir ki, iman və yaxşı əməl insanlar arasında məhəbbət və sevgiyə səbəb olur. Bəli, iman və yaxşı əməl qəribə cazibədarlığa malikdir ki, ürəkləri .yumşaldır, hətta günahkar insanlar belə, pak və yaxşı əməldən ləzzət alırlar

Bu ayənin təfsiri ilə əlaqədar əhli-sünnə mənbələrində müxtəlif ravilər vasitəsilə onun imam Əli (ə) haqqında nazil olması ilə bağlı Peyğəmbəri-Əkrəm (s)-dən çoxlu rəvayət nəql olunmuşdur. Dəfələrlə qeyd etdiyimiz kimi, ayənin müəyyən bir şəxs haqqında nazil olması onun kamil nümunəsini göstərir və bu da ayənin geniş mənası ilə əsla .ziddiyyət təşkil etmir

Şəvahidut-tənzil” kitabında müxtəlif sənədlərlə Bərra ibn Azib, Əbu Rafe, Cabir ibn“ Abdullah Ənsari, İbn Abbas, Əbu Səid Xudri və Məhəmməd ibn Hənəfiyyədən nəql olunan hədisdə deyilir ki, bu ayə Əli ibn Əbi Talib (ə) haqqında nazil olmuş və o həzrətin .məhəbbəti hər bir möminin qəlbində yer tutmuşdur

Əbu Səid Xudridən nəql olunan hədisdə deyilir ki, Peyğəmbəri-Əkrəm (s) Əliyə (ə) :buyurdu

:يا اَبَاالْحَسَن! قُل اَللّهُمَّ اجْعَلْ لِى عِنْدَكَ عَهْداً وَاجْعَلْ لِى فِى صُدُورِهِ الْمُؤْمِنِينَ مَوَدَّةً

Ya Əbəl-Həsən, de ki: “İlahi! Sənin yanında mənim bir əhd-peymanımı qəbul et(١) və“ ”!məhəbbətimi möminlərin qəlbinə sal

Bu zaman “Həqiqətən, iman gətirən və yaxşı işlər görənlər üçün Allah (möminlərin ürəklərində) bir məhəbbət yaradacaqdır!” – ayəsi nazil oldu və Peyğəmbər (s) :buyurdu

:لا تَلْقِى رَجُلًا مُؤمِناً اِلّا فِى قَلْبِهِ حُبٌّ لِعَلِىِّ بْنِ اَبى طالِبٍ

Buna görə də elə bir mömin görmərik ki, onun qəlbində Əli ibn Əbi Talibin məhəbbəti“ (olmasın!”(٢)

Bu hədis azacıq fərqlə Cabir ibn Abdullahdan, Bərra ibn



---

Bu təbir Qurani-Kərimin “Məryəm” surəsinin şəfaət məsələsi haqda söz açan ۷۸- . [۱] -۱
ci ayəsinə işarədir: “Allahla əhd-peyman bağlamış kəslər müstəsna olmaqla, heç kəs
”.şəfaət etməyə qadir olmaz

.Şəvahidut-tənzil”, ۱-ci cild, səh. ۳۶۵, hədis: ۵۰۴“ . [۲] -۲

Azibdən(۱), həmçinin (bir neçə sənədlə) Məhəmməd ibn Hənəfiyyədən də nəql olunmuşdur ki, bu hədisdə Əlidən (ə) əlavə, Əhli-beytin də məhəbbəti qeyd olunmuşdur. Ümumiyyətlə, bu kitabda təxminən, müxtəlif sənədlərlə bir mənanı daşıyan iyirmi rəvayət nəql olunmuşdur.(۲)

Süyuti "Əd-durrul-mənsur" kitabında bu hədisi müxtəlif sənədlərlə Bərra ibn Azib və İbn Abbasdan nəql etmişdir.(۳)

Zəməxşəri "Kəşşaf" kitabında (bəhs etdiyimiz ayənin təfsirində) Peyğəmbəri-Əkrəm (s)-in imam Əliyə (ə) belə buyurduğunu nəql edir: "Allahdan istə ki, Öz dərgahında səninlə əhd-peyman (şəfaət) bağlasın, məhəbbətini möminlərin qəlbinə yerləşdirsin." Elə bu zaman həmin ayə nazil oldu."(۴)

Məşhur təfsir alimi Qurtubi də bu rəvayəti eynilə nəql etmiş və "Kəşşaf" kitabının müəllifi kimi, o da buna əsla irad tutmamışdır.(۵)

Bu hədisi nəql edən digər alimlər isə aşağıdakılardan ibarətdir:

– Sibt ibn Cövzi: "Ət-təzkirə" kitabı(۶);

– Muhibbuddin Təbəri: "Zəxairul-uqba" kitabı(۷);

– İbn Səbbağ Maliki: "Əl-füsulul-muhimmə" kitabı(۸);

– Heysəmi: "Əs-səvaiq" kitabı(۹);

– İbn Səbban: "Əsafur-rağibin"(۱۰) və imamət məsələsi ilə bağlı sair kitablar.

Bu hədislərin müqabilində məşhur təfsir alimləri içərisində mənfi mövqe tutan yalnız "Ruhul-məani" kitabının müəllifi Alusidir ki, adəti üzrə bu hədisi nəql etdikdən sonra onu əhəmiyyətsiz qələmə vermək istəmişdir. O, bu hədisi Bərra ibn Azibdən nəql edərək, onu Məhəmməd ibn Hənəfiyyədən nəql olunan hədislə təsdiqləyib yazır: "Ayə kimin

۱- [۱]. Yenə orada, səh. ۳۵۹, hədis: ۴۸۹-۴۹۰.

۲- [۲]. Yenə orada, səh. ۳۶۶-۳۶۷, hədis: ۵۰۵-۵۰۹.

۳- [۳]. “Əd-durrul-mənsur”, ۴-cü cild, səh. ۲۷۸.

۴- [۴]. “Kəşşaf”, ۳-cü cild, səh. ۴۷.

۵- [۵]. “Təfsiri-Qurtubi”, ۶-cı cild, bəhs etdiyimiz ayənin təfsirində.

۶- [۶]. “Ət-təzkir”, səh. ۲۰.

۷- [۷]. “Zəxairul-üqba”, səh. ۸۹.

۸- [۸]. “Füsulul-muhimmə”, səh. ۱۰۶.

۹- [۹]. “Əs-səvaiqul-muhriqə”, səh. ۱۷۰.

۱۰- [۱۰]. “Əsafur-rağibin”, “Nurul-əbsar” kitabının haşiyəsində çap olan, səh. ۱۱۸.

(haqqında nazil olmağı demək istəmir, ümumi mənanı ifadə edir."(١)

Dəfələrlə deyildiyi kimi, heç kim ayənin nazil olma səbəbi ilə onun ümumiliyini məhdudlaşdırmaq istəmir, əksinə belə səbəb ayənin xaricdəki kamil nümunəsini göstərir. Başqa sözlə desək, bu rəvayətlərdə imam Əli (ə) haqqında deyilənlər, onun bütün möminlərin ürəklərində yerləşən məhəbbəti İslam ümməti içərisində heç bir kəsə aid olmadığı halda, o həzrət üçün böyük fəzilət sayılır və bu baxımdan heç kim .onunla müqayisə oluna bilməz

Görəsən, Allah-taalanın bütün möminlərin qəlblərini məhəbbəti ilə doldurduğu bir kəs !?imamət və vilayət məqamına hamıdan artıq layiq deyilmi

### MÜNAFİQUN" (MÜNAFİQLƏR) AYƏSİ"-٢١

:Mühəmməd" (s) surəsinin ٣٠-cu ayəsində buyurulur"

وَلَوْ نَشَاء لَأَرَيْنَاكَهُمْ فَلَعَرَفْتَهُم بِسِيمَاهُمْ وَلَتَعْرِفَنَّهُمْ فِي لَحْنِ الْقَوْلِ

Əgər Biz istəsəydik, onları (münafiqləri) mütləq sənə göstərər, sən də onları mütləq" "!tanıyardın. Sən onsuz da onları danışıq tərzlərindən tanıyacaqsan

Bu ayə həqiqətdə qabaqkı ayənin müqabilində durur. Allah-taala bu ayədə münafiqlər və onların nişanələri haqda söz açaraq buyurur: "Əgər Biz istəsək, onları sənə göstərər, hətta onların çöhrələrinə əlamət və nişanə qoyar, bununla da bir baxışla onları tanıyarsan." Sonra əlavə edərək buyurur: "Sən onsuz da onları danışıq tərzlərindən tanıyacaqsan!" Çünki hər vaxt cihad və müharibədən söz düşdükdə, onlar bu işdən boyun qaçırmağa və camaatı ruhiyyədən salmağa cəhd göstərəcək, yaxşı və .pak insanlardan söz düşdükdə isə onları ləkələməyə çalışacaqlar

Əbu Səid Xudridən nəql olunan məşhur bir hədisdə "Onsuz da onları danışıq tərzlərindən tanıyacaqsan!" – ibarəsinin təfsiri ilə bağlı belə deyilir: "Onlar Əli ibn Əbi ".Talibə olan kin-küdurət və ədavətləri ilə tanınarlar

Hakim Həskani "Şəvahidut-tənzil" kitabında bu hədisi üç

sənədlə, Süyuti isə “Əd-durrul-mənsur” təfsirində İbn Mərdəveyh və İbn Əsakirdən (onlar da Əbu Səid Xudridən) nəql etmişlər.(۱)

Süyuti başqa bir rəvayəti İbn Abbasdan belə nəql edir: “Biz Peyğəmbəri-Əkrəm (s)-in dövründə münafiqləri yalnız Əli ibn Əbi Talibə (ə) kin-küdurət və ədavətləri ilə tanıyırdıq!”(۲)

Bu hədisi nəql edən ravilər və kitablar yuxarıdakılarla bitmir və bunu Cabir ibn Abdullah Ənsari və Əbuzər Qifari də nəql etmişdir.

İbn Əbdül-Bir “İstiyab” kitabında Cabir ibn Abdullah Ənsaridən, Muhibbuddin Təbəri isə “Ər-riyazun-nuzrə” kitabında Əbuzər Qifaridən belə nəql etmişdir: “Biz Peyğəmbəri-Əkrəm (s)-in dövründə münafiqləri ancaq üç yolla tanıyırdıq: Allahı və Peyğəmbəri (s) təkzib etdikdə, namazdan (camaat namazından) boyun qaçırdıqda və Əli ibn Əbi Talibə (ə) ədavət bəslədikdə.”(۳)

Əhli-sünənnin birinci dərəcəli mənbələrindən sayılan Termizinin “Səhih” kitabında da bu hədis iki sənədlə Əbu Səid Xudri və Ümmü Sələmədən nəql olunmuşdur. (Ümmü Sələmənin hədisinin yuxarıdakı hədislə azacıq fərqi vardır.)(۴)

İbn Əsakir “Tarixud-Dəməşq” kitabında bu məzmunda və buna oxşar bir neçə hədisi Əbu Səid Xudridən, Cabir ibn Abdullah Ənsaridən, İbadət ibn Samitdən və Məhbub ibn Əbiz-Zənaddan nəql etmişdir.(۵)

İbadət ibn Samitin rəvayətində belə deyilir: “Biz övladlarımızı Əli ibn Əbi Talibin (s) məhəbbəti ilə tanıyır və kimin Əli ibn Əbi Talibi (ə) sevmədiyini görsəydik, bilərdik ki, o, bizdən deyildir!”

Məhbub ibn Əbiz-Zənadın hədisində ənsarın dili ilə deyilir: “Hər vaxt bir kəs Əli ibn Əbi Talibə (ə) qarşı kin-küdurət və ədavət göstərsəydi, başa düşürdük ki, o, öz atasının oğlu deyildir!”(۶)

Bu məzmunda rəvayətlər çoxdur və bəhsimizi Peyğəmbəri-

۱- [۱]. “Şəvahidut-tənzil”, ۲-ci cild, səh. ۱۷۸, hədis: ۸۸۳-۸۸۵; “Əd-durrul-mənsur”, ۶-cı cild, səh. ۶۶.

۲- [۲]. Yenə orada.

۳- [۳]. “İstiyab”, ۲-ci cild, səh. ۴۶۴ və “Ər-riyazun-nəzrə”, səh. ۲۱۴.

۴- [۴]. “Səhihi-Termizi”, ۵-ci cild, səh. ۶۳۵, hədis: ۳۷۱۷.

۵- [۵]. “Təlxisu tarixid-Dəməşq”, ۱۷-ci cild, səh. ۳۷۰-۳۷۱, “Darul-fikr” çapı.

۶- [۶]. Yenə orada.

Əkrəm (s)-in buyurduğu bir hədislə sona yetiririk. Peyğəmbəri-Əkrəm “Xeybər” günü :imam Əli (ə) haqqında geniş söhbəti əsnasında belə buyurmuşdur

يـا اَيُّهَـا النّـاسُ اِمْتَحِنُوا اَوْلادَكُمْ بِحُبِّهِ، فَـاِنَّ عَلِيّاً لا يَـدْعُو اِلى ضَـلالَةٍ وَلا يُبْعِـدُ عَنْ هُـدىً، فَمَنْ اَحَبَّهُ فَهُوَ مِنْكُمْ وَمَنْ اَبْغَضَهُ فَلَيْسَ مِنْكُم!:

Ey camaat! Övladlarınızı Əlinin məhəbbəti ilə sınaqdan keçirin. Həqiqətən, Əli (heç“ kimi) azğınlığa dəvət etməz və hidayətdən uzaqlaşdırmaz. Onu sevən sizdəndir, ona (kin-küdurət və ədavət bəsləyən isə sizdən deyildir!”(١)

İnsan bu rəvayətləri diqqətlə araşdırdıqda, elə bir şəxsiyyətlə üzləşir ki, ona qarşı eşq və məhəbbət bəsləmək imanın, ədavətli olmaq isə küfr və münafiqliyin nişanəsidir. Halbuki bu rəvayətlər imam Əlinin (ə) tərəfdarlarına ağır işkəncələr verən, düşmənlərini isə vəzifə kürsüsündə əyləşdirən “əməvilər” kimi azğın sülaləni arxada qoymuş, həmin dövrün insanlarının dillərində dolanmışdır. Hətta ümumi məclislərdə o həzrəti söymək və lənətləmək də hökumət idarələrində vəzifəyə çatmaq üçün bir vasitə sayılırdı. Doğrudan da dünyanın şərq və qərbini bürüyən, tarix, təfsir və hədis kitablarında dolu olan bu qədər fəzilətlərin inadkar düşmənlərin caynaqlarından çıxıb, bu gün bizim əlimizə çatması təəccüblüdür. Bu da bütün əsrlərdə haqq nurunu qorumağın və Əli ibn Əbi Talibin (ə) imamət və xilafətinin bütün nəsillərə !çatdırılmağının yalnız ilahi məşiyyət, imdad və yardımla mümkün olduğunu göstərir

### İYZA” (ƏZİYYƏT) AYƏSİ”-٢٢

:Əhzab” surəsinin ٥٧-ci ayəsində buyurulur“

إِنَّ الَّذِينَ يُؤْذُونَ اللَّهَ وَرَسُولَهُ لَعَنَهُمُ اللَّهُ فِى الدُّنْيَا وَالْآخِرَهِ وَأَعَدَّ لَهُمْ عَذَابًا مُّهِينًا

Həqiqətən, Allaha və Onun Peyğəmbərinə əziyyət verənləri Allah dünya və axirətdə“ lənətləmiş (Öz rəhmətindən uzaqlaşdırmış) və onlar üçün xaredici bir əzab ”!hazırlamışdır

Məlum olduğu kimi, kimsə Allah-taalanın müqəddəs və pak zatına bir zərər yetirə bilməz. Buna əsasən, “Allaha əziyyət vermək”dən məqsəd – təfsir alimlərinin qeyd etdikləri kimi – Allahın

qəzəbinə səbəb olan küfr və dinsizlikdir. Bu hədə-qoxu ilə Peyğəmbər (s)-i və möminləri incidən kəslərin cəzalanacağı xatırlanır və onları incidən kəs, şübhəsiz, Allahı incitmiş olur.

Ayənin təfsirində həm əhli-sünnə, həm də Əhli-beyt (ə) ardıcıllarının vasitəsilə nəql olunan çoxlu rəvayətdə Peyğəmbəri-Əkrəm (s)-in belə buyurduğunu oxuyuruq: “Ya Əli! Hər kəs səni incitsə, şübhəsiz, məni incitmişdir!”

Hakim Həskani “Şəvahidut-tənzil” kitabında Cabir ibn Abdullah Ənsaridən belə nəql edir: “Peyğəmbəri-Əkrəm (s)-dən eşitdim ki, Əliyə (s) belə buyurdu: “Səni incidən kəs, şübhəsiz, məni incitmişdir!”(۱)

Başqa bir hədisdə İbn Əbi Sələmə, Ümmü Sələmədən Peyğəmbəri-Əkrəm (s)-in belə buyurduğunu nəql edir: “Peyğəmbəri-Əkrəm (s)-dən eşitdim ki, Əliyə (s) belə buyurdu:

اَنْتَ اَخِی وَ حَبِیبِی، مَنْ آذاکَ فَقَدْ آذانِی:

“Sən mənim qardaşım və həbibimsən, kim sənə əziyyət versə, şübhəsiz, mənə əziyyət vermişdir!”(۲)

Sonra müəllif yazır: “Bu hədis Ömər, Səd ibn Əbi Vəqqas, Əbu Hüreyrə, İbn Abbas və Əbu Səid Xudri kimi səhabələrdən də nəql olunmuşdur.”(۳)

Başqa bir hədisdə isə Əli ibn Əbi Talibdən (ə) belə nəql edilir: “Allahın Peyğəmbəri (s) öz tükündən tutub, mənə belə buyurdu:

مَنْ آذی شَعْرَةً مِنْکَ فَقَدْ آذانِی ومَنْ آذانِی فَقَدْ آذَی الله فَعَلَیْهِ لَعنه الله:

“Hər kəs sənin bir tükünü belə incitsə, məni incitmiş, hər kəs məni incitsə, şübhəsiz, Allahı incitmişdir və hər kəs Allahı incitsə, ona Allahın lənəti olsun!”(۴)

Burada qeyd edilən hədislərdə imam Əlini (ə) incitmək, Peyğəmbər (s)-i incitməklə eyni hesab edilsə də, bu ayəyə istinad edilməmişdir. Halbuki bəzi rəvayətlərdə bu istinadı açıq-aydın görmək olar. Məsələn, Hakim Nişapurinin “Müstədrəküs-səhiheyn”

۱- [۱] . “Şəvahidut-tənzil”, ۲-ci cild, səh. ۹۸, hədis: ۷۷۷.

۲- [۲] . Yenə orada.

۳- [۳] . Yenə orada, səh. ۹۹.

۴- [۴] . Yenə orada, səh. ۹۷, hədis: ۷۷۶.

kitabında İbn Abbasdan nəql olunan səhih və mötəbər hədisdə belə deyilir: “Şam əhlindən bir kişi Əlini (ə) söydükdə, İbn Abbas ona dedi: “Ey Allahın düşməni! Sən bu sözünlə Allahın Peyğəmbərini incitdin və ona əziyyət verdin. (Çünki Qurani-Kərimdə buyurulur:) “Allaha və Onun Peyğəmbərinə əziyyət verənləri Allah dünya və axirətdə lənətləmiş (Öz rəhmətindən uzaqlaşdırmış) və onlar üçün xaredici bir əzab hazırlamışdır!” Əgər Peyğəmbəri-Əkrəm (s) sağ olsaydı, indi sən onu incitmiş (olardın!”(١

Zəhəbi bu hədisi “Təlxisul-müstədrək” kitabında nəql etmiş və onun doğru olduğunu (etiraf etmişdir.(٢

Süyuti də “Əd-durrul-mənsur” kitabında İbn Abbasın bu ayəyə istinad edərək nəql (etdiyi hədisi qeyd etmişdir.(٣

Həmçinin “Müstədrəküs-səhiheyn” kitabında Əmr ibn Şasdan ətraflı bir hədis nəql olunmuşdur ki, onun bir qismi belədir: “Mən Peyğəmbər (s)-in məscidində Əlinin (ə) Yəmən səfərində mənimlə etdiyi rəftarına görə gileyləndim və bu söz Peyğəmbər (s)-ə çatdı. Sübh vaxtı Peyğəmbər (s) bir qrup səhabə ilə məscidə daxil olduqda, mənə qaş-qabaqla baxıb buyurdu: “Ey Əmr! Allaha and olsun ki, məni incitdin.” Mən dedim: “Ya :Peyğəmbər (s)! Allaha pənah aparıram, bu nə sözdür?” Peyğəmbər (s) buyurdu

مَنْ آذی عَلِیّاً فَقَدْ آذانِی:

”!Əlini incidən şəxs məni incitmişdir“

Hakim Nişapuri bu hədisi nəql etdikdən sonra onun səhih və mötəbər olduğunu (yazmışdır.(۴

Təlxisu tarixid-Dəməşq” kitabının müəllifi də bu hədisi başqa hədislərlə yanaşı Cabir“ .ibn Abdullah Ənsaridən, Səd ibn Əbi Vəqqasdan və Əmr ibn Şasdan nəql etmişdir

-(Bütün bunlar göstərir ki, Əliyə (ə) əziyyət vermək Peyğəmbər (s

۱- [۱]. “Müstədrəküs-səhiheyn”, ۳-cü cild, səh. ۱۲۱, Beyrutun “Darul-mərifət” çapı.

۲- [۲]. “Müstədrəküs-səhiheyn” kitabının haşiyəsində çap olan “Təlxisul-müstədrək”, ۳-cü cild, səh. ۱۲۲.

۳- [۳]. “Əd-durrul-mənsur”, ۵-ci cild, səh. ۲۲۰.

۴- [۴]. “Müstədrəküs-səhiheyn”, ۳-cü cild, səh. ۱۲۲. Zəhəbinin “Təlxisul-müstədrək” kitabında da bu hədis eynilə nəql olunmuşdur.

ə əziyyət verməklə eynidir(١) və əhli-sünnə alimlərinin səhih və düzgün saydıqları bu qədər hədisə əsasən, Əli (ə) Peyğəmbər (s)-in canı kimidir və ona məhəbbət bəsləmək eynilə Peyğəmbər (s)-ə məhəbbət bəsləmək, onu incitmək isə eynilə Peyğəmbər (s)-i incitmək deməkdir. Bundan sonra görəsən, İslam ümməti içərisində imam Əlinin (ə) Peyğəmbəri-Əkrəm (s)-dən sonra ən fəzilətli, imamət, vilayət və xilafət məqamına ən !?layiqli şəxs olmasında şəkk-şübhəyə yer qalırmı

## İNFAQ" AYƏSİ"–٢٣

:Bəqərə" surəsinin ٢٧۴-cü ayəsində buyurulur"

الَّذِينَ يُنفِقُونَ أَمْوَالَهُم بِاللَّيْلِ وَالنَّهَارِ سِرًّا وَعَلاَنِيَةً فَلَهُمْ أَجْرُهُمْ عِندَ رَبِّهِمْ وَلاَ خَوْفٌ عَلَيْهِمْ وَلاَ هُمْ يَحْزَنُونَ

Öz mal-dövlətlərini gecə-gündüz, gizlin və aşkar infaq (xərc) edənlərin mükafatı öz" "!Rəbbinin yanındadır. Onlar üçün nə qorxu vardır, nə də qəm-qüssə görərlər

Şübhəsiz, bu ayənin məfhumu ümumi olub, Allah yolunda mal-dövləti xərcləməyin müxtəlif formalarını göstərir; gizlin və aşkar, gecə və gündüz... Ayədə belə işlər görənlər böyük mükafatla müjdələnir, onların mükafatları Allahın yanındadır, keçmiş və gələcək barəsində də qəmgin deyillər. Bu ayə ümumi məfhumu ifadə etsə də, rəvayətlərdən belə başa düşülür ki, onun nazil olma səbəbi imam Əli (ə) ilə bağlıdır. .Çünki onların çoxunda bu ayənin ilk dəfə Əli (ə) haqqında nazil olduğu göstərilir

İbn Abbas deyir: "Bu ayə Əli ibn Əbi Talib (ə) haqqında nazil olmuşdur. Həzrət Əlinin (ə) yalnız dörd dirhəm pulu var idi. Onun bir dirhəmini gecə, bir dirhəmini gündüz, bir dirhəmini aşkar və bir dirhəmini də gizlin Allah yolunda ehsan etdi. Allahın Peyğəmbəri (s) ondan "(Ya Əli!) Səni bu işə nə vadar etdi?" – deyə soruşduqda, Əli (ə) belə cavab verdi: "Allahın mənə vəd etdiklərini qazanmaq istəyim!" Peyğəmbər (s) buyurdu: "Agah ".ol ki, sən həmin vədlərə nail oldun!" Bu zaman yuxarıdakı ayə nazil oldu

Hakim Həskani "Şəvahidut-tənzil" kitabında bu hədisi eynilə



---

.Təlxisu tarixid-Dəməşq", ١٧-ci cild, səh. ٣۵٢" . [١]-١

(digər yeddi hədislə yanaşı müxtəlif ravilərdən nəql etmişdir.(١)

Süyuti də “Əd-durrul-mənsur” kitabında bunu müxtəlif sənədlərlə İbn Abbasdan nəql edir və deyir ki, bu ayə Əli ibn Əbi Talib (ə) haqqında nazil olmuşdur. O həzrətin dörd dirhəm pulu var idi ki, Allah yolunda onun birini gecə, birini gündüz, birini aşkar və birini (də gizlin xərc etdi. Bu zaman “infaq” ayəsi nazil oldu.(٢)

Bu hədisin mənası odur ki, Əli (ə) öz mal-dövlətini xərcləməkdə Allahın razılığını qazanmaq üçün heç nəyini əsirgəməmiş, birincisi, malik olduğu malını Allah yolunda xərc etmiş, ikincisi isə onu həm gecə, həm gündüz, həm aşkar, həm də gizlin etmişdir. Allahın razılığını qazanmaq üçün sevinclə yanaşı olan bu ixlas və fədakarlıq Allah .dərgahında qəbul olunmuş və bu ayə nazil olmuşdur

Bu hədisi Muhibbuddin Təbəri “Zəxairul-uqba”(٣), Sibt ibn Cövzi “Təzkirətul-xəvass”(۴), Əllamə Gənci “Kifayətut-talib”(۵), məşhur təfsir alimi Qurtubi “Təfsir”(۶), Şəblənci “Nurul-əbsar”(٧), Şeyx Süleyman Qunduzi “Yənabiul-məvəddət”(٨) və digər alimlər öz .kitablarında (yuxarıda qeyd etdiyimiz ibarəni azacıq fərqlə) nəql etmişlər

Fəzailul-xəmsə”də bu hədis digər kitablardan, o cümlədən, İbn Əsirin “Usdul-“ ğabə”(٩), İbn Həcərin “Əs-səvaiqul-muhriqə”(١٠) və Vahidinin “Əsbabun-nüzul”(١١) .kitablarından da nəql edilmişdir

Bu ayənin təfsirində nəql olunan hədislərin sonuncusunu İbn Əbil-Hədid Mötəzilinin rəvayəti ilə sona yetiririk. O, imam Əlinin (ə) fəzilətlərini qeyd edib, “səxavət” fəzilətinə ,çatdıqda, “Həl-əta” surəsinin ayələrinə işarə edərək yazır: “Təfsirçilərin nəqlinə görə



---

١- [١] . “Şəvahidut-tənzil”, ١-ci cild, səh. ١٠٩-١١۵.

٢- [٢] . “Əd-durrul-mənsur”, ١-ci cild, səh. ٣۶٣.

٣- [٣] . “Zəxairul-üqba”, səh. ٨٨.

۴- [۴] . “Təzkirətul-xəvass”, səh. ١٧.

۵- [۵] . “Kifayətut-talib”, səh. ١٠٨.

۶- [۶] . “Təfsiri-Qurtubi”, ٢-ci cild, səh. ١١١۵, bəhs etdiyimiz ayənin təfsirində.

.Nurul-əbsar”, səh. ۱۰۵“ . [۷] -۷

.Yənabiul-məvəddət”, səh. ۹۲“ . [۸] -۸

.Usdul-ğabə”, ۴-cü cild, səh. ۲۵“ . [۹] -۹

.Əs-səvaiqul-muhriqə”, səh. ۷۸“ . [۱۰] -۱۰

Əsbabun-nüzul”, səh. ۶۴, “Fəzailul-xəmsə” kitabının nəqlinə görə, ۱-ci cild,“ . [۱۱] -۱۱
.səh. ۳۲۱-۳۲۲

Əlinin (ə) yalnız dörd dirhəm pulu var idi. Allah yolunda onun birini gecə, birini gündüz, birini aşkar və birini də gizli infaq etdi. Bu zaman Allah-taala “infaq” ayəsini onun (haqqında nazil etdi.”(١)

Burada qeyd olunduğu kimi, bu hadis də təfsirçilər arasında yekdil, yaxud da məşhur .məsələdir

## MƏHƏBBƏT” AYƏSİ”–٢۴

:Maidə” surəsinin ۵۴-cü ayəsində buyurulur“

يَا أَيُّهَا الَّذِينَ آمَنُواْ مَن يَرْتَدَّ مِنكُمْ عَن دِينِهِ فَسَوْفَ يَأْتِي اللّهُ بِقَوْمٍ يُحِبُّهُمْ وَيُحِبُّونَهُ أَذِلَّةٍ عَلَى الْمُؤْمِنِينَ أَعِزَّةٍ عَلَى الْكَافِرِينَ يُجَاهِدُونَ فِي سَبِيلِ اللّهِ وَلاَ يَخَافُونَ لَوْمَةَ لآئِمٍ ذَلِكَ فَضْلُ اللّهِ يُؤْتِيهِ مَن يَشَاء وَاللّهُ وَاسِعٌ عَلِيمٌ

Ey iman gətirənlər! Sizlərdən hər hansı biriniz öz dinindən qayıtsa, (Allaha heç bir“ zərər yetirmir). Allah gələcəkdə elə bir tayfanı gətirəcək ki, həm Allah onları, həm də onlar Allahı sevirlər. Onlar möminlərin qarşısında təvazökar, kafirlərin qarşısında isə qüvvətlidir və Allah yolunda cihad edir, məzəmmət edənlərin danlağından qorxmurlar. Bu Allah tərəfindən istədiyi (və layiq gördüyü) şəxsə əta etdiyi bir lütf və mərhəmətdir. ”!Allahın elmi (lütf və mərhəməti) genişdir

Bu ayədən məlum olur ki, dini təzə qəbul edən müsəlmanların dindən çıxması İslama heç bir zərər yetirə bilməz. Allah-taala müqəddəs dininin müdafiəsini müəyyən xüsusiyyətlərə malik bir qrup möminə tapşırmışdır ki, həm Allah onları sevir, həm də onlar Allahı sevirlər. Onlar möminlərə qarşı təvazökar, düşmənlər və kafirlərə qarşı isə kəskin duraraq, həmişə Allah yolunda cihad edər, məzzəmmət edənlərin məzzəmət və danlağından əsla qorxmazlar. Bəli, bu xüsusiyyətlər bir nəfərə, yaxud bir qrup .insana verilən ilahi lütf və mərhəmətdir ki, hər kəs ona layiq deyil

Şübhəsiz, bu ayənin də məfhumu bir çox ayələr kimi, ümumi və genişdir. Lakin həm şiə, həm də əhli-sünnə vasitəsilə nəql olunan rəvayətlərdən açıq-aydın başa düşülür .ki, Əli (ə) bu ayənin ən kamil və bariz nümunəsidir

Fəxri-Razi bu ayənin təfsirinə çatdıqda, belə yazır: “Bəzilərinin

dediyinə əsasən, bu ayə Əli (ə) haqqında nazil olmuşdur.” Sonra özü bu müddəanın səhih olduğunu sübut etmək üçün iki dəlil gətirir; birincisi, Peyğəmbər (s)-in “Xeybər” :müharibəsində bayrağı Əliyə (ə) verib belə buyurduğunu nəql edir

لَاَدْفَعَنَّ الرّايَهَ غَداً اِلى رَجُلٍ يُحِبُّ اللهَ وَرَسُولَهُ وَ يُحِبُّهُ اللهُ وَرَسُولُهُ:

Mən sabah bayrağı elə bir kəsə verəcəyəm ki, həm o, Allah və Peyğəmbəri sevir, həm“ ”.də Allah və Peyğəmbər onu sevirlər

Sonra əlavə edərək yazır: “Bununla yuxarıdakı ayənin kimə aid olduğu başa düşülür. İkinci dəlil isə Əlinin (ə) haqqında nazil olan sonrakı ayədir ki, orada buyurulur: “Həqiqətən, sizin vəliniz və rəhbəriniz Allah, Peyğəmbəri və namaz qılıb rüku halında zəkat verənlərdir...” Buna əsasən, ondan qabaqkı ayənin də onun haqqında nazil (olduğunu deməyimiz daha yaxşı olar!”(١)

Fəxri-Razinin Peyğəmbəri-Əkrəm (s)-in “Xeybər” günü ilə əlaqədar kəlamına istinadı mötəbər kitablarda imam Əli (ə) haqda nəql olunan və o həzrətin ən böyük fəzilətlərindən sayılan məşhur bir hadisədən qaynaqlanır. Belə ki, İslam ordusunun neçə sərkərdəsi “Xeybər” qalasını fəth edə bilmədiyini görən Peyğəmbəri-Əkrəm (s) :üzünü orduya tutub buyurdu

لَأُعْطِيَنَّ الرّايَهَ غَداً رَجُلاً يُحِبُّ اللهَ وَرَسُولَهُ وَ يُحِبُّهُ اللهُ وَرَسُولُهُ كَرّاراً غَيْرَ فَرّارٍ، لا يَرْجِعُ حَتّى يَفْتَحَ اللهُ عَلَى يَدِهِ:

Allaha and olsun! Sabah bayrağı elə bir kəsə verəcəyəm ki, həm o, Allah və“ Peyğəmbərini sevir, həm də Allah və Peyğəmbəri onu sevirlər. O, ardıcıl olaraq hücum edəcək, heç vaxt (meydandan) qaçmayacaq və Allah onun vasitəsilə (müsəlmanlara) ”.qələbəni nəsib etdiyi halda, geri qayıdacaqdır

Ertəsi gün sübh Həzrət (s) buyurdu: “Əli haradadır?” Dedilər: “Xəstədir, gözü ağrıyır.” Peyğəmbər (s) buyurdu: “Ona xəbər verin, gəlsin!” Əli (ə) də gəldi. Peyğəmbər (s) onun gözünə üfürdü (yaxud ağız suyunu onun gözünə sürtdü) və onun göz ağrısı çəkildi. Bayrağı ona verdi və Əli (ə) də bir hücumla “Xeybər”i fəth etdi (və Peyğəmbər (s)-in (.sözü gerçək çıxdı

Bu hədisi Fəxri-Razidən başqa digər tarix və hədis alimləri də (azacıq fərqlə) öz

Nişapuri “Müstədrəküs-səhiheyn” kitabında bu haqda üç hədis qeydə almışdır ki, onların birincisi İbn Abbasdan nəql edilir: “Müsəlmanlardan bir qrupu onun yanında Əlini (ə) pislədikləri zaman qəzəblənib buyurdu: “Vay olsun bu camaatın halına ki, heç kəsin malik olmadığı on ikidən çox fəziləti olan bir şəxsin haqqında gör, nə danışırlar?!” Sonra Əlinin (ə) fəzilətlərini bir-bir sayaraq, birinci fəziləti kimi “Xeybər” müharibəsindəki hadisəyə toxundu.”(١)

İkinci hədisdə Səd ibn Əbi Vəqqasın oğlu Amirin belə dediyi nəql olunur: “Bir gün Müaviyə atam Səddən soruşdu: “Nə üçün Əli ibn Əbi Talibi söymürsən?” Atam dedi: “Peyğəmbər (s)-in onun haqqında buyurduğu üç fəzilət yadımda ikən onu söyməkdən çəkinərəm. Əgər bu üç fəzilətin biri məndə olsaydı, mənim üçün qiymətli qırmızı tüklü dəvələrə sahib olmağımdan daha sevimli olardı.” Müaviyə soruşdu: “Onlar hansılardır?” Səd dedi: “Birincisi “kisa” (əba) hədisi, ikincisi “mənzilət” hədisi (Peyğəmbər (s) “Təbuk” müharibəsinə gedərkən, Əliyə (ə) buyurmuşdu: “Ya Əli! Mənimlə sənin nisbətin Musanın Harunla nisbəti kimidir!”) və üçüncüsü isə Əlinin (ə) “Xeybər” müharibəsindəki şücaəti və Peyğəmbər (s)-in buyurduğu bu kəlamdır: “Sabah bayrağı elə bir kəsə verəcəyəm ki, həm o, Allahı və Peyğəmbərini sevir, həm də Allah və Peyğəmbəri onu sevirlər. Allah onun vasitəsilə Xeybər qalalarını fəth edəcək.” Sonra Peyğəmbər (s) Əlini (ə) çağırdı və öz ağız suyunu onun gözlərinə sürtməklə ağrısı kəsildi. Bundan sonra bayrağı ona verdi. Bu üç fəzilətə görə, Əlini (ə) söyə bilmirəm. Bu zaman Müaviyə susub, daha bir söz demədi...”(٢)

Üçüncü hədisi isə Abdullah ibn Büreydədən, qeyd etdiyimiz “Xeybər” əhvalatı haqda bir sıra əlavələrlə yanaşı nəql etmişdir.(٣)

Sələbi də “Mənaqib” kitabında yazır: “Həqiqətən, bu ayə Əli (ə) haqqında nazil olmuşdur.”(۴)

„Kənzül-ümmal” kitabında da bu hədis Səd ibn Əbi Vəqqasdan“



---

١- [١] . “Müstədrəküs-səhiheyn”, ٣-cü cild, səh. ١٣٢.

٢- [٢] . “Təlxisul-müstədrək”, ٣-cü cild, səh. ١٠٨-١٠٩.

٣- [٣]. “Müstədrəküs-səhiheyn”, ٣-cü cild, səh. ٤٣٧.

٤- [٤]. “Mənaqib”, səh. ١٦٠, “Ehqaqul-həqq” kitabından nəqlən, ١٤-cü cild, səh. ٢٤٨.

.eləcə də bir sıra əlavələrlə Amir ibn Səddən nəql olunmuşdur

Əhli-sünnə və Əhli-beyt məktəbinin ardıcıllarının məşhur kitablarında nəql olunan bu hədislər elə bir fəziləti aşkar edir ki, Səd ibn Əbi Vəqqasın dediyi kimi, onun misli və tayı-bərabəri yoxdur. Hətta bəziləri bu fəzilətlərin yalnız birinə malik olmağı belə, özləri üçün böyük iftixar bilmişlər. Görəsən, İslam ümməti arasında belə fəzilətlər sahibinin varlığı ilə yenə deyə bilərikmi ki, bunlar Peyğəmbər (s)-in canişinliyinə dəlalət !?etmir

Bu ayənin dəqiq ibarələrindən və məşhur kitablarda nəql olunan rəvayətlərdən başa düşülür ki, Əli (ə) nəinki Peyğəmbər (s)-in sevdiyi və Allahın lütf etdiyi şəxsdir, həm də Allaha və Peyğəmbər (s)-ə görə, yaradılmışların ən sevimlisidir! Buna şahid məşhur “Teyr” (quş) hədisidir ki, “Əl-müstədrəkü ələs-səhiheyn” kitabında belə yazılır: “Peyğəmbər (s)-in uzun həyat sürən Ənəs adlı xidmətçisi xəstələndiyi zaman Məhəmməd ibn Həccac bir neçə nəfərlə birlikdə onun görüşünə getmişdi. Onlar çox şey haqda danışdılar. Nəhayət, Əlidən (ə) söz düşdükdə, Həccacın oğlu o həzrətin barəsində nalayiq sözlər deməyə başladı və Ənəs narahat olub dedi: “Bu kimdir, belə danışır? Məni əyləşdirin!” Onu yerindən qaldırıb, oturtdular. O dedi: “Ey Həccacın oğlu! Nə üçün Əli ibn Əbi Talibin (ə) haqqında pis fikirdəsən? Mühəmməd (s)-i peyğəmbərliyə seçən Allaha and olsun! Mən Peyğəmbər (s)-in xidmətçisi olmuşam. Hər gün ənsarın cavanlarından biri o həzrətin qulluğunda dururdu. Növbə mənə çatan gün Ümmü Əymən Peyğəmbər (s) üçün (qızardılmış) quş gətirib, o həzrətin qarşısına qoydu. Həzrət buyurdu: “Ey Ümmü Əymən! Bu quşu haradan gətirmisən?” Ümmü Əymən dedi: “Onu özüm ovlamış və sizin üçün bişirmişəm!” Bu zaman Peyğəmbər (s) :buyurdu

اَللّهُمَّ جِئْنِی بِاَحَبِّ خَلْقِکَ اِلَیْکَ وَاِلَیَّ، یَأْکُلُ مَعِی مِنْ هذا الطَّیْرِ:

İlahi! Sənin və mənim yanımda yaradılmışların ən sevimlisi olan şəxsi yetir ki, mənimlə“ ”!birlikdə bu quşun ətindən yesin

Bu vaxt evin qapısı döyüldü. Allahın Peyğəmbəri (s) buyurdu: “Ey Ənəs, gör, qapının arxasındakı kimdir?” Mən öz-özümə dedim: “Kaş, qapının arxasında ənsardan biri olaydı. Lakin qapını açdıqda, Əlini (ə) gördüm və ona dedim: Peyğəmbər (s)-in işi vardır

görüşməyə vaxtı yoxdur). Bunu deyib, qayıtdım və öz yerimdə əyləşdim. Yenidən qapı döyüldü. Peyğəmbər (s) buyurdu: “Ey Ənəs! Hər kimdirsə, icazə ver, qoy gəlsin! Öz tayfasını sevən təkcə sən deyilsən və o da ənsardan deyildir!” Mən qapını açdım. Əli (ə) içəri daxil oldu. Peyğəmbər (s) buyurdu: “Ey Ənəs! Quş ətini ona yaxın qoy.” Mən quş ətini Peyğəmbər (s)-lə Əlinin (ə) qarşısına qoydum və hər ikisi ondan yeməyə .başladılar

”?Məhəmməd ibn Həccac dedi: “Ey Ənəs! Sən bu hadisəni öz gözünləmi gördün

”!Ənəs dedi: “Bəli

Bu vaxt Həccacın oğlu dedi: “Mən Allahla əhd-peyman bağlayıram ki, bundan sonra heç vaxt Əlinin (ə) haqqında pis fikirdə olmayım və kimin də ona irad tutduğunu (görsəm, onun abır-heysiyyətini aparacağam!”(١

Bu hədis və əhvalatı Zəhəbi “Əl-müstdərəkü ələs-səhiheyn” kitabının haşiyəsində çap .olan “Təlxisül-müstədrək” kitabında da nəql etmişdir

Teyr” hədisi ilə məşhur olan bu hədis çoxlu kitabda, İslamın müxtəlif mənbələrində“ nəql olunmuşdur. Əllamə Əmini bu barədə yazır: “Teyr” (quş) hədisi “mütəvatir” və ”.səhih hədislərdəndir ki, alimlər onun “təvatür” və doğruluğunu inkar edə bilməmişlər

Böyük fəqih, hədis alimi, xətib, ədib və şair Əhməd ibn Müvəffəq də “Mənaqib” (kitabında bu hədisi qeyd etmişdir.(٢

Hətta məşhur hədis alimi Termizi “Səhih” kitabında Ənəs ibn Malikdən belə nəql edir: :“Peyğəmbər (s)-in qarşısına qızardılmış quş əti qoyulduğu zaman dedi

اَللّهُمَّ ائْتِنِی بِاَحَبِّ خَلْقِکَ اِلَیْکَ یَأْکُلُ مَعِی هذا الطَّیْرَ فَجاءَ عَلِیٌّ فَاَکَلَ مَعَهُ:

İlahi! Yaradılmışların ən sevimlisini göndər ki, mənimlə bu quşdan yesin.” Bu vaxt Əli“ ((ə) gəldi və onu birlikdə yedilər.”(٣

Əllamə Gənci Şafei “Kifayətut-talib” kitabında “Teyr” hədisini qeyd

١- [١] . “Əl-müstədrəkü ələs-səhiheyn”, ٣-cü cild, səh. ١٣١, “Darul-mərifət” çapı.

٢- [٢] . “Mənaqib”, səh. ۶٧.

٣- [٣] . “Səhihi-Termizi”, ١٣-cü cild, səh. ١٧٠, Misirin “Əs-savi” çapı.

etdikdən sonra yazır: “Bu hədis açıq-aydın dəlalət edir ki, Əli (ə) Peyğəmbərdən (s) sonra Allahın yaratdıqlarının ən sevimlisidir. Buna da ən qəti dəlil odur ki, Allah-taala Peyğəmbər (s)-in duasını qəbul etmişdir... Beləliklə, Allahın dərgahına yaxınlaşmaq üçün ən yaxşı vasitə Əli ibn Əbi Talibə (ə) – Allahı sevən bir şəxsə məhəbbət (bəsləməkdir!”(١

Hicri qəməri tarixi ilə ٣-cü əsrin alimlərindən olan Əllamə Nisai “Xəsais” adlı məşhur (kitabında da bu hədisi bir sıra əlavələrlə nəql etmişdir.(٢

Bu hədisi öz kitablarında nəql edən digər alimlərdən “Təxkirətul-xəvass” kitabının müəllifi Sibt ibn Cövzini, “Usdul-ğabə” kitabının müəllifi İbn Əsiri, “Məsabihus-sünnə” kitabının müəllifi İbn Məsud Şafeini, “Zəxairul-uqba” kitabının müəllifi Muhibbuddin Təbərini və “Yənabiul-məvəddət” kitabının müəllifi Şeyx Süleyman Bəlxi Qunduzini .misal göstərmək olar

Bəlkə də bəzilərini lap təəccüb və heyrətə gətirən oudur ki, İbn Əsirin “Usdul-ğabə” kitabında nəql olunan “Teyr” hədisinin sənədlərindən birində – Ənəs ibn Malikdən nəql olunan hədisdə deyilir: “Əvvəl Əbu Bəkr gəldi və Ənəs onu geri qaytardı. Sonra Osman gəldi və Ənəs onu da geri qaytardı. (Nisainin “Əl-xəsais” kitabında nəql olunan hədisdə isə Osmanın yerinə Ömərin adı qeyd olunur.) Sonra Əli (ə) gəldi və ona evə girməyə ”.icazə verdi

İbn Əsir özü axırda yazır: “Bu hədisdə Əbu Bəkr və Osmanın adının çəkilməsi doğrudan (da qəribədir!”(٣

Daha maraqlısı oudur ki, əhli-sünnənin bəzi hədis alimləri imam Əlinin (ə) belə bir misilsiz fəzilətini qiymətdən salmaq üçün bu hədisin sənədində tərəddüd etmişlər. Məsələn, “Əl-bidayətu vən-nihayə” kitabının müəllifi İbn Kəsir bu hədisi nəql etdikdən ”.sonra yazır: “Bu hədisin sənədləri çox olsa da belə, ürəyimdə ona qarşı şəkk vardır

Halbuki bir çox məşhur mənbələrdə geniş nəql olunan bu “mütəvatir” hədisin sənəd və dəlalətində heç bir irad yoxdur. Sadəcə

.Kifayətut-talib”, səh. ۵۹, “Ehqaqul-həqq” kitabından nəqlən, ۵-ci cild, səh. ۳۱۹“ . [۱] -۱

.Əl-xəsais”, səh. ۵, Misirin “Təqədd ü m” çapı“ . [۲] -۲

.Usdul-ğabə”, ۴-cü cild, səh. ۳۰, Beyrutun “Daru ehyait-turasil-ərəbi” çapı“ . [۳] -۳

olaraq, bu hədis onların əqidələri ilə uyğun gəlmədiyindən, bəzi məntiqsiz və yersiz bəhanələrə əl atmışlar. Mərhum Əllamə Əmini bu hədisi qeyd etdikdən sonra yazır: “Hədisin doğruluğunu təmin edən bütün şərtlər mövcud olduğu halda, əgər yenə də bir kəsin qəlbində ona qarşı şəkk-şübhə varsa, irad hədisdə yox, onun qəlbindədir!”

### ۲۵– “MƏSULUN” (SORĞU–SUALA TUTULANLAR) AYƏSİ

“Saffat” surəsinin ۲۴-cü ayəsində zalımların haqqında buyurulur ki, qiyamət günü əzab mələklərinə belə xitab olunar:

وَقِفُوهُمْ إِنَّهُم مَّسْئُولُونَ

“Onları (zülmkarları) saxlayın, çünki onlar sorğu-suala tutulacaqlar!”

Qiyamətdə onların hansı məsələ haqda sorğu-suala tutulacaqları barədə təfsirçilər arasında müxtəlif fikirlər vardır; bəziləri onların dünyada iz qoyduqları bidətlərinə, bəziləri səhv və çirkin işlərinə, bəziləri də tövhid və Allahın yeganəliyini inkar etdiklərinə görə soruşulacaqlarını bildirmişlər.(۱)

Əlbəttə, bu ayənin məfhumunda bütün bu mənaların nəzərə alınması mümkündür. Lakin bir çox rəvayətlərdə isə onların Əli ibn Əbi Talibin (ə) imamət və vilayəti barədə sorğu-sualından söz açılır. Bu rəvayətlər İslam mənbələrində qeyd olunmuşdur. O cümlədən, “Şəvahidut-tənzil” kitabında iki sənədlə Əbu Səid Xudridən nəql edilən rəvayətdə Peyğəmbəri-Əkrəm (s)-in belə buyurduğu yazılır: “Əli ibn Əbi Talibin vilayəti barədə soruşacaqlar!”(۲)

Başqa bir hədisdə Səid ibn Cübeyr, İbn Abbasdan belə nəql edir: Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur:

اِذا كـانَ يَوْمَ الْقِيامَهِ اُوقَفُ اَنَا وَ عَلِيٌّ عَلَى الصِّراطِ فَما يَمُرُّ بِنا اَحَـدٌ اِلّا سَـئَلْناهُ عَنْ وَلايَهِ عَلِيٍّ، فَمَنْ كانَتْ مَعَهُ، وَاِلّا اَلْقَيْناهُ فِى النارِ!
وَذالِكَ قَوْلُهُ وَقِفُوهُمْ اِنَّهُمْ مَسْؤُلُونَ:

“Qiyamət günü mən və Əli “Sirat” körpüsünün üstündə duracaq və bizim yanımızdan keçən hər kəsdən Əlinin vilayətini soruşacağıq. Kim bəraət alsa, “Sirat”dan keçəcək, əks təqdirdə, onu cəhənnəmə atacağıq! “Onları (zülmkarları) saxlayın, çünki onlar

(sorğu-suala tutulacaqlar!” – ayəsinin mənası məhz budur!”(۳)

səh:۲۶۸

---

۱- [۱] . “Məcməül-bəyan”, ۷-ci cild, səh. ۴۴۱, bəhs etdiyimiz ayənin təfsirində.

۲- [۲] . “Şəvahidut-tənzil”, ۲-ci cild, səh. ۱۰۶-۱۰۷, hədis: ۷۸۶-۷۸۷.

۳- [۳] . Yenə orada, ۲-ci cild, səh. ۱۰۶-۱۰۷, hədis: ۷۸۸.

.Hakim Həskani həmin kitabda bu hədisi başqa sənədlərlə də nəql etmişdir

(İbn Həcər də "Əs-səvaiq" kitabında onu Əbu Səid Xudridən nəql etmişdir.(١

Əhməd ibn Hənbəl də "Müsnəd" kitabında Əbu Səid Xudridən belə nəql edir: "Qiyamət ".günü Əli ibn Əbi Talibin (ə) barəsində sorğu-sual olunacaqlar

Bu hədisi öz əsərlərində nəql edən digər alimlərdən "Kəşfül-ğümmə" kitabının(٢) müəllifi İzzəddin Hənbəlini, "Ruhul-məani" təfsirinin(٣) müəllifi Alusini, "Ət-təzkirətul-xəvass" kitabının(۴) müəllifi Sibt ibn Cövzini, "Kifayətul-xisam" kitabının(۵) müəllifi Əbu Nəim İsfahanini və "Yənabiul-məvəddət" kitabının(۶) müəllifi Şeyx Süleyman Qunduzini misal göstərmək olar. Əlbəttə, digər alimlər də onu nəql etmişlər ki, biz onların mühümlərinin adını çəkdik. Burada diqqəti cəlb edən məsələ budur ki, bu rəvayətlərin bəzisində imam Əlinin (ə) vilayətindən əlavə, Əhli-beytin vilayətinə də işarə edilmişdir.(٧) Daha əhəmiyyətlisi budur ki, qeyd edilən bütün rəvayətlər əhli-sünnənin mühüm mənbə və kitablarında məşhur ravilərdən nəql olunmuşdur. Amma bununla belə, Alusi qeyd etdiyimiz rəvayəti nəql etdikdən sonra yazır: "Bəzi imamiyyə şiələrinin İbn Cübeyr və İbn Abbasdan nəql etdikləri hədislərdə qiyamətdə Əlinin (ə) vilayətindən soruşulacağı deyilir. Onlar bu rəvayəti Əbu Səid Xudridən də nəql (etmişlər."(٨

Təəssüflər olsun ki, belə alimlər digər xəlifələrin də vilayətini özlərindən ona əlavə !!!etmişlər

Bu təəssübkeş təfsir alimi elə fikirləşir ki, imam Əlinin (ə) fəzilətləri ilə bağlı nəql olunan hər bir hədisin ravisi şiədir. Sanki onun əqidəsi hətta əhli-sünnə mənbələrində geniş nəql olunan bu hədisləri belə, qəbul etməyə icazə vermir. Həm də elə bil, güman



---

.Əs-səvaiq", səh. ٨٩" . [١] -١

.Kəşfül-ğümmə", səh. ٩٢" . [٢] -٢

.Ruhul-məani", bəhs etdiyimiz ayənin təfsirində" . [٣] -٣

.Ət-təzkirətul-xəvass", səh. ٢١" . [۴] -۴

۵- [۵] . “Kifayətul-xisam”, səh. ۳۶۱.

۶- [۶] . “Yənabiul-məvəddət”, səh. ۲۵۷.

۷- [۷] . “Əliyyun fil-kitabi vəs-sünnə”, ۱-ci cild, səh. ۲۲۹.

۸- [۸] . “Ruhul-məani”, ۲۳-cü cild, səh. ۷۴.

etməyib ki, gələcəkdə onun sözləri və fikirləri təhlil olunacaq və aydınlaşacaq ki, bu .hədislərin raviləri şiə yox, əksərən əhli-sünnənin böyük alimləridir

Ümumiyyətlə, bu hədislərin, eləcə də bəhs etdiyimiz ayənin mənası insanların qiyamət günü yalnız imam Əli ibn Əbi Talibin (ə) imamət və vilayəti barədə sorğu-sual olunacaqları deyil, həm də bütün əməlləri, nemətlər və hansı məsuliyyət daşıdıqları haqda soruşulacaqlar. Amma burada məqsəd budur ki, qiyamətdə sorğu-sual olunan ən mühüm məsələlərdən biri də o həzrətin vilayətidir. Şübhəsiz, burada vilayət bir möminin başqalarına qarşı bəslədiyi sadə dostluq deyildir; çünki bu özü fürui-dindən və dinin adi məsələlərindən sayılır, məqsəd ən üstün və əhəmiyyət daşıyan – İslamın əsaslarından olan o həzrətin canişinliyidir və bu da Peyğəmbəri-Əkrəm (s)-dən sonra rəhbərlik məqamı və ilahi xilafətdən başqa bir şey deyildir! Bəli, Əli ibn Əbi Talibin (ə) imamət və vilayəti İslamın ən mühüm əsası və imanın ən mühüm şərti olub, qiyamətdə soruşulacaq ilkin suallardandır. Əlbəttə, biz müxaliflərdən başqa bir iş də gözləmirik. Ədavətli düşmənlər həmişə o həzrətə qarşı çıxmış, fəzilətlərini inkar etmişlər və indinin özündə də bu işi görürlər. Bəzən dostları belə, düşmənin işkəncələrindən qorxaraq, bu fəzilətləri gizli saxlayırlar. Bununla belə, imam Əlinin (ə) fəzilətləri bütün hədis kitablarında doludur və onun misilsiz şəxsiyyəti Qurani-Kərimdə nur saçır! Burada da bəhsimizi bir çox İslam mənbələrində İbn Abbasdan nəql olunan məşhur bir hədislə sona yetiririk. O deyir: "Qurani-Kərimdə "Ya əyyuhəl-ləzinə amənu!" (Ey iman gətirənlər!) ifadəsi ilə başlayan hər bir ayənin kamil nümunəsi – möminlərin sərvəri, ağası və əmiri Əlidir. Qurani-Kərimdə Peyğəmbəri-Əkrəm (s)-in səhabələri içərisində danlanmayan yalnız Əli ibn Əbi Talib olmuşdur. Allahın kitabında Əli (ə) (onun fəzilətləri) haqda nazil olanlar heç kimin barəsində deyilməmişdir... (Qurani-Kərimin üç yüz ayəsi təkcə Əli (ə) haqda nazil olmuşdur!"(١)

Bu hədisi – xüsusilə onun əvvəlini – bir çox alimlər nəql etmişlər ki, buna misal Əbu Nəim İsfahani ("Hilyətül-övliya"da), Muhibbuddin Təbəri ("Zəxairul-uqba"da), Əllamə Gənci Şafei ("Kifayətut-talib"də), Sibt



---

.Təlxisu tarixid-Dəməşq", ١٨-ci cild, səh. ١, "Darul-fikr" çapı" . [١] -١

ibn Cövzi ("Ət-təzkirətul-xəvass"da), Şəblənci ("Nurul-əbsar"da), Heysəmi ("Əs-səvaiq"də), Süyuti ("Tarixul-xüləfa"da) və Qunduzini ("Yənabiul-məvəddət"də) (göstərmək olar.(۱)

Bəli, bütün bunlar Qurani-Kərimdə imam Əli (ə) haqda nazil olan ayələrin bir qismini .təşkil edir



---

Bu mənbələr haqda əlavə məlumat əldə etmək istəyənlər "Ehqaqul-həqq" . [۱] -۱ .kitabının ۳-cü cildinin ۴۷۶-cı səhifəsinə müraciət edə bilərlər

## VI. ON İKİ İMAM

### İşarə

Şiə məzhəblilərin arasında dörd imamı qəbul edən “zeydiyyə”, yeddi imamı qəbul edən “ismailiyyə” kimi firqələrə rast gəlinsə də, şübhəsiz, ən məşhur məzhəb kimi dünya müsəlmanlarının mühüm bir hissəsini təşkil edən “imamiyyə” şiələridir. Onlar bəzi ölkələrdə, o cümlədən, İraqda, İranda, Azərbaycanda və Bəhreyndə çoxluq, bəzi ölkələrdə də cəmiyyətin bir qismini təşkil edirlər. İmamiyyə şiələrinin on minlərlə tələbə təhsil aldığı və İslam maarifini öyrəndiyi böyük elmi mərkəzləri vardır. Şiə alimləri tərəfindən müxtəlif elmlər üzrə “İslam əqidələri”, “fiqh”, “üsul”, “təfsir”, “hədis”, “fəlsəfə”, “rical”, “dirayə” və “İslam tarixi” haqda on minlərlə kitab yazılmış və çap olunmuşdur. Böyük və görkəmli alim Şeyx Ağabüzürg Tehraninin son zamanlar iyirmi altı clddə çap olunan “Əz-zəriətu ila təsanifiş-şiə” adlı kitabında şiə alimlərinin on mindən artıq əsəri müəllifləri ilə yanaşı, qısa şərh edilmişdir. Bunlar göstərir ki, şiə alimlərinin İslama və elmə nə qədər xidməti dəymişdir.

Nə yaxşı olar ki, bunu bilmək istəyənlər şiələrin dünyanın müxtəlif məntəqələrində yerləşən elmi mərkəzlərinə baş vurub, müxtəlif elmlər üzrə böyük alim və tələbələrlə yaxından tanış olsun, onların əsərləri ilə maraqlansınlar.

Təəssüflər olsun ki, bir çox müsəlman ölkələrində informasiyaya qoyulan ciddi nəzarət və senzuralar səbəb olub ki, indiyə qədər əhli-sünnənin insaflı təhqiqatçıları belə, Əhli-beyt məktəbinin ardıcılları, alimləri və onların elmi əsərləri ilə yaxından tanış ola bilməsinlər.

Halbuki bizim kitabxanalarımız şiə alimlərinin kitab və əsərləri ilə yanaşı, əhli-sünnə alimlərinin də kitabları ilə doludur, kitabxanalarda onların arasında əsla fərq qoyulmur və heç kim də burada məzhəb təhlükəsi hiss etmir. Əhli-sünnə qardaşlarımızın kitabxanalarında isə şiələrin məşhur elmi əsərləri gözə dəymir və əgər olsa da, nadirdir. Arzumuz budur ki, münsif təhqiqatçılar bunlara diqqət yetirməklə imamiyyə şiələrini düşmənlərin, yaxud hakim durumun təbliğat vasitələri ilə deyil, obyektiv şəkildə tanısınlar. Bu isə şübhəsiz, İslam aləmində yeni üfüqlərin açıldığına, vəhdətin ...təşkilinə zəmin yaradacaqdır

Əsl bəhsimizə qayıdaraq deyirik ki, Quran ayələrində imam Əlidən (ə) əlavə, Əhli-beyt imamlarına bir sıra işarələr olunmuş və bunları təfsir kitablarında nəql olunan .rəvayətlərdə axtarmaq lazımdır

Biz isə burada həmin ayələrin bir neçəsinə işarə etməklə kifayətlənirik. Onların bir qismi kitabın əvvəlində imam Əlinin (ə) imamət və vilayəti ilə əlaqədar bəhslərdə keçdi :ki, aşağıdakı ayələri misal göstərmək olar

Təthir" ayəsi: "Həqiqətən, Allah siz Əhli-beytdən hər bir çirkinliyi təmizləyib, sizi pak-" .١ pakizə etmək istəyir!"(١) Bu ayənin möhtəvasına, eləcə də məşhur İslam mənbələrində Peyğəmbəri-Əkrəm (s)-dən onun təfsir və şərhində nəql olunan rəvayətlərə əsasən, onun məfhumu ümumi olsa da, imam Əlidən (ə) başqa digər məsum imamlara, .xüsusilə rəvayətlərdə adları çəkilən imam Həsən və imam Hüseynə (ə) də aiddir

Qurba" (məvəddət) ayəsi: "(Ya Peyğəmbər!) De: "Sizdən (risalət və" .٢ peyğəmbərliyimin müqabilində) ən yaxınlarımı sevməkdən başqa heç bir mükafat istəmirəm!"(٢) Bu ayədə də məsum imamlara qısa şəkildə işarə edilmiş və Səid ibn Cübeyr və İbn Abbasın Peyğəmbəri-Əkrəm (s)-dən nəql etdikləri müxtəlif rəvayətlərdə açıq-aydın göstərilmişdir ki, ondakı "qurba" (ən



---

.Əhzab" surəsi, ayə: ٣٣" .[١]-١

.Şura" surəsi, ayə: ٢٣" .[٢]-٢

yaxınlar) sözündən məqsəd Əli (ə), Fatimə (ə.s) və onların övladlarıdır. Bəzi rəvayətlərdə birbaşa imam Həsən və imam Hüseynin (ə) adları da çəkilmişdir. Əlavə (məlumat üçün "Şəvahidut-tənzil" və s. kitablara müraciət edə bilərsiniz.(١)

Ulil-əmr" (əmr sahibləri) ayəsi: "Allaha, Peyğəmbərə və sizlərdən olan əmr" .٣ sahiblərinə itaət edin!"(٢) Bu ayənin də məfhumu ümumi olub, hər bir dövrdəki əmr sahibinə aiddir. Buna əsasən, hər bir dövr və əsrdə pak, günahsız bir şəxsin vücudu zəruridir. Bundan əlavə, əhli-sünnənin bir çox mənbələrində nəql olunan məşhur .rəvayətlərdə imam Həsən və imam Hüseynin (ə) adları açıq-aydın çəkilmişdir

Sadiqin" (sadiq olanlar) ayəsi: "Sadiq olanlarla birgə olun!"(٣) Əvvəldə şərh etdiyimiz" .۴ kimi, bu ayənin də məfhumu ümumi olub, hər bir dövr və əsrə aiddir. Çünki hər bir dövrdə sözündə və əməlində doğru olan məsum bir imamın vücudu şübhəsizdir (qeydsiz-şərtsiz və mütləq şəkildə tabe olmaq yalnız məsum imamlarda öz mənasını tapır). Bu ayənin şərhində nəql olunan bir sıra rəvayətlərdə "sadiqin" sözü Peyğəmbər ((s) və onun Əhli-beytinə (ə) təfsir edilmişdir.(۴

Əvvəlki bəhslərdə bu ayələr və onları şərh edən rəvayətləri geniş şəkildə bəyan etdiyimiz üçün bir daha onları təkrarlamır və fəzilət ayələrini araşdırmağı davam edirik. Yenə də təkidlə deyirik ki, bu ayələr Əhli-beyt imamlarının vilayət və imamətinə birbaşa dəlalət etmir, sadəcə olaraq bununla onların yaşadıqları hər bir dövr və əsrdə ən üstün olduqlarını açıqlamaq məqsədi daşıyır. Ötən ayələrə əsasən, hər bir dövrdə bir məsum imam və əmr sahibinin vücudunun zəruriliyindən söz açdıq və bunu :əsaslandırmaq üçün bir sıra ayələri aşağıda qeyd edirik



---

Şəvahidut-tənzil"də bu haqda sənədləri müxtəlif olan altı hədis nəql" . [١] -١ .olunmuşdur, ٢. ci cild, səh. ١٣٠-١٣۴

.Nisa" surəsi, ayə: ۵٩" . [٢] -٢

.Tövbə" surəsi, ayə: ١١٩" . [٣] -٣

.Şəvahidut-tənzil", ١-ci cild, səh. ٢۶٢" . [۴] -۴

## ١–"SALAVAT" AYƏSİ

:Əhzab" surəsinin ٥٦-cı ayəsində buyurulur"

إِنَّ اللَّهَ وَمَلَائِكَتَهُ يُصَلُّونَ عَلَى النَّبِيِّ يَا أَيُّهَا الَّذِينَ آمَنُوا صَلُّوا عَلَيْهِ وَسَلِّمُوا تَسْلِيمًا

Həqiqətən, Allah və Onun mələkləri Peyğəmbərə salavat göndərirlər. Ey möminlər!" "!(Siz də) ona salavat və salam göndərin, onun əmrinə təslim olun

Bu ayədə İslam Peyğəmbərinin (s) məqamı çox yüksək bəyan olunmuşdur. Çünki həm Allah, həm Onun bütün mələkləri Peyğəmbər (s)-ə salam və salvat göndərir, həm də göstəriş verilir ki, müstəsna olunmadan bütün möminlər də o həzrətə salam, salavat !?və rəhmət göndərsinlər. Bundan da böyük məqam varmı

Düzdür ki, bu ayədə Peyğəmbər (s)-in övladlarından söz açılmamışdır, lakin bir çox rəvayətlərə görə, səhabələr Peyğəmbər (s)-dən "Sənə necə salam və salavat göndərək?" – deyə soruşduqda, o həzrət "ali" (övladlar) sözünü də öz adının kənarında qeyd etmişdir. Bununla da Allahdan o həzrət üçün salam və salavat istənildikdə, bu onun (s) övladlarına da aid olur. Burada Allah və mələklərinin həm Peyğəmbər (s)-ə, həm də onun övladlarına salavat göndərməsi sadə bir məsələ olmayıb, əksinə onların da Peyğəmbər (s)-dən sonra ağır məsuliyyət daşıdığını göstərir. Halbuki belə böyük məqama malik olmaq Peyğəmbər (s)-lə sadəcə qohumluq vasitəsilə qeyri-.mümkündür

İndi isə əhli-sünnənin məşhur mənbələrində nəql olunan bir sıra rəvayətləri qeyd :edirik

١) Buxarinin "Səhih" kitabında Əbu Səid Xudrinin belə dediyi nəql olunur: "Biz Peyğəmbər (s)-dən soruşduq: "Ya Rəsuləllah! Sənə necə salam verməyin qaydası aydındır, necə salavat göndərməyi isə bilmirik?" Peyğəmbər (ə) buyurdu: "Belə deyin: "Əllahummə, səlli əla Muhəmmədin əbdikə və rəsulik, kəma səlləytə əla İbrahimə və ali-İbrahim və barik əla Muhəmmədin və əla ali-Muhəmməd, kəma barəktə əla İbrahim!" (İlahi! Bəndən və rəsulun Mühəmmədə salavat göndər, necə ki, İbrahim və onun övladlarına salavat göndərdin. Mühəmməd və onun övladlarına bərəkət yetir, (necə ki, İbrahimə bərəkət verdin!)(١)

Yenə həmin kitabda məşhur səhabə Kəb ibn Ücrədən nəql olunur ki, müsəlmanlar həzrət Peyğəmbər (s)-dən, ona necə salavat göndərmələrini soruşduqda, onlara bu qaydada salavat göndərməyi öyrətdi: "Əllahummə, səlli əla Muhəmməd və ali-Muhəmməd, kəma sələytə əla ali-İbrahim, innəkə həmidun məcid! Əllahummə, barik əla Muhəmməd və əla ali-Muhəmməd, kəma barəktə əla ali-İbrahim, innəkə həmidun məcid!" (İlahi! Mühəmməd və onun övladlarına salavat göndər, necə ki, İbrahimin övladlarına salavat göndərdin. Həqiqətən, Sən uca və tərifəlayiqsən. İlahi! Mühəmməd və onun övladlarına bərəkət yetir, necə ki, İbrahimin övladlarına bərəkət verdin. (Həqiqətən, Sən uca və tərifəlayiqsən!)(١)

.Buxari bu hədisləri "salavat" ayəsinin təfsirində qeyd etmişdir

Əhli-sünnənin ikinci məşhur mənbəsi sayılan "Səhihi-Müslüm" kitabında Əbu Məsud (٢ Ənsaridən belə nəql olunur: "Bir gün Peyğəmbəri-Əkrəm (s) bizim yanımıza gəlmişdi. Biz, Səd ibn Ubadənin məclisində idik. Sədin oğlu Bəşir dedi: "Ya Peyğəmbər! Allah-"?taala bizə sənə salavat göndərməyi göstəriş vermişdir. Sənə necə salavat göndərək

Peyğəmbər (s) bir az sükut etdikdən sonra buyurdu: "Deyin: Əllahummə, səlli əla Muhəmməd və əla ali-Muhəmməd, kəma sələytə əla ali-İbrahim və barik əla Muhəmməd və əla ali-Muhəmməd, kəma barəktə əla ali-İbrahim fil-aləmin, innəkə həmidun məcid!" (İlahi! Mühəmməd və onun övladlarına salavat göndər, necə ki, İbrahimin övladlarına salavat göndərdin. Mühəmməd və onun övladlarına bərəkət yetir, necə ki, o zaman İbrahimin övladlarına bərəkət verdin. Həqiqətən, Sən uca və (tərifəlayiqsən!) (٢)

Süyuti "Əd-durrul-mənsur" təfsirində Əbu Səid Xudrinin rəvayətini Buxari, Nisai, İbn (٣ (Macə və İbn Mərdəveyhdən nəql etmişdir.(٣)

Yenə həmin kitabda Əbu Səid Ənsarinin rəvayəti Termizi, Nisai



---

.Yenə orada . [١] -١

.Səhihi-Müslüm", ١-ci cild, səh. ٣٠٥, hədis: ۶۵, Beyrutun "Ehyau turasil-ərəbi" çapı" . [٢] -٢

və İbn Mərdəveyhdən(۱), azacıq fərqlə Malik, Əhməd, Buxari, Müslüm, Əbu Davuddan (onlar da Əbu Əhməd Saididən) nəql olunmuşdur.(۲)

Hakim Nişapuri “Əl-müstədrəkü ələs-səhiheyn” kitabında İbn Əbi Leylidən belə nəql edir ki, Kəb ibn Ücrə mənim yanıma gəlib dedi: “Peyğəmbər (s)-dən eşitdiyim müjdəni sənə deyimmi?”

Dedim: “Bəli!”

Dedi: “Peyğəmbər (s)-dən soruşdum ki, sənin Əhli-beytinə necə salavat göndərək?”

Peyğəmbər (s) buyurdu: “Deyin: Əllahummə, səlli əla Muhəmməd və ali-Muhəmməd, kəma səlləytə əla İbrahim və əla ali-İbrahim, innəkə həmidun məcid! Əllahummə, barik əla Muhəmməd və əla ali-Muhəmməd, kəma barəktə əla İbrahim və əla ali-İbrahim, innəkə həmidun məcid!” (İlahi! Mühəmməd və onun övladlarına salavat göndər, necə ki, İbrahimə və onun övladlarına salavat göndərdin. Həqiqətən, Sən uca və tərifəlayiqsən. İlahi! Mühəmməd və onun övladlarına bərəkət yetir, necə ki, İbrahimə və onun övladlarına bərəkət verdin. Həqiqətən, Sən uca və tərifəlayiqsən!”

“Səhihi-Müslüm” və Səhihi-Buxari”də mövcud olmayan hədisləri nəql edən Hakim Nişapuri yazır: “Bu hədisi eyni sənəd və ibarə ilə Buxari “Səhih” kitabında Musa ibn İsmayıldan nəql etmişdir. Mənim burada onu təkrar etməyimin səbəbi “Əhli-beyt” və “ali” sözlərinin eyni olduğunu göstərməkdir.(۳) Diqqət yetirmək lazımdır ki, Hakim Nişapuri bu hədisi Əhli-beytin Əli (ə), Fatimeyi-Zəhra (ə.s), Həsən (ə) və Hüseyn (ə) olduğunu açıq-aydın göstərən “Kisa” hədisindən sonra nəql etmişdir ki, bu da öz növbəsində dərin mənanı kəsb edir. Bundan sonra Hakim Nişapuri “səqəleyn” hədisini, daha sonra isə Əbu Hüreyrənin hədisini nəql edir ki, orada deyilir: “Peyğəmbər (s) Əli, Həsən və Hüseynə (ə) baxıb buyurdu: “Mən sizinlə müharibəyə qalxan hər kəslə müharibə, sizinlə sülh edən hər kəslə də sülh edirəm.”(۴)



---

۱- [۱] . Yenə orada.

۲- [۲] . Yenə orada.

۳- [۳]. “Əl-müstədrəkü ələs-səhiheyn”, ۳-cü cild, səh. ۱۴۷.

۴- [۴]. Yenə orada, səh. ۱۴۷.

Məhəmməd ibn Cərir Təbəri də “Təfsir” kitabında “salavat” ayəsinin təfsirində yuxarıdakı rəvayəti azacıq fərqlə Musa ibn Təlhədən və onun atasından, başqa bir rəvayəti İbn Abbasdan, üçüncü bir rəvayəti Ziyad və İbrahimdən, dördüncü rəvayəti isə Əbdür-Rəhman ibn Bəşir ibn Məsud Ənsaridən nəql etmişdir.(١)

Beyhəqi də “Sünən” adlı məşhur kitabında bu haqda çoxlu rəvayət nəql etmişdir ki, onların bəzisi namazda təşəhhüd vaxtı müsəlmanların vəzifəsini aydınlaşdırır. Məsələn, Əbu Məsud və Əqəbət ibn Əmrin hədisində belə deyilir: “Bir kişi gəlib Peyğəmbər (s)-in yanında əyləşdi və biz də orada idik. O dedi: “Ya Rəsuləllah! Sənə salam verməyi bilir, lakin namaz qılanda sənə salavat göndərməyin qaydasını isə bilmirik. Sənə necə salavat göndərək?” Bu vaxt Peyğəmbər (s) sükuta daldı və hətta biz o həzrəti belə görüb fikirləşdik ki, kaş, o kişi belə bir sual soruşmayaydı. Sonra Həzrət buyurdu: “Mənə salavat göndərmək istəsəniz, belə deyin: Əllahummə, səlli əla Muhəmmədin-nəbiyyil-ummiyy və əla ali-Muhəmməd, kəma səlləytə əla İbrahim və əla ali-İbrahim və barik əla Muhəmmədin-nəbiyyil-ummiyy və əla ali-Muhəmməd, kəma barəktə əla İbrahim və əla ali-İbrahim, innəkə həmidun məcid!” (İlahi! Ümmi peyğəmbərin Mühəmməd və onun övladlarına salavat göndər, necə ki, İbrahim və onun övladlarına salavat göndərdin. Ümmi peyğəmbərin Mühəmməd və onun övladlarına bərəkət yetir, necə ki, İbrahim və onun övladlarına bərəkət verdin. Həqiqətən, Sən uca və tərifəlayiqsən!)

Sonra o, Əbu Abdullah Şafeidən belə nəql edir: “Namazda Peyğəmbər (s)-ə salavat barədə söz açan bu hədis səhih və doğrudur.”(٢)

Beyhəqi Peyğəmbəri-Əkrəm (s)-ə mütləq şəkildə, yaxud namazda salavat göndərməyin qaydası haqda daha əlavə rəvayətlər də nəql etmişdir, xüsusilə Kəb ibn Ücrənin nəqlinə görə, Peyğəmbəri-Əkrəm (s) namazda belə salavat deyirmiş: “Əllahummə, səlli əla Muhəmməd



---

١- [١] . “Camiul-bəyan”, Təbəri, ٢٢-ci cild, səh. ٣٢, Beyrutun “Darul-mərifət” çapı.

٢- [٢] . “Sünəni-Beyhəqi”, ٢-ci cild, səh. ١٤٦-١٤٧.

və ali-Muhəmməd, kəma sələytə əla İbrahim və əla ali-İbrahim və barik əla Muhəmməd və ali-Muhəmməd, kəma barəktə əla İbrahim və ali-İbrahim, innəkə (həmidun məcid!”(١)

Bu hədisdə açıq-aydın görünür ki, hətta Peyğəmbər (s)-in özü namazlarında bu .salavatı deyirmiş

Beyhəqi rəvayətlərin birini şərh edərkən yazır: “Bu rəvayət namaza aiddir. Çünki bu rəvayətdə qeyd olunan “qəd əlimna keyfə nusəllimu” (biz salam göndərməyin qaydasını bilirik” – ibarəsi namazın təşəhhüddən sonrakı salamı (Əssəlamu, əleykə (əyyuhənnəbiyyu və rəhmətullahi və bərəkatuh!) ilə uyğun gəlir.”(٢)

Beləliklə, bütün məzhəblərin əqidəsinə görə, müsəlmanlar namaz üstə Peyğəmbəri-Əkrəm (s)-ə salam göndərərkən “Əssəlamu əleykə əyyuhənnəbiyyu və-rəhmətullahi və bərəkatuh!”, təşəhhüddə isə “Əllahummə, səlli əla Muhəmməd və ali-Muhəmməd...” – ibarələrini deməlidirlər. Əlbəttə, əhli-sünnə məzhəbləri arasında bu məsələ ilə əlaqədar ixtilaf gözə dəyir. Şafei və hənbəlilər ikinci təşəhhüddə Peyğəmbər (s)-ə salavat göndərməyi vacib saydıqları halda, maliki və hənəfilər onu müstəhəb bilirlər.(٣) .Lakin qeyd etdiyimiz rəvayətlərə əsasən, təşəhhüddə salavat demək hamıya vacibdir

Peyğəmbər (s) və onun Əhli-beytinə (mütləq şəkildə, yaxud namazın təşəhhüdündə) salavatın vacibliyi ilə bağlı rəvayətlər və bunu qeyd edən kitabların sayı az deyildir. Burada qeyd etdiyimiz həm rəvayət, həm də kitabların az bir qismi idi. Bu rəvayətlər İbn Abbas, Təlhə, Əbu Səid Xudri, Əbu Hüreyrə, Əbu Məsud Ənsari, Büreydə, İbn .Məsud, Kəb ibn Ücrə və imam Əli (ə) kimi səhabələrdən nəql edilmişdir

İnsanı daha heyrətləndirən məsələ budur ki, əhli-sünnə (alimləri də daxil olmaqla) Peyğəmbər (s)-dən nəql olunan rəvayətlərdə “ali-Mühəmməd” (Mühəmmədin (s) övladları) sözünün qəti qeyd olunmasına baxmayaraq, (çox nadir halları müstəsna etməklə) həmişə salvatı naqis (“Səlləllahu əleyhi və səlləm”) deyirlər. Bundan



---

١- [١] . ١٤٧ .Yenə orada, səh

۲- [۲] . Yenə orada.

۳- [۳] . “Əl-fiqh ələl-məzahibil-ərbəə”, ۱-ci cild, səh. ۲۶۶, “Darul-fikr” çapı.

da heyrətlisi budur ki, hətta hədis kitablarında salavatda “ali-Mühəmməd” (s) sözünün əlavə edilməsinə dair rəvayətlərləri nəql edərkən onların əsnasında Peyğəmbər (s)-in adını yenə “ali-Mühəmməd” olmadan – “Səlləllahu əleyhi və səlləm!” – deyirlər. (Bundan böyük inadkarlıq olmaz!) Biz daha bilmirik ki, onlar Peyğəmbər (s)-in aşkar göstərişinə müxalifətləri ilə qiyamət günü Allahın dərgahına nə üzrlə çıxacaqlar?! Məsələn, Beyhəqi kimi bir alim Peyğəmbər (s)-ə salavat bölümünü bu ünvanla qeyd edir: “Babus-sələvati ələn-nəbiyyi (səlləllahu əleyhi və səlləm) fit-təşəhhüd.” Yəni “Təşəhhüddə Peyğəmbər (səlləllahu əleyhi və səlləm)-ə salavat bölümü”. Həmçinin digər məşhur mənbələrdə də bunu belə qeyd etmişlər. Bu kitablarda fəsillərin istər onların müəllifləri, istərsə də tədqiqatçılar tərəfindən belə adlanması, daxilində qeyd edilən hədislərlə çox qəribə ziddiyyət təşkil edir. Bu məsələ ilə əlaqədar bəhsimizi iki hədislə sona yetiririk:

١. İbn Həcər “Əs-səvaiq” kitabında Peyğəmbəri-Əkrəm (s)-in belə buyurduğunu nəql edir:

لا تُصَلُّوا عَلَيَّ الصَّلاةَ الْبَتْراءَ:

“Mənə heç vaxt yarımçıq salavat deməyin.”

O həzrətdən soruşdular: “Yarımçıq salavat necədir?”

Peyğəmbər (s) buyurdu:

اَللّهُمَّ صَلِّ عَلَى مُحَمَّدٍ وَ تُمْسِكُونَ، بَلْ قُولُوا اَللّهُمَّ صَلِّ عَلَى مُحَمَّدٍ وَ آلِ مُحَمَّدٍ:

“Əllahummə, səlli əla Muhəmməd” – deyib, susasınız. Əksinə, (salavatı) belə deyin: “Əllahummə, səlli əla Muhəmməd və ali-Muhəmməd!”(١)

Bu hədisdən göründüyü kimi, salavatda “Muhəmməd” və “ali-Muhəmməd” (s) arasında hətta “əla” sözü belə ayrılıq salmamalı, “Əllahummə səlli əla Muhəmməd və ali-Muhəmməd!” – deyilməlidir.

٢. Səmhudi “Əl-işrafu əla fəzlil-əşraf” kitabında İbn Məsuddan Peyğəmbəri-Əkrəm (s)-in belə buyurduğunu nəql edir:

مَنْ صَلّی صَلاةً لَمْ یُصَلِّ فِیها عَلیَّ و عَلَی اَهْلِ بَیْتِی لَمْ تُقْبَلْ:

„Kim namaz qılarkən mənimlə Əhli-beytimə salavat deməsə“



---

۱- [۱]. “Əs-səvaiq”, səh. ۱۴۴.

(onun namazı qəbul deyildir.”(١

:Şafei də məşhur bir şerində buna işarə edərək yazır

Ya Əhlə-beyti Rəsulillah, hubbukumu“

!Fərzun minəllahi fil-Qurani ənzələh

,Kəfakum min əzimil-qədri ənnəkumu

(Mən ləm yusəlli ələykum la səlatə ləh.”(٢

***

,Ey “Peyğəmbər Əhli-beyti”, sevginiz“

!Vacib olub, Qurandadı bu yazı

,Yetər sizə o möhtəşəm qədriniz

”.Salavatsız kəsin puçdur namazı

Namazda Allahın vacib buyurduğu bir əməl kimi adı Peyğəmbər (s)-in adının kənarında qeyd edilən şəxsləri başqaları ilə bərabər, yaxud başqalarını imamət, vilayət və Peyğəmbər (s)-in canişinliyinə layiq bilmək olarmı? Hansı insaflı şəxs özünə bəraət qazandıra bilər? Məgər, bunlar birbaşa imamət və xilafəti onlara həsr etmirmi? Ədalət .və insafı sizə tapşırırıq

### NUR” VƏ “BÜYUT” (EVLƏR) AYƏSİ”–٢

:Nur” surəsinin ٣٦-٣٨-ci ayələrində buyurulur“

فِي بُيُوتٍ أَذِنَ اللَّهُ أَن تُرْفَعَ وَيُذْكَرَ فِيهَا اسْمُهُ يُسَبِّحُ لَهُ فِيهَا بِالْغُدُوِّ وَالْآصَالِ رِجَالٌ لَّا تُلْهِيهِمْ تِجَارَةٌ وَلَا بَيْعٌ عَن ذِكْرِ اللَّهِ وَإِقَامِ الصَّلَاةِ وَإِيتَاء الزَّكَاةِ يَخَافُونَ يَوْمًا تَتَقَلَّبُ فِيهِ الْقُلُوبُ وَالْأَبْصَارُ لِيَجْزِيَهُمُ اللَّهُ أَحْسَنَ مَا عَمِلُوا وَيَزِيدَهُم مِّن فَضْلِهِ وَاللَّهُ يَرْزُقُ مَن يَشَاء بِغَيْرِ حِسَابٍ

İlahi nur) Allahın tikilib (şeytanların əlindən uzaq olmaq üçün) ucaldılmasına və öz)“ adının zikr edilməsinə izn verdiyi o evlərdir ki, orada səhər-axşam Onu təqdis edib

şəninə təriflər deyərlər. O kəslər ki, nə ticarət, nə alış-veriş onları Allahı zikr etməkdən, namaz qılmaqdan və zəkat verməkdən yayındırmaz. Onlar qəlblərin və gözlərin haldan-hala düşəcəyi bir gündən qorxarlar ki, Allah onlara yerinə yetirdikləri əməllərin ən gözəl mükafatını versin, onlara olan lütf və mərhəmətini artırsın. Allah istədiyi "!şəxsə saysız-hesabsız ruzi verər

Allah-taala bu surənin ۳۵-ci ayəsində ilahi nuru çox dəqiq, incə və



---

Əl-işrafu əla fəzlil-əşraf", səh. ۲۸, "Ehqaqul-həqq" kitabından nəqlən, ۱۸-ci cild,“ . [۱] -۱ .səh. ۳۱۰

.Şərhul-məvahib", Zərqani, ۷-ci cild, səh. ۷“ . [۲] -۲

gözəl misallarla şərh etdikdən sonra ardınca gələn ayələrdə onun yerini və sahiblərini bəyan edərək buyurur: Bu nur aşağıdakı xüsusiyyətlərə malik olan evlərdədir; bu evlər şeytanların əli çata bilmədiyi hündür divarlarla ucaldılmışdır, onu gecə-gündüz, sübh və axşam Allahı yad edən kəslər qoruyub-saxlayırlar, elə kəslər ki, dünyanın maddi ləzzətləri, qızıl-gümüşü onları Allahı zikr etməkdən, namaz qılmaqdan və zəkat verməkdən ayırmır, onlar qiyamət, hesab-kitab günündən qorxurlar və bu qorxu ümidlə yanaşıdır, onlar haqq yolda daim çalışırlar və Allah-taala belə insanlara saysız-hesabsız savab verər.

Bu ibarələrə diqqət yetirdikdə, ilahi evlərin və onların mühafizlərinin necə də əzəmətlə vəsf edildiyinin şahidi oluruq. İndi isə bu ayə ilə əlaqədar nəql olunan rəvayətlərə diqqət yetirək:

Süyuti "Əd-durrul-mənsur" kitabında Peyğəmbər (s)-in iki səhabəsi Ənəs ibn Malik və Büreydədən nəql edir ki, Peyğəmbər (s) bu ayəni tilavət edərkən, bir nəfər ayağa qalxıb soruşdu: "Ya Rəsuləllah! Bu ayədəki evlər kimlərindir? Peyğəmbər (s) buyurdu: "Peyğəmbərlərin evləridir." Əbu Bəkr ayağa qalxıb dedi: Bu evlər məlum oldu, bəs, Əli və Fatimənin evi necə? Peyğəmbər (ə) buyurdu: "Bəli, bu o evlərin ən üstünüdür!"(١)

Bu rəvayətin oxşarını Hakim Həskani "Şəvahidut-tənzil" kitabında Peyğəmbər (ə)-in başqa səhabəsi Əbu Bərzədən nəql etmişdir. O deyir: "Bir nəfər Peyğəmbər (s)-dən soruşdu: Ya Rəsuləllah! Əli və Fatimənin də evi o evlərdən sayılırmı? Peyğəmbər (s) buyurdu: "O evlərin ən fəzilətlisidir!"(٢)

Hakim Həskani bu rəvayətdən sonra ötən rəvayəti də iki sənədlə Ənəs ibn Malik və Büreydədən nəql etmişdir.(٣)

Diqqəti cəlb edən məsələ budur ki, Əhli-beytin (ə) bütün fəzilətlərinə iradla yanaşan "Ruhul-məani"nin müəllifi bura çatdıqda, birinci rəvayəti Ənəs ibn Malik və Büreydədən nəql etdikdən sonra yazır: "Əgər bu rəvayət səhih və doğru olsa, ayənin təfsirində onu

١- [١]. “Əd-durrul-mənsur”, ٥-ci cild, səh. ٥٠.

٢- [٢]. “Şəvahidut-tənzil”, ١-ci cild, səh. ٤١٠, hədis: ٥٦٦.

٣- [٣]. Yenə orada, hədis: ٥٦٧-٥٦٨.

nəzərə almamaq insafsızlıqdır!”(۱) (Başqa sözlə desək, ayənin ən gözəl təfsiri budur ki, vəsf olunan evlər peyğəmbərlərin evləridir və onların ən fəzilətlisi Əli və Fatimənin (!evidir

Əhli-sünnənin digər alimləri də bu rəvayəti öz əsərlərində nəql etmişlər. Şübhəsiz, bu rəvayətlər Əli (ə), Fatimə (ə.s) və onların övladları Həsən və Hüseynə (ə), eləcə də imam Hüseynin (ə) nəslindən olan Fatimənin (ə.s) övladlarına, yəni məsum imamlara da şamil olur. Çünki bütün imamlar həmin sülaləyə mənsub olub, onların davamçılarıdır. Bəli, onların evi peyğəmbərlərin evləri ilə bərabər, hətta daha fəzilətli olub, həmişə ilahi nurla işıqlanır və şeytanların əlindən uzaqdırlar. Şübhəsiz, bu evlərin sakinləri də insanların ən üstünü, ən fəzilətlisidir və fəzilətcə ilahi peyğəmbərlərlə bərabərdirlər. Bütün bunlar qeyd etdiyimiz rəvayətlərdən aydın başa düşülürsə, !?görəsən, başqalarını onlardan üstün bilmək zülm və cəfa deyilmi

## SİRATİ-MÜSTƏQİM” (DOĞRU YOL) AYƏSİ”-۳

:Gündəlik namazlarda dediyimiz “Həmd” surəsinin ۶-cı ayəsində buyurulur

أِهْدِنَا الصِّرَاطَ الْمُسْتِقِيمَ

”!İlahi! Bizi doğru yola hidayət et“

Elə bir yola ki, bizi Sənin razılığını qazananlara çatdırsın, qəzəb etdiyin şəxslərin və azğınların yolundan ayırsın! İlahi! Bizi bu yola hidayət et, həm də bu yolda sabitqədəm .saxla

Şübhəsiz, “sirati-müstəqim” (doğru yol) geniş məna daşıdığından bəzi alimlər onu “İslam”, bəziləri “Quran”, bəziləri “Peyğəmbər (s) və həqiqi imamlar”, bəziləri “ilahi ayin”, bəziləri də “ilahi peyğəmbərlərin qayda-qanunları” kimi təfsir etmişlər ki, bunaların hər biri həmin geniş məfhumda özünə yer tapır. Amma müxtəlif sənədlərlə Peyğəmbəri-Əkrəm (s)-dən nəql olunan bir çox rəvayətlərə görə, doğru yolun xaricdə ən bariz nümunəsinə toxunulmuş, Əli ibn Əbi Talib (ə), yaxud Mühəmməd (s) və ali-Mühəmmədin yolu

göstərilmişdir. Hakim Həskani “Şəvahidut-tənzil” kitabında Cabir ibn Abdullah Ənsarinin Peyğəmbəri-Əkrəm (s)-dən nəql etdiyi hədisdə buyurulur:

اِنَّ اللهَ جَعَلَ عَلِيّاً وَزَوْجَتَهُ وَاَبْنائَهُ حُجَجُ اللهِ عَلى خَلْقِهِ وَهُمْ اَبْوابُ الْعِلْمِ فِى اُمَّتِى، مَنْ اِهْتَدى بِهِمْ هُدِىَ اِلى صِراطٍ مُسْتَقِيمٍ:

“Allah Əlini, zövcəsini (Fatimeyi-Zəhranı) və onların övladlarını məxluqatı üzərində ilahi höccət seçmişdir. Onlar mənim ümmətim içərisində elm qapılarıdır ki, hər kəs onların vasitəsilə hidayət olunsa, doğru yolu tutar!”(1)

Başqa bir hədisdə isə İbn Abbas Peyğəmbəri-Əkrəm (s)-in Əliyə (ə) belə buyurduğunu nəql edir:

اَنْتَ الطَّرِيقُ الْواضِحُ وَاَنْتَ الصِراطُ الْمُسْتَقِيمُ وَاَنْتَ يَعْسُوبُ الْمُؤمِنِينَ!:

“(Ya Əli!) Sən aydın və doğru yol, möminlərin rəhbərisən!”(2)

Üçüncü bir hədisdə İbn Abbas “İhdinəs-siratəl-mustəqim!” (İlahi, bizi doğru yola hidayət et!) – ayəsinin təfsirində deyir: “Ey Allahın bəndələri! Deyin ki, ilahi, bizə Peyğəmbər və onun Əhli-beytinin məhəbbətini nəsib et!”(3)

Dördüncü bir hədisdə isə Əbu Büreydədən nəql olunur və o deyir: “Doğru yoldan məqsəd Mühəmməd (s) və onun Əhli-beytidir!”(4)

Bu hədisi Əllamə Sələbi (“Təfsir”də)(5) və Şeyx Übeydullah Hənəfi (“Ərcəhül-mətalib”də) onu Əbu Hüreyrədən nəql etmişdir.(6)

“Şəvahidut-tənzil”də qeyd olunan beşinci hədis Əbdür-Rəhman ibn Zeyddən nəql olunur ki, onun atası “Siratəl-ləzinə ənəmtə ələyhim” (Nemət verdiyin şəxslərin yoluna (hidayət et)) – ayəsinin təfsirində deyir: “Onlar (nemət verilən kəslər) Peyğəmbər, onunla birgə olan Əli ibn Əbi Talib və onun şiələridir!”(7)

Bu haqda Əhli-beyt ardıcıllarının mənbələrində rəvayət çoxdur. Məsələn, imam Sadiq (ə) “Siratəl-ləzinə ənəmtə ələyhim” – ayəsinin

۱- [۱]. “Şəvahidut-tənzil”, ۱-ci cild, səh. ۵۸, hədis: ۸۹.

۲- [۲]. Yenə orada, hədis: ۸۸.

۳- [۳]. Yenə orada, səh. ۸۷.

۴- [۴]. Yenə orada, hədis: ۸۸.

۵- [۵]. “Təfsiri-Sələbi”, “Kifayətul-xisam” kitabından nəqlən, səh. ۳۴۵.

۶- [۶]. “Ərcəhül-mətalib”, səh. ۸۵, “Lahur” çapı.

۷- [۷]. “Şəvahidut-tənzil”, ۱-ci cild, səh. ۶۶, hədis: ۱۰۵.

(təfsirində buyurmuşdur: “Məqsəd, Mühəmməd (s) və onun övladlarıdır!”(۱)

Bütün bunlar göstərir ki, “sirati-müstəqim”in (doğru yolun) xaricdə ən aydın və ən bariz nümunəsi Peyğəmbər (s), Əli (ə) və Fatimeyi-Zəhranın (ə.s) məsum övladlarıdır. Deməli, kim onların vilayətinə bağlanıb, onları özünə örnək seçsə, sözsüz, Allahın haqq .yoluna düşəcək və azğınlıqdan uzaq olacaqdır

## ADƏM PEYĞƏMBƏRİN TÖVBƏSİ–۴

:Bəqərə” surəsinin ۳۷-ci ayəsində buyurulur“

فَتَلَقَّى آدَمُ مِن رَّبِّهِ كَلِمَاتٍ فَتَابَ عَلَيْهِ إِنَّهُ هُوَ التَّوَّابُ الرَّحِيمُ

Adəm (tərki-övladan, qadağan olunmuş ağaca yaxınlaşdıqdan sonra) öz Rəbbindən“ müəyyən kəlmələri öyrəndi, onların səbəbi ilə tövbə etdi və Allah onun tövbəsini qəbul ”!etdi. Allah tövbə qəbul edən və mərhəmətlidir

Allahın Adəmə (ə) tövbə üçün öyrətdiyi “kəlmələr”in nə olduğu barədə təfsirçilər arasında müxtəlif rəylər vardır. Bəzi təfsirçilərin əqidəsinə görə, bu kəlmələr “Əraf” surəsinin ۲۳-cü ayəsində verilən ibarələrdir: “(Adəm və Həvva) dedilər: “İlahi! Biz özümüzə zülm etdik. Əgər Sən bizi bağışlamasan və bizə rəhm etməsən, mütləq ”.ziyankarlardan olarıq

Bəzilərin nəzərincə, bunlar dualar, raz-niyazlar, o cümlədən, balığın qarnında həbs edilən Yunis peyğəmbərin duasından ibarətdir: “Ey mənim Rəbbim! Həqiqətən, mən ”...!özümə zülm etdim, məni bağışla. Çünki Sən bağışlayanların ən yaxşısısan

Lakin Peyğəmbəri-Əkrəm (s)-dən, yaxud səhabələrdən nəql olunan müxtəlif rəvayətlərdə bu “kəlmələr”in Allah-taalanın Mühəmməd (s), Əli, Fatimə, Həsən və .Hüseynin (ə) haqqına and verilməsi kimi təfsir və təvilləri gözə dəyir

Süyuti Əd-durrul-mənsur” kitabında bu ayənin təfsiri ilə bağlı İbn Abbasdan belə nəql edir: “Mən Peyğəmbəri-Əkrəm (s)-dən

Nurus-səqəleyn”, ١-ci cild, səh. ٢٣, hədis: ١٠١. Əlavə məlumat üçün o kitaba və“ . [١] -١
.“Burhan” kitabında nəql olunan hədislərə müraciət edin

soruşdum: Adəm peyğəmbərin Allahdan öyrəndiyi və onun vasitəsilə tövbə etdiyi “kəlmələr” nə idi? Peyğəmbər (s) buyurdu: “O, Allahı Mühəmməd, Əli, Fatimə, Həsən və Hüseynin haqqına and verərək tövbə etdi və Allah da onun tövbəsini qəbul etdi.”(١)

Yenə orada imam Əlidən (ə) belə nəql olunur: “Mən Peyğəmbəri-Əkrəm (s)-dən bu ayənin təfsirini soruşdum və Həzrət də buyurdu: “…Allah Adəmə öyrətdi ki, belə desin:

اَللّهُمَّ اِنِّی اَسْئَلُکَ بِحَقِّ مُحَمَّدٍ وَ آلِ مُحَمَّدٍ، سُبْحانَکَ لا اِلهَ اِلاّ اَنْتَ عَمِلْتُ سُوءً وَظَلَمْتُ نَفْسِی فَاغْفِرْلِی اِنَّکَ اَنْتَ الْغَفُورُ الرَّحِیمُ، اَللّهُمَّ اِنِّی اَسْئَلُکَ بِحَقِّ مُحَمَّدٍ وَ آلِ مُحَمَّدٍ، سُبْحانَکَ لا اِلهَ اِلاّ اَنْتَ عَمِلْتُ سُوءً وَظَلَمْتُ نَفْسِی فَتُبْ عَلَیَّ اِنَّکَ اَنْتَ التَّوّابُ الرَّحِیمُ فَهؤُلاءِ الْکَلِماتُ الَّتِی تَلَقَّی آدَمُ:

“İlahi! Mən Səni Mühəmməd və ali-Mühəmmədin haqqına and verirəm ki, Sən pak və münəzzəhsən, Səndən başqa heç bir məbud yoxdur. Mən pis iş görüb özümə zülm etdim, məni bağışla. Həqiqətən, Sən bağışlayan və mərhəmətlisən. İlahi! Mən Səni Mühəmməd və ali-Mühəmmədin haqqına and verirəm, Sən pak və münəzzəhsən, Səndən başqa heç bir məbud yoxdur, Sən paksan, Səndən başqa heç bir məbud yoxdur. Mən pis iş görüb özümə zülm etdim, mənim tövbəmi qəbul et. Həqiqətən, Sən tövbələri qəbul edən və mərhəmətlisən.” Adəmin Allahdan öyrəndiyi “kəlmələr” bunlardan ibarət idi!”(٢)

Bu rəvayətdən açıq-aydın başa düşülür ki, bu üç təfsirin arasında heç də ziddiyyət yoxdur və ola bilsin, onların hamısı birlikdə Adəm peyğəmbərə öyrədilmişdir. Adəm də onların həqiqətini, dolğun məna və batinini duymaqla onda kamil ruhi dəyişiklik baş verərkən, Allah-taalanın lütf və mərhəmətini qazanmışdır.

İbn Məğazili “Mənaqib” kitabında Səid ibn Cübeyrin İbn Abbasdan belə nəql etdiyini yazır: “Peyğəmbəri-Əkrəm (s)-dən Adəmin Allah-taaladan öyrəndiyi “kəlmələr” barəsində soruşulduqda, Həzrət buyurdu:

سَئَلَهُ بِحَقِّ مُحَمَّدٍ وَعَلِیٍّ وَ فاطِمَهَ وَالْحَسَنِ وَالْحُسَیْنِ اِلاّ ما تُبْتَ عَلَیَّ فَتابَ عَلَیْهِ:

“O, Allahı Mühəmməd, Əli, Fatimə, Həsən və Hüseynin haqqına and verərək tövbəsinin qəbul olunmasını istədi və Allah da onun tövbəsini qəbul

۱- [۱] . “Əd-durrul-mənsur”, ۱-ci cild, səh. ۶۰.

۲- [۲] . Yenə orada.

etdi.”(1)

Əllamə Qunduzi “Yənabiul-məvəddət”, Beyhəqi “Dəlailun-nubuvvət”, Bədəxşi “Miftahun-nəcah”, Abdullah Şafei “Mənaqib” kitablarında da bu hədisi nəql etmişlər.(2) Əksər kitablarda bu hədisin sonu İbn Abbasa gedib çıxsa da, onun ravisi təkcə o deyildir. Çünki “Əd-durrul-mənsur”da Deyləminin “Müsnədül-firdovs” kitabından nəql edilən bu hədisin sənədi imam Əliyə (ə) yetişir. Əli (ə) buyurur: “Peyğəmbəri-Əkrəm (s)-dən bu ayə (“kəlmələr”in nəyə işarə olunduğu) haqda soruşdum... Həzrət (s) buyurdu: “Allah-taala Adəmə tövbəsinin qəbul olunması üçün Məhəmməd və ali-Mühəmmədin haqqını and verməyi öyrətdi.”(3)

Bu haqda həm şiə, həm də əhli-sünnə mənbələrində imam Sadiqdən (ə) də müxtəlif sənədli rəvayətlər nəql olunmuşdur.

Burada göründüyü kimi, Əhli-beytin (ə) fəzilətlərini bəyan edən bu hədislərin üstündən gözüyumulu keçmək olmaz. Çünki həm Adəm peyğəmbər belə tövbə etmək və bağışlanmaq üçün Allah tərəfindən məmur olunur ki, Allahı Mühəmməd (s) və ali-Mühəmmədin (ə) haqqına and versin! Bu isə Əhli-beytdən (ə) başqa heç kimə aid olmayan, məhz onlara məxsus çox böyük məqamdır. Bununla belə, imamət və xilafət məqamına onlardan başqasını layiq bilmək olarmı?! Bu fəzilətlər göstərir ki, imamət və vilayət Peyğəmbərin (s) süláləsi və Əhli-beytində qiyamət gününə qədər davam edəcək və bu da təəccüblü deyildir!

### 5– ƏN YAXŞI ƏMƏL

“Nəml” surəsinin 89-cu ayəsində buyurulur:

مَن جَاء بِالْحَسَنَةِ فَلَهُ خَيْرٌ مِّنْهَا وَهُم مِّن فَزَعٍ يَوْمَئِذٍ آمِنُونَ

“Hər kəs həsənə ( yaxşı əməl) yerinə yetirsə, onu bu əməldən də yaxşı bir mükafat gözləyəcəkdir. Belələri o günün dəhşətli qorxusundan əmin-amanlıqda olarlar!”

Bu ayədəki “həsənə” (yaxşı əməl) sözü geniş mənada bütün yaxşı

١- [١]. "Mənaqib", "Ehqaqul-həqq" kitabından nəqlən, ٩-cu cild, səh. ١٠٢.

٢- [٢]. Yenə orada.

٣- [٣]. "Əd-durrul-mənsur", ١-ci cild, səh. ٦٠, biz burada hədisi ixtisarla qeyd etdik.

əməllərə şamil olur. Yaxşı əməl sahibləri Allahın xas mükafatları ilə müjdələnirlər ki, onlardan ən mühümü qiyamət və məhşər gününün dəhşətli qorxusundan əmin-.amanlıq içərisində olmaqdır

Bir çox rəvayətlərdə Peyğəmbər (s)-in Əhli-beytinə məhəbbət bəsləmək bu ayədə qeyd olunan yaxşı əməlin xaricdə ən gözəl və bariz nümunəsi kimi göstərilir. Bu da o deməkdir ki, insanın onlara məhəbbət bəsləməsi qiyamət günü ən gözəl əmin-.amanlığa səbəb olacaq

Şəvahidut-tənzil" kitabında bu ayənin təfsiri ilə əlaqədar bir neçə rəvayət nəql" olunmuşdur ki, orada yaxşı əməl Əhli-beytə (ə) məhəbbətlə əlaqələndirilmişdir. Əbu Abdullah Cədəli deyir ki, Əli (ə) mənə buyurdu: "İstəyirsənmi sənə "Hər kəs yaxşı əməl yerinə yetirsə, onu bu əməldən də yaxşı bir mükafat gözləyəcəkdir!" – ayəsinin təfsirini deyim?" Dedim: "Bəli, sənə qurban olum!" Həzrət buyurdu: "Yaxşı əməl biz Əhli-beytə məhəbbət, pis əməl isə bizə kin-küdurət və ədavət bəsləməkdir!" Sonra (Həzrət bu ayəni tilavət etdi."(١

Bu məzmun həmin kitabın ٥٨٢ və ٥٨٧-ci hədislərində vardır; bu fərqlə ki, ٥٨٧-ci hədisdə :belə buyurulur

اَلا اُخْبِرُکَ بالسَّیِّئَهِ الّتِی مَنْ جاءَ بِها اَکَبَّهُ اللهُ عَلی وَجْهِهِ فِی نارِ جَهَنَّمَ، بُغْضُنا اَهْلَ الْبَیْتِ!

Sənə elə pis əməlin adını deyimmi ki, Allah-taala onu yerinə yetirən hər kəsi üzü üstə" ".cəhənnəmə atacaqdır? O (pis əməl), Əhli-beytə kin-küdurət və ədavət bəsləməkdir

:Sonra Əmirəl-möminin Əli (ə) ikinci ayəni ("Nəml" surəsinin ٩٠-cı ayəsini) tilavət etdi

وَمَن جَاء بِالسَّيِّئَهِ فَكُبَّتْ وُجُوهُهُمْ فِی النَّارِ

(Hər kəs pis əməl yerinə yetirsə, cəhənnəm oduna üzü üstə atılar!"(٢"

Başqa bir hədisdə Əbu Əmamə Bahili Peyğəmbəri-Əkrəm (s)-in belə buyurduğunu :nəql edir

اِنَّ اللهَ خَلَقَ الاَنْبِیاءَ مِنْ شَجَرٍ شَتّی، وَخُلِقْنِی وَعَلِیّاً مِنْ شَجَرَهٍ واحِدَه، فَاَنَا اَصْلُها وَعَلِیٌّ فَرْعُها، وَالْحَسَنُ وَالْحُسَیْنُ ثِمارُها، وَ اَشْیاعُنا اَوْراقُها، فَمَنْ تَعَلَّقَ بِغُصْنٍ مِنْ اَغْصانِها نَجا، وَمَنْ زاغَ هَوی، وَلَوْ اَنَّ عابِداً عَبَدَاللهَ اَلْفَ عامٍ، ثُمَّ اَلْفَ عامٍ، ثُمَّ اَلْفَ عامٍ، ثُمَّ لَمْ

يُدْرِكْ مَحَبَّتَنااَكَبَّهُ اللهُ عَلى مِنْخَرَيْهِ فِى النّارِ:

Allah-taala peyğəmbərləri müxtəlif ağaclardan (köklərdən), məni və Əlini isə bir“ ağacdan yaratdı. Mən o ağacın kökü, Əli budağı, Həsən və

səh:۲۸۹

---

.Şəvahidut-tənzil”, ۱-ci cild, səh. ۴۲۵, hədis: ۵۸۱“ . [۱] -۱

.Yenə orada . [۲] -۲

Hüseyn meyvələri, şiələrimiz isə yarpaqlarıdır. Belə isə, o ağacın budaqlarının birindən yapışan şəxs nicat tapar, onlardan üz döndərən isə süqut edər. Əgər bir abid Allaha min il, yenə min il, yenə də min il ibadət etsə, lakin bizə məhəbbət bəsləməsə, Allah-taala onu üzü üstə cəhənnəmin oduna atar!”(١)

Əllamə Qunduzi birinci hədisi imam Əlidən (ə) nəql edərək, onu Həzrətin bu sözü ilə sona yetirir: “Yaxşı əməl bizə məhəbbət, pis əməl isə bizə kin-küdurət və ədavət bəsləməkdir!”(٢)

Yenə həmin kitabda İbn Kəsirdən imam Sadiqin (ə) belə buyurduğu nəql olunmuşdur: “Hər kəs yaxşı əməl yerinə yetirsə, onun müqabilində on bərabər mükafat verilər!” – ayəsi bütün müsəlmanlar üçün, “Hər kəs yaxşı əməl yerinə yetirsə, onu bu əməldən də yaxşı bir mükafat gözləyəcəkdir. Beləlıri o günün dəhşətli qorxusundan əmin-amanlıqda olarlar!” – ayəsi isə yalnız vilayəti qəbul etmək və bizə (Peyğəmbər (s)-in Əhli-beytinə) məhəbbət bəsləməyin mükafatıdır!”(٣)

Bir qrup təfsir və hədis alimi bu ayənin təfsirində Əhli-beytə (ə) məhəbbət bəsləməyi böyük “həsənə” və yaxşı əməl kimi qeyd etməsələr də, “Şura” surəsinin “Kim yaxşı əməl yerinə yetirsə, onun yaxşılığının savabını artırarıq!”(۴) – ayəsinin təfsirində bu məzmunu daşıyan hədislər nəql etmişlər. Məsələn, Süyuti “Əd-durrul-mənsur” kitabında İbn Əbi Hatəmdən İbn Abbasın bu ayənin təfsirində belə dediyini nəql edir: “Bu ayədəki yaxşı əməldən məqsəd Məhəmməd (s)-in Əhli-beytini sevməkdir!”(۵)

Alusi “Ruhul-məani” kitabında bu ayənin (“Şura”/٢٣) təfsirində “həsənə”dən (yaxşı əməldən) məqsədin Əhli-beytə (ə) və Peyğəmbər (s)-in yaxın adamlarına məhəbbət bəsləməyi bildirən bəzi təfsir alimlərinin nəzərlərini və bunun İbn Abbas və Südeydən nəql olunduğunu qeyd etdikdən sonra yazır: “Peyğəmbər (s)-in Əhli-



---

١- [١]. “Şəvahidut-tənzil”, ١-ci cild, səh. ۴٢٨, hədis: ۵٨٨.

٢- [٢]. “Yənabiul-məvəddət”, səh. ٩٨.

٣- [٣]. Yenə orada.

۴- [۴]. “Şura” surəsi, ayə: ٢٣.

beytini sevmək ən böyük həsənə və yaxşı əməldir və bu ayədə qeyd olunan “həsənə”nin önündə qərar tuturlar.”(۱)

Buna oxşar hədislər başqa kitablarda da nəql olunmuşdur və biz isə qeyd olunanlarla kifayətlənirik. Bu bəhsi də Əhli-beytin (ə) məhəbbətini qiymətləndirən bir hədislə sona yetiririk. (Əlbəttə, bu hədis bəhs etdiyimiz ayənin təfsirində nəql olunmamışdır.)

Şəblənci “Nurul-əbsar” kitabında Peyğəmbəri-Əkrəm (s)-dən (öz etirafına görə, səhih və doğru olan) belə bir hədis nəql edir:

وَاللهِ لا يَدْخُلُ قَلْبَ رَجُلٍ، اَلْاِيمانَ حَتّى يُحِبَّهُمْ اَهْلَبَيْتِى لِقَرابَتِهِمْ مِنِّى:

“Allaha and olsun! Mənim Əhli-beytimi onların mənimlə yaxınlığına görə sevməyən şəxsin qəlbinə iman daxil olmaz.”(۲)

Bunu da qeyd edirik ki, sadə məhəbbət və sevgi qiyamət gününün dəhşətli qorxusundan kiməsə əmin-amanlıq verə bilməz, yaxud imanın şərtlərindən əsla sayılmaz. Bu ibarələr açıq-aydın göstərir ki, Əhli-beytin sevgisi, sözsüz, din və nübüvvətin davamı, imanın qorunub-saxlanılmasını təmin edən imamət və vilayət əsası ilə əlaqədardır.

Qeyd etdiyimiz bütün ayə və rəvayətlərdən aydın başa düşülür ki, Peyğəmbər (s)-in Əhli-beyti, xüsusilə Əli ibn Əbi Talib, Fatimeyi-Zəhra, Həsən və Hüseyn (ə) yüksək məqama malikdirlər; onları sevmək risalət və peyğəmbərliyə hörmət, onlara salavat göndərmədən qılınan namaz batildir, onlar “sirati-müstəqim” (doğru yol) və Adəm peyğəmbərin tövbə üçün Allahdan öyrəndiyi müqəddəs adlar və sözlərdir. Bəli, bu böyük fəzilətlərə malik olan, həm şiə, həm də əhli-sünnənin məşhur rəvayətlərində böyük adla yad edilən kəslər başqaları ilə bərabər deyildir. Onlara məhəbbət bəsləmək, şübhəsiz, Peyğəmbər (s) tərəfindən əsası qoyulan imamət və vilayətə doğru atılan ilk addımlardır. Onlar “səqəleyn” kimi “mütəvatir” rəvayətlərdə Qurani-Kərimlə yanaşı durur, həm onlar, həm də Qurani-Kərim nicat gəmisi kimi tanıtdırılır. Bu sülalə qiyamət gününə qədər İslam ümməti arasında yaşayacaqdır və

müsəlmanların onlara sığınmaları labüddür. Onlar nicat gəmisi, parlaq ulduz, hidayət çıraqları və fəzilət dəryasıdırlar.

Bəli, bizim əqidəmizə görə, Qurani-Kərimdə Əhli-beytin (ə) fəzilətlərinə dair bir çox işarələr var ikən, Peyğəmbəri-Əkrəm (s)-in buyuruqları ilə bütün müsəlmanlara elan edilmişdir. Müsəlmanlar da Peyğəmbər (s)-ə itaət etməli, təəssübkeşlikdən əl çəkərək nicat yolunu seçməli, yəni o həzrətin Əhli-beytinə sarılıb, onların hidayət və rəhbərliyi ilə son məqsədə – səadət və təkamülə çatmalıdırlar. Bu qədər işarə və açıq-aşkar bəyanları, mötəbər sənədləri görməməzliyə vuranlar, yaxud Quranı öz şəxsi rəyi ilə təfsir edib hər tərəfə yozanlar qiyamət günü cavab verə bilməzlər!

## HƏDİSLƏRDƏ ƏHLİ–BEYT İMAMLARININ ADLARI

Qeyd etmək lazımdır ki, əhli-sünnə mənbələrində qeyd olunan bəzi rəvayətlərdə on iki imamın hamısının adları aşağıdakı tərtiblə qeyd olunmuşdur:

İmam Əli ibn Əbi Talib, imam Həsən ibn Əli, imam Hüseyn ibn Əli, imam Əli ibn Hüseyn, imam Mühəmməd ibn Əli-Baqir, imam Cəfər ibn Mühəmməd-Sadiq, imam Musa ibn Cəfər-Kazim, imam Əli ibn Musər-Riza, imam Mühəmməd ibn Əli-Təqi, imam Əli ibn Mühəmməd-Nəqi, imam Həsən ibn Əli-Əskəri və imam Mühəmməd ibn Həsən-Məhdi (əleyhimus-səlam)!

Süleyman ibn İbrahim Qunduzi Hənəfi “Yənabiul-məvəddət” kitabında iki hədis nəql etmişdir. Birinci hədis (“Fəraidus-səmteyn” kitabından) İbn Abbasdan belə nəql edilir: “Bir nəfər yəhudi, Peyğəmbəri-Əkrəm (s)-in hüzuruna gəlib İslam və onun təlimləri haqqında müxtəlif suallar soruşdu. O cümlədən, Həzrətin vəsi və xəlifələrindən soruşduqda, Peyğəmbəri-Əkrəm (s) birinci vəsisini Əli ibn Əbi Talibin, sonra Həsən və Hüseynin, sonra da doqquz imamın adlarını bir-bir çəkdi. Yəhudi iman gətirib dedi: Mən keçmiş peyğəmbərlərin kitablarında, o cümlədən, Musa peyğəmbərin kitabında oxumuşam ki, sonuncu peyğəmbərin ilk canişini onun kürəkəni, ikinci və üçüncü canişini bir-birilə qardaş və onun

(övladları, qalan doqquz nəfəri isə üçüncü canişinin övladları olacaq.”(١

İkinci hədis isə “Mənaqib” kitabından Cabir ibn Abdullah Ənsaridən nəql edilir və orada da on iki imamın adları bir-bir çəkilir. Bu hədis də yuxarıdakı əhvalata bənzəyir və uzun (olduğundan onu qeyd etmirik.(٢

Unutmamalıyıq ki, ötən bəhslərdə biz qısa şəkildə on iki imamın vücuduna dəlalət edən çoxlu rəvayət qeyd etdik. Əgər yenidən həmin bəhslərə müraciət etməklə həm şiə, həm də əhli-sünnənin məşhur və mötəbər rəvayətlərinə diqqət yetirsək, görəcəyik ki, on iki imam, yaxud on iki xəlifə üçün doğru təfsir yalnız şiələr tərəfindən bəyan edilmiş, digər firqələr üçün isə Peyğəmbər (s)-in on iki xəlifəsi barəsindəki buyuruqları anlaşılmaz qalmışdır. Ən mötəbər hədis mənbələrində nəql olunan bu rəvayətlərin əksəriyyəti Zsəhih olduğundan onları inkar etmək qeyri-mümkündür. Onların doğru .təfsiri yalnız imamiyyə şiələrinin əqidələri ilə uyğun gəlir

Ümid edirik ki, hər birimiz təəssübkeşlikdən əl çəkərək imamət, vilayət və Peyğəmbər (s)-in xilafəti ilə bağlı ayə və rəvayətləri bir daha yenidən araşdırıb, bütün !müsəlmanların üzünə yeni bir qapı açacağıq



---

.Yənabiul-məvəddət”, səh. ۴۴٠, ٨۶-cı bölüm“ . [١] -١

.Yenə orada, səh. ۴۴٢, ٨۶-cı bölüm . [٢] -٢

## (VII. PEYĞƏMBƏR (S)–İN SONUNCU XƏLİFƏSİ – İMAM MƏHDİ (Ə

### İşarə

İlk növbədə deyirik ki, bəzi xəbərsizlərin təsəvvürünə əks olaraq, imam Məhdinin (ə) qiyamı və cahanşümul hökumətinə inam yalnız Əhli-beyt məktəbinin ardıcıllarına – şiələrə məxsus deyildir. Müstəsnasız olaraq, bütün İslam firqələri arasında "axirəz-zaman"da Peyğəmbər (s)-in sülaləsindən Məhdi adlı bir şəxsin zühur edib, dünyanı haqq-ədalətlə dolduracağı təsəvvürü vardır və Peyğəmbəri-Əkrəm (s)-in bu məsələ ilə bağlı buyurduğu rəvayətləri onların kitablarında nəql edilmiş, bu haqda şiə və sünnü alimləri tərəfindən çoxlu kitab yazılmışdır. Biz kələcək səhifələrdə yeri gəldikcə, .onlardan statlar gətirəcəyik

Bu rəvayətlər müəyyən məzhəbə xas olmayıb, bütün İslam təhqiqatçıları tərəfindən qəbul edilən qəti və "mütəvatir" rəvayətlərdir. Bu təhqiqatçılar içərisindən yalnız İbn Xəldun və Əhməd Əmin Misri kimi neçə nəfər onların İslam Peyğəmbərindən (s) nəql olunmasında şübhə etmişlər. Bizim əqidəmizə görə, onların da məqsədi bu rəvayətləri zəif qələmə vermək olmamışdır. Bəlkə də onları belə fikrə vadar edən imam Məhdinin (ə) qiyamı ilə əlaqədar bir sıra xariqül-adə hadisələrin baş verməsidir ki, onları qəbul etmək çətindir. Halbuki "vəhhabi" kimi ən təəssübkeş firqə belə onu qəbul və bu hədislərin "mütəvatir" olduğunu etiraf edirlər. Bu müddəanın şahidi neçə il bundan öncə vəhhabilərin və Səudiyyə dövlətinin himayəsi altında fəaliyyət göstərən "Ümumdünya İslam əlaqələr

təşkilatı” tərəfindən imam Məhdinin (ə) zühuru ilə bağlı soruşulan sualın cavabında verilən bəyanatdır. Bu sual Keniyadan Əbu Məhəmməd adlı bir nəfər tərəfindən irəli sürülmüş, cavab olaraq bu bəyanat verilmiş və həmin təşkilatın sədri Məhəmməd Saleh Qəzzazın imzası ilə də təsdiq edilmişdir. Bu bəyanatda deyilir: “Vəhhabi məzhəbinin təsisçisi İbn Teymiyyə, Məhdi ilə bağlı hədisləri qəbul edir.” Sonra bu haqda Hicazın beş məşhur alimi tərəfindən yazılan bir risalədən statlar gətirilir və həmin risalənin bir yerində belə yazılır: “Dünyaya fitnə-fəsad, zülm və küfr hakim olduğu bir vaxtda, Allah-taala dünyanı Məhdinin vasitəsilə haqq-ədalətlə dolduracaqdır. O, on iki nəfərdən ibarət “raşidin” xəlifələrinin sonuncusudur və “Sihah” ”...kitablarına görə, Peyğəmbər (s) bu haqda xəbər vermişdir

İmam Məhdi (ə) haqda hədislər Peyğəmbər (s)-in bir çox səhabəsi tərəfindən nəql edilmişdir. O cümlədən, Osman ibn Əfvan, Əli ibn Əbi Talib, Təlhə ibn Übeydullah, Əbdür-Rəhman ibn Ovf, Abdullah ibn Abbas, Əmmar ibn Yasir, Abdullah ibn Məsud, Əbu Səid Xudri, Sovban, Qurrət ibn Əyas Məzəni, Abdullah ibn Haris, Əbu Hüreyrə, Hüzeyfə ibn Yəman, Cabir ibn Abdullah Ənsari, Əbu Əmamə, Cabir ibn Macid, Abdullah .ibn Ömər, Ənəs ibn Malik, İmran ibn Həsin və Ümmü Sələmə

İmam Məhdinin (ə) zühuru haqqında səhabələrin də bir çox sözləri nəql olunmuşdur ki, onları da Peyğəmbər (s)-in hədisləri ilə eyni səviyyədə hesab etmək olar. Çünki bu məsələnin ictihadla rabitəsi yoxdur. Deməli, səhabələr bu hədisləri Peyğəmbər (s)-dən .eşitmişlər

Həmin risalədə yazılır: “Bu iki mətləb (həm Peyğəmbər (s)-in, həm də səhabələrin rəvayətləri) İslamın bir çox məşhur mənbələrində və “əsl” hədis kitablarında nəql olunmuşdur, o cümlədən, “Sünəni-Əbi Davud”, “Sünəni-Termizi”, “Sünəni-İbn Macə”, “Sünəni-İbn Əmr”, “Müsnədi-Əhməd”, “Müsnədi-İbn Leyli”, “Müsnədi-Bəzzaz”, “Səhihi-Hakim”, “Məacimi-Təbərani”, “Məacimi-Darü-Qutni”, “Məacimi-Əbu Nəim”, .“Məacimi-Xətib Bağdadi”, “Məacimi-İbn Əsakir” və s

Bu məsələ o qədər əhəmiyyətlidir ki, bəzi İslam alimləri Məhdi ilə əlaqədar ayrıca kitablar yazmışlar, o cümlədən, Əbu Nəim İsfahani

Əxbarul-Məhdi", İbn Həcər Heysəmi "Əl-qovlul-muxtəsər fi əlamatil-Məhdiyyil-" Muntəzər", Şövkani "Ət-tövzihu fi təvatur caə fil-Muntəzəri vəd-Dəccali vəl-Məsih", İdris İraqi Məğribi "Əl-Məhdi", Əbul-Abbas ibn Əbdül-Mömin Məğribi "Əl-vəhmul-.məknun fir-rəddi əla Əli ibn Xəldun" və s. misal göstərmək olar

Bir çox alimlər öz əsərlərində qeyd etmişlər ki, Məhdi (ə) haqqında nəql olunan hədislər "təvatür" həddinə çatdığından, həmin hədisləri inkar etmək olmaz. Məsələn, Səxavi ("Fəthul-muğis"), Məhəmməd ibn Əhməd Səfavini ("Şərhul-əqidə"), Əbülhəsən Əbri ("Mənaqibuş-şafei"), İbn Teymiyyə "Fətava", Süyuti ("Əl-havi"), Şovkani ("Ət-tövzih") və Məhəmməd Cəfər Kənani ("Nəzmut-tənamur") imam Məhdi (ə) haqqındakı ".hədislərin "təvatür" həddinə çatdığını qeyd etmişlər

Bu bəhsin sonunda isə belə yazırlar: "Alimlərin içərisində yalnız İbn Xəldun, Məhdi haqqında olan hədislərə irad tutmaq istəmişdir ki, dinin böyükləri və İslam alimləri onun kəlamını rədd etmiş, hətta İbn Əbdül-Mömin kimiləri də onun nəzərini rədd etmək üçün ayrıca kitablar yazmışlar. Bir sözlə, hədis hafizləri və din alimləri açıq-aşkar qeyd etmişlər ki, Məhdi (ə) haqqında nəql olunan hədislər "səhih" (doğru) və ".“həsən”dir, bütövlükdə "təvatür" həddinə çatmışdır

Nəhayət, onlar belə nəticəyə gəlirlər: "Məhdinin (ə) zühuruna inam hər bir müsəlmana vacibdir. Bu əhli-sünnənin etiqadi əsaslarından biridir. Nadanları və bidətçiləri (müstəsna etməklə, heç kim bunu inkar etmir."(١)

Qeyd etmək lazımdır ki, təhqiqatçıların əqidəsinə görə, imam Məhdiyə (ə) yalnız müsəlmanlar deyil, həm də digər dinlərin ardıcılları inanaraq böyük dünyəvi islahatın intizarını çəkirlər. Bu onların da mənbələrində qeyd olunmuşdur. (Bu barədə məlumat əldə etmək istəyənlər imam Məhdinin (ə) zühuru ilə bağlı yazılmış kitablara müraciət ((edə bilərlər.(٢)



---

Bu risalənin müəlliflərinin adları: Məhəmməd Müntəzir Kənani (" İ slam fiqhi" . [١] -١ adına təşkilatın rəisi), Şeyx Saleh ibn İ siyyin, Şeyx Əhməd Məhəmməd Camal, Şeyx .Əhməd Əli və Şeyx Abdullah Xəyyat

٢- [٢]. Bu haqda “Məhdinin (ə) cahanşümul inqilabı” kitabına müraciət edə bilərsiniz.

:İndi isə imam Məhdinin (ə) zühuru ilə əlaqədar ayələri qeyd edirik

## YER ÜZÜNDƏ SALEHLƏRİN HÖKUMƏTİ–۱

:Ənbiya" surəsinin ۱۰۵-۱۰۶-cı ayələrində buyurulur"

وَلَقَدْ كَتَبْنَا فِى الزَّبُورِ مِن بَعْدِ الذِّكْرِ أَنَّ الْأَرْضَ يَرِثُهَا عِبَادِىَ الصَّالِحُونَ إِنَّ فِى هَذَا لَبَلَاغًا لِّقَوْمٍ عَابِدِينَ

Həqiqətən, Biz Zikrdən (Tövratdan) sonra Zəburda da yer üzünə yalnız Mənim saleh" bəndələrimin sahib olacağını yazmışdıq. Həqiqətən, bu sözdə ibadət edən bir qövmdən "!ötrü moizə, öyüd-nəsihət vardır

Saleh bəndələrin (axirət) mükafatlarını ardıcıl qeyd edən bu ayələrdə həqiqətdə, dünyəvi mükafatdan söz açılır. Bu elə mükafatdır ki, səadətin təmini, ilahi hökmlərin icrası, bəşəriyyətin nicat və islahı üçün zəmindir. Ayədə qeyd olunan "ərz" (yer) sözünün mütləq şəkildə bütün dünyaya və yer kürəsinə aid olduğunu nəzərə almaqla, yer kürəsində saleh bəndələrə cahanşümul hökumətin bərpası haqda müjdə verilir. Bu məsələ keçmiş zamanlarda gerçəkləşmədiyi üçün, mütləq gələcəkdə intizarı .çəkilməlidir. Bu da yalnız həzrət Məhdinin (ə) cahanşümul hökuməti ola bilər

Diqqət yetirmək lazımdır ki, "Biz bu vədi keçmiş peyğəmbərlərin kitablarında yazmışıq!" – ibarəsinə görə, bu yeni bir vəd deyil, hər zaman və hər dində bu haqda məlumat verilmişdir. Ayədə qeyd olunan "Zəbur"dan məqsəd çox ehtimala görə, Davud peyğəmbərin dua, münacat, raz-niyaz, moizə və öyüd-nəsihətlərdən ibarət olan "Zəbur" kitabıdır ki, "Əhdi-qədim"də (Tövratda) "Davudun məzamiri" adı ilə yad edilir. Maraqlıdır ki, zaman ötdükcə, "Əhdi-qədim" təhrifə məruz qalsa da, "Davudun məzamiri"ndə yenə bu böyük müjdənin şahidi oluruq. Bu kitabın ۳۷-ci bölümünün (məzmurunun) ۹-cu cümləsində belə deyilir: "...Çünki şər insanlara son qoyacaq, Allaha güvənənlər isə yer üzünün sahibləri, varisləri olacaqlar!" ۱۱-ci cümlədə də belə yazılır: "Təvazökarlar yer üzünün varisləri olacaq, sağlamlıqdan ləzzət alacaqlar!" ۲۷-cü cümlə isə bu ibarələrlə qeyd olunmuşdur: "Allaha yaxın olanlar yer üzünün

varisləri olacaqlar. Onun lənət etdiyi şəxslərə isə son qoyulacaq!” ۲۹-cu cümlə isə belədir: “Sadiqlər (sözündə və əməlində doğru olanlar) yer üzünə sahib və əbədi ”!olaraq orada sakin olacaqlar

Aydındır ki, buradakı “sadiqlər”, “Allaha təvəkkül edib güvənənlər”, “Allaha yaxın olanlar” və “təvazökarlar” kimi ifadələr Qurani-Kərimdə qeyd olunan “saleh bəndələr”lə eynidir. Bəhs etdiyimiz ayədə qeyd olunan “Zikr”dən məqsəd isə bir çox təfsirçilərin əqidəsinə görə Tövratdır. Necə ki, “Ənbiya” surəsinin ۴۸-ci ayəsində :buyurulur

وَلَقَدْ آتَيْنَا مُوسَى وَهَارُونَ الْفُرْقَانَ وَضِيَاء وَذِكْرًا لِّلْمُتَّقِينَ

Biz Musa və Haruna haqqı batildən ayıran, nur və pərhizkarlardan ötrü öyüd-nəsihət“ ”.olan Tövratı vermişdik

Beləliklə, imam Məhdinin (ə) zühur müjdəsi Tövratın digər fəsillərində, o cümlədən, Əşiya peyğəmbərin kitabında da verilmişdir. Necə ki, bu kitabın ۱۱-ci fəslində belə yazılır: “Həqiqətən, zalımlar üzərində ədalət hökm sürəcək və bu da yer üzünün yoxsulları üçün aydınlıq olacaqdır. Hər yerdə ədalət bərqərar olacaq, əhdə vəfa ediləcəkdir. Qurd qoyunun yanında yatacaq... Çünki yer üzü dənizlər su ilə dolduğu ”!kimi, Allahın elmi ilə dolacaqdır

Tövratın özündə də buna oxşar bəzi ibarələr vardır. Məsələn, ۱۳-cü fəslin ۱۵-ci cümləsində belə deyilir: “Yer üzünü İbrahimin övladlarından birinə verəcəyik...” ۱۸-ci fəslin ۲۰-ci cümləsi belədir: “Mən ona (İsmayıla) bərəkət verdim, onun övladlarını çoxaldacağam, nəhayət, on iki sərvər gətirəcək və onun ümməti böyük olacaqdır!” “On iki sərvər gətirəcək!” – ibarəsi göstərir ki, on iki imam və rəhbərin hamısı onun övladlarıdır. ۱۸-ci fəslin ۱۸-ci cümləsində deyilir: “Dünyanın bütün qövmləri onun ”!ətrafına toplaşacaqlar

İmam Məhdinin (ə) qiyamı ilə əlaqədar bu ayədəki açıq-aydın ibarələrdən əlavə, rəvayətlərdə də bu haqda geniş söz açılmışdır. Mərhum Təbərsi “Məcməül-bəyan” kitabında bu ayənin təfsirində imam Baqirdən (s) belə bir hədis nəql edir: “Onlar (yer ”.üzünə sahib olan saleh bəndələr) axirəz-zamanda Məhdinin dostlarıdır

Təfsiri-Qummi”də qeyd olunan bir hədisdə deyilir: “Bu ayədən məqsəd Məhdi (ə) və“ ”!onun səhabələridir

səh:۲۹۹

Burada ola bilər ki, Allahın saleh bəndələri yer üzünün hakimiyyətinin bir hissəsini öz ixtiyarına alsınlar. Necə ki, Peyğəmbərin dövründə və digər əsrlərdə belə hadisələr baş vermişdir. Lakin saleh bəndələrin bütün yer üzündəki hökuməti, yalnız həzrət Məhdinin (ə) zühuru zamanı olacaqdır. Bu haqda həm şiə, həm də əhli-sünnə vasitəsilə nəql olunan çoxlu “mütəvatir” hədislər vardır. Şeyx Mənsur Əli Nasif əhli-sünnənin məşhur “beş üsul”undan sayılan “Əttacul-cami lil-üsul” kitabında yazır: “Bütün keçmiş və müasir alimlər arasında məşhur nəzər budur ki, şübhəsiz, axirəz-zamanda Əhli-beytdən bir nəfər zühur edərək bütün İslam ölkələrinə hakim olacaq və bütün müsəlmanlar ona tabe olaraq onların arasında haqq-ədalətlə hökm sürəcək və dini ”!qüdrətləndirəcəkdir

Sonra yazır: “Məhdi haqqında deyilən hədisləri Peyğəmbər (s)-in bir qrup yaxın səhabələri nəql etmiş, eləcə də Əbu Davud, Termizi, İbn Macə, Təbərani, Əbu Yəla, Bəzzaz, Əhməd ibn Hənbəl və Hakim kimi böyük hədis alimləri öz əsərlərində qeyd (etmişlər.”(١

Hətta bu hədislərə şübhə ilə yanaşan İbn Xəldun belə, onların bütün İslam alimləri (arasındakı şöhrətini inkar edə bilməmişdir.(٢

Bu hədislərin “təvatür” həddində olduğunu nəql edən məşhur Misir alimi Məhəmməd Şəblənci “Nurul-əbasar” kitabında yazır: “Peyğəmbəri-Əkrəm (s)-dən bizə gəlib çatan “mütəvatir” hədislərə əsasən, Məhdi onun sülaləsindəndir və yer üzünü haqq-ədalətlə ”.dolduracaqdır

Bu ibarə bir çox kitablarda da vardır və hətta məşhur əhli-sünnə alimi Şövkani imam Məhdinin (ə) zühuru, Dəccalın qiyamı və həzrət İsa-Məsihin (ə) gəlişi ilə əlaqədar yazdığı kitabda bu hədislərin “təvatür” həddində olduğunu izah etdikdən sonra yazır: “Deyilən mətləblər zərrə qədər imanı, arpa dənəsi qədər insafı olan kəslər üçün (kifayətdir!”(٣

Biz isə burada məşhur İslam mənbələrində nəql olunan bu hədislərin bir neçəsini qeyd :etməklə kifayətlənirik

səh:۳۰۰

.(Ət-tacul-cami lil-üsul”, ۵-ci cild, səh. ۳۴۱ (kitabın vərəqaltı haşiyəsində“ . [۱] -۱

.İ bn Xəldun”, səh. ۳۱۱, Beyrut çapı “ . [۲] -۲

Ət-tacul-cami lil-üsul” kitabından nəqlən, ۵-ci cild, səh. ۳۶۰, “Daru ehyait-turasil-“ . [۳] -۳
.ərəbi” çapı

Əhli-sünnənin dörd imamından biri olan Əhməd ibn Hənbəl “Müsnəd” kitabında Əbu .١ :Səid Xudridən Peyğəmbəri-Əkrəm (s)-in belə buyurduğunu nəql etmişdir

لا ـ تَقُومُ السّـ اعَةَ حَتّى تَمْتَلَـأُ الْاَرْضَ ظُلْماً وَعُـدْواناً، قالَ ثُمَّ يَخْرُجُ رَجُلٌ مِنْ عِتْرَتِى اَوْ مِنْ اَهْلِ بَيْتِى يَمْلَأُها قِسْـطاً وَعَـدْلاً كَما مُلِئَتْ عُدْواناً:

Yer üzü zülm və haqsızlıqla dolmayınca, qiyamət bərpa olmayacaq; bu zaman mənim “ itrətimdən (Əhli-beytimdən) bir kişi qiyam edəcək və yer üzünü zülm və haqsızlıqla (dolduğu kimi, haqq-ədalətlə dolduracaqdır.”(١)

Bu hədisi Hafiz Əbu Davud Səcistani də “Sünən” kitabında azacıq fərqlə nəql .٢ (etmişdir.(٢)

Məşhur hədis alimi Termizi (Şeyx Mənsur Əli Nasifinin yazdığına görə) səhih sənədlə .٣ :Abdullahdan Peyğəmbəri-Əkrəm (s)-in belə buyurduğunu nəql etmişdir

لَوْ لَمْ يَبْقَ مِنَ الـدُّنْيا اِلاّ ـ يَوْمٌ لَطَوَّلَ اللهُ الْيَوْمَ حَـتّى يَبْعَثَ رَجُلاً ـ مِنِّى اَوْ مِنْ اَهْـلِ بَيْـتِى يَواطِئُ اِسْـمُهُ اِسْـمِى وَاِسْمُ اَبِيهِ اِسْمَ اَبِى يَمْلَأُ الاَرْضَ قِسْطاً وَعَدْلاً كَما مُلِئَتْ ظُلْماً وَجَوْراً:

Əgər dünyanın qurtarmasına bir gündən artıq qalmasa belə, Allah-taala həmin günü" məndən, yaxud mənim Əhli-beytimdən(٣) olan bir kişinin zühur edəcəyi vaxta qədər uzadacaq. Onun adı mənim adım, atasının adı mənim atamın adı ilə eynidir.(٤) O, yer (üzünü zülm və haqsızlıqla dolduğu kimi, haqq-ədalətlə dolduracaqdır!”(٥)

Hakim Həskani “Əl-müstədrək” kitabında bu hədisi azacıq fərqlə nəql etdikdən sonra yazır: “Bu hədis səhih və doğrudur, hərçənd, Buxari və Müslüm onu nəql etməmişlər!” ((٦)

Əbu Davud “Sünən” kitabında bunu Ümmü Sələmədən belə nəql edir: “Mən .٤ :Peyğəmbəri-Əkrəm (s)-in belə buyurduğunu eşitdim



---

.Müsnədi-Əhməd”, ٣-cü cild, səh. ٣٦“ .[١]-١

.Sünəni-Əbi Davud”, ٤-cü cild, səh. ١٥٢“ .[٢]-٢

Hədisdə qeyd olunan “məndən, yaxud mənim Əhli-beytimdən” deyilməsi ravinin . [٣] -٣
.şəkkini bildirir və hər ikisinin məfhum və möhtəvası birdir

Bəzi böyük alimlərin açıq-aydın qeydlərinə görə , hədisdə qeyd edilən “Atasının . [۴] -۴
adı atamın adı ilə eynidir!” – ibarəsinin əvəzində “atasının adı övladımın adı ilə eynidir!” nəql olunan ibarəsi doğrudur. Buna əsasən, bu hədis imam Məhdinin (ə) adı ilə tamamilə uyğun gəlir. Çünki imam Məhdinin (ə) adı Mühəmməd, atasının adı isə Həsən
.Əskəridir ki, Peyğəmbəri-Əkrəm (s)-in övladı imam Həsənin (ə) adı ilə eynidir

.Ət-tacul-came lil-üsul”, ۵-ci cild, səh. ٣۴٣“ . [۵] -۵

.Əl-müstədrəku ələs-səhiheyn”, ۴-cü cild, səh. ۵۵٨“ . [۶] -۶

اَلْمَهْدِیُّ مِنْ عِتْرَتی مِنْ وُلْدِ فاطِمَة

“Məhdi mənim sülaləmdən və Fatimənin övladlarındandır!”(۱)

۵. Hakim Nişapuri “Əl-müstədrək” kitabında Əbu Səid Xudridən daha ətraflı bir hədisdə Peyğəmbəri-Əkrəm (s)-in belə buyurduğunu yazır:

يَنْزِلُ بِاُمَّتِی فِی آخِرِالزَّمانِ بَلاءٌ شَديدٌ مِنْ سُلْطانِهِمْ، لَمْ يُسْمَعْ بَلاءٌ اَشَدُّ مِنْهُ، حَتّی تَضيقَ عَنْهُمُ الاَرْضُ الرَّحْبَهُ، وَحَتّی يَمْلَأَ الْاَرْضَ جَوْراً وَظُلْماً، لايَجِدُ الْمُؤمِنُ مَلْجَأً يَلْتَجِأُ اِلَيْهِ مِنَ الظُّلمِ فَيَبْعَثُ اللهُ عَزَّوَجَلَّ رَجُلاً مِنْ عِتْرَتی، فَيَمْلَأُ الْاَرْضَ قِسْطاً وَعَدْلاً كَما مُلِئَتْ ظُلْماً وَجَوْراً، يَرْضی عَنْهُ ساكِنُ السَّماءِ وَ ساكِنُ الْاَرْضِ، لا تَدَّخِرُ الْاَرْضُ مِنْ بَذرِها شَيْئاً اِلّا اَخْرَجَتْهُ، وَلاَ السَّماءُ مِنْ قَطْرِها شَيْئاً اِلّا صَبَّهُ اللهُ عَلَيْهِمْ مِدراراً:

“Axirəz-zamanda mənim ümmətim hökmranlar tərəfindən ağır bəlalara məruz qalacaq, belə ki, ondan ağır və şiddətlisi eşidilməmişdir! Hətta yer üzü bu qədər genişliyi ilə belə, onlara dar olacaq, zülm və haqsızlıq hər yeri tutacaq, mömin bir kəs zülmdən pənah aparmağa yer üzündə bir yer tapmayacaqdır. Bu zaman Allah-taala mənim sülaləmdən olan bir nəfəri göndərəcək ki, yer üzünü zülm və hasızlıqla dolduğu kimi, haqq-ədalətlə doldursun. Göy və yerin sakinləri ondan razı olarlar, yer üzü özünün bütün toxumlarını cücərdər, səma bütün yağışını onun üzərinə tökər (və hər yeri xeyir- bərəkət bürüyər)!”(۲)

Hakim Nişapuri bu hədisi qeyd etdikdən sonra yazır: “Bu hədis səhih və doğrudur, hərçənd, Buxari və Müslüm onu nəql etməmişlər.”

Müxtəlif ravilər tərəfindən nəql olunan bu hədislərin məşhur mənbələrdə qeyd olunması göstərir ki, axirəz-zamanda imam Məhdinin (ə) dünyaya hakim olacağı, yer üzünü haqq-ədalətlə dolduracağı və “həqiqətən, yer üzünə saleh bəndələr sahib olacaqlar!” – ayəsi gerçək həqiqətdir.

**۲– “NUR” AYƏSİ**

“Nur” surənin ۵۵-ci ayəsində buyurulur:

وَعَدَ اللَّهُ الَّذِينَ آمَنُوا مِنكُمْ وَعَمِلُوا الصَّالِحَاتِ لَيَسْتَخْلِفَنَّهُم فِی الْأَرْضِ كَمَا اسْتَخْلَفَ الَّذِينَ مِن قَبْلِهِمْ وَلَيُمَكِّنَنَّ لَهُمْ دِينَهُمُ الَّذِی ارْتَضَی لَهُمْ وَلَيُبَدِّلَنَّهُم مِّن بَعْدِ خَوْفِهِمْ أَمْنًا يَعْبُدُونَنِی لَا يُشْرِكُونَ بِی شَيْئًا وَمَن كَفَرَ بَعْدَ ذَلِكَ فَأُوْلَئِكَ هُمُ الْفَاسِقُونَ

Allah aranızda iman gətirib saleh əməllər yerinə yetirənləri – yalnız Mənə ibadət edən“
və heç nəyi Mənə şərik qoşmayanları – onların özlərindən



---

.Səhihi-Əbi Davud”, ۲-ci cild, səh. ۲۰۷“ .[۱]-۱

.Əl-müstədrəkü ələs-səhiheyn”, ۴-cü cild, səh. ۴۶۵. Heydərabad çapı“ .[۲]-۲

əvvəlkilər kimi yer üzünün varisləri edəcəyini, möminlər üçün Allahın Özü bəyəndiyi dinini möhkəmləndirəcəyini və onların qorxusunu sonra əmin-amanlıqla, arxayınçılıqla əvəz edəcəyini vəd etmişdir. Bundan sonra hər kəs kafir olsa, şübhəsiz ki, əsl "!fasiqlərdir

Bu ayədə açıq-aydın saleh və yaxşı işlər görən möminlərə müjdə verilir ki, onlar yer üzünün rəhbərliyini əldə edəcək, İslam dini hər tərəfə yayılacaq, qorxu əmin-amanlıq, arxayınçılıq və təhlükəsizliklə əvəz olacaq, şirkə, fitnə-fəsada son qoyulacaq, Allahın bəndələri azadlıqla yeganə Allaha ibadət edəcək və bütün insanlara höccət tamamlanacaqdır. Belə ki, əgər hər kəs bundan sonra küfr etsə, Allahın itaətindən .çıxmış əsl fasiq adlanacaqdır

Bu mühüm hadisə və ilahi vədlər həm Peyğəmbəri-Əkrəm (s)-in, həm də ondan sonrakı dövrlərdə nisbətən geniş miqyasda dünya müsəlmanları üçün gerçəkləşdi. Lakin sonralar düşmənlərin caynaqları altına keçən İslam və müsəlmanları qorxu və vəhşət bürüdü, bu, təkcə ərəb ölkələrini deyil, dünyanın əksər məntəqələrini əhatə etdi və düşmənlər bütün cəbhələrdə kəskin mövqe tutdular. Bununla belə, bütün dünyada şirk və bütpərəstliyi tövhidlə, zülm və haqsızlığı təhlükəsizlik, əmin-amanlıqla əvəz edəcək cahanşümul İslam hökuməti hələ də gerçəkləşməmişdir və mütləq onun intizarını çəkmək lazımdır. Bu böyük hadisə "mütəvatir" rəvayətlərə görə, imam Məhdinin (ə) zühuru və inqilabı ilə həyata keçəcəkdir. Lakin bu ayə nisbi olaraq İslam Peyğəmbərinin və ona yaxın olan dövrlərə də şamil olur. Bu isə geniş miqyasda imam Məhdinin (ə) zühurundan sonra baş verəcəkdir. Burada əsla ziddiyyət yoxdur və .bunlar ilahi vədlərin müxtəlif zamanlardakı təzahürləridir

Ayədə qeyd olunan "Onları özlərindən əvvəlkilər kimi yer üzünün varisləri edəcəyini vəd etmişdir!" – ibarəsindən məqsəd budur ki, keçmiş ümmətlərdə (nisbi) baş verdiyi kimi, möminlər və saleh bəndələr yer üzündən birdəfəlik zülm və küfrü qaldırıb yerində haqq hökuməti bərpa edəcəklər. Bunu biz "Yunus" surəsinin ۱۴-cü ayəsində də görürük: "Onların ardınca sizi yer üzünün varisləri təyin etdik ki, görək özünüzü necə "!aparacaqsınız

Buna “Əraf” surəsinin ۶۹ və ۷۴-cü ayələrində də işarə edilmişdir. Beləliklə, bu ayənin ilk dörd xəlifənin xilafəti zamanına dəlalət etdiyini və ilahi vədin onların dövründə gerçəkləşdiyini deyən Fəxri-Razi kimiləri yanılırlar. Çünki qeyd etdiyimiz ayə hətta Peyğəmbər (s)-in dövrünə aid olmayıb, “Yunus” surəsinin ۱۴-cü və “Əraf” surəsinin ۶۹-۷۵-ci ayələrində işarə edildiyi kimi, keçmiş qövmlər haqda deyilmişdir. Həmçinin “Əraf” surəsinin ۱۳۷-ci ayəsində də buna toxunulmuşdur: “Zəif görünən o tayfanı (İsrail övladlarını) yer üzünün xeyir-bərəkət verdiyimiz şərq və qərb tərəflərinə varis etdik. Səbir etdiklərinə görə, Rəbbinin İsrail övladlarına verdiyi gözəl sözlər tam yerinə ”.yetdi

Məlum olduğu üzrə, Allah İsrail övladlarını Fironun varisi etdi və onlar Misir və onun .ətraf nahiyələrinə, eləcə də orada mövcud bütün sərvətə sahib oldular

Ümumiyyətlə, bəhs etdiyimiz ayədə saleh bəndələrə, möminlərə geniş miqyasda yer üzünün rəhbərliyi müjdə verilir. Hərçənd, o zaman bu rəhbərlik və hökumət cahanşümul olmayıb, bütün dünyanı əhatə etmirdi, lakin bu özü də ilahi vədin gerçək bir nümunəsi idi. Onların yer üzündəki cahanşümul hökuməti isə təsis olunan zaman Allahın məşiyyət və istəyi, imam Məhdinin (ə) inqilabı ilə tam əksini tapacaq, Peyğəmbər (s)-in və sair məsumların rəvayətlərinə əsasən, o, bütün dünyanı zülm və haqsızlıqla dolduğu kimi, haqq-ədalətlə dolduracaqdır. Biz də Qurani-Kərimin vəd !etdiyi bu hökumətin intizarını çəkirik

Bu ayənin təfsiri ilə bağlı müxtəlif mənbələrdə nəql olunan rəvayətlərdə bu həqiqət aşkar qeyd edilir. Məsələn, məşhur təfsir alimi Qurtubi “Əl-camiu li-əhkamil-Quran” kitabında Səlim ibn Amirin və Miqdad ibn Əsvədin Peyğəmbəri-Əkrəm (s)-dən belə eşitdiyini nəql edir: “Yer üzündə daşdan, yaxud palçıqdan (tikilmiş) elə bir ev (qalmayacaq ki, Allah-taala İslamı o evə daxil etməsin!”(۱)

Ruhul-məani” kitabında imam Əli ibn Hüseynin (ə) (bu ayənin təfsiri ilə əlaqədar) belə“ :buyurduğu nəql olunmuşdur



---

.Təfsiri-Qurtubi”, ۷-ci cild, səh. ۴۶۹۲“ . [۱] -۱

هُمْ وَاللهِ شِيعَتُنا اَهْلَ الْبَيْتِ يُفْعَلُ ذالِكَ بِهِمْ عَلَى يَدِ رَجُلٍ مِنّا وَهُوَ مَهْدِىُّ هذِهِ الاُمَّهِ وَهُوَ الَّذى قالَ رَسُولُ اللهِ (ص) فِيهِ لَوْ لَمْ يَبْقَ مِنَ الدُّنْيا اِلاّ يَوْمٌ لَطَوَّلَ اللهُ تعالى ذالِكَ الْيَوْمَ حَتّى يَلِىَ رَجُلٌ مِنْ عِتْرَتِى اِسْمُهُ اِسْمِى يَمْلَأُ الاَرْضَ عَدْلاً وَ قِسْطاً كما مُلِئَتْ ظُلْماً وَجَوْراً:

Allaha and olsun! Onlar bizim şiələrimizdir. Allah-taala bunu bizdən olan bir şəxsin“ vasitəsilə həyata keçirəcək. O, bu ümmətin Məhdisidir. Allahın Peyğəmbəri (s) onun haqqında belə buyurmuşdur: “Əgər dünyanın qurtarmasına bir gündən artıq qalmamış olsa belə, Allah-taala həmin günü Əhli-beytimdən adı mənim adımla eyni olan bir şəxsi yer üzünə hakim edəcəyi vaxta qədər uzadar və o, yer üzünü zülm və haqsızlıqla ”.dolduğu kimi, haqq-ədalətlə doldurar

.Bu hədisi azacıq fərqlə şiənin bir çox mənbələrində də görmək olar

Alusi “Ruhul-məani” kitabında bu hədisi müvafiq nəzərlə araşdırmasına baxmayaraq, onun təfsirində yazır: “Bizim sənədlərimizlə nəql olunan bir sıra rəvayətlər bunu təsdiq etsə də, biz onlara istinad etmirik. Məsələn, Ətiyyə Peyğəmbəri-Əkrəm (s)-dən nəql edir ki, o həzrət bu ayəni tilavət etdikdən sonra belə buyurdu: “Bu ayədə məqsəd Əhli-(beytdir!”(١

Qurtubi başqa bir hədisdə Peyğəmbəri-Əkrəm (s)-in belə buyurduğunu nəql edir: “Yer mənim üçün bir yerə yığıldı, şərq və qərbin hər tərəfini gördüm. Tezliklə yer üzündə (mənim ümmətimin hökuməti bərpa olacaqdır!”(٢

Qeyd etdiyimiz rəvayətlərə əsasən, bəzilərinin bu ayənin təfsiri ilə əlaqədar iradları da .mənasızdır

İzah: Dediyimiz kimi, ilahi vədin xaricdə təzahürləri vardır ki, Peyğəmbəri-Əkrəm (s)-in dövrünün saleh bəndələri və möminlərinə də şamil olur. Belə ki, Məkkə fəth edildikdən və İslam bütün Ərəbistan yarımadasına yayıldıqdan sonra müsəlmanlar İslam və Peyğəmbəri-Əkrəm (s) sayəsində nisbi təhlükəsizlik əldə etdilər və çox böyük .məntəqəyə hakim oldular ki, bu da həmin ayənin nazil olması ilə əlaqəsiz deyildir

Bu ayənin nazil olma səbəbini açıqlayan bir çox təfsir kitablarında, o cümlədən, “Əsbabun-nüzul”, “Məcməül-bəyan”, “Fi

zilal” və “Qurtubi” kimi təfsir kitablarında (azacıq fərqlə) nəql olunan rəvayətlərdə deyilir ki, Peyğəmbəri-Əkrəm (s) və müsəlmanlar Mədinəyə hicrət etdikdən və “ənsar” onları gülərüzlə qarşıladıqdan sonra bütün ərəblər onların əleyhinə qalxdılar. Hətta müsəlmanlar məcburiyyət qarşısında qalıb, özlərilə həmişə silah gəzdirir, gecəni salahla yatır, sübh silahla dururdular. Bu vəziyyət çətinləşdikdə, bəziləri dedilər ki, axı bu vəziyyət haçana qədər davam edəcək? Elə bir vaxt gələcəkmi ki, gecəni rahat yataq, Allahdan başqa heç kəsdən qorxmayaq?! Bu zaman həmin ayə nazil olub, onları .belə bir xəbərlə müjdələdi

Ondan böyük mərhələ xəlifələrin dövründə həyata keçdi, dünyanın böyük bir hissəsi .İslamı qəbul etdi və müsəlmanların əmin-amanlığı, təhlükəsizliyi bir az da artdı

Lakin üçüncü və sonuncu mərhələ İslamın cahanşümul hökuməti, bütün dünyaya hakim olması, təhlükəsizliyin tam təmini və tövhid ordusunun şirk və küfr üzərində qəti qələbəsi ilə başa çatacaq və bu da yalnız imam Məhdinin (ə) zühuru zamanıdır. Qeyd etdiyimiz bu üç mərhələ bir hədəfə doğru yönəlmiş və bir-birləri əsla ziddiyyəti yoxdur. Yeri gəlmişkən, bu ilahi vəd yalnız möminlərə və saleh əməl sahiblərinə məxsusdur. Şübhəsiz, hər bir əsr və dövrdə bu şərt (iman və saleh əməl) gerçəkləşərsə, ilahi vəd öz əksini tapacaqdır. Amma bu şərt mövcud olmadığı təqdirdə, müsəlmanlar məğlubiyyətə məruz qalaraq, düşmənlərin caynaqları altına düşəcəkdir. Deməli, bu vaxt ilahi vədi doğruldan o iki şərt unudulmuş, müsəlmanların imanı zəifləmiş, saleh !əməllər çirkinliklərlə qarışmışdır

### HAQQIN ZÜHURU–٣

#### İşarə

:Tövbə” surəsinin ٣٣-cü ayəsində buyurulur“

هُوَ الَّذِى أَرْسَلَ رَسُولَهُ بِالْهُدَى وَدِينِ الْحَقِّ لِيُظْهِرَهُ عَلَى الدِّينِ كُلِّهِ وَلَوْ كَرِهَ الْمُشْرِكُونَ

Müşriklərin xoşuna gəlməsə də, bütün dinlərə qələbə çalmaq üçün Peyğəmbərini“ ”!doğru yolla və haqq dinlə göndərən Odur

Diqqət yetirmək lazımdır ki, bu ayə “Onlar Allahın nurunu batil sözləri ilə söndürmək

istəyirlər, Allah isə kafirlərin xoşuna gəlməsə də, yalnız Öz nurunu tamamlamaq .istəyir!” – ayəsindən sonra gəlir

Ötən ayələrdəki kimi, bu ayələrdə də Allah-taala İslamın digər dinlərə qalib gələcəyini vəd etmişdir. İslamın bütün dinlərə qalib gəlməsindən məqsədin nə olduğu barədə təfsirçilərin çoxlu ehtimalları vardır.

Fəxri-Razi burada beş cür təfsir qeyd etmişdir ki, qələbənin keyfiyyəti ilə bağlı suallara bir növ cavab verir:

١. Məqsəd nisbi qələbədir; çünki İslamın tutduğu hər bir yerdə bu din hakimdir.

٢. Məqsəd Ərəbistan yarımadasındakı dinlərə olan üstünlüyüdür.

٣. Məqsəd Peyğəmbəri-Əkrəm (s)-i bütün ilahi dinlərdən agah etməkdir (ayədəki "li-yuzhirəhu" ifadəsi tam agahlıq kimi məna edilmişdir).

٤. Məqsəd məntiqli qələbədir, yəni İslamın mahiyyəti digər dinlərə nisbətdə bitkin və idealdır.

٥. Məqsəd İslamın həzrət İsanın (ə) zühuru və imam Məhdinin (ə) inqilabı ilə bütün din və ayinlər üzərində son qələbəsidir ki, o vaxt bütün dünyanı əhatə edəcəkdir.

Şübhəsiz, burada İslam mahiyyətinin qələbəsi təfsiri düzgün bir məfhum daşımır. Çünki İslamın mahiyyətinin digər dinlərin fövqündə durması elə ilk çağlardan İslamın zühuru ilə aşkar oldu.

Bundan əlavə, ayədə qeyd olunan "li-yuzhirəhu" sözünün kökü olan "zühur" və "izhar" sözləri Qurani-Kərimin digər ayələrindəki kimi, xarici və həqiqi qələbəni ifadə edir. Necə ki, "Əshabi-Kəhf"in əhvalatında buyurulur: "Əgər onlar sizə qələbə çalsa, sizi daş-qalaq edəcəklər!"(١)

"Tövbə" surəsinin ٨-ci ayəsində buyurulur:

كَيْفَ وَإِن يَظْهَرُوا عَلَيْكُمْ لاَ يَرْقُبُواْ فِيكُمْ إِلاًّ وَلاَ ذِمَّةً

"Necə onların əhd-peymanının bir dəyəri olsun, halbuki əgər onlar sizə qalib gəlsələr, nə sizinlə qohumluğu gözləyər, nə də bir əhdə əməl edərlər?!"

Aydındır ki, nə “Əshabi-Kəhf” qövmünün, nə də Məkkənin bütpərəstləri və müşrikləri allahpərəstlərin məntiqinə qalib gələ bildilər. Burada məqsəd, yalnız onların döyüşlə xaricdə



---

.Kəhf” surəsi, ayə: ٢٠“ . [١] -١

qələbələrinin mümkünlüyü idi. Buna əsasən, İslamın bütün dinlərə qələbəsindən məqsəd məntiqi və zehni aləmindəki qələbə deyil, xarici aləmdəki qələbəsidir. Öncə qeyd etdiyimiz kimi, bu qələbənin müxtəlif mərhələləri vardır ki, birinci mərhələsi İslam Peyğəmbərinin (s) dövründə və daha geniş bir mərhələsi sonrakı əsrlərdə baş vermişdir. Son mərhələsi isə imam Məhdinin (ə) zühuru və inqilabı ilə hasil olacaqdır. Çünki bu ayədə İslam dininin qeydsiz-şərtsiz bütün dinlərə qalib gələcəyindən söz açılır. Mütləq və qeydsiz-şərtsiz qələbə yalnız bütün yer üzünü əhatə etdiyi bir vaxt gerçəkləşə bilər. Necə ki, Peyğəmbər (s)-dən nəql olunan bir rəvayətdə buyurulur:

لا يَبْقى عَلى ظَهْرِ الْاَرْضِ بَيْتُ مَدَرٍ وَلا وَبَرٍ اِلاّ اَدْخَلَهُ اللهُ كَلِمَةُ الْاِسْلامِ:

“Yer üzündə daşdan və palçıqdan tikilən elə bir ev, yundan və kürkdən hazırlanan elə bir xeymə tapılmayacaq ki, Allah-taala İslamın səsini o evə daxil etməsin!”(١)

Süyuti “Əd-durrul-mənsur” kitabında Səid ibn Mənsur və İbn Münzərdən, eləcə də Beyhəqi “Sünən” kitabında Cabir ibn Abdullah Ənsaridən bəhs etdiyimiz ayənin təfsirində belə nəql etmişlər: “Bu hadisə (Peyğəmbər (s)-in buyurduğu hədis) o zaman gerçəkləşəcək ki, (yer üzündə) İslamdan başqa məzhəb və din sahibi olan yəhudi və məsihi belə qalmayacaq! (Hamı İslam sayəsində yerləşəcək və hər yerdə İslamdan, tövhiddən və yeganə Allahın əzəmətindən danışılacaqdır.)”(٢) Bəli, o gün bu ilahi vəd həyata keçəcəkdir.

Bu ayənin təfsirində imam Sadiqdən (ə) də belə bir hədis nəql olunmuşdur: “Allaha and olsun! Bu ayənin mənası (sonuncu mərhələsi) hələ həyatda gerçəkləşməmişdir və bu, yalnız Qaimin zühuru zamanı olacaqdır. Onun qiyamından sonra dünyanın heç bir məntəqəsində Allaha qarşı küfr edən bir şəxs belə tapılmayacaq!”(٣)

Bunu da qeyd etməliyik ki, هُوَ الَّذِى أَرْسَـلَ رَسُولَهُ بِالْهُـدَى وَدِينِ الْحَقِّ لِيُظْهِرَهُ عَلَى الـدِّينِ كُلِّهِ وَلَوْ كَرِهَ الْمُشْـرِكُونَ "Müşriklərin xoşuna gəlməsə də, bütün dinlərə qələbə çalmaq"



---

١- [١]. “Məcməül-bəyan”, həmin ayənin təfsiri.

٢- [٢]. “Əd-durrul-mənsur”, ٣-cü cild, səh. ٢٣١.

üçün Peyğəmbərini doğru yolla və haqq dinlə göndərən Odur!" – ayəsi Qurani-Kərimin üç surəsində – "Tövbə" surəsinin ٣٣-cü, "Fəth" surəsinin ٢٨-ci, "Səff" surəsinin ٩-cu ayəsində gəlmişdir. Bunun üç dəfə təkrar olunması bu məsələnin əhəmiyyətli .olduğunu göstərir

Əhli-sünnə mənbələrində Əbu Hüreyrədən nəql olunan bir hədisdə belə deyilir: "Ayədəki "Li-yuzhirəhu ələd-dini kullih" – ibarəsindən məqsəd İsa ibn Məryəmin (ə) gəlişidir." (Bildiyimiz kimi, rəvayətlərə əsasən, həzrət İsa-Məsih (ə) imam Məhdinin (ə) (qiyamı zamanı yenidən gələcəkdir!)(١)

Bu bəhsi də məşhur təfsir alimi Qütadənin nəql etdiyi bir hədislə sona yetiririk. O, bu ayənin təfsirində yazır: "Dünyada altı cür pərəstiş edən vardır: müsəlmanlar, məsihilər, yəhudilər, ulduzpərəstlər, məcuslar və müşriklər. Bütün bunlar İslam dininə (qoşulacaqlar!"(٢)

Məlum olduğu kimi, bu hələ tam mənada həyatda baş verməmiş, yalnız imam Məhdinin (ə) inqilabı zamanı hasil olacaqdır. Bunu da deyək ki, yəhudi və məsihi dinləri tamamilə aradan getməyəcək və burada məqsəd, İslam dininin bütün dünyaya hakim .olacağıdır

### İMAM MƏHDİNİN (Ə) İNTİZARININ TƏSİRLƏRİ

Bəzi nadanlar elə güman edirlər ki, bu ayə və rəvayətlər imam Məhdinin (ə) intizarı fikrini irəli çəkməklə irtica və geriliyə, yaxud insanların məsuliyyətdən boyun qaçırmasına və zülmə təslim olmasına zəmin yaradır. Çünki bu rəvayətlərə görə, imam Məhdinin (ə) qiyam və gəlişindən öncə dünyada islah və əmin-amanlığa ümid yoxdur, !hətta zühura zəmin yaratmaq belə zülm və fitnə-fəsadın yayılmasına kömək edir

Bu isə qədimdən bəri düşmənlərin və imam Məhdinin (ə) qiyamını inkar edənlərin sözü olmuş, hətta İbn Xəldun da bu məsələyə işarə etmişdir. Halbuki həqiqət tamamilə ,bunun əksidir. Bu böyük zühurun intizarını çəkməyin çoxlu müsbət təsiri vardır ki



---

١- [١] . "Əd-durrul-mənsur", ٣-cü cild, səh. ٢٣١.

aşağıda onlara qısa şəkildə işarə edəcək və nadanların belə qəzavət və hökmlərinin düzgün olmadığını, həm Qurani-Kərimin ayələrinə, həm də şiə və əhli-sünənin məşhur kitablarında nəql olunan "mütəvatir" hədislərə əsaslanmaqla onların yanlış mövqe .tutduqlarını göstərəcəyik

### İNTİZARIN MAHİYYƏTİ VƏ ONUN MÜSBƏT TƏSİRLƏRİ

Görəsən, imam Məhdinin (ə) zühuruna inamın (zülm və haqsızlığın köklərini məhv edən cahanşümul proqramları nəzərə almaqla) nə kimi müsbət və tərbiyəvi təsirləri vardır? Görəsən, bu inam insanı qafil, yaxud hər şeyə təslim olmağa vadar etmirmi? Yoxsa bu əqidə müsbət mənada bir növ fərdi və ictimai qiyama dəvət deyildirmi? İnsanı tərəqqiyə doğru aparmırmı? İnsanda məsuliyyət hissi yaratmırmı? Bir sözlə, bu inam ?viranedicidir, yoxsa islahedici və qurucu

Bu sualları araşdırmazdan öncə, bilmək lazımdır ki, müsbət fikir və ideyalar həmişə nadan və nalayiq, yaxud mənafe güdənlərin əli ilə təhrifə məruz qalır və tamamilə əsl məqsəddən yayındırılır. Tarixdə belə nümunələr həddən artıq çoxdur və "intizar" da amanda qalmamışdır. Belə məsələlərdə hər bir təhrif və xətadan uzaq olmaq üçün, necə deyərlər, suyu bulağın gözündən götürmək lazımdır ki, qarışıq çay və yol arxlarının natəmiz, çirkab suları ilə daxilimizi aludə etməyək. Burada "intizar"ı düzgün başa düşmək üçün İslamın kökünə müraciət etməli və bunu xalis rəvayətlərin dili ilə .araşdırmalıyıq

:Aşağıdakı rəvayətlər bu məsələyə aydınlıq gətirir

Bir nəfər imam Sadiqdən (ə) soruşdu: "Haqq hökumətin bərpasının intizarını çəkdiyi .١ "?halda, dünyadan gedən şəxs haqqında nəzəriniz nədir

İmam buyurdu: "O, Qaimlə sanki bir işdə onun xeyməsində (ordusunda) hazır olan şəxs kimidir. (Həzrət bir az sükut etdikdən sonra buyurdu:) O, İslam Peyğəmbəri ilə birgə mübarizələrdə iştirak

(.edən şəxs kimidir!”(١) (Buna bənzər rəvayətlər çoxdur

”!Bəzi rəvayətlərdə deyilir: “O, Allah yolunda qılınc çəkən şəxs kimidir .٢

”!O, Peyğəmbərin hüzurunda qılıncla düşmən başına zərbə endirən şəxs kimidir“ .٣

”!O, Qaimin bayrağı altında olan şəxs kimidir“ .۴

”!O, Peyğəmbərin hüzurunda cihad edən şəxs kimidir“ .۵

O, Peyğəmbərlə şəhid olan şəxs kimidir!” (İmam Məhdinin (ə) zühurunun intizarı ilə“ .۶ əlaqədar bu təşbeh və bənzətmələr düşmənlə mübarizəyə və cihada daha artıq şövq (.yaradır

Bir çox rəvayətlərdə isə belə bir hökumətin intizarını çəkmək ən böyük və ən fəzilətli .٧ .ibadət sayılmışdır

Bunları biz həm Peyğəmbəri-Əkrəm (s)-dən, həm də imam Əlidən (ə) nəql olunan :hədislərdə görə bilərik. Bir hədisdə Peyğəmbəri-Əkrəm (s) belə buyurmuşdur

اَفْضَلُ الْاَعْمالِ اُمَّتِی اِنْتِظارُ الْفَرَجِ مِنَ اللهِ عَزَّوَجَلَّ:

(Mənim ümmətimin ən fəzilətli əməli Allahın vəd etdiyi zühurun intizarını çəkməkdir!”(٢“

:O həzrət başqa bir hədisdə belə buyurmuşdur

اَفْضَلُ العِبادَهِ اِنْتِظارُ الْفَرَجِ:

(Ən fəzilətli əməl zühurun intizarını çəkməkdir!”(٣“

Burada deyilən “intizar” sözü istər ümumi və geniş, istərsə də xüsusi və dünyanın böyük islahatçısının zühurunun intizarını bildirsə belə, hər bir halda “intizar”ın böyük .əhəmiyyət daşıdığını göstərir

Bütün bunlar böyük bir cihadla birgə olduğuna və bunu nəzərə alaraq yekun nəticə .alacağımıza zəmin yaradacaq

### İNTİZAR” MƏFHUMU“

İntizar”, adətən, insanın mövcud vəziyyətdən narahat olaraq yaxşı“



---

Məhasini-Bərqi”, “Biharul-ənvar” kitabından nəqlən, qədim çapla ۱۳-cü cild, səh.“ . [۱] -۱ .۱۳۶

.Kafi”, “Biharul-ənvar” kitabından nəqlən, ۱۳-cü cild, səh. ۱۳۷“ . [۲] -۲

.Yenə orada, səh, ۱۳-cü cild, səh. ۱۳۶ . [۳] -۳

vəziyyətin yaranması ümidilə gözlədiyi hala deyilir. Məsələn, sağalmaq intizarını çəkən xəstə mövcud vəziyyətdən, yaxud övladının səfərdən qayıtmasının intizarını çəkən ana övladının ayrılığından narahatdır və hər ikisi bu vəziyyətin sona çatmasını .gözləyirlər

Burada dünyanın böyük islahatçısının qiyamının və imam Məhdinin (ə) haqq-ədalətli hökumətinin intizarı həqiqətdə iki əsldən təşkil tapmışdır: "inkar" və "isbat" əslləri. "İnkar" dedikdə, mövcud vəziyyətdən narahatçılıq hissi, "isbat" dedikdə isə vəziyyətin yaxşılaşmasının intizarı nəzərdə tutulur. Bu iki əslin insanda inkişafı ilə iki mütənasib fikrin də qaynaqlanmasına səbəb olacaqdır: ١) zülm və haqsızlığa qarşı ikrah, hətta onlarla mübarizə hissi; ٢) vahid ədalətli bir hökumətin təşkili üçün cismi və ruhi, maddi .və mənəvi hazırlıq hissi. Göründüyü kimi, bu hislərin hər ikisi müsbət xarakterlidir

İntizar"ın bu məfhumuna diqqət yetirməklə, imam Məhdinin (ə) qiyamının intizarını" çəkənlərin böyük savabı və rəvayətlərin nə üçün həqiqi intizar çəkənləri imam Məhdinin (ə) xeyməsində və bayrağı altında olanlarla bir, yaxud Allah yolunda cihad .edən və şəhid olanlar kimi saydığını açıq-aydın başa düşürük

Görəsən, bunlar insanları hazırlığa, haqq-ədalət yolunda mübarizəyə və yüksək dərəcələrə dəvət deyildirmi? Məlumdur ki, Allah yolunda cihad edənlərin fədakarlıqlarının dərəcələri və onların rolları bir-birindən fərqləndiyi kimi, intizarla əlaqədar insanın haqq-ədalətli bir hökumətin təşkili üçün hazırlığının da müxtəlif dərəcələri vardır ki, bu baxımdan biri digərinə bənzəyir, hər ikisi cihad sayılır və hazırlıq tələb edir. Belə bir hökumətin bayrağı altında durmağa layiq şəxs məsələyə əhəmiyyətsiz yanaşa bilməz. Ora yalnız layiqli şəxslərin yeridir. Eləcə də əlinə silah götürüb, bu inqilabın rəhbəri qarşısında saleh və ədalətli hökumətin əleyhinə qalxanlarla mübarizə aparmaq istəyən şəxsin ruhi, fikri və cismi cəhətdən tam hazırlığı .olmalıdır

İmam Məhdinin (ə) zühurunun intizarının təsirləri barədə aşağıda verilən geniş :izahlara diqqət yetirək

## İNTİZAR – TAM HAZIRLIQ

Əgər mən özümə zülm edirəmsə, zülmkarların əleyhinə qalxacaq bir rəhbərin intizarını necə çəkə bilərəm? Əgər mən özüm də günahkar olub, pak deyiləmsə, yer üzünü çirkin insanlardan təmizləmək məramında olan bir inqilabın intizarını çəkənlərdən ?necə ola bilərəm

Böyük bir cihadın intizarını çəkən ordu hərbi hazırlığı və hərbiçilərin sayını artırmağa, .onlarda inqilab ruhiyyəsini yaratmağa və bütün zəif nöqtələri islah etməyə cəhd edir

.İntizar, yəni bir müsafirin səfərdən qaytmasını gözləmək

.İntizar, yəni əziz bir dostun gəlişini gözləmək

İntizar, yəni meyvənin dərilmə və məhsulun biçilmə fəslini gözləmək. (Bu intizarların (.hər biri müəyyən hazırlıqla birgədir

Amma dünyanın böyük islahatçısının qiyamının intizarını çəkmək, həqiqətdə bəşərin tarixində inqilabların ən böyüyü və genişinin, ümumbəşəri çevriliş və dəyişikliklərin intizarıdır. Bu inqilab digər inqilablardan fərqli olaraq, müəyyən bir məntəqəyə məxsus olmayıb cahanşümuldur, insanların bütün yaşayış yönlərinə – həm siyasi, həm .mədəni, həm iqtisadi, həm də əxlaqi cəhətlərinə şamildir

## BİRİNCİ FƏLSƏFƏ: FƏRDİ İSLAHAT

Belə dəyişiklik hər şeydən öncə insani dəyərlərə ehtiyac duyur ki, ümumdünyəvi islahatın ağır məsuliyyətini çəkə bilsin. Belə böyük bir proqramın icrasında həmkarlıq üçün mütləq elmi dərəcə, yüksək məlumat, ruhi və fikri hazırlıq tələb edir. Dardüşüncəlik, ümumiyyətlə, hər növ irtica həqiqi intizarla uyğun gəlmir. Əsas məsələ isə odur ki, həqiqi intizar çəkənlər belə bir mühüm proqramda heç vaxt tamaşaçı .rolunu ifa edə bilməz və elə indidən inqilabçılar sırasına qoşulmaqdır

Əgər mən özüm əyri işlərə əl atıramsa, necə düzgün bir nizamın intizarını çəkə !?bilərəm

Görəsən, bu intizarın özü ruhi, fikri və cismi çirkinliklərdən təmizlənib saflaşma üçün

mübarizə intizarı çəkən ordu tam hazır vəziyyətdə olmalı, hərbiçilərin hazırlığı və ruhiyyələrini gücləndirməli, şövq hissini diriltməlidir. Belə hazırlığa malik olmayan ordu .heç vaxt intizardan danışa bilməz. Əgər belə hazırlıqdan söz getsə, bu boş bir iddiadır

Dünyanı hidayət edəcək bir islahatçının intizarını çəkmək fikri, əxlaqi, maddi və mənəvi cəhətdən tam hazırlığı tələb edir ki, bu hazırlığın nə qədər müsbət təsirləri vardır. Bütün yer üzünü islah etmək, zülm, təfriqə və ixtilafa son qoymaq isə asan və sadə bir iş deyil, belə bir inqilabı həyata keçirmək üçün şücaətli, dərrakəli, ağıllı, dərin düşüncəli, tam hazırlıqlı, sözü və əməlində doğru olan şəxsiyyətlər lazımdır. Belə böyük hədəf üçün insanın dərin əxlaqi, fikri və ictimai cəhətdən islahı lazımdır. Həqiqi intizarın !mənası məhz budur və kimsə onun irtica olduğunu deyə bilməz

### İKİNCİ FƏLSƏFƏ: İCTİMAİ HAZIRLIQ

Həqiqi intizar fərdi islahı tələb etdiyi kimi, ictimai birliyi qorumağı, ümumi islahı da qarşıya məqsəd qoyur. Çünki intizarı çəkilən o böyük hadisədə bütün inqilabi qüvvələr iştirak edərək, hamı bir məqsəd üçün çalışacaqdır. Hamının əlbir olduğu mübarizə meydanında heç kim yoldaşının vəziyyətindən qafil ola bilməz, hər kəs hər yerdə zəif bir nöqtə görsə, onu islah etməyə cəhd göstərməlidir. Burada mübarizlərin fəal iştirakı olmadan, belə bir proqramın icrası qeyri-mümkündür. Buna əsasən, həqiqi intizar üçün fərdi islahla yanaşı ictimai islah və hazırlıq da zəruridir. Bu da böyük bir !islahatçının qiyamının intizarının başqa bir müsbət təsiri idi

### ÜÇÜNCÜ FƏLSƏFƏ: HƏQİQİ İNTİZARÇILAR ÇİRKİNLİKDƏN UZAQDIR

İmam Məhdinin (ə) intizarının digər mühüm təsirlərindən biri də çirkinlik və .eybəcərliklərə qarşı islahat proqramıdır

İzah: Fitnə-fəsad və çirkinliklər ictimai forma aldıqda, cəmiyyəti özünə doğru çəkir, bəzən pak insanları belə, psixi-ruhi sıxıntıya, ümidsizliyə məruz qoyur, bəzən də elə fikirləşirlər ki, artıq iş-işdən keçmişdir, islahata əsla ümid yeri yoxdur və özlərini də pak

saxlamaq üçün çalışmaq faydasızdır. Bu ümidsizlik onları yavaş-yavaş fitnə-fəsada, çirkin mühitə doğru çəkə bilir və əksəriyyətə hakim kəsilən çirkin mühitin müqabilində azlıq təşkil edərək qorunmaq onlara çətinləşir, bəzən də camaatla həmrəng olmağa .üstünlük verirlər

Amma onlarda ümid və müqavimət hissini yaşada biləcək yeganə amil, mütləq vaqe olacaq islaha ümidvar olmaqdır. Onlar yalnız belə bir ümidlə özlərinin və başqalarının .islah fikrindən daşınmazlar

Əgər İslam göstərişlərində ümidsizlik ən böyük günahlardan biri və bu məsələyə böyük əhəmiyyət verildiyini görürüksə, həqiqətdə bunun səbəbi Allahın mərhəmətindən naümid olan günahkar şəxsin günahını yumaq, heç olmazsa, günahdan çəkinmək fikrinə düşməməsilə əlaqədardır. O fikirləşir ki, mən onsuz da cəhənnəmə gedəcəyəm və nə üçün dünyada qəm-qüssə çəkməliyəm?! İslanmışın !yağışdan nə qorxusu

Amma onun üzünə Allahın əfv və məğfirəti, ümid səhifələri açıldıqda, həyatı tamamilə dəyişilir, onda günahdan uzaqlaşmağa, paklıq və islaha doğru şövq yaranır. Buna görə də ümid hissi belə insanlar üçün həmişə psixoloji-tərbiyəvi əhəmiyyət daşıyır, eləcə də .çirkin mühitdə yaşayan saleh insanlar belə ümidsiz paklığı qoruya bilməzlər

Hazırda dünya hər nə qədər çirkinliyə, fitnə-fəsada doğru gedirsə, imam Məhdinin (ə) zühuruna ümid bir o qədər da artır, ona inananların fəsad və çirkinliyin tufanları qarşısında müqaviməti möhkəmlənir, mühit nə qədər aludə olsa belə naümid olmur, üstəlik hədəfə daha yaxın olduqlarını görür, fəsadla mübarizədə, yaxud paklıq üçün .sonsuz eşq və şövqlə çalışırlar

Ötən bəhslərdən belə nəticə alırıq ki, intizarın viranedici təsiri yalnız onun məfhumunun təhrif və məsx olunduğu təqdirdədir. Necə ki, qədimdən bəri təhrif əlləri ona doğru uzanmışdır. Lakin onun həqiqi məfhum və mənası ictimai-fərdi islahatın, tərbiyə və təşviqin əsasını təşikl edir. Bu məsələyə elə əvvəldən obyektiv yanaşan :Quranın özü olmuş və bu haqda “Nur” surəsinin ۵۵-ci ayəsində buyurmuşdur

وَعَدَ اللَّهُ الَّذِينَ آمَنُوا مِنكُمْ وَعَمِلُوا الصَّالِحَاتِ لَيَسْتَخْلِفَنَّهُم فِي الْأَرْضِ كَمَا اسْتَخْلَفَ الَّذِينَ مِن قَبْلِهِمْ وَلَيُمَكِّنَنَّ لَهُمْ دِينَهُمُ الَّذِي ارْتَضَى لَهُمْ وَلَيُبَدِّلَنَّهُم مِّن بَعْدِ خَوْفِهِمْ أَمْنًا يَعْبُدُونَنِي لَا يُشْرِكُونَ بِي شَيْئًا

“Allah aranızda iman gətirib saleh əməllər yerinə yetirənlərə – yalnız Mənə ibadət edər və heç nəyi Mənə şərik qoşmazlar deyə – onları özlərindən əvvəlkilər kimi yer üzünün varisləri edəcəyini, möminlər üçün onların Allahın Özü bəyəndiyi dinini möhkəmləndirəcəyini və onların qorxusunu sonra əmin-amanlıqla, arxayınçılıqla əvəz edəcəyini vəd etmişdir!”

Böyük İslam rəhbərlərindən nəql olunan bir çox rəvayətlərə əsasən, bu ayədəkilər imam Məhdi (ə) və onun dostlarıdır.(1) Başqa bir hədisdə isə deyilir: “Bu ayə Məhdi (ə) haqqında nazil olmuşdur!”

Bu ayədə imam Məhdi (ə) və onun dostları “iman gətirən və saleh əməllər yerinə yetirənlər” kimi tanıtdırılmışdır. Beləliklə, cahanşümul bir inqilabın həyata keçməsi hər bir süstlük və nöqsandan uzaq olan möhkəm iman və dünyəvi islahı təmin edə biləcək saleh əməllər olmadan qeyri-mümkündür. Belə bir proqram üçün həm yetkin bilik, həm güclü iman, həm də saleh əməl lazımdır. Yalnız bu xüsusiyyətlərə malik olanlar özlərinə bəşəriyyətin xilaskarının quruculuğunda iştirak etməyi müjdə verə bilərlər. Zülm və haqsızlığı seçib, iman və saleh əmələ biganə olanlar, imanın zəifliyinə görə, hətta öz kölgələrindən qorxanlar, cəmiyyətdən uzaqlaşaraq əllərini əllərinin üstünə qoyub sükut və tamaşa edənlər və haqq uğrunda mübarizəyə qoşulmayanlar verilən həmin vəd və müjdələrdən məhrumdurlar! Budur imam Məhdinin (ə) intizarının müsbət təsiri!

İlahi! Bizim gözlərimizi o həzrətin mübarək camalı ilə işıqlandır! Bizi onun vəfalı dostlarından və fədakar əsgərlərindən qərar ver! Amin!



---

۱- [۱]. “Biharul-ənvar”, qədim çapla ۱۳-cü cild, səh. ۱۴.

## Haqqında mərkəzi

Allahın adı ilə

Rəhman və Rəhimli olan Allahın adı ilə.Və bütün həmdlər aləmlərin rəbbi olan Allaha .məxsusdur

.Varlıq aləminin Kövsəri olan Həzrəti Fatiməyi Zəhraya (a) təqdim olunur

(Bilən kimsələrlə (alimlər) bilməyənlər (cahillər) eynidirlərmi? (Zümər surəsi, ayə ۹

:Ön söz

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi ۲۰۰۶-cı ildən Mərhum Ayətullah Seyyid Həsən Fəqih İmaminin nəzarəti altında,elmi mərkəzlərdə tanınan görkəmli tələbələrin vasitəsi ilə məzhəb,mədəniyyət və elmi sahələrdə öz fəaliyyətinə .başlamışdır

:Məramnamə

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi təhqiqatçıların dini biliklərə rahət və tez bir zamanda yiyələnmələri üçün hər bir xidməti onların ixtiyarında qərar vermişdir.Və bu sahədə təəssübkeşlikdən,ictimai,siyasi,fərdi cəryanlardan uzaq duraraq yalnız və yalnız elmi sahədə ixlasla öz xidmətini həyata keçirməkdədir.Bu səbəbdən adı çəkilən müəssisə layihəsini həyata keçirmiş.Və tədqiqat üçün nəzərdə tutulmuş kitabları,məqalələri mütəxəssislər və müxtəlif təbəqələrdən olan insanlar üçün,bir neçə dillərdə və formalarda hazırlayaraq,heç bir məbləğ tələb etmədən sosial .medyada istifadəçilərin ixtiyarında qoymuşdur

:Hədəflər

Quran və Əhli beyt mədəniyyətini və maarifini yaymaq.۱

İnsanları,xüsusən gəncləri tam dəqiq şəkildə dini məsələləri araşdırmağa.۲ sövqləndirmək

Telefon,tablet və kompüterlərdə olan faydasız,yararsız mövzuların yerini .۳ faydalı,mənəviyyatlı mövzularla doldurmaq

.Təhqiqatla məşğul olan tələbələrə xidmət etmək.۴

.Kitab və elmi əsərlər oxumaq mədəniyyətini yaymaq.۵

.Müəlliflərin öz elmi əsərlərini digital formada yaymaq üçün onlara şərait yaratmaq.۶

:İcraçılıq

.Qanunla icazəli olan lisenziyaya malik əsərlərin yayımı.۱

.Bu mərkəz kimi xidmət göstərən oxşar mərkəzlərlə əlaqə.۲

.(Paralel xidmətlərdən çəkinmək (başqalarının etdiklərini təkrarlamamaq.۳

.Yalnız və yalnız elmi məsələləri yaymaq.۴

.Nəşriyyatın mənbələrini qeyd etmək.۵

.Qeyd:Kitabda olanlara görə məsüliyyət o kitabı yazan müəllifin öhdəsindədir

:Müəssisənin fəaliyyəti

.Kitabların çapı və nəşri.۱

.Kitab oxumaq müsabiqələrinin təşkili.۲

.Məcazi sərgilərin istehsalı.۳

.Kompüter oyunlarının istehsalı.۴

Qaimiyyə internet saytının yaradılması:www.ghaemiyeh.com.۵

.Sərgi məhsullarının və moizələrin istehsalı.۶

.Şər'i,əxlaqi və etiqadi suallara cavab.۷

.Mühasibat,mətbuat yaratmaq və sms... sistemlərinin layihəsi.۸

.Təlim kurslarının həyata keçirilməsi.۹

Tərbiyəçi şəxslər hazırlamaq üçün təlim kurslarının təşkili.۱۰

Kompüterdə,tabletdə və telefonlarda icrası mümkün olan minlərlə proqramların.۱۱ dünyada məşhur olan səkkiz formada istehsalı

JAVA.۱

ANDROID.۲

EPUB.۳

CHM.۴

PDF.۵

HTML.۶

CHM.۷

GHB.۸

.v.Qaimiyyə kitab bazarı adına dörd market

ANDROID.۱

IOS.۲

WINDOWS PHONE.۳

WINDOWS.۴

deyilənlər müəssisənin veb saytında Fars,Ərəb,İngilis və Azərbaycan dillərində pulsuz

.istifadəyə verilmişdir

:Sonunda

Mərcəi təqlid müctəhidlərin dəftərxanalarından (ofis),müəssisələrdən,nəşriyyatçılardan,müəlliflərdən və əməyi olan bütün şəxsiyyətlərdən bizlərə hədəfə çatmaqdan ötrü yardım etdikləri üçün səmimi qəlbdən .təşəkkür edirik

:Mərkəzin ünvanı

İsfahan-Əbdurrəzzaq küçəsi-Hacı Muhəmməd Cəfər adına bazar-Şəhid Muhəmməd Həsən Təvəkküli küçəsi-blok۱۲۹/۳۴-birinci mərtəbə

veb sayt:www.ghbook.ir

mail:Info@ghbook.ir

mərkəzin ofis telefonu: ۰۰۹۸۳۱۳۴۴۹۰۱۲۵

Tehran ofisi: ۰۰۹۸۲۱۸۸۳۱۸۷۲۲

Biznes və alqı satqı: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

Mərkəzdə çalışan insanlarla əlaqə yaratmaq üçün nəzərdə tutulan nömrə: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹